***«Müəllim adı dünyada ən yüksək addır. Şəxsən mən Yer üzündə müəllimdən yüksək ad tanımıram. Çünki hər birimizə təhsil, bilik verən, bu səviyyəyə qaldıran məktəbdir və məktəbdə təhsil verən də müəllimdir. Mən müəllim qarşısında baş əyirəm».***

**HEYDƏR ƏLİYEV**



**Yusif Məmmədov,**
Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru, AMEA-nın müxbir üzvü, fizika-riyaziyyat elmləri doktoru, professor

## ÖN SÖZ

Fəaliyyətlərinə Ümummilli liderimiz Heydər Əliyevin yüksək dəyər verdiyi Azərbaycan müəllimləri, həqiqətən də, çox şərəfli və ləyaqətli yol keçmiş, müstəqil respublikamızın intellektual potensialının formalaşmasında böyük əmək sərf etmişlər. Yüksəkixtisaslı pedaqoji kadr hazırlığında 90 il şərəfli inkişaf yolu keçmiş Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim heyətinin və onun məzunlarının xüsusi payı vardır. Bu illər ərzində Pedaqoji Universitet böyük inkişaf yolu keçmiş, zəngin ənənələrə malik şöhrətli elm və tədris ocağına çevrilmişdir. Pedaqogika, psixologiya və ayrı-ayrı fənlərin tədrisi metodikası məhz burada təşəkkül tapmış, inkişaf edərək indiki yüksək səviyyəsinə çatmışdır.

Azərbaycan XKS-nin sədri N.Nərimanovun imzaladığı 1921-ci il 26 avqust tarixli dekret əsasında 6 nəfər tələbə ilə milli dildə fəaliyyətə başlayan bu ilk ali pedaqoji təhsil ocağı yeni təşkil olunan I və II dərəcəli məktəbləri yüksəkixtisaslı pedaqoji kadrlarla təmin etmək məqsədilə yaradılmışdı. Fəaliyyəti dövründə institut bu missiyanı şərəflə yerinə yetirdi, 150 minə yaxın müəllim kadrları hazırladı, bir çox ixtisaslar üzrə elmi-pedaqoji kadr hazırlığının mərkəzinə çevrildi.

İnstitut tədris və elmi-pedaqoji fəaliyyətində müxtəlif çətinliklərlə qarşılaşmalı oldu: iki dəfə (1927–1929 və 1941–1943-cü illərdə) öz fəaliyyətini dayandırdı, Azərbaycan Dövlət Universiteti ilə birləşdirildi. Lakin o, bütün çətinliklərdən şərəflə çıxaraq Azərbaycanda milli mədəniyyətin, elmin və təhsilin inkişafında xüsusi xidmətləri olan müəllim kadrları yetişdirməklə, millətin mənəvi potensialının formalaşmasında önəmli rol oynadı.

İnstitutun formalaşmasına və inkişafına Azərbaycan hökumətinin başçısı N.Nərimanov, Xalq maarif komissarı D.X.Bünyadzadə, dövrün görkəmli ziyalıları M.Quliyev, Ü.Hacıbəyli, V.Xuluflu, Ə.Übeydulin, B.Çobanzadə və b. yaxından köməklik göstərdilər. Odessa Universitetinin məzunu Fətulla bəy Rzabəyli institutun direktoru, Tiflis Müəllimlər İnstitutunu bitirmiş Həbib bəy Mahmudbəyov direktor müavini vəzifəsinə təyin olundular.

Sonralar direktor vəzifəsində çalışan M.Əfəndiyev, H.Mahmudbəyov, Ş.Manafov və C.Məmmədzadə Pedaqoji İnstitutun təşkilatca möhkəmlənməsinə, kollektivin tədris və elmi fəaliyyətinin tənzimlənməsinə xeyli qüvvə sərf etdilər. Onların həyata keçirdikləri əməli tədbirlər yeni təhsil müəssisəsinin maddi-texniki bazasının qurulub-möhkəmləndirilməsinə, fakültə və şöbələrin elmi-pedaqoji kadrlarla təmin edilməsinə, fəhlə və kəndli gənclərin ali təhsil almasına şərait yaratdı. Qərbi Avropa, Rusiya, Türkiyə və Şərqin bir sıra tədris və elm mərkəzlərində təhsil alan yüksəkixtisaslı milli kadrlar burada pedaqoji fəaliyyətə cəlb edildilər. Onlara öz bilik və bacarıqlarını tədris prosesinə tətbiq etmələri üçün münasib şərait yaradıldı.

Azərbaycanda pedaqoji kadrların hazırlanmasını yaxşılaşdırmaq və ali məktəblərdə vahid rəhbərliyi təmin etmək məqsədilə Azərbaycan XKS 1926-cı ilin iyun ayının 16-da «Ali pedaqoji institutların yenidən təşkili haqqında» qərar qəbul etdi. Həmin qərara uyğun olaraq, Ali Pedaqoji Kişi və Ali Pedaqoji Qadın İnstitutları Bakı Universitetinin Pedaqoji fakültəsinə birləşdirildi. BDU-nun Pedaqoji fakültəsi səmərəli fəaliyyət göstərməsinə baxmayaraq, ali təhsilli pedaqoji kadrlara olan ehtiyacı ödəyə bilmədi. Ona görə də Pedaqoji fakültənin bazası əsasında müstəqil ali təhsil ocağının – APİ-nin

yenidən yaradılması planlaşdırıldı. Respublikada ali pedaqoji təhsilin təzədən qurulmasında uğurlu addımlar atıldı. P.Qasımov instituta direktor, prof. B.B.Komarovski isə direktor müavini təyin edildilər. Bakı Dövlət Universiteti müvəqqəti olaraq öz fəaliyyətini dayandırdı. Universitetin Pedaqoji fakültəsində çalışan tanınmış alimlərin əksəriyyəti ADPİ-yə müəllimliyə cəlb olundular.

30-cu illərdə və 40-cı illərin əvvəllərində APİ-də təşkilati məsələlərin həllində, tədris və elmi-tədqiqat işlərinin düzgün qurulmasında direktor vəzifəsində çalışan P.Qasımovun, M.Bayramovun, B.Bünyadovun, M.Məmmədovun, D.Rəsulzadənin böyük xidmətləri oldu. Onların fəaliyyət göstərdikləri dövr tariximizin çox mürəkkəb, ziddiyyətli və faciələrlə dolu bir mərhələsidir. Sərt və ciddi qanunların tətbiqi ilə səciyyələnən həmin dövrdə Pedaqoji İnstitutda təhsilin tamamilə siyasiləşdirilməsi, sinfi mübarizənin gücləndirilməsi haqqında Stalin təlimi ali pedaqoji təhsilin inkişafında demokratik ənənələrin inkişafını ləngitməklə, yeni, arzuolunmaz istiqamətin formalaşmasına zəmin yaratdı. 30-cu illərdə başlanan repressiya dalğası bir çox Azərbaycan ziyalıları kimi Pedaqoji İnstitutun da ən yaxşı müəllimlərinin cismən məhv olmasına və ya sürgünə göndərilməsinə səbəb oldu. APİ-nin kafedralarına rəhbərlik edən milli kadrlarla yanaşı, bəzi görkəmli rus alimləri də sıradan çıxarıldı və onların yerinə maneəsiz olaraq ermənilər yerləşdirildi.

Böyük Vətən müharibəsinin ilk illərində APİ-nin maliyyə imkanları tükəndi, tələbə və müəllim heyətinin vəziyyəti ağırlaşdı. Ona görə də Azərbaycan XKS və Azərbaycan K(b)P MK-nın qərarı ilə institut ADU ilə birləşdirildi. Müharibənin gedişində əsaslı dönüş yarandıqdan sonra APİ Universitetin tərkibindən ayrıldı və müstəqil ali təhsil ocağı kimi fəaliyyətə başladı. Bu dövrdə instituta rəhbərlik ardıcıl olaraq A.Abdullayev, M.Ələkbərli və Ə.Seyidova həvalə edildi. APİ-nin yenidən qurulması onun maddi-texniki bazasının xeyli möhkəmlənməsinə, tələbələrin sayının artmasına imkan verdi. Cəbhədə həlak olan müəllimləri əvəz edə biləcək elmi-pedaqoji kadrlar hazırlamaq məqsədilə məqsədyönlü işə başlandı.

50–70-ci illərdə tanınmış elm və maarif xadimləri – C.X.Hacıyev, M.Mehdizadə, H.Qədirov, C.Ələsgərov, M.Vəkilov, M.Əliyev, Ş.Ağayev APİ-nin direktoru (rektoru) vəzifəsində çalışdılar.

50–60-cı illərdə M.Muradxanov, Ə.Zəkuzadə və Ə.Əbdülrəhmanova professor elmi adının verilməsi, prof. A.Abbaszadənin RSFSR PEA-nın müxbir üzvü, M.Mehdizadənin SSRİ PEA-nın həqiqi üzvü seçilməsi fərəhli elmi fakt və hadisə kimi gənc elmi kadrların inkişafına təkan verən əsas amilə çevrildi.



*Sov.İKP MK-nın Siyasi Bürosu üzvlüyünə namizəd, Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev V.İ.Lenin adına APİ-nin yaradılmasının 50 illiyinə həsr olunmuş təntənəli yığıncaqda çıxış edərkən (1973-cü il)*

Qeyd etmək yerinə düşər ki, SSRİ PEA-nın həqiqi və müxbir üzvü seçilən azərbaycanlı alimlərin hamısı (Mehdi Mehdizadə, Abbasqulu Abbaszadə, Hüseyn Əhmədov, Sədi İmanov) ADPU-nun əməkdaşları olmuşlar.

Ali pedaqoji təhsilin öncülü və bayraqdarı olan Azərbaycan Dövlət Pedaqoji Universitetinin 90 illik tarixinin bütöv bir mərhələsində (1969–1987 və 1993–2003-cü illər) qazanılan uğurlar bilavasitə Heydər Əliyevin unudulmaz adı və fəaliyyəti ilə bağlıdır. O, bir neçə dəfə Pedaqoji Universitetdə olmuş, professor-müəllim və tələbə kollektivinə çox dəyərli tövsiyələr, məsləhətlər və göstərişlər vermiş, hər bir əməkdaşın arzu və istəkləri ilə maraqlanmışdır. Onun dəyərli tövsiyələri universitetimizdə təhsil-tərbiyənin səmərə və keyfiyyətinin yüksəldilməsində, qəbul imtahanlarında obyektivlik və ədalətin bərqərar edilməsində, nöqsanların aradan qaldırılmasında, gənclərin ictimai fəallığının artırılmasında, yüksək səviyyəli, elmi və pedaqoji kadr hazırlığında həlledici rol oynamışdır.



*V.İ.Lenin adına APİ-nin yaradılmasının 50 illiyinə həsr olunmuş təntənəli yığıncaqda (1973-cü il)*

Ulu öndərin APİ-nin 60 illik yubileyi ilə bağlı təntənəli mərasimdə *«Azərbaycan Dövlət Pedaqoji İnstitutu böyük və çətin yol keçmişdir. Onun kollektivi Azərbaycan ümumtəhsil məktəbinin inkişafında böyük xidmət göstərmiş, institut xalq maarifi üçün yüksəkixtisaslı kadrlar ocağına çevrilmişdir»* – cümlələri ilə verdiyi qiymət institut əməkdaşlarının sonrakı fəaliyyətinə yeni ruh gətirmiş və böyük impuls vermişdir.

70–80-ci illərdə institutda tədris və elmi fəaliyyətin səviyyəsinin yüksəldilməsi, yüksəkixtisaslı müəllim kadrlarının hazırlanması, maddi-texniki bazanın genişləndirilməsi, yeni tədris korpusları və tələbə yataqxanalarının tikilməsi istiqamətində konkret tədbirlər həyata keçirildi. ADPU-nun rəhbərliyi dəyişdirildi. Əvvəlcə Haşım Ağayev, sonra Afad Qurbanov instituta rektor təyin olundular.

80-ci illərin sonu, 90-cı illərin əvvəllərində ölkədə baş verən ictimai-siyasi şərait, hakimiyyət uğrunda gedən savaşlar, ermənilərin işğalçılıq siyasəti tədris prosesində və elmi-tədqiqat işlərində geriləməyə səbəb oldu. Ölkəmizə

erməni-sovet hərbi qruplaşmalarının təcavüzü, ölkə daxilində isə hakimiyyət uğrunda mübarizə aparan səriştəsiz müxalifət qruplarının, konstitusiyaya zidd üsullarla hakimiyyətə yiyələnmək təşəbbüsləri nəticəsində ölkədə intizam pozuldu. Bütün bunlar ADPU-da normal tədris fəaliyyətinə maneçilik törədirdi. Belə çətin bir şəraitdə Azərbaycan xalqının böyük oğlu, görkəmli dövlət xadimi Heydər Əliyev xalqın təkidli tələbi ilə yenidən respublika rəhbərliyinə gəldi və «öz ömrümün qalan hissəsini də xalqıma bağışlayıram» – söyləməklə müasir Azərbaycan dövlətini qurmaq missiyasını həyata keçirməyə başladı. Ölkədə alovlanmaqda olan vətəndaş müharibəsinin qarşısını aldı, silahlı yolla hakimiyyətə gəlmək cəhdlərinə birdəfəlik son qoydu, ölkədə möhkəm daxili sabitlik təmin edildi. Ermənilərlə hərbi qarşıdurmada tarazlığa nail olundu, hərbi əməliyyatlar dayandırıldı, münaqişəni dinc yolla aradan qaldırmaq üçün ilkin şərait yarandı. Qonşu dövlətlərlə yaranmış gərginlik tədricən aradan qaldırıldı. Ölkədə və cəbhədə yaranmış sabitlik və Heydər Əliyevə inam nəticəsində dünyanın ən iri neft şirkətləri ilə «Əsrin müqaviləsi» imzalandı. Respublikada irimiqyaslı sosial-iqtisadi problemlərin həlli istiqamətində məqsədyönlü tədbirlər həyata keçirildi. Ümummilli lider Heydər Əliyev böyük siyasi məharətlə Azərbaycanı, dövlətçiliyimizi, müstəqilliyimizi hədələyən bütün bəlaları dəf etdi, iqtisadiyyatımızın, beynəlxalq əlaqələrimizin, milli birliyimizin möhkəm özülünü quraraq bizlərə əmanət etdi. Cəmiyyətin bütün potensialı mənəvi-psixoloji, sosial-iqtisadi mühitin sağlamlaşmasına, millətin tərəqqisinə, intibahına və inkişafına yönəldi. Bütün tədris və elm müəssisələri kimi ADPU-nun da səmərəli fəaliyyəti üçün geniş şərait yarandı.

Azərbaycan Dövlət Pedaqoji Universiteti 90-cı illərdən sonra Azərbaycanda gedən bütün ictimai-siyasi proseslərin mərkəzində olmuş, sabitliyin və əmin-amanlığın qorunub saxlanılmasında, dövlətin və dövlətçiliyin möhkəmləndirilməsində vətəndaşlıq mövqeyi nümayiş etdirmişdir. Pedaqoji Universitet ölkəmizdə ali pedaqoji məktəblər arasında Universitet statusu alan ilk tədris və elm ocağıdır.

Universitet statusu qazanan ADPU-ya 1989–1994-cü illərdə prof. Səlvər Aslanov, 1994–1996-cı illərdə prof. Nizami Xudiyev, 1996–2000-ci illərdə prof. Bəhlul Ağayev rəhbərlik etdilər.

2006-cı ilin aprel ayında Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sərəncamı ilə Universitetin rektoru vəzifəsinə mən təyin olundum.

İşimizi Boloniya prosesinin prinsiplərinə uyğun olaraq yeni standartların tələbləri gözlənilməklə ali pedaqoji təhsilin məzmununun zamanın tələb-

lərinə uyğun qurulması, keyfiyyətin yüksəldilməsi, şəfaflıq və ədalətlilik prinsiplərinin təmin olunması, maliyyələşdirmə və idarəolunmanın təkmilləşdirilməsi, əməkdaşlığın və beynəlxalq əlaqələrin genişləndirilməsi, pedaqoji kadr hazırlığında yeni modellərin tətbiqi sahələrinə yönəltməyə çalışdıq və hesab edirəm ki, bu istiqamətdə universitetimizdə diqqətəlayiq nailiyyətlər qazanıldı. Bu uğurların əldə edilməsi, bütövlükdə təhsilimizlə, o cümlədən ali təhsilimizlə bağlı Respublika Prezidenti cənab İlham Əliyevin rəhbərliyi ilə dövlətin müəyyənləşdirdiyi strategiya və konsepsiya, ölkədə həyata keçirilən təhsil islahatları, Prezident və onun Administrasiyası, Təhsil Nazirliyi tərəfindən göstərilən diqqət və qayğı, təhsildə qazanılan uğurların və buraxılan nöqsanların açıq müzakirə olunduğu yüksək səviyyəli müşavirələrdən çıxarılan nəticələr sayəsində mümkün olmuşdur. Etiraf etmək lazımdır ki, çatışmazlıqlar da yetərincədir, dövlətin gözlədiyi səviyyəyə qalxmaq üçün hələ çox işlər görülməlidir.

Prezident İlham Əliyevin rəhbərliyi ilə Azərbaycanda siyasi, sosial-iqtisadi, hüquqi islahatların həyata keçirilməsində, vətəndaş cəmiyyətinin qurulmasında, milli və Avropa dəyərlərinin bərqərar edilməsində, insan hüquqlarının və azadlıqlarının təmin olunmasında, demokratik təsisatların yaradılmasında, bazar iqtisadiyyatına keçid prosesində əldə edilən nailiyyətlərin mühüm bir hissəsi təhsilin payına düşür. Təhsil cəmiyyətin inkişafının özülünü təşkil etməklə yanaşı, həm də ölkənin təhlükəsizliyinin, sabitliyinin təmin edilməsində mühüm amil kimi çıxış edir. Hazırda təhsillə bağlı on altı inkişafyönümlü dövlət proqramının uğurla həyata keçirilməsi Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin «Təhsil Nazirliyində düşünülmüş proqram, konsepsiya vardır» – fikrinin real təsdiqidir. Təhsilin ayrı-ayrı sahələrinin inkişafı üzrə real vəziyyətin təhlili əsasında hazırlanıb təsdiq edilmiş bu proqramların reallaşdırılması nəticəsində təhsilin infrastrukturu müasir tələblərə uyğun qurulmuş, təhsilin məzmunu yeniləşdirilmiş, «Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli kurikulum)» təsdiq olunmuş, yeni dərslik siyasəti reallaşdırılmış, təhsilalanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni model və mexanizmlər tətbiq edilmiş, təhsil müəssisələri informasiya-kommunikasiya texnologiyaları ilə təmin edilmiş, təhsil sisteminin informasiyalaşdırılması, məktəbəqədər, texniki-peşə, ali təhsil, xaricdə təhsil, istedadlı uşaqların inkişafı, xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsilinin təşkili, de-institutlaşdırma və digər bu kimi sahələrdə əhəmiyyətli nailiyyətlər əldə olunmuş, maddi dəyərlərdən əldə edilən kapital

ölkədə insan kapitalının inkişafına yönəldilmişdir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin sərəncamları ilə təhsil, səhiyyə, elm və mədəniyyət sahəsində inkişafyönümlü proqram və layihələrin həyata keçirilməsində Heydər Əliyev Fondunun, xüsusən onun prezidenti UNESCO-nun və ISESCO-nun xoşməramlı səfiri, Milli Məclisin deputatı Mehriban xanım Əliyevanın müstəsna xidmətləri vardır. Fondun təşəbbüsü ilə «Yeniləşən Azərbaycana yeni məktəb» proqramı çərçivəsində 300-ə yaxın yeni məktəb, uşaq bağçası, uşaq evi, internat məktəbi binası tikilib istifadəyə verilib, müasir avadanlıqla təchiz edilmişdir. Azərbaycan təhsilinin, elminin inkişafına, milli-mənəvi dəyərlərimizin qorunmasına, bütün dünyada təbliğinə önəmli töhfələr verən Mehriban xanım Əliyevanın həyata keçirdiyi layihələr, humanitar yönümlü proqramlar Azərbaycandan çox-çox uzaqlarda da böyük rəğbətlə qarşılanır. Xarici ölkələrdə (Pakistan, Rusiya, Fransa, Gürcüstan və s.) fondun vəsaiti hesabına inşa olunan məktəb binaları, təmir edilən mədəniyyət abidələri Mehriban xanım Əliyevanın çoxşaxəli fəaliyyətinin bariz nümunəsidir. Onun əsrlərin miras qoyduğu maddi və mənəvi dəyərləri yaşatmaq, təbliğ etmək missiyası tarixi dəyərə malikdir.

2006–2007-ci tədris ilində universitetimizin Kimya və Filologiya, 2007–2008-ci tədris ilində Biologiya və Fizika, 2008–2009-cu tədris ilində Pedaqoji, Tarix, Riyaziyyat, 2009–2010-cu tədris ilində Pedaqogika və psixologiya, Coğrafiya və çağırışaqədər hazırlıq, Mühəndis-pedaqoji və bədii qrafika fakültələrində Kredit Transfer Sisteminin tətbiqinə başlanılmış, kredit sisteminin tələblərinə cavab verən yeni tədris planları, fənlərin reyestri, tədris qrafikləri, sillabuslar, fənlərin semestrlər üzrə bölgüsünü göstərən sənədlər hazırlanmış, 40 nəfər tyutor hazırlanaraq tədris prossesinə cəlb olunmuşdur.

2007–2008-ci tədris ilində universitetimizdə kompyuter mərkəzi təşkil edilmişdir. Müasir tələblərə cavab verən kompyuter mərkəzinin təşkili kollokviumların və imtahanların elektron test üsulu ilə keçirilməsinə şərait yaratmışdır. Belə ki, tələbələrin biliklərinin qiymətləndirilməsində bir çox qabaqcıl dünya universitetlərində uğurla tətbiq edilən «Elektron-test sistemi» layihəsi hazırlanıb müvəffəqiyyətlə sınaqdan çıxarılmışdır. 2007–2008-ci tədris ilinin qış və yaz sessiya və buraxılış imtahanları universitet tarixində ilk dəfə olaraq elektron test üsulu ilə aparılmışdır. İmtahan prosesində 5 kompyuter sinfində olan 180 kompyuterdən istifadə edilir. İmtahanlarda şəffaflığı təmin etmək üçün hər bir kompyuter sinfində xüsusi

vebkamera quraşdırılmışdır. Mərkəzdə qoyulmuş monitorlar vasitəsilə valideyn və ictimaiyyətin nümayəndələri imtahanın gedişini canlı izləyə bilirlər. Kollokviumların və imtahanların keçirilməsinə kameralar vasitəsilə tərəfimizdən ciddi nəzarət olunur.

Universitetin professor-müəllim və inzibati-köməkçi heyətinin kompyuter kurslarına cəlb edilməsi istiqamətində də iş aparılır. Universitetimiz üçün elektron dərsliklərin yaradılması, tədris resurslarının hazırlanması, elektron kitabxananın, universitetin avtomatlaşdırılmış idarəetmə sisteminin yaradılması istiqamətində işlər də tam ciddiyyəti ilə davam edir.

Ulu öndər Heydər Əliyevin xatirəsini əbədiləşdirmək, onun nəzəri irsini öyrənmək, təbliğ etmək, gələcəyin müəllimlərini dövlətçiliyə sədaqət və azərbaycançılıq ruhunda tərbiyə etmək ADPU-nun professor-müəllim heyətinin ən ümdə vəzifələrindəndir. Heydər Əliyev irsində Vətən sevgisi, Azərbaycan sevgisi, azərbaycançılıq hissi, xalq, millət sevgisi, dil sevgisi, milli mədəniyyət sevgisi, insanın insana, insanın Vətəninə, xalqına, dövlətinə sədaqət hissi mühüm yer tutur. Bu irsin qorunması və gələcək nəsillərə çatdırılması, hər bir gəncdə azərbaycançılıq hissinin formalaşdırılması, gənc nəslin dövlətçilik ənənələrinə sədaqət ruhunda tərbiyə olunması ən vacib şərtlərdən biridir. Bu məqsədlə universitetimizdə geniş tədbirlər həyata keçirilmiş və keçirilməkdədir. Ulu öndərin xatirəsinə ehtiram əlaməti olaraq universitetimizin foyesində abidəsi qoyulmuş, nadir eksponatlarla təchiz edilən, professor-müəllimlərin, tələbələrin və Universitetimizin qonaqlarının ziyarət məkanına çevrilən Xatirə muzeyi yaradılmış, zəngin irsinin gənc nəslə çatdırılması məqsədilə «Heydər Əliyev Məktəbinin Lektoriyası» təşkil edilmişdir. Heydər Əliyevin nəzəri irsini dərindən öyrənmək məqsədilə universitetimizin professor-müəllim heyəti, magistr və doktorantları üçün xüsusi kurslar təşkil edilmişdir.

Hazırda universitetin 12 fakültəsində ali təhsilin bakalavr pilləsində 23 ixtisas üzrə 8000-dən artıq tələbə, magistratura pilləsində 11 istiqamət, 39 ixtisas üzrə 802 nəfər magistr təhsil alır. Onların təhsil-tərbiyəsi ilə 69 nəfər elmlər doktoru, professor, 380 nəfər elmlər namizədi, dosent, 330 nəfər müəllim və baş müəllim məşğul olur. Universitetimizdə fəlsəfə doktoru proqramı üzrə 28 nəfər doktorant, 42 nəfər dissertant, elmlər doktoru proqramı üzrə isə 30 nəfər doktorluq dissertasiyası üzərində çalışır.

Hazırda ADPU-da maddi-texniki bazanın möhkəmləndirilməsi, ali pedaqoji təhsilin məzmununun təkmilləşdirilməsi, professor-müəllim və tələbə kollektivi arasında mənəvi-psixoloji mühitin sağlamlaşdırılması istiqamətində




*ADPU-nun foyesində Ulu öndər Heydər Əliyevin abidəsi*



*ADPU-da Ulu öndər Heydər Əliyevin Xatirə muzeyi*



*ADPU-da «Heydər Əliyev Məktəbinin Lektoriyası»*

ciddi islahatlar aparılır. Universitetimizdə müxtəlif ölkələrlə tələbə mübadiləsi və birgə elmi tədqiqatlar aparmaq, konfrans, konqres, simpozium keçirmək, beynəlxalq və regional təhsil proqramlarına qoşulmaq və onlarda fəal iştirak etmək istiqamətində uğurlu iş görülür. Fərəhli haldır ki, dünyanın tanınmış elm və tədris ocaqları ilə əməkdaşlarımızın əlaqəsi günbəgün genişlənir. Elə bunun nəticəsidir ki, universitetimizdə fransız və ingilis dili müəllimlərinin hazırlığına xüsusi fikir verilir.

Əməkdaşlarımızın elmi tədqiqatlarının nəticələri Avropanın, Rusiyanın və Türkiyənin ən nüfuzlu elmi nəşrlərində çap edilir. Onların elmi yaradıcılıq nümunələrinin işıq üzü görməsində respublika nəşriyyatları və elmi jurnalları ilə yanaşı, 3 seriyada nəşr olunan Azərbaycan Pedaqoji Universitetinin «Xəbərlər»inin və «Təhsildə İKT» elmi-nəzəri jurnalının mühüm rolu vardır.

1958-ci ildən indiyə kimi universitetimizdə nəşr olunan «Gənc müəllim» qəzeti ADPU-nun elmi-mədəni həyatında baş verən hadisələrin fəal iştirakçısı və şərhçisi kimi fəaliyyətini davam etdirir. 1948-ci ildə yaradılan və müvafiq avadanlıqla təchiz edilən nəşriyyat şöbəsi proqram, metodik göstəriş və dərs vəsaitləri nəşr etməklə tələbələrin tədris ədəbiyyatına olan tələbatını ödəməyə çalışır.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin xüsusi diqqət və qayğısı ilə əhatə olunmuş universitetimiz öz inkişafının yeni mərhələsinə qədəm qoymuş, elmi fəaliyyətin həm strukturu, həm də məzmununda əhəmiyyətli keyfiyyət dəyişiklikləri baş vermişdir. Mövcud elmi-tədqiqat laboratoriyalarının maddi-texniki bazası gücləndirilmiş, zəruri avadanlıqla təchiz edilmiş, gerçəkliyə maksimum adekvat olan elmi nəticələrin alınması üçün tədqiqat mövzuları müasir dövrün tələblərinə uyğunlaşdırılmış, «Türk odası» və «Dədə Qorqud» elmi-tədqiqat laboratoriyasının strukturunda əsaslı dəyişiklik edilmiş, yeni elmi-tədqiqat laboratoriyaları («Pedaqoji təhsilin problemləri», «Bioinformatika») yaradılmışdır. Universitetimizdə professor-müəllimlərin, magistr və doktorantların apardıqları elmi-tədqiqat işləri daha çox pedaqoji təhsilin məzmununun yeniləşdirilməsinə, pedaqoji kadr hazırlığının nəzəri və praktik məsələlərinin araşdırılmasına, yeni dərslik, dərs vəsaiti və metodik tövsiyələrin hazırlanmasına istiqamətlənmişdir. Elmi-tədqiqatların metodoloji bazasının məqsədyönlü istiqamətdə təkmilləşdirilməsi son illərdə elmi potensialın kəmiyyət və keyfiyyət artımına səbəb olmuşdur.

1990-cı illərin əvvəllərindən başlayaraq universitetin əməkdaşları yaxın və uzaq xaricdə müxtəlif konfrans və simpoziumlarda iştirak etmişlər. Əgər 1991–2000-ci ildə xarici ölkələrdə konfrans və simpoziumlarda 79 nəfər iştirak etmişdisə, 2001–2010-cu illərdə onların sayı 191 nəfər olmuşdur. Son illərdə ADPU-nun beynəlxalq əlaqələri xeyli genişlənmiş, müxtəlif ölkələrlə müəllim-tələbə mübadiləsi, birgə elmi tədqiqatlar, beynəlxalq forum, konqres və simpoziumlarda iştirak, beynəlxalq və regionlararası təhsil proqramlarına qoşulmaq və onların işində fəal iştirak etmək kimi istiqamətlərdə həyata keçirilən tədbirlərdə keyfiyyət dəyişikliyi xüsusi nəzərə çarpmaqdadır. Bu baxımdan ADPU ilə Türkiyənin Hacəttəpə Universiteti arasında yaradılmış pedaqoji və elmi istiqamətlərə söykənən əlaqələrin günü-gündən daha da gücləndiyini xüsusi qeyd etmək yerinə düşər. Türkiyənin Hacəttəpə Universitetinin nümayəndələri dəfələrlə universitetimizdə olmuşlar. Eləcə də ADPU-nun nümayəndə heyəti Hacəttəpə Universitetinin iş təcrübəsi ilə tanış olmaq üçün bir neçə dəfə Türkiyə Cümhuriyyətində olmuşdur. Hər iki universitetin əməkdaşlarının iştirakı ilə dörd dəfə beynəlxalq konfrans keçirilmişdir. 2007-ci ilin may ayının 12–14-də Bakıda Azərbaycan xalqının Ümummilli lideri Heydər Əliyevin anadan olmasının 84-cü ildönümünə həsr olunmuş «Müəllim hazırlama siyasəti və problemləri» Beynəlxalq Elmi Konfransı xüsusi qeyd

etmək lazımdır. Türkiyənin, Şimali Kipr Türk Respublikasının, Almaniyanın, Qırğızıstanın, Amerikanın 29 universitetindən 175 tədqiqatçının və Azərbaycanın 21 ali məktəbindən çox saylı nümayəndələrin iştirak etdiyi həmin konfransda 11 bölmə üzrə 300-dən artıq məruzə dinlənilmişdir. Konfransın materialları Türkiyədə 2 cilddə toplu halında nəfis şəkildə çap edilmişdir.

Qara Dəniz Hövzəsi Ölkələrinin Universitetləri Assosiasiyasının üzvü olan ADPU 2009-cu ildən Avropa Müəllim Hazırlığı Birliyinə üzv seçilmişdir. Universitetimizdə BMT-nin İnkişaf Proqramı, ADPU və Lider Qadın ictimai Birliyi tərəfindən Gender Təhsili Araşdırma Mərkəzi, UNICEF tərəfindən isə «Müasir təlim texnologiyaları, təlim və resurs mərkəzi» təşkil edilmişdir.

Bütün bunlar Azərbaycan Dövlət Pedaqoji Universitetində elmin və təhsilin inkişafının real göstəriciləridir. Azərbaycan Dövlət Pedaqoji Universitetində aparılan islahatlara ən yüksək qiymət ali məktəbimizin 85 illik yubileyi ilə bağlı möhtərəm Prezidentimiz cənab İlham Əliyev tərəfindən verilmişdir. Prezidentin 26 dekabr 2006-cı il tarixli Sərəncamı ilə 2 nəfərə «Şöhrət» ordeni, 16 nəfərə «Tərəqqi» medalı, 2 nəfərə Əməkdar elm xadimi, 19 nəfərə Əməkdar müəllim fəxri adı və 1 nəfərə Azərbaycan Respublikası Prezidentinin təqaüdü verilmişdir. Yubileydən sonra 2 nəfərə «Şöhrət» ordeni, 1 nəfərə Əməkdar elm xadimi, 1 nəfərə Əməkdar Mədəniyyət işçisi, 1 nəfərə Əməkdar bədən tərbiyəsi və idman xadimi fəxri adı, 2 nəfərə Azərbaycan Respublikası Prezidentinin təqaüdü verilmişdir.

Universitetimizin 2 nəfər professoru AMEA-nın müxbir üzvü, 1 nəfər professoru isə Rusiya Təhsil Akademiyasının əcnəbi üzvüdür.

Fəaliyyəti dövründə ADPU təkcə respublikamız üçün deyil, Gürcüstan, Ermənistan, Mərkəzi Asiya respublikaları, Bolqarıstan və b. ölkələr üçün də yüksəkixtisaslı müəllimlər və elmi kadrlar hazırlamış, son illərdə ABŞ, İngiltərə, Fransa, Almaniya, İtaliya, Türkiyə, İran və Yəmən Ərəb Respublikasının ali pedaqoji təhsil ocaqları, elm mərkəzləri ilə ildən-ilə genişlənən əməkdaşlığa başlamışdır.

Pedaqoji Universitet Azərbaycanda elmin və təhsilin inkişafına dəyərli töhfələr verən çoxsaylı alimlər hazırlamış, fəaliyyəti ərzində elmi mərkəz kimi formalaşıb inkişaf etmişdir. Bu ali təhsil və elm məbədində pedaqogika və psixologiya (Ə.Y.Seyidov, M.M.Mehdizadə, Ə.K.Zəkuzadə, M.Ə.Muradxanov, Ş.S.Ağayev, H.M.Əhmədov, Ə.Ə.Əlizadə), riyaziyyat (M.R.Əfəndiyev, M.Ə.Cavadov, İ.İ.İbrahimov, M.H.Cavadov), fizika (A.Q.Abbaszadə,

S.Ş.İmanov, M.İ.Murquzov), kimya (H.Şaxtaxtinski, Ş.Ə.Məmmədov, A.Ə.Verdizadə), biologiya (Z.M.Şahtaxtinskaya, A.İ.Qarayev), tarix (Z.İ.İbrahimov, Y.B.Yusifov), filologiya (B.V.Çobanzadə, M.Ş.Şirəliyev, Ə.M.Dəmirçizadə, M.H.Rəfili, Ə.R.Sultanlı, H.M.Araslı, F.S.Qasımzadə, A.M.Qurbanov, H.İ.Mirzəyev), fəlsəfə (H.İ.Hüseynov) və başqa sahələr üzrə elmi məktəblər və istiqamətlər yaradılıb inkişaf etdirilmişdir.

Xalqımızın fəxr etdiyi yüzlərlə tanınmış alim, yaradıcı ziyalı, ictimai və dövlət xadimi ADPU-da təhsil almışlar. Universitetin məzunlarından Y.Məmmədəliyev, H.Hüseynov, Z.Xəlilov, H.Abdullayev, M.Rəsulov, Ə.Hüseynov, İ.Hüseynov, S.Rəhimov, Ş.Qurbanov, A.Qarayev, Ə.Sumbatzadə, M.Dadaşzadə, M.Cəfərov, İ.İbrahimov, M.Şirəliyev, İ.Şıxlı, H.Əmirxanov kimi tanınmış elm və mədəniyyət xadimləri çoxdan xalqımızın elm və şöhrət simvollarına çevrilmişlər. Onların adları respublikamızın sərhədlərindən uzaqlarda keçirilən nüfuzlu elmi məclislərdə böyük iftixarla çəkilir. Fəxrlə qeyd etməliyəm ki, AMEA-ya rəhbərlik etmiş 9 nəfər prezidentlərdən 3 nəfəri (Yusif Məmmədəliyev, Zahid Xəlilov, Həsən Abdullayev) Pedaqoji Universitetin məzunlarıdır.

Sovet İttifaqı Qəhrəmanları – Mehdi Hüseynzadə, Xıdır Mustafayev, Fariz Səfərov, Səlahəddin Kazımov, Sosialist Əməyi Qəhrəmanları – Səfa İmanov, Zərbəli Səmədov, Rüstəm Səfərəliyev, Azərbaycanın Milli Qəhrəmanları Mirələkbər İbrahimov, Mətləb Quliyev, Azərbaycan Bayrağı ordenli Malik Bayramov, Mürşid Məmmədov igidlik, hünər, vətənpərvərlik rəmzi kimi xatırlanırlar. Onlar mərdlik və şücaətləri ilə bitirdikləri ali təhsil müəssisəsinin – ADPU-nun şərəfini uca tutmuş, on minlərlə insana örnək və tərbiyə nümunəsi olmuşlar.

Bu günlərdə ADPU-nun 90 illik tarixinin yeni-yeni səhifələri yazılır. Universitet kollektivi Ümummilli liderimiz Heydər Əliyevin siyasi kursunun layiqli davamçısı, möhtərəm Prezidentimiz İlham Əliyevin daxili və xarici siyasətini birmənalı olaraq dəstəkləyir, ona dayaq olmağı özlərinə borc bilir, Azərbaycan təhsili qarşısında qoyduğu tələblərə və eləcə də təhsil işçilərinə diqqət və qayğısına cavab olaraq elmdə və təhsildə daha böyük uğurlar qazanmaq üçün gərgin yaradıcılıq axtarışlarını inamla davam etdirir, müasir düşüncəyə, yeni təhsil-tərbiyə texnologiyasına, əxlaqi və mənəvi saflığa, yüksək peşə və ixtisas hazırlığına malik müəllim kadrları hazırlamaq işini özlərinin ən ümdə məqsəd və vəzifəsi bilirlər.

## 1.1. ALİ PEDAQOJİ İNSTİTUTUN TƏŞKİLİ: ÇƏTİNLİKLƏR VƏ İLK UĞURLAR
*(1920–1927-ci illər)*

XIX əsrin sonu, XX əsrin əvvəllərində Azərbaycanın ən mühüm pedaqoji problemlərindən biri milli müəllim kadrlarının hazırlanması idi. Azərbaycanda müəllim hazırlayan tədris müəssisələrinin olmaması bu sahədə böyük çətinlik yaratmışdı. Azərbaycanlı müəllimlər əsas etibarilə Qori Müəllimlər Seminariyasında və Tiflis Müəllimlər İnstitutunda hazırlanırdı. XIX əsrin 80-ci illərindən 1918-ci ilə kimi həmin təhsil müəssisələrini cəmi 262 nəfər azərbaycanlı bitirmişdi.

Millətin tərəqqisinin məktəbdən, məktəbin tərəqqisinin isə müəllimdən asılı olduğunu söyləyən N.Nərimanov və onun həmfikirləri F.Köçərli, H.Zərdabi, Ü.Hacıbəyli, A.Səhhət, A.O.Çernyayevski, S.Vəlibəyov, M.Mahmudbəyov, F.Ağazadə, C.Məmmədquluzadə, M.Rəsulzadə ana dilində dərs deyə biləcək müəllimlərin hazırlanmasını dövrün əsas tələbi kimi dəyərləndirirdilər. Mətbuat səhifələrində Azərbaycanda müəllimlər seminariyasının açılması, Qori Müəllimlər Seminariyasının Güney Qafqazın müsəlman şəhərlərinin birinə köçürülməsi qızğın müzakirə olunurdu. Xalqın təhsillə bağlı böyük istək və arzularını ADR (1918–1920) reallaşdırdı. Bu illərdə ADR hökumətinin maliyyə yardımı ilə Qori Müəllimlər Seminariyasının Azərbaycan şöbəsi Qazax şəhərinə köçürüldü. Şərqdə ilk dünyəvi təhsil ocağı olan Bakı Dövlət Universiteti yaradıldı, mövcud məktəblərin böyük əksəriyyəti milliləşdirildi, xeyli yeni ibtidai və orta məktəb açıldı, milli dərsliklər nəşr edildi. Ölkədə təhsil sistemini nizama salmaq, milli təhsilin möhkəm bünövrəsini qoymaq məqsədilə həmin dövrdə Azərbaycan Xalq Maarif Nazirliyi yaradıldı. Nazirlik bir sıra ali və orta ixtisas müəssisələrinin açılmasını planlaşdırsa da, onu reallaşdıra bilmədi.

Azərbaycan Parlamentinin fövqəladə iclası 1920-ci il aprelin 27-də axşam saat 11-də səs çoxluğu ilə hakimiyyəti müsəlman kommunistlərə vermək haqqında qərar qəbul etdi. Respublikada hakimiyyəti yeni yaradılan oyuncaq Müvəqqəti Hərbi İnqilab Komitəsi ələ keçirdi[1]. Komitənin 1920-ci il 28 aprel tarixli əmri ilə maarif sistemi yenidən quruldu və D.X.Bünyadzadə Xalq maarif komisarı təyin olundu. Azərbaycanın böyük iqtisadi və mənəvi potensialından Sovet imperiyasının mənafeyinə səmərəli istifadə etmək üçün geniş

[1] **Qafarov T.B.** Azərbaycan tarixi (1920–1991). Bakı, 1997, s. 67.

bilik və bacarığa malik işçilər hazırlamaq lazım gəlirdi. Həmin məqsədlə 20-ci illərdə yeni təhsil sistemi təşkil edildi.

Sovet məktəbinin təşkilində demokratik əhvali-ruhiyyəli ziyalılar, qabaqcıl maarif və mədəniyyət xadimləri yaxından iştirak edirdilər. Ə.Haqverdiyev, N.Vəzirov, Ü.Hacıbəyli, C.Məmmədquluzadə, H.Mahmudbəyov, R.Əfəndiyev, A.Şaiq (Talıbzadə), S.Axundov, M.Quliyev, M.Mirqasımov, F.Rzabəyli, S.Hüseynov, İ.Əfəndiyev, Ə.Nəzmi, R.Cəfərov, Q.Mirzəzadə, S.Əfəndiyeva, M.Qiyasbəyli, B.Bünyadov və başqaları ilk günlərdən respublikanın mədəni həyatında fəallıq göstərirdilər.

Respublikada ümumtəhsil məktəblərinin inkişafına böyük diqqət göstərilirdi. 1920-ci ildə 965 ümumtəhsil məktəbində 794 min şagird oxuyurdu. Lakin bu, heç də hamının təhsilə cəlb edilməsi deyildi. 700 mindən çox məktəbyaşlı, o cümlədən 180 mindən artıq kimsəsiz uşaq təhsildən kənarda qalmışdı. Bununla belə məktəblərin maddi-texniki bazasının təşkili və pedaqoji kadrların hazırlanması üçün yaradılan şərait nəticəsində orta təhsil sistemində irəliləyiş nəzərə çarpırdı. Əsas çatışmazlıqları aradan qaldırmaq, Azərbaycan məktəblərini müəllim kadrları ilə təmin etmək üçün üçaylıq kurslar açıldı. Təkcə 1920-ci ilin 3 ayı (iyun-avqust) ərzində respublikanın 9 yaşayış məntəqəsində müəllimlər hazırlayan üçaylıq kurslar təşkil olundu. Sovet dövləti 1920-ci ilin yayında Bakı, Şamaxı, Qusar və respublikanın digər beş yaşayış məntəqəsində ibtidai məktəblər üçün müəllimlər hazırlayan qısa müddətli kurslar və texnikumlar açdı. Müəllimlərlə bağlı əsaslı iş aparıldı. Lakin həmin təhsil ocaqları respublikanın I və II dərəcəli məktəblərinin müəllimlərə olan ehtiyacını təmin edə bilmirdi. Bakıda 1920-ci ilin sentyabr ayının 19-da maarif və mədəniyyət işçilərinin qurultayı çağırıldı. Azərbaycan hökumətinin başçısı N.Nərimanov ziyalılar qarşısında çıxış edərək məktəbin yenidən qurulması, uşaqların tərbiyəsinin əsaslı şəkildə dəyişdirilməsi zərurətini ortaya qoydu. Qurultayda göstərildi ki, yeni sovet təhsil sisteminə keçilməsi ilə əlaqədar respublikada 40 min nəfər müəllimə ehtiyac vardır[1].

Azərbaycan hökuməti 1920-ci ilin payızında Bakı, Gəncə, Qazax müəllimlər seminariyalarını yenidən təşkil etməklə yanaşı, Şəki və Şuşada da müəllimlər seminariyası açılmasına sərəncam verdi. Həmin pedaqoji təhsil ocaqlarının təşkili məktəblərin müəllim kadrları ilə təmin edilməsinə qismən kömək etdi.

[1] Ali Pedaqoji İnstitutunun salnaməsi. Bakı, 1924, s. 5–6.

Respublikanın II dərəcəli məktəbləri və orta ixtisas təhsil ocaqları üçün pedaqoji kadrlar hazırlamaq məqsədilə Azərbaycan Xalq Maarif Komissarlığının 1920-ci il 17 noyabr tarixli qərarı ilə Bakıda birillik Ali Pedaqoji kurslar açıldı. Təbiyyat-coğrafiya, fizika-riyaziyyat və tarix-filologiya şöbələrindən ibarət olan həmin kurslarda tədris xüsusi proqram üzrə Azərbaycan və rus dillərində aparılırdı. Gündüz məktəblərində çalışan müəllimləri kurslara cəlb etmək məqsədilə dərslər axşam keçirilirdi.

Bölgələrdən oxumağa gələnlər üçün internat da təşkil edildi. Kursların tədris planında fənlərin tədrisi metodikasına xüsusi yer verilirdi. Keçilən bütün fənlər üzrə nəzəri məşğələlərlə yanaşı, təcrübi məşğələlər üçün də müəyyən vaxt ayrılırdı. Bu, tədris edilən fənlərin dinləyicilər tərəfindən yaxşı öyrənilməsinə kömək edirdi. Kursun tədris planında humanitar fənlərin tədrisinə az yer ayrılırdı. Kurslara ilk dəfə 150 nəfər müdavim qəbul edildi.

İşindəki müəyyən qüsurlara baxmayaraq, Birillik Ali Pedaqoji kurslar Azərbaycanda ilk Ali Pedaqoji İnstitutun yaradılmasında zəmin rolunu oynadı. Birillik Ali Pedaqoji kursların müdiri, Azərbaycanın görkəmli maarifçisi və biologiya alimi Fətulla bəy Rzabəyli yazırdı ki, bu kursların təşkili ilk pedaqoji institutun yaradılması üçün bünövrə – baza idi. Ona görə də onun institut tarixində rolu xüsusi nəzərə alınmalıdır.

O dövrün qabaqcıl maarifçi-ziyalıları: Həbib bəy Mahmudbəyov, Məmməd Əfəndiyev, Sadıq Hüseynov, Rəhim Cəfərov və başqaları həm kursların təşkilində yaxından iştirak edir, həm də müxtəlif ixtisaslar üzrə orada dərs deyirdilər.

Azərbaycan Pedaqoji kurslarının səmərəli fəaliyyətindən və müsbət iş təcrübəsindən Ali Pedaqoji İnstitutun təşkilində istifadə olundu. İnstitut Azərbaycan Xalq Komissarları Sovetinin sədri ***Nəriman Nərimanovun*** imzaladığı 1921-ci il 26 avqust tarixli 66 saylı «Azərbaycan Dövlət Pedaqoji İnstitutunun təşkili haqqında» dekret əsasında yaradıldı. Orada deyilirdi:

«Respublikanın vahid əmək məktəbi»nin ideyalarını həyata tətbiq etməyə qabil yüksəkixtisaslı maarif işçiləri hazırlamaq məqsədilə bu ilin sentyabr ayının 1-dən etibarən Bakı şəhərində II dərəcəli şura məktəbliləri üçün türk dilində müəllimlər hazırlaya biləcək Azərbaycan Dövlət Pedaqoji Kişi İnstitutu təsis edilsin. İnstitutun təşkilinə həmin dekretin nəşrindən dərhal sonra başlanılsın.

| | |
|---|---|
| Xalq Komissarı Sovetinin sədri | *N.Nərimanov* |
| Xalq Maarif Komissarı | *D.Bünyadzadə* |
| XMK-nın işlər müdiri | *Şirvani* |
| Katib | *R.Tahirov* |



Nəriman Nərimanov
(1870 – 1925)

***Nəriman Nəcəf oğlu Nərimanov*** *1870-ci il aprelin 14-də Tiflis şəhərində doğulmuşdur. O, 1882-ci ildə Qori Müəllimlər Seminariyası nəzdindəki ibtidai məktəbə, 1885-ci ildə isə seminariyaya daxil olmuşdur. 1890-cı ildə seminariyanı bitirən Nəriman Nərimanov Tiflis quberniyası Borçalı qəzasının Qızılhacılı kəndində pedaqoji fəaliyyətə başlamışdır. Bir il sonra, yəni 1891-ci ildə Bakıya köçmüş, Sultan Məcid Qənizadənin köməyi ilə A.İ.Pobedonostsevin 6 sinifli progimnaziyasının hazırlıq şöbəsinə müəllim qəbul edilmiş və həmin məktəbdə beş il fəaliyyət göstərmişdir.*

*Nəriman Nərimanov müəllimlik etməklə yanaşı, 1894-cü ildə Bakıda ilk milli qiraətxana-kitabxana təşkil etmişdi. O, Sultan Məcid Qənizadə ilə birlikdə 1896-cı ildə uşaqlar üçün «Sovqat» adlı jurnal nəşr etmək istəmiş, lakin buna nail ola bilməmişdi. Nəriman Nərimanov 1900-cü ildə «Məktəb» adlı pedaqoji jurnal nəşr etmək üçün bir daha Qafqaz senzura komitəsinə müraciət etmiş, lakin yenə də müsbət cavab almamışdır.*

*Nəriman Nərimanov 1902-ci ildə imtahan verib orta təhsil haqqında attestat almış və təhsilini Odessa Universitetinin Tibb fakültəsində davam etdirmişdir.*

*1913-cü ildə Bakıda «Qara şəhər» xəstəxanasında həkim kimi fəaliyyət göstərən Nəriman Nərimanov ədəbi yaradıcılıqla da məşğul olurdu. O, bu dövrdə bir sıra hekayələr yazmış, mətbuatda müxtəlif mövzularda məqalələrlə çıxış etmişdir.*

*Azərbaycanda sovet hakimiyyəti qurulduqdan sonra Nəriman Nərimanov Azərbaycan SSR Xalq Komissarları Sovetinin sədri vəzifəsində işləmişdir.*

*O, Zaqafqaziya Federasiyası İttifaq Sovetinin sədri, sonra isə SSRİ MİK-in sədrlərindən biri seçilmişdir.*

*Nəriman Nərimanov Moskvada Qızıl Meydanda dəfn edilmişdir.*

Dekretin verilməsindən xeyli əvvəl Ali Pedaqoji İnstitutun təşkili ilə əlaqədar xüsusi hazırlıq işi aparılmışdı. Bu məqsədlə hələ 1920-ci ilin sonunda təşkilat komitəsi (hazırlıq komissiyası) yaradılmışdı. Təşkilat komitəsinin sədri Fətulla bəy Rzabəyli, üzvləri isə Həbib bəy Mahmudbəyov və Rəhim Cəfərov idilər. Əməli kömək göstərmək məqsədilə komitənin tərkibinə Abdulla Şaiq Talıbzadə, Məmməd bəy Əfəndiyev, Sadıq Hüseynov da cəlb edilmişdi. Təşkilat komitəsi institut açılana qədər tədris planı layihəsini hazırlayıb Azərbaycan Xalq Maarif Komissarlığına təqdim etməli, yüksəkixtisaslı

müəllim kadrları tapıb seçməli, eləcə də tədris ləvazimatı və bina məsələsini həll etməli idi. Komitə öz işinə 1920-ci il iyunun 9-da Bakı Darülmüəlliminin binasında (Bakı, İstiqlaliyyət küçəsi, 10. Azərbaycan Dövlət İqtisad Universitetinin yerləşdiyi bina) başlamışdı.

Hazırlıq komissiyası gördüyü işlər haqqında bilavasitə Azərbaycan Xalq Komissarları Sovetinin sədri N.Nərimanova və Xalq Maarif komissarı D.Bünyadzadəyə məlumat verir, onlardan lazımi göstəriş və yardım alırdı. N.Nərimanov komissiya üzvlərini qəbul edən zaman öz razılığını bildirərək demişdi: «Mən görürəm, maarifin haradan başlanmasını ruhən düzgün düşünmüş və Azərbaycan xalqının nicatı yolunu görüb bütün həyatınızı ona həsr etmişsiniz. Azərbaycan Respublikası bu zəhmətinizi hər zaman təqdir edəcək. Azərbaycan xalqı həmişə sizi yad edəcəkdir».

Xalq Maarif Komissarlığının qərarı ilə Lebedinski döngəsində (indiki Səbail rayonunun Şövkət Ələkbərova küçəsinin solunda) yerləşən Turgenev məktəbi (indiki 6 saylı məktəb) institut üçün boşaldıldı. Burada bir ildən artıq dərs keçildi. 1922–1923-cü tədris ilində Ali Pedaqoji İnstitut keçmiş realni məktəbin binasına köçürüldü.

Azərbaycan Xalq Maarif Komissarlığının 1921-ci ilin iyun ayının 13-də keçirilən kollegiyası Ali Pedaqoji Kişi İnstitutunun ilk Əsasnaməsi və Nizamnaməsini təsdiq etmişdi. Əsasnamədə ali təhsil ocağının quruluşu, vəzifələri və hüquqları müəyyənləşdirilirdi. Nizamnamədə isə göstərilirdi ki, yeni təşkil olunmuş institutun məqsədi orta məktəbdə ana dilində dərs demək üçün yüksəkixtisaslı pedaqoji kadrlar hazırlamaqdır. Orada tədris planına daxil olan ixtisas fənləri və onlar üçün ayrılan saatlar müəyyənləşdirilir, tələbələrin biliyini yoxlamaq və nəzarəti gücləndirmək məqsədilə kollokvium, məqbul və imtahanların aparılması qaydaları qeyd olunurdu.

İnstitutda təhsil müddəti 3 il idi. Tədris ili 40 həftə müəyyən edilmişdi. İnstitutun nəzdində tələbələr üçün 40 nəfərlik pansionat və təcrübə aparmaq üçün orta məktəbə bərabər «Nümunə məktəbi» təşkil edilməsi qərara alındı. Həmin məktəbi yaratmağı Abdulla Şaiq öz üzərinə götürdü. Görkəmli yazıçı uzun müddət «Nümunə məktəbi»nə rəhbərlik etdiyindən ora «Şaiq məktəbi» adlanırdı. Nəhayət, «Nümunə məktəbi» 1925-ci ildə Şaiq adına Pedaqoji Texnikuma çevrildi[1].

İnstituta 18 yaşından yuxarı zəhmətkeş balaları, ilk növbədə, müəllimlər seminariyasını, yaxud II dərəcəli məktəbləri bitirənlər imtahan verməklə qə-

[1] Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı, 1924, s.12.

bul olunurdular. Tədris planına uyğun olaraq, birinci kursdan tələbələrə riyaziyyat, ana dili, rus dili, rəsm, musiqi və başqa fənlərə dair ümumi məlumat verilirdi. İkinci kursdan isə onlar ixtisaslar üzrə ayrılır, nəzəri və praktiki biliklər alırdılar.

Ali Pedaqoji İnstitutda dərslər başlamamışdan 3 gün əvvəl – 1921-ci ilin noyabr ayının 12-də İnstitut Şurasının ilk iclası keçirildi və dərslərin mütəşəkkil təşkili, kollektivin qarşısında duran mühüm vəzifələr müzakirə edildi.

İnstitutun təşkilinin ilk dövründə iqtisadi-təsərrüfat, maddi-təchizat və tələbə qəbulunda çətinliklər yarandı. Orta təhsilli gənclər çox az idi. Eləcə də institutu müəllim kadrları ilə təmin etmək problem olaraq qalırdı. Bu səbəbdən Ali Pedaqoji İnstitutda dərslər oktyabrın 1-də deyil, noyabrın 15-də cəmi 6 nəfər tələbə ilə: Rəhimzadə Əbdülhəsən (Salyan), Musaxanlı Atababa (Bakı), Axundzadə Vəli (Ağdam), Süleymanzadə Mahmud, Mustafazadə Veyis (Göyçay) və Ədilzadə Əbdülmünsəvər (Orta Asiya) başladı. İnstitutun rəhbərliyi və müəllimlər Xalq Maarif Komissarlığı tərəfindən təsdiq olundu. Odessa Universitetinin məzunu ***Fətulla bəy Rzabəyli*** (1885–1968) institutun ilk direktoru təyin edildi.

Tiflis Müəllimlər İnstitutunun məzunu Həbib bəy Mahmubdəyov direktor müavini, Abdulla Şaiq Talıbzadə dil-ədəbiyyat, Peterburq Universitetinin məzunu Məmməd Əfəndiyev fizika-riyaziyyat, Odessa Universitetinin məzunu Həmid Şahtaxtinski psixologiya və ruhaniyyət, Almaniyanın Darmştadt Ali Texniki Məktəbini bitirən Sadıq Hüseynov kimya, Qafur Rəşad coğrafiya,



***Fətulla bəy Əziz oğlu Rzabəyli*** *1885-ci ildə Bakı şəhərində anadan olmuş, 1911-ci ildə Odessa Universitetini bitirmişdir. 1913-cü ilə qədər orada fəaliyyət göstərmişdir. Bioloq, həkim, pedaqoq və görkəmli təhsil təşkilatçısı olmuşdur. Xalq Maarif Komissarlığında şöbə müdiri vəzifəsində çalışmışdır. APİ-nin təşkilində onun mühüm xidmətləri vardır. O, İnstitutun yaradılması ilə bağlı komissiyanın sədri olmuş, 1921– 1924-cü illərdə Azərbaycan Pedaqoji İnstitutuna rəhbərlik etmişdir. 1930–1933, 1946–1964-cü illərdə Azərbaycan Tibb İnstitutunda Biologiya kafedrasının müdiri olmuşdur. «Ümumbiologiya»(1931), «Biologiya terminləri lüğəti»(1934), «Biologiya»(1955) əsərlərinin müəllifidir. 1950-ci ildə professor, 1960-cı ildə isə Əməkdar elm xadimi fəxri adına layiq görülmüşdür. F.Ə.Rzabəyli 1968-ci ildə Bakıda vəfat etmişdir.*

V.Pismennaya isə rus dili müəllimi kimi Ali Pedaqoji İnstitutun bünövrə daşını qoyan ilk mütəfəkkirlər oldular.

İnstitut ilk illər tarix-filologiya, təbiyyat-kimya, fizika-riyaziyyat ixtisasları üzrə müəllim kadrları hazırlayırdı.

İlk vaxtlar təbiyyat-kimya-coğrafiya və sonra isə biologiya-kimya şöbəsi kimi fəaliyyət göstərən ali tədris müəssisəsində botanika, zoologiya, fiziologiya, kimya, geologiya və minerologiya, habelə həmin fənlərin metodikası üzrə nəzəri kurs və təcrübi məşğələlər keçirilirdi. Şöbədə tədris Bakı Dövlət Universitetinin proqramı həcmində aparılırdı. Burada F.Ə.Rzabəyli, S.C.Hüseynov, A.A.Əmirov, S.X.Osmanzadə kimi istedadlı və təcrübəli pedaqoqlar çalışırdılar. Onlar yalnız mühazirə və təcrübi məşğələlər keçirməklə kifayətlənmir, həm də ana dilində ilk dərsliklərin hazırlanmasında, elmi-terminoloji vəsaitlərin tərtibatında, elmi-tədqiqat işlərinin aparılmasında yaxından iştirak edirdilər. O dövrdə şöbənin ən güclü elmi mərkəzi Fiziologiya kafedrası idi. Böyük elmi potensiala malik kafedraya ilk zamanlar görkəmli fizioloq alimlər: prof. A.M.Çernikov (1921-ci ildə kafedranın əsasını qoymuşdur), prof. N.A.Popov (1922–1925-ci illərdə), prof. P.Y.Rostovtsev (1925-ci ildən 1927-ci ilədək) rəhbərlik ediblər.

1921-ci ilin payızında tarix-ictimaiyyat-ədəbiyyat şöbəsi yaradıldı. Yeni şöbədə humanitar və ixtisas fənləri ilə yanaşı, fəlsəfə, məntiq, pedaqogika, didaktika, siyasi iqtisad, dövlət hüququnun əsasları və s. fənlər də tədris olunurdu. 1925–1926-cı dərs ilindən həmin şöbə tarix-ictimaiyyat və filologiya kimi iki müstəqil şöbəyə ayrıldı. Bu, hər iki şöbədə ixtisas fənlərinin daha səmərəli öyrənilməsinə yaxından kömək etdi.

Tarix-ictimaiyyat şöbəsində ictimaiyyat, SSRİ tarixi, Azərbaycan tarixi, pedaqogika tarixi, qədim tarix, Şərq tarixi, ümumi tarixlə yanaşı, inqilabi hərəkat tarixi, sosial-iqtisadi quruluşların inkişafı tarixi, ədəbiyyat tarixi, etnoqrafiya, iqtisadi coğrafiya və s. fənlər tədris olunurdu. Şöbədə görkəmli professorlardan – P.P.Fridolin, P.K.Juze, A.O.Makovelski, Ə.S.Übeydulin, B.V.Çobanzadə, V.M.Xuluflu, A.A.Bukşpan ilə yanaşı, istedadlı gənc kadrlar da çalışırdılar.

İnstitutun ədəbiyyat şöbəsində görkəmli şərqşünas və türkoloq-professorlar: N.İ.Aşmarin, B.V.Çobanzadə ilə birlikdə Ə.Haqverdiyev, A.Ş.Talıbzadə, Y.V.Çəmənzəminli, M.K.Ələkbərli, A.Musaxanlı və H.Zeynallı kimi tanınmış ədəbiyyatçılar dərs deyirdilər.

1921-ci ilin sonunda respublikanın Xalq Maarif komissarının müavini, institutun ilk direktoru F.Ə.Rzabəyli müsahibəsində yeni ali pedaqoji məktəbin qar-

şısında duran vəzifələrdən bəhs edərək yazırdı: «Pedaqoji İnstitut yalnız azərbaycanlıların deyil, bütün məhkum Şərq xalqlarının qayələrini (arzularını – *red.*) təmin etməlidir. İnstituta fəhlə və kəndlilər cəlb edilməli və işi yaradıcı bir ruhda təchiz etmək lazımdır. Həyatın tələbi və ehtiyacı üzündən səhnəyə atılmış pedaqoji institutu var qüvvə ilə müdafiə edəcək və yüksəldəcəyik».

İnstitutun müvafiq şöbələrində ixtisas fənləri ilə bir sırada fəlsəfə, məntiq, pedaqogika və didaktika, tarixi materializm, siyasi iqtisad və s. fənlər tədris olunurdu.

1922-ci ilin yazında yeni fənlərin tədrisə daxil edilməsi ilə əlaqədar antropologiya və rus dili üzrə Kiyev Universitetinin məzunu Davud Şərifov, siyasi iqtisad üzrə Hüseyn Mirzəcamalov, anatomiya üzrə Kazan Universitetinin məzunu Fətulla Əlizadə, rəsm üzrə Fransa Rəssamlıq Akademiyasını bitirən Kelxis, dilçilik üzrə prof. B.V.Çobanzadə, fizikadan təcrübə məşğələləri üzrə N.Berq instituta çağırıldılar. 1922–1923-cü tədris ilində isə fizika ixtisası üzrə Kazan Universitetini bitirən Rəhim bəy Məlikov (o, Şimali Qafqazda işləyirdi), siyasi iqtisad üzrə Azərbaycanın Xalq maarif komissarının müavini Mustafa Quliyev, anatomiya üzrə Odessa Universitetinin məzunu Mirəsədulla Mirqasımov və Kiyev Universitetini bitirən Cəlil Məmmədzadə, botanika üzrə Peterburq Ali Qadınlar kursunun məzunu Səlimə xanım Osmanzadə, fars dili üzrə Paris Universitetini bitirən Mirzə Möhsün İbrahimov, psixologiya və məntiq üzrə Tiflisdəki Aleksandrovski Müəllimlər İnstitutunu bitirən Abdulla Azadbəyli, coğrafiya üzrə Süleyman Səlimov və b. müəllim heyətinə qatıldılar.

Dərslərin 1921-ci ilin noyabrından başlanmasına baxmayaraq, instituta qəbul davam edirdi. Birinci tədris ilini bütün tələbələr müvəffəqiyyətlə başa vurub, yay tətilinə buraxıldığı dövrdə institutun rəhbərliyi tələbələr üçün əlavə 40 nəfərlik pansion təşkil etdi. İnstitutun tədris və elmi kabinələri ilk illər zəngin materiallara malik deyildi və laboratoriyalar da yeni cihazlarla təmin edilməmişdi. Odur ki, Azərbaycan XKS-nin 1922-ci il 13 iyun tarixli 69 saylı qərarı ilə XMK-a institutun maddi cəhətdən təmin olunması tapşırıldı. N.Nərimanovun köməyi sayəsində institutda bir neçə kabinə və laboratoriya yaratmaq mümkün oldu. Onun göstərişi ilə Ali Xalq Təsərrüfatı Şurasının nəzdindəki kimya laboratoriyası bütünlüklə Ali Pedaqoji İnstituta verildi. Kimya və fizika laboratoriyalarında 120 tələbənin təcrübə aparması üçün imkan var idi. Sonralar kimya laboratoriyası xeyli genişləndirildi. Bu işdə onun ilk müdiri S.C.Hüseynovun, həmin dövrdə laborant vəzifəsində çalışan X.Ş.Kələntərlinin və V.V.Kutukovun xidmətləri təqdirəlayiq idi.

1923–24-cü tədris ilində institutda Tarix və etnoqrafiya muzeyi yaradıldı. Respublika hökuməti institutun maddi bazasının möhkəmləndirilməsinə xüsusi diqqət yetirir və ona hərtərəfli yardım göstərirdi. Təkcə 1923–24-cü tədris ilində Azərbaycan XKS Maarif Komissarlığı xətti ilə institutun tədris, elmi və təsərrüfat işləri üçün 112 min 69 manat vəsait buraxıldı. Həmin illərdə institutun əsaslı kitabxanası da xeyli zənginləşdirildi. İnstitut təşkil olunduğu günlərdə onun kitabxanasında Azərbaycan dilində 50, başqa dillərdə isə 73 kitab vardısa, bir neçə ildən sonra Moskvadan və başqa şəhərlərdən alınan ədəbiyyatlar hesabına kitabxananın fondu xeyli artırıldı. 1923–24-cü tədris ilində orada Azərbaycan dilində 2000 nüsxə, rus dilində 1000 nüsxə kitab vardı[1].

İnstitut ildən-ilə genişlənirdi. Xalq maarifi orqanlarının müəllimlərə olan ehtiyacı nəzərə alınaraq tələbə qəbulu artırılır, tədrisin vəziyyəti yaxşılaşdırılırdı.

1921-ci ilin noyabr ayının ortalarından 1922-ci ilin yanvarınadək institutda tələbələrin sayı 15 nəfərdən 40 nəfərə, 1922–23-cü tədris ilində 70 nəfərə çatdırılmışdı. 1923–24-cü tədris ilində isə 6 ixtisas qrupunda və hazırlıq şöbəsində 100 tələbə oxuyurdu.

Azərbaycan Xalq Maarif Komissarlığı tərəfindən 1924-cü ildən başlayaraq respublikanın başqa ali məktəblərində olduğu kimi, Ali Pedaqoji İnstitutun da akademik heyətinə yeni elmi qüvvələr cəlb edilirdi. Görkəmli şərqşünas alimlər – akademiklər: V.V.Bartold, İ.İ.Meşşaninov, N.Y.Marr, A.N.Samoyloviç, professorlar: P.K.Juze, Ə.S.Übeydulin və başqaları Rusiyanın elmi mərkəzlərindən və müxtəlif ali məktəblərindən Ali Pedaqoji İnstituta gətirildilər. Onlar institutun tarix-ədəbiyyat şöbəsində mühazirə oxumaqla bərabər, elmi kadrların hazırlanmasında da yaxından iştirak edirdilər. Eyni zamanda Türkiyədən dəvət olunmuş, Berlin Universitetinin məzunu doktor Xəlil Fikrət psixologiya və pedaqogikadan, İstanbul Universitetinin məzunu İsmayıl Hikmət və Tofiq Hikmət türk ədəbiyyatı tarixindən, həmin universitetin məzunu İsmayıl Novruz və Süleyman Səlim isə təbiyyat və coğrafiyadan mühazirə oxuyur, praktik məşğələlər aparırdılar.

Xalq Maarif Komissarlığının təşəbüssü ilə istedadlı milli elmi-pedaqoji qüvvələrin ali məktəblərə cəlb edilməsi nəticəsində Ali Pedaqoji İnstitutun müəllim heyətinin tərkibi azərbaycanlı gənc müəllimlər hesabına daha da möhkəmlənirdi. İnstitutun ilk direktoru F.Ə.Rzabəylidən (1921–1924) sonra həmin vəzifəyə ***Məmməd Əfəndiyev*** (1924) təyin edildi.

---

[1] Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı, 1924, s.18.



*__Məmməd Rəşid oğlu Əfəndiyev__ 5 oktyabr 1887-ci ildə Nuxada anadan olmuşdur. 1908-ci ildə Peterburq Universitetinin Fizika-riyaziyyat fakültəsinə daxil olmuş və oranı bitirdikdən sonra bir müddət Tbilisi şəhərində müəllim işləmiş, sonra Şəki şəhərindəki gimnaziyada müəllim və direktor vəzifəsində çalışmışdır. M.Əfəndiyev APİ-də Riyaziyyat və təbiyyat elmləri fakültəsinin dekanı (1934–1936), ADU-da Riyazi analiz kafedrasının müdiri (1935–1965) olmuşdur. 1943-cü ildə Əməkdar elm xadimi fəxri adına layiq görülmüş, 1945-ci ildə professor elmi adı almışdır. Riyazi ifadələrin Yaxın Şərqdə yayılmış yazılış formaları əvəzinə latınca yazılışını ilk dəfə Əfəndiyev işlətmişdir. O, ilk dəfə riyazi analiz, analitik həndəsə və riyaziyyatın tədrisi metodikası fənlərindən Azərbaycan dilində mühazirələr oxumuşdur. Bir neçə dərs vəsaitinin («Cəbrə aid proqram və tapşırıq», «Matematik analizdən kontrol tapşırıqlar» (1935), «Adi diferensial tənliklər» (1950) və s.) müəllifidir. Lenin ordeni və 2 Qırmızı Əmək Bayrağı ordeni ilə təltif olunmuşdur.*

*Əfəndiyev Məmməd Rəşid oğlu 1 iyun 1977-ci ildə Bakı şəhərində vəfat etmişdir.*

Ondan sonra həmin vəzifədə qısa bir müddətdə ***Həbib bəy Mahmudbəyov***, Şərif Manafov və Cəlil Məmmədzadə (1925–1927) çalışdılar.

1923–24-cü tədris ilində Ali Pedaqoji İnstitutun 28 nəfərdən ibarət ilk buraxılışı oldu. Azərbaycanın və qonşu respublikaların müxtəlif yaşayış məntəqələrindən gəlib təhsil alan gənclər öz doğma yerlərinə və müəllimə daha çox ehtiyac olan rayon mərkəzlərinə – Xalq Maarif orqanlarının sərəncamına göndərildilər. Məzunların 14 nəfəri Təbiyyat-coğrafiya fakültəsinin təbiyyat



*__Həbib bəy Mahmudbəyov__ 1864-cü ildə Şamaxı şəhərində anadan olmuşdur. Əvvəlcə Şamaxı məhəllə məktəbində, sonra Bakı realni məktəbində (1873–1881) təhsil almışdır. 1882–1887-ci illərdə Tiflis Aleksandrovski Müəllimlər İnstitutunda təhsil almışdır. 1887-ci ildə S.Qənizadə ilə birlikdə Bakıda ilk rus-tatar (Azərbaycan) məktəbini açmışdır. O, 1889–1891-ci illərdə Mixaylovski Bakı şəhər məktəbində müəllimlik etmiş, 1905-ci ildən 1916-cı ilə kimi Bakı ikisinifli şəhər məktəbində müdir vəzifəsində çalışmışdır. Ali Pedaqoji İnstitutun təşkilində yaxından iştirak etmiş, burada direktor müavini və qısa bir müddətdə direktor vəzifəsində çalışmışdır.*

şöbəsini, 9 nəfəri fizika-riyaziyyat fakültəsinin riyaziyyat şöbəsini, 5 nəfəri Tarix-filoloji fakültəsinin ədəbiyyat şöbəsini bitirmişdilər.

Azərbaycan SSR XMK-nın Kollegiyasının 1924-cü il 24 may tarixli iclasının qərarı ilə institutu bitirənlərin 3 nəfəri Bakı, 3 nəfəri Gəncə, 2 nəfəri Şuşa, 2 nəfəri Qazax, 1 nəfəri Naxçıvan müəllimlər seminariyalarına, qalanları isə digər maarif müəssisələrinə işə göndərildilər.

Görkəmli dövlət xadimi, o zaman Moskvada işləyən SSRİ MİK-nin sədrlərindən biri N.Nərimanov institutun ilk məzunlarını «Elmlərini yeni tamam etmiş müəllimlərə açıq məktub»la təbrik etdi. Təbrikdə deyilirdi: «Əziz yoldaşlar, təzə həyata qədəminizi təbrik edirəm. Vəzifəniz hər nə qədər qayət (çətin) və məsuliyyətli bir vəzifədirsə, bunu da düşünməlisiniz: insanın ruhunu ucaldan bir çox şey vardır ki, onun ən birincisi zəhmətdir. Mən istərdim, siz gələcək həyatınızda üç məsələyə diqqət edəsiniz:

1. Sizin tərbiyənizdə olan Azərbaycan balaları gərək zəhmətsevər olsunlar, yəni çətinlikləri başqasının yox, öz zəhmətləri ilə dəf etsinlər. Bunun üçün balalara təbiəti sevdirmək, onları təbiətin əlamətləri ilə maraqlandırmaq lazım gəlir.

2. Sizin tərbiyənizdən çıxan cavanlarımız gərək cəsur, cürətli və dəyanətli olsunlar. Yəni bir parça çörəkdən ötrü ikiüzlülük etməsinlər, filankəsin xoşuna gəlmək üçün «qatığa qara» deməsinlər.

Amandır, yoldaşlar! Buna yaxşı fikir veriniz. Mənsəbdən ötəri yalan söyləyən, gündə vicdanını satan «ikiüzlü» adamlar bizim gələcək kommunaya üzv ola bilməzlər. Ona görə də uşaqlarla daim əlaqədə olarkən hər kəlmənizdə, sözünüzdə artıq dərəcədə ehtiyatlı olmalısınız, çünki uşaq gördüyünü tez götürər.

3. Biz iddiamızdan əl çəkmirik: Azərbaycan Şərq üçün bir məktəbdir, yəni Şərq hazırkı halında qalırsa, biz ona hər cəhətdən müəllim olacağıq. Beş ildən sonra Türkiyə, İran, Əfqanıstan üçün bizim müəllimlərimiz elm – fənn meydanında hazır olacaqlar. Ona binaən (görə) qeyrisinin lisanı (dili) altında qalmaq bütün işimizi təxirə salar. Bu səbəblərə görə dilimizi müstəqil bir şəklə salmada ən çox siz müəllimlərə ümid bağlayıb məktəbi bitirməyiniz münasibətilə sizi bir daha səmimi-qəlbdən təbrik edirəm. *N.Nərimanov*»[1].

1924–25-ci tədris ilindən etibarən institut 4 illik tədris planı ilə işə başladı. Həmin vaxt orada 142 tələbə oxuyurdu. Ali pedaqoji təhsil müəssisəsinə təkcə respublikamızdan deyil, həmçinin qonşu müttəfiq və muxtar respublikalardan – Orta Asiya, Dağıstan, Gürcüstan və Ermənistandan da oxumağa gələnlər var idi. 1925-ci ildə institutun pansionatında yaşayan tələbələrin 125 nəfəri Azərbaycan-

[1] Ali Pedaqoji İnstitutun salnaməsi. Bakı, 1924, №1, s. 38.

dan, 12 nəfəri Dağıstandan, 9 nəfəri Özbəkistandan, 5 nəfəri Türkmənistandan, 8 nəfəri Krımdan, 3 nəfəri Ermənistandan, 1 nəfəri isə Gürcüstandan idi.

1924–25-ci tədris ilində institutun 27 nəfərlik ikinci buraxılışı, 1925–26-cı tədris ilində isə 56 nəfərlik üçüncü buraxılışı oldu. Ümumiyyətlə, üç buraxılışda 111 nəfər yüksəkixtisaslı müəllim hazırlanıb maarif orqanlarının sərəncamına göndərildi. Pedaqoji institutun professor-müəllim heyətinin həyatı getdikcə daha artıq dərəcədə normal məcraya düşürdü. Lakin hələ problemlər az deyildi. Belə ki, pedaqoji institutun müstəqilliyi açıq şəkildə müqavimətlə qarşılanır, kollektiv yuxarı təşkilatların – Xalq Maarif Komissarlığının, Azərbaycan partiya təşkilatının «direktiv xarakterli qərar və göstərişlərinə əməl etməmək»də təqsirləndirilir, rəhbərliyə tez-tez iradlar tutulur, başqa ali məktəblərdə, xüsusən də Bakı Universitetində olduğu kimi, burada da möhkəmlənməkdə olan amirlik metodlarının üstünlüyü açıq-aşkar hiss edilirdi.

20-ci illərin ikinci yarısında Pedaqoji İnstitutun mövcud fakültələrinin fəaliyyətində müəyyən dəyişikliklər aparıldı. 1925–26-cı tədris ilində institutda tarix-ədəbiyyat (dekan prof. Ə.S.Übeydulin), təbiyyat-aqronomiya (dekan Səlimə Osmanzadə) və fizika-riyaziyyat (dekan Məmməd Əfəndiyev) şöbələri vardı. Həmin tədris ilinin əvvəlində tarix-ədəbiyyat şöbəsi iki müstəqil şöbəyə: ədəbiyyat və tarix şöbələrinə ayrıldı. Tarix-ictimaiyyat şöbəsinin dekanı vəzifəsinə prof. Əziz Übeydulin təyin edildi. Həmin dövrdə institutda tələbələrin sayı 172 nəfərə çatmışdı.

1926-cı ildə Ali Pedaqoji İnstitutun 5 illiyi respublika ictimaiyyəti tərəfindən geniş qeyd edildi.

Azərbaycanda sovet hakimiyyəti qurulduğu ilk aylardan qadınların ictimai və mədəni həyata cəlb edilməsi üçün imkanlar yaranmışdı. Lakin onların əksəriyyətinin savadsızlığı bu işin gerçəkləşməsinə mane olurdu. Bunu nəzərə alan respublika hökuməti qadın müəllimlərin hazırlanmasına xüsusi əhəmiyyət verməyə başladı. 1920-ci ildə Bakıda qızlar üçün Darülmüəllimatın açılması bu yolda atılan ilk addım idi. Qadınlara pedaqoji məktəblər həcmində təhsil verilməsi nəzərdə tutulurdu. Darülmüəllimata birinci tədris ilində 120, 1921-ci ildə isə 133 nəfər azərbaycanlı qız qəbul olundu. 1923-cü ildə həmin məktəbdə təhsil alan 213 nəfər azərbaycanlı qızın 11-i Şəkidən, 23-ü Şamaxıdan, 17-si Gəncədən, 8-i Salyandan, 13-ü Göyçaydan, 6-sı Ağdaşdan, 12-si Bakıdan, qalanları isə respublikanın digər rayonlarından gəlmişdilər. İxtisaslı qadın müəllimlərinin hazırlanmasında Şəfiqə xanım Əfəndiyeva, Zəhra xanım Şaxtaxtinskaya, Xədicə xanım Ağayeva, Azad Əmirov, Camo Cəbrayılbəyli və başqaları böyük əmək sərf etdilər. 1924-cü ildə Bakı Darülmüəllimatını ilk dəfə ola-

raq 16 nəfər azərbaycanlı qız bitirdi ki, bunların 4-ü Şəkidən, 4-ü Şamaxıdan, 3-ü Qazaxdan, 1-i Lənkərandan, 2-si Bakıdan idi.

Azərbaycan hökumətinin 20-ci illərdə pedaqoji təhsil sahəsində gördüyü tədbirlərdən biri də qadınların ali pedaqoji təhsilinin təşkili idi. Yeni həyat quruculuğunda qadınların iştirakını təmin etmək, xüsusilə təhsil almaları üçün geniş imkanlar yaratmaq vacib məsələlərdən biri sayılırdı. N.Nərimanov respublikada ali pedaqoji qadın təhsili müəssisəsinin yaradılmasına xüsusi əhəmiyyət verirdi. Onun təşəbbüsü və köməyi ilə Bakıda Məktəbəqədər Qadın Tərbiyə İnstitutu açıldı. Azərbaycan Xalq Komissarları Sovetinin 1920-ci il 25 dekabr tarixli 11 saylı dekretində deyilirdi: «Məktəbəqədər tərbiyə sahəsində təcrübəli kadrlar və rəhbər işçilər hazırlamaq, həmçinin qadınlar arasında tərbiyə işlərini yaymaqdan ötrü 1921-ci ilin mart ayının 1-dən etibarən Bakıda birinci Azərbaycan Qadın Məktəbəqədər Tərbiyə İnstitutu açılsın».

İnstitut II dərəcəli məktəblər üçün qadın müəllimləri hazırlayırdı. Orada üç hazırlıq qrupu və iki ixtisas şöbəsi: ədəbiyyat və ictimaiyyat və təbiyyat şöbələri vardı. İnstitutda təhsil müddəti üç il idi. İnstitut açıldığı il oraya 30 nəfər qadın qəbul olunmuşdu. Azərbaycan Qadın Məktəbəqədər Tərbiyə İnstitutunun tələbələrinin çoxu oxumağa qəzalardan göndərilirdilər. İlk illər respublikada qadın kadrlara ciddi ehtiyacı və tam orta təhsilli qadınların azlıq təşkil etməsini nəzərə alaraq, instituta orta təhsilli olmayanlar da qəbul edilirdilər. İnstitutun rəhbəri A.N.Maginskaya, müəllim heyəti–Həsən Mirzə Camalov, Azad Əmirov, Həmid Şahtaxtinski, bir qədər sonra isə A.N.Lukyanova, K.A.Ordubadskaya, S.N.Xuramoviç (Talışinskaya), S.X.Osmanzadə, Z.M.Şahtaxtinskaya və başqaları idilər. Məktəbə xüsusi tədris korpusu ayrılmadığından dərslər Darülmüəllimatının binasında keçirilirdi.

1921–22-ci tədris ilində institutda 54 tələbə vardısa, bir il sonra onların sayı 115 nəfərə çatdı. Lakin Məktəbəqədər Qadın Tərbiyə İnstitutunun fəaliyyəti çox davam etmədi. Respublikada ali təhsilli qadın müəllimlərə böyük ehtiyac olduğuna görə o, Qadın Pedaqoji İnstitutuna çevrildi. Azərbaycan XKS-nin 1922-ci il 29 noyabr tarixli dekretində deyilirdi:

«1. Bakı şəhərində mövcud olan Məktəbəqədər Qadın Tərbiyə İnstitutu türk dövlət dilində (Azərbaycan dilində) II dərəcəli məktəblər üçün qadın müəllimləri hazırlayan Ali Pedaqoji İnstituta çevrilsin.

2. Xalq Maarif Komissarlığı Kollegiyasının 13 iyun 1921-ci ildə Azərbaycan Dövlət Kişi Pedaqoji İnstitutu haqqında qəbul etdiyi Nizamnamə Azərbaycan Qadın Pedaqoji İnstitutuna da şamil edilsin.

Azərbaycan SSR XKS-nin sədri Q.M.Musabəyov».[1]

---

[1] Собрание узаконений и распоряжений правительства АССР за 1922 г. Баку, 1923.



Azərbaycan Dövlət Ali Pedaqoji İnstitutunun bir qrup müəllimi (1925–1926-cı illər)



Pedaqoji İnstitutun müəllimlərindən bir qrupu
Ön sırada: Məmməd Əfəndiyev, Z.Hüseynov, Mirzə Möhsün İbrahimov, Həbib bəy Mahmudbəyov, Tağı Şahbazi, Səlimə Yaqubova (1926–1927-ci illər)



*Azərbaycan Dövlət Ali Pedaqoji İnstitutunun bir qrup müəllim və tələbəsi (1926-cı il)*




*Pedaqoji İnstitutun məzunları (1927-ci il)*

İnstitutun ilk direktoru vəzifəsinə Sara xanım Xuramoviç (Talışinskaya) təyin edildi. Məktəbəqədər Qadın Tərbiyə İnstitutunun bütün müəllim heyəti oraya köçürüldü. 1923–24-cü tədris ilində Azərbaycan xalq maarifi tarixində ilk dəfə olaraq Azərbaycan Qadın Pedaqoji İnstitutunu 17 nəfər ali təhsilli müəllim qadın bitirdi və Azərbaycan qəzalarına işə göndərildi. Bu o dövr üçün böyük nailiyyət və son dərəcə fövqəladə hadisə idi.

1926-cı ilin dekabr ayının 1-nə olan məlumata görə, respublikanın iki ali pedaqoji institutunda təhsil alan 302 nəfər tələbənin 165-i kişi, 137-si qadın idi. 302 nəfər tələbənin 287-si azərbaycanlı idi (bunların 150-si kişi, 137-si isə qadın). İki institutda cəmi 68 müəllim çalışırdı.

Ali pedaqoji təhsilli kişi və qadın müəllimlərinin hazırlığının ilk mərhələsi müəyyən çətinliklərdən xali deyildi. Təsərrüfat-inzibati və maliyyə məsələləri ilə bağlı yaranan çətinliklər, pedaqoji təhsil ocaqlarının birləşməsi zərurətini gündəmə gətirirdi. Odur ki, Azərbaycan SSR XMK Kollegiyasının 1923-cü il 3 aprel tarixli qərarı ilə 1924–25-ci tədris ilində Ali Pedaqoji Kişi İnstitutu və Ali Pedaqoji Qadın İnstitutu inzibati cəhətdən Azərbaycan Pedaqoji İnstitutu şəklində birləşdirildi.

APİ-nin 1925–26-cı tədris ilində üçüncü buraxılışı oldu. İnstitutu 56 nəfər gənc azərbaycanlı oğlan və qız bitirərək respublikanın Xalq Maarifi sisteminə göndərildi.

Növbəti tədris ilinin (1926–27) sonunda Ali Pedaqoji İnstitutun 76 nəfərdən ibarət dördüncü buraxılışı oldu. Məzunların 18-i ədəbiyyat, 24-ü təbiyyat, 17-si riyaziyyat, 16-sı isə tarix-ictimaiyyat şöbələrini bitirdi. Bu, institutun Bakı Dövlət Universitetinin Pedaqoji fakültəsinin tərkibinə verilməsi ərəfəsində son buraxılışı idi.

Ali Pedaqoji İnstitutun 20-ci illərin birinci yarısındakı yetişdirmələri içərisində sonralar görkəmli ictimai xadim və alim kimi formalaşıb tanınan şəxslər – SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü M.M.Mehdizadə, SSRİ EA-nın müxbir üzvü Y.H.Məmmədəliyev, SSRİ Pedaqoji Elmlər Akademiyasının müxbir üzvü A.Abbaszadə, Azərbaycan EA-nın müxbir üzvü M.Ə.Cavadov, prof. T.H.Abdullayev, dosentlər: Ə.Hüseynzadə, V.Hacıyev, H.Rzayev, M.Abdullayev, M.Mədətzadə, şair Mikayıl Rzaquluzadə, respublikanın əməkdar müəllimləri H.Hacızadə, N.Nəcəfquluzadə, M.Bayramov və b. vardı.

Bu dövrdə respublikanın ali məktəblərində elmi və pedaqoji kadrların kifayət qədər olmaması üzündən təhsil və təlim, əsasən, Sovet Rusiyasının elmi və ali təhsil müəssisələrindən dəvət olunmuş akademik heyət tərəfindən apa-


Şahadatnama
Свидетельство

*1926-cı ildə Azərbaycan Dövlət Ali Pedaqoji İnstitutu tərəfindən Şuşa sakini Məhəmmədzadə Bəhmən Qərim oğluna verilmiş Şəhadətnamə*

rılırdı. Müttəfiq respublikaların qarşısında duran ümdə vəzifələrdən biri təhsili tədricən yerli əhalinin ana dilində (respublikamızda Azərbaycan dilində) aparmaqdan və onu milli zəmində qurmaqdan ibarət idi. Azərbaycanda milli dildə ümumtəhsil müəssisələri az idi. Ona görə də təhsili milliləşdirmək respublika əhalisinin mənafeyinə tam uyğun idi. Ali məktəblərdə tədrisin Azərbaycan dilində aparılması (türkləşdirilməsi) siyasəti 1922-ci ildən başlayaraq özünün müsbət nəticəsini verdi. Respublikanın ali məktəblərində 1924-cü ildən ardıcıl şəkildə həyata keçirilən bu siyasət on il müddətində başa çatmalı idi. Təhsilin milliləşdirilməsi siyasəti yerli millətlərin nümayəndələrindən ibarət elmi-pedaqoji kadrların yetişməsinə diqqəti artırmaq zərurətini doğururdu. Əslində, rus dili ilə yanaşı, tədrisin Azərbaycan dilində aparılması xalqın ehtiyacları ilə bağlı idi. Sovet hakimiyyətinin 7 ili ərzində (1920–1927-ci

illər) Azərbaycanın ali və orta ixtisas məktəbləri 3662 nəfər mütəxəssisə vəsiqə vermişdir, onların yarısı, daha dəqiq desək, 1870 nəfəri ali təhsilli idi. Təsadüfi deyil ki, onların da 41,7 faizini pedaqoji təhsilli mütəxəssislər – xalq maarifi işçiləri və müəllimlər təşkil edirdi.

20-ci illərin ortalarında respublikanın Xalq Maarifi orqanlarının ehtiyaclarını qismən təmin etmək mümkün oldu. İlk növbədə, müəllimlərin əməkhaqları artırıldı. 1924–25-ci tədris ilində respublikanın xalq maarifi orqanlarına 3699637 manat ayrıldı. Bunun 777499 manatı kənd müəllimlərinin əməkhaqqının ödənilməsinə sərf edildi. 1925–26-cı tədris ilində həmin məbləğ 5659840 manata, 1926–27-ci tədris ilində 7038817 manata çatdırıldı. Ali məktəblərdə 1924–25-ci tədris ilində 894470 (30 faiz), 1925–26-cı tədris ilində 1291857 (30,9 faiz), 1926–27-ci tədris ilində 1316344 (49 faiz), 1927–28-ci tədris ilində isə 1346251 (23,8 faiz) manat vəsait xərcləndi[1].

Görülən tədbirlər öz müsbət nəticəsini verdi və respublikanın müəllimlərinin tərkibində milli pedaqoji kadrların sayı ildən-ilə artdı. Əgər 1920–21-ci dərs ilində ali və orta təhsilli azərbaycanlı müəllimlər cəmi 3 faiz təşkil edirdisə, 1922–23-cü tədris ilində həmin nisbət 9 faiz, 1924–25-ci tədris ilində 43,6 faizə çatdırıldı.[2]

Respublikanın 3 ali pedaqoji təhsil ocağında: Bakı Universitetinin Pedaqoji fakültəsində, Ali Kişi Pedaqoji İnstitutunda və Ali Qadın Pedaqoji İnstitutunda 1926–27-ci tədris ilində 877 nəfər tələbə oxuyurdu. Bu rəqəm o zaman respublikanın 5 ali məktəbində təhsil alan 5391 tələbənin 16,4 faizini təşkil edirdi.

Azərbaycanda pedaqoji kadrların hazırlanmasını yaxşılaşdırmaq və ali məktəblərdə vahid rəhbərliyi təmin etmək məqsədilə Azərbaycan XKS-nin 1926-cı ilin iyun ayının 16-da keçirilən iclasında «Ali pedaqoji institutların yenidən təşkili haqqında» qərar qəbul edildi. Həmin qərar əsasında 1926–27-ci tədris ilinin sonunda Ali Pedaqoji Kişi və Ali Pedaqoji Qadın institutları Bakı Universitetinin Pedaqoji fakültəsinə birləşdirildi.

1920–1927-ci illərdə respublikanın orta ixtisas və ali məktəblərini 1347 nəfər müəllim bitirmişdi ki, onların da 587 nəfəri ali təhsilli idi. Bunlardan 389 nəfəri Bakı Universitetinin Pedaqoji fakültəsinin, 198 nəfəri isə Ali Pedaqoji İnstitutun payına düşürdü.

[1] Azərbaycan Xalq Maarifi (1920–1927-ci illər). Bakı, 1928, s. 27.

[2] Yenə orada, s. 60–63.

## 1.2. ALİ PEDAQOJİ İNSTİTUTUN BAKI DÖVLƏT UNİVERSİTETİNİN TƏRKİBİNƏ VERİLMƏSİ *(1927–1930-cu illər)*

Azərbaycan hökumətinin «Ali pedaqoji institutların yenidən təşkili haqqında» 1926-cı il 16 iyun tarixli qərarına əsasən Bakı Universitetinin fakültələri (Tibb fakültəsi istisna olmaqla) 20-ci illərin ortalarından başlayaraq Azərbaycan məktəbləri üçün müəllim hazırlamağa istiqamətləndirildi.

Azərbaycan K(b)P-nin 1927-ci ilin noyabr ayında keçirilən VIII qurultayı Xalq Maarifi sahəsində həll edilməsi qarşıda duran məsələlərdən bəhs edərkən ali məktəblərin türkləşdirilməsinə (tədrisin Azərbaycan dilində təşkilinə) xüsusi diqqət yetirdi. Bundan sonra da həmin xəttin davam etdirilməsinin vacibliyi vurğulandı, ali məktəblərin tədris və elmi fəaliyyəti üçün şərait yaratmaq məqsədilə elmi işçilərin sabit tərkibinin yaradılması və onların maddi şəraitinin yaxşılaşdırılması zərurəti nəzərə alındı.

Azərbaycanda 1928-ci ilin mart ayının 29-da ümumi icbari ibtidai təhsilə keçmək haqqında qərar qəbul edildi. Ümumi icbari ibtidai təhsilin həyata keçirilməsində ixtisaslı müəllim kadrlarının hazırlanması əsas şərt idi. Azərbaycan K(b)P MK-nın və MNK-nın birləşmiş Plenumunda (1928-ci il 16–20 iyun) və Azərbaycan K(b)P BK-nın V Plenumunda (1928-ci il 1–3 sentyabr) «Ali məktəblərin işi haqqında» məsələ müzakirə obyektinə çevrildi. Qəbul olunan müvafiq qərarlarda ali təhsilli mütəxəssislərin hazırlanması sahəsində mövcud nöqsanları tezliklə aradan qaldırmaq üçün tədris və yataqxana binalarının tikilməsi, ali məktəblərin büdcəsinə yenidən baxılması, tələbələrin aylıq təqaüdünün 28 manatdan 45 manata qədər, professor-müəllim heyətinin əməkhaqqının isə 20–30 faiz artırılması nəzərdə tutuldu. Lakin qaldırılan məsələlər real həllini tapa bilmədi, direktiv göstəriş olaraq qaldı.

Ali pedaqoji institutların BDU-nun Pedaqoji fakültəsi tərkibinə verilməsi müəllim kadrlarına olan böyük ehtiyacı tam təmin etmirdi. Bununla belə həmin fakültə 20-ci illərin sonunda elmi-pedaqoji fikrin əsas mərkəzi sayılırdı.

Pedaqoji fakültədə təhsil alan tələbələrin illər üzrə sayı, milli və sosial-sinfi tərkibi belə idi:

| Tədris ili | Tələbələrin ümumi sayı | O cümlədən: | | Sinfi-siyasi tərkibi | | | |
|---|---|---|---|---|---|---|---|
| | | Azərb. bölməsi | Rus bölməsi | Fəhlə | Kəndli | Qulluqçu | Başqa |
| 1927–28 | 880 | 283 | 597 | 181 | 212 | 416 | 81 |
| 1928–29 | 916 | 383 | 533 | 268 | 65 | 437 | 46 |
| 1929–30 | 1345 | 731 | 614 | 470 | 424 | 331 | 120 |

Tələbələr arasında yerli millətlərin nümayəndələri 1926–27-ci tədris ilində 40,3, 1927–28-ci tədris ilində 46,6, 1928–29-cu tədris ilində isə 70,9 faiz idi. Üç tədris ili ərzində artım nisbəti 30,6 faiz olmuşdu.

Pedaqoji fakültə ildən-ilə respublikanın təhsil orqanlarını və ümumtəhsil məktəblərini daha çox müəllimlərlə təmin edirdi. Əgər 1924–1927-ci illərdə həmin fakültəni 389 nəfər bitirmişdisə, 1928–29-cu tədris ilində 394 nəfər başa vurub respublikanın Xalq Maarifi sisteminə işə göndərilmişdi.

Ali pedaqoji təhsilli kadrların hazırlanmasına verilən diqqət və göstərilən qayğı nəticəsində 1920–21-ci tədris ilində respublikanın ümumtəhsil məktəblərində çalışan 3279 müəllimdən yalnız 141 nəfərinin ali təhsili olduğu halda, 1928–29-cu tədris ilində artıq 5339 müəllimin 524 nəfərinin ali pedaqoji təhsili vardı.

Universitetin Pedaqoji fakültəsində professorlar: A.O.Makovelski, N.M.Javoronkov, dosentlər: V.M.Zummer, A.M.Ammasov, V.L.Arxarova və başqalarından ibarət tədris-pedaqoji, elmi-tədqiqat işləri üzrə komissiya yaradıldı. Komissiyanın fəaliyyəti tədris prosesinin keyfiyyətini yüksəltməyə yönəldildi. Fakültədə fənn komissiyaları da vardı. Onların tərkibinə professorlar: Ə.S.Übeydulin, P.P.Fridolin, Y.A.Rathauzer kimi görkəmli mütəxəssislər daxil edilmişdilər.

20-ci illərin sonunda respublikada məktəb şəbəkələri genişləndi, şagird kontingenti sürətlə artdı, ümumtəhsil və orta ixtisas məktəblərinin pedaqoji mütəxəssislərə ehtiyacı bir qədər də artdı.

1927-ci ildə təhsilin yeni formasına başlanıldı. Pedaqoji texnikumlarda 1927–1929-cu illər ərzində qiyabi şəkildə 1500 ixtisaslı kadr hazırlandı. Azərbaycan pedaqoji texnikumlarında təkcə yerli müəllimlər deyil, Özbəkis-

tan, Gürcüstan, Ermənistan və Dağıstandan gələn təhsil işçiləri də öz biliklərini təkmilləşdirirdilər. Lakin bu yolla da müəllim hazırlığına olan ehtiyacı təmin etmək mümkün deyildi. Bunu nəzərə alan VI Ümumazərbaycan Sovetlər qurultayı müəllimlərin ixtisasını artıran təhsil müəssisəsi yaratmağı qarşıya məqsəd qoydu. Həmin qərarı əsas tutan hökumət pedaqoji texnikumların bazası əsasında 1929-cu ilin payızında Xalq Maarifi işçilərinin İxtisasartırma İnstitutunu, habelə Bakıda İkiillik Müəllimlər İnstitutunu açdı. Ancaq bu tədris müəssisələri də respublikanın maarif ocaqlarının müəllim kadrlarına olan tələbatını tam ödəyə bilmədi.

Ona görə də Ali Pedaqoji İnstitutu yenidən təşkil etmək məqsədəuyğun sayıldı. Bu məqsədlə 1929-cu ilin payızında Xalq Maarif Komissarlığı Azərbaycan XKS-nə Pedaqoji İnstitutun yenidən yaradılması barədə müraciət etdi. Hökumətin razılığı alındıqdan sonra hazırlıq işləri görülməyə başlandı.

1930-cu ilin mart ayının 13-də Xalq Maarif Komissarlığında Azərbaycan K(b)P MK-nın katibi Ağa Sultanov və Ayna Sultanovanın iştirakı ilə ali pedaqoji təhsil müəssisələri rəhbərlərinin xüsusi müşavirəsi çağırıldı. Müşavirədə Ali Pedaqoji İnstitutun təşkilinə hazırlıq haqqında P.A.Qasımovun məruzəsi və prof. P.P.Fridolinin məlumatı müzakirə edildi.

Respublika hökuməti yaranmış vəziyyəti nəzərə alıb Ali Pedaqoji İnstitutu yeni statusda təşkil etmək zərurətini gerçəkləşdirmək məqsədilə tədbirlər həyata keçirdi. Bakı Dövlət Universitetinin Pedaqoji fakültəsinin bazası əsasında müstəqil Azərbaycan Dövlət Pedaqoji İnstitutu yaratmaq qərara alındı. Bu məqsədlə ciddi hazırlıq işi aparıldı. Ayrı-ayrı fakültələrdə dərs deyəcək müəllimlər müəyyənləşdirildi.

Respublikada ali pedaqoji təhsilin yenidən qurulmasında Azərbaycan XKS-nin 1930-cu il 19 iyun tarixli «Azərbaycan SSR ali məktəblərinin və ali texniki məktəblərinin yenidən təşkili və rayonlaşdırılması, onların müvafiq təsərrüfat idarələri və Xalq Komissarlıqları tərkibinə verilməsi haqqında» qərarı xüsusi əhəmiyyət kəsb etdi. Həmin qərar əsasında ali təhsil müəssisələri ixtisas profilləri üzrə quruldu. V.İ.Lenin adına BDU-nun ayrı-ayrı fakültələrinin bazası əsasında müstəqil sahə institutları, o cümlədən Azərbaycan Dövlət Pedaqoji İnstitutu (Pedaqoji fakültəsinin bazası əsasında) yaradıldı.

## 1.3. AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ İNSTİTUTUNUN MÜSTƏQİL TƏDRİS VƏ ELMİ MƏRKƏZ KİMİ YENİDƏN TƏŞKİLİ VƏ FƏALİYYƏTİ *(1930–1941-ci illər)*

Azərbaycanda keçən əsrin 20-ci illərinin sonu, 30-cu illərin əvvəllərində yeni ümumtəhsil məktəbləri açıldı, xalq maarifi şəbəkələri genişləndi və ali təhsilli müəllimlərə ehtiyac daha ciddi şəkildə artdı.

Dövrün ehtiyacı və tələbi ilə yenidən qurulub fəaliyyətə başlayan Azərbaycan Dövlət Pedaqoji İnstitutu milli maarifçi ziyalıların yetişdirilməsində mühüm rol oynamalı, respublikada elmi-pedaqoji fikrin təşəkkülü və inkişafında aparıcı tədris və elmi mərkəz vəzifəsini yerinə yetirməli idi.

Azərbaycan Xalq Maarif Komissarlığının 1930-cu il 18 yanvar tarixli 5 saylı əmri ilə Ali Pedaqoji İnstitutun Bakı Universitetinin tərkibinə verilmiş professor-müəllim heyəti ilə yanaşı, universitetin pedaqoji fakültəsində çalışan elmi-pedaqoji kadrların xeyli hissəsi APİ-yə müəllimliyə cəlb olundular. Professorlar – M.M.Mirqasımov, B.V.Çobanzadə, Ə.S.Übeydulin, B.B.Komarovski; dosentlər – V.M.Xuluflu, Ə.K.Zəkuzadə, Z.Qayıblı, Ü.Ə.Hacıbəyli, S.C.Hüseynov, Z.M.Şahtaxtinskaya, S.X.Osmanzadə, C.Cəbrayılbəyli; baş müəllimlər – M.Z.Quliyev, N.Xalfin, A.Şaiq, H.Zeynallı, M.Ə.Abdullayev, A.A.Teterev, Ə.S.Hacıyev, T.H.Abdullayev, M.A.Şeydayev, V.M.Mustafazadə, H.İ.Əliyev, H.K.Xudaverdiyev, doktor Ə.X.Şahmalıbəyov və b. yeni ali pedaqoji məktəbdə çalışmağa başladılar.[1]

***Pənah Qasımov*** (01.09.1929–10.12.1930) instituta direktor, prof. B.B.Komarovski direktor müavini vəzifəsinə təyin edildilər.

Pedaqoji İnstitutda tədris prosesi və elmi işləri nizama salmaq kimi ciddi təşkilatçılıq işləri yerinə yetirildi. Kafedralar aparılacaq işlərin mərkəzinə çevrilməli idi. 1931-ci ilin sentyabr ayının 29-da İnstitutun Elmi Şurasının iclası keçirildi, orada kafedraların təşkil edilməsi məsələsi müzakirə edildi. Ali məktəbdə ilk olaraq 26 kafedra yaradıldı. Həmin kafedralara rəhbərlik görkəmli alim və mütəxəssislərə tapşırıldı. Siyasi iqtisad kafedrasına prof. B.B.Həsənbəyov, SSRİ tarixi kafedrasına prof. B.N.Tixomirov, Qərb tarixi kafedrasına prof. P.P.Fridolin, Yaxın Şərq tarixi kafedrasına A.A.Bukşpan, ÜİK(b)P tarixi kafedrasına M.Ə.Məmmədov, Dialektik materializm kafedra-

[1] Azərbaycan Sovet Ensiklopediyası, III c., Bakı, 1979, s. 314.



***Pənah Ələkbər oğlu Qasımov** 1881-ci ildə Cəbrayıl qəzasının Qarğabazar kəndində anadan olmuşdur. Kənd məktəbini bitirdikdən sonra 1901–1905-ci illərdə Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan şöbəsində təhsil almışdır. Sonralar təhsilini Tiflis Müəllimlər İnstitutunda davam etdirmişdir. Pənah Qasımov təhsilini başa vurduqdan sonra Lənkəran şəhər məktəbində fəaliyyətə başlamışdır. Lənkərandakı ikiillik fəaliyyətindən sonra Pənah Qasımov Bakıya qayıtmış və 6-cı rus-Azərbaycan məktəbində tarix müəllimi işləmişdir.*

*1925-ci ildən sonra Pənah Qasımov Xalq maarifi komissarının müavini, Ali Pedaqoji İnstitutun və Maarif Kadrlarının Təkmilləşdirmə İnstitutunun direktoru vəzifəsində çalışmışdır. Pənah Qasımov 1939-cu ildə vəfat etmişdir.*

sına prof. A.B.Çiçikalov, İqtisadi coğrafiya kafedrasına prof. M.H.Cuvarlinski, Pedaqogika kafedrasına M.Ə.Rəhimli, Dil-ədəbiyyat kafedrasına dos. Ə.Nəzmi, Riyaziyyat kafedrasına prof. M.R.Əfəndiyev, Psixologiya kafedrasına S.Q.Hacıyev, Geologiya və minerologiya kafedrasına prof. A.Z.Nazarenko, Təbiətşünaslıq və onun tədrisi metodikası kafedrasına prof. F.Ə.Rzabəyli, Bitkilərin morfologiyası və sistematikası kafedrasına prof. A.A.Qrossheym, Riyaziyyatın tədrisi metodikası kafedrasına prof. A.M.Ammosov, İnsan və heyvan fiziologiyası kafedrasına dos. A.A.Əmirov, Fizika kafedrasına dos. R.M.Məlikov, İctimaiyyat və tarixin tədrisi metodikası kafedrasına dos. A.A.Şapirov müdir təyin olundular. Dövrün tanınmış elmi pedaqoji qüvvələri – professorlar: H.V.Şahtaxtinski, A.B.Baqray, dosentlər: F.Ə.İbrahimbəyli, Ə.Y.Seyidov, Ə.S.Sumbatzadə, M.M.Mehdizadə, F.S.Qasımzadə, H.Q.Qasımzadə, H.Ə.Dadaşov, M.Ə.Axundov, B.R.Mirzəyev, K.Ə.Balakişiyev, M.M.Yerevanski, M.Ə.Hüseyn, M.Q.Əhmədli, A.M.Qarayev, S.R.Ocaqverdizadə, M.M.Möhsümzadə, Ə.A.Sultanlı, M.H.Rəfili və başqaları müvafiq kafedralarda işləməyə başladılar. İnstitutun professor-müəllim heyətinin qarşısında tədris prosesini nizama salmaqla yanaşı, daha çətin və məsuliyyətli vəzifə – milli pedaqoji kadrlar hazırlamaq dururdu. Ali pedaqoji təhsil ocağının yenidən təşkili respublika əhalisi tərəfindən ruh yüksəkliyi ilə qarşılandı. Azərbaycanın ayrı-ayrı rayonlarından müəllim olmaq arzusu ilə buraya gələnlərin sayı artdı.

Azərbaycan hökuməti daim APİ-nin yenidən təşəkkül tapıb böyüməsi və inkişafı qayğısına qalır, bu məqsədlə maddi yardım göstərir, çatışmaz-

lıqları aradan qaldırmağa çalışırdı. Yenidən təşkil olunduğu 1930–31-ci tədris ilində instituta 1143222 manat, 1931–32-ci tədris ilində 1668645 manat vəsait buraxıldı. Göstərilən yardım onun maddi bazasını xeyli möhkəmləndirdi.

Azərbaycan Dövlət Pedaqoji İnstitutunun təşkilati məsələlərinin həllində, tədris və elmi həyatının düzgün qurulmasında, kollektivin çoxsahəli fəaliyyətinin tənzimlənməsində 30–40-cı illərdə direktor vəzifəsində çalışmış Məmməd Bayramov (10.12.1930–22.02.1933), Bəşir Bünyadov (22.02.1933–21.12.1933), Mirzə Məmmədov (21.12.1933–25.05.1936), Davud Rəsulzadə (26.05.1936–31.02.1937), Hüseyn Musayev (31.01.1937–07.10.1937), Aqil Salayev (22.11.1937–27.11.1939), Camal Əliyev (22.11.1939–14.03.1940) və Ələsgər Həşimovun (14.03.1940–13.01.1942) xidmətləri böyük olmuşdur.

1931–32-ci tədris ilindən ümumtəhsil məktəbləri yeni plan və proqramlar əsasında işləməyə başladı. Müəllim və şagirdlərə tədris planında xeyli müstəqillik verən briqada-laboratoriya üsulu ləğv edildi, əvəzinə sinif-dərs sistemi tətbiq edildi. Tədris planı elmin strukturunu, məntiqini mühafizə edən tədris fənləri üzrə formalaşdırıldı.[1] Pedalogiya burjua elmi kimi ləğv edildikdən sonra ona qarşı qəti mübarizə aparıldı. Dövlətin və partiya orqanlarının bütün səyləri ali məktəblərdə, xüsusən pedaqoji institutlarda təhsilin tamamilə siyasətləşdirilməsinə yönəldi. SSRİ Mərkəzi İcraiyyə Komitəsinin «Ali məktəblərdə və texnikumlarda tədris proqramları və rejimi haqqında» 1932-ci il 19 sentyabr tarixli qərarında tədris planı və proqramlarındakı «ciddi nöqsanlar» tənqid obyektinə çevrildi. APİ-nin də tədris planlarında «qüsurlar» «aşkar» edildi. 20-ci illərin sonu və 30-cu illərin əvvəllərində ölkənin bütün ali məktəblərində tətbiqi məqbul sayılıb geniş yayılan «briqada-laborator metodu» zərərli üsul kimi qiymətləndirildi.

Tədris işindəki bir mühüm nöqsan da tədris planlarında ayrı-ayrı fənlər üzrə saatların düzgün bölünməməsi idi. Qərarla bağlı 1933-cü ilin yanvar ayının 7-də APİ-də tədris-istehsalat müşavirəsi keçirildi. İnstitut rəhbərliyi hökumətin qarşıya qoyduğu məsələləri nəzərdən keçirib tədrisin keyfiyyətini yüksəltmək məqsədilə konkret təkliflər irəli sürdü. Müşavirədən sonra APİ-də müəllim hazırlanmasında üzə çıxan nöqsanlar tədricən ara-

[1] **F.Rüstəmov.** Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri (1920–1991-ci illər) B., 1998, s.164.

dan qaldırıldı. Pedaqoji kadr hazırlığına ciddi məzmun və struktur dəyişikliyi edildi.

Gəncliyi «sosializm prinsipləri ruhunda tərbiyə etmək» məqsədilə SSRİ-nin bütün keçmiş pedaqoji institutlarında yeni fakültə yaradıldı. 1932-ci ilin sonunda APİ-də də yeni siyasi maarif fakültəsi açıldı.[1]

Respublikada məktəbəqədər uşaq tərbiyə müəssisələri də fəaliyyət göstərirdi. Məktəbəqədər müəssisələrin pedaqoji kadrlara böyük ehtiyacı vardı. Bu sahədə kadr ehtiyacını ödəmək məqsədilə 1930–31-ci dərs ilində Azərbaycan Pedaqoji İnstitutunun Pedaqoji fakültəsi nəzdində məktəbəqədər şöbə yaradıldı və ilk dəfə oraya 9 nəfər tələbə qəbul edildi. Şöbədə tədris Azərbaycan dilində aparılırdı. 1936-cı ildə şöbənin bazası əsasında məktəbəqədər fakültə təşkil olundu və dekan vəzifəsinə dos. D.M.Mustafayeva təyin edildi. Fakültədə Ə.Q.Qədimbəyovanın rəhbərliyi ilə Məktəbəqədər pedaqogika kafedrası yaradıldı. Kafedra 1941-ci ilin yayınadək fəaliyyət göstərdi. On il ərzində məktəbəqədər fakültəni 120 tələbə bitirmişdi.

APİ-nin əsas fakültələrindən biri olan Pedaqoji fakültədə ibtidai məktəblər üçün yüksəkixtisaslı müəllimlər hazırlanırdı. 1931–32-ci tədris ilində oranı 19, 1932–33-cü tədris ilində 39, 1934–35-ci tədris ilində 30, 1935–36-cı tədris ilində 38, 1936–37-ci tədris ilində 10, 1938–39-cu tədris ilində 7 və 1939–40-cı tədris ilində 26 nəfər qurtarmışdı. Buna baxmayaraq, hələ də respublikanın müəllim kadrları ilə təmin edilməsində ciddi çatışmazlıqlar mövcud idi. Orta ümumtəhsil məktəblərində çalışan pedaqoji kadrların böyük əksəriyyətinin tam orta təhsili yox idi. Bu da, öz növbəsində maarif və təhsil məsələlərində müəyyən çətinliklər törədirdi.

Doğrudur, ali pedaqoji məktəblər, ilk növbədə, APİ bu sahədə müəyyən dönüş yaratmışdı. Nəticədə ümumtəhsil məktəblərində ali təhsilli müəllimlərin tərkibində əsaslı kəmiyyət və keyfiyyət dəyişiklikləri baş vermişdi. Əgər 1932–33-cü dərs ilində respublikada çalışan 10432 müəllimin 693-ü ali, 6772-i orta, 2967-i natamam orta təhsilli idisə, 1935–36-cı tədris ilində 11106 müəllimin 1142-si ali, 8272-si orta, 1692-si natamam orta pedaqoji təhsilə malik idi. Göründüyü kimi, tam orta təhsili olmayan müəllimlərin nisbəti ilbəil azalır, ali və orta ixtisas üzrə pedaqoji təhsil alanların hesabına dəyişirdi. Yüksəkixtisaslı pedaqoji kadrların sayının 2 dəfə artması orta məktəblərdə tədrisin keyfiyyətini də xeyli yüksəltmişdi.

---

[1] Azərb.Resp.Təhsil Nazirliyinin cari arxivi. f.1, iş 31, vər.1.

Yenidən təşkil edilib müstəqil instituta çevriləndən sonra – 1930–31-ci tədris ilində APİ-nin ilk buraxılışı oldu. Təbiyyat-kimya fakültəsinin kimya ixtisasının Azərbaycan bölməsini 17, rus bölməsini 14, biologiya şöbəsini 14, riyaziyyat şöbəsini 31 nəfər bitirdi. İnstitutun İctimaiyyat və ədəbiyyat fakültəsinin tarix şöbəsinin Azərbaycan bölməsini 71, rus bölməsini 35, ədəbiyyat şöbəsini 25 nəfər bitirib respublikanın rayonlarına müəllimliyə göndərildilər.

1931–1932-ci tədris ilində institutun kimya-biologiya şöbəsini 27 (sonralar AEA-nın müxbir üzvü olmuş, kimya elmləri doktoru, prof. H.X.Əfəndiyev məzunların arasında idi) və İctimaiyyat-ədəbiyyat fakültəsinin ədəbiyyat şöbəsini 43 nəfər (sonralar görkəmli elm və ictimai xadim kimi yetişən – Azərbaycan EA üzvü, filologiya elmləri doktoru, prof. M.C.Cəfərov, Azərbaycan EA müxbir üzvü, filologiya elmləri doktoru, prof. Ə.C.Dəmirçizadə, şair Mirvarid Dilbazi, tanınmış ictimai xadim Çimnaz Aslanova və b. məzunların arasında idilər) ali məktəb diplomu ilə həyata vəsiqə aldı.

ADPİ 30-cu illərin əvvəllərində Qafqazda ən iri ali pedaqoji təhsil müəssisəsinə çevrilmişdi. Təsadüfi deyil ki, 1932-ci ildə bütün fakültə və ixtisaslar üzrə rus və erməni şöbələri də fəaliyyət göstərirdi.

1930–31-ci dərs ilində Azərbaycan Pedaqoji İnstitutunun nəzdində Müfəttiş-inspektor fakültəsi təşkil edildi. 1931–32-ci tədris ilində institutda türkləşdirilmə xətti (tədrisin və elmi işlərin ana dilində – Azərbaycan dilində aparılması nəzərdə tutulur) tamamilə başa çatdırıldı. Ali təhsil ocağına qəbul olunanların 80 faizi azərbaycanlılar idi, qalan 20 faiz də Azərbaycan dilində sərbəst danışırdı.

İnstitutda humanitar və ictimai fənlərin tədrisinin səmərəsinin yüksəldilməsində və gənc mütəxəssislərin vətənpərvər ruhda hazırlanmasında humanitar fakültələr mühüm rol oynayırdı. İctimai fənlərin tədrisinə 30-cu illərin əvvəllərindən etibarən daha ciddi fikir verilməyə başlandı. İctimai elmlərin tədrisinə ayrılan saatların həcmi ciddi surətdə artırıldı. Bu tədbirlər, öz növbəsində əsas ixtisaslar üzrə mütəxəssis hazırlanmasına mənfi təsir göstərdi.

Bunu daha aydın görmək üçün 1933–34-cü tədris ilində institutun məktəbəqədər şöbəsinin tədris planına nəzər yetirmək kifayətdir.

| № | Fənlərin adı | Saatların miqdarı |
|---|---|---|
| 1. | Dialektik materializm | 100 saat |
| 2. | ÜİK (b)P Kominterinin tarixi | 90 saat |
| 3. | Siyasi iqtisad | 120 saat |
| 4. | Leninizm | 80 saat |
| 5. | Türk (Azərbaycan) dili | 60 saat |
| 6. | Türk dili üzrə praktika | 50 saat |
| 7. | Rus dili | 350 saat |
| 8. | Ədəbiyyat | 100 saat |
| 9. | Pedaqogika | 220 saat |
| 10. | Məktəbəqədər pedaqogika | 390 saat |
| 11. | Pedaqoji praktika | 780 saat |
| 12. | Xarici dil | 240 saat |
| 13. | Bədii söz və uşaq kitabçası | 90 saat |

20-ci illərdən fərqli olaraq, 30-cu illərin ortalarında institutda humanitar və ictimai elmlər üzrə fənlərin saatları artırıldı və partiya tarixi, siyasi iqtisad kafedraları təşkil olundu. Yeni kafedraların tərkibinə təcrübəli və istedadlı elmi-pedaqoji qüvvələr cəlb edildi. 30-cu illərin əvvəllərindən respublikanın ən böyük pedaqoji təhsil ocağına çevrilən APİ müəllim kadrlarının hazırlanmasında əsas rol oynayırdı. İnstitut tələbələrinin tərkibində də əsaslı kəmiyyət və keyfiyyət dəyişiklikləri nəzərə çarpırdı. 1932–33-cü tədris ilində ali məktəbə 588 nəfər tələbə qəbul edilsə də, onların yalnız 255 nəfəri ali məktəbi müvəffəqiyyətlə bitirə bilmişdi. APİ-nin o zamankı məzunları arasında sonralar görkəmli elm xadimləri və yazıçı kimi tanınan ziyalılar – akademiklər: M.Şirəliyev, Həmid Araslı, professorlar: Mərdan Muradxanov, Əhməd Seyidov, xalq yazıçıları Mehdi Hüseyn, Süleyman Rəhimov, Məmməd Rahim, dramaturq Sabit Rəhman və b. vardı.

30-cu illərdə APİ-də tədris, elmi-metodiki işlər yenidən quruldu, kafedra və laboratoriyaların sayı artdı, kitabxana fondu xeyli çoxaldı.

Respublikada ümumtəhsil məktəbləri şəbəkələri 20-ci illərin sonu – 30-cu illərin əvvəllərində xeyli genişləndi. Müəllim kadrlarına olan ehtiyacı ödəmək üçün tam ali təhsil almayan, savadlı və hazırlıqlı şəxslərdən də istifadə edilirdi. Sonralar Azərbaycan Xalq Maarif Komissarlığı müəllimlərin ixtisasını artırmaları üçün bir sıra tədbirlər həyata keçirdi. Ali təhsil sahəsində yeri-

dilən siyasət, aparılan islahatlar çox hallarda demokratik proseslərin, peşəkarların nüfuzunun zəifləməsi ilə nəticələnirdi. Belə tədbirlərdən biri də natamam ali təhsilli müəllimlər üçün qiyabi yolla, işdən ayrılmadan tam ali təhsil almaq imkanının yaradılması idi. İlk qiyabi pedaqoji məktəblər Respublika Xalq Maarif Komissarlığının təşəbbüsü ilə 1927-ci ildə təşkil edilmişdi. Qiyabi Pedaqoji məktəbi bitirənlərin ali təhsil almasından ötrü Azərbaycan XKS-nin 1929-cu il 25 aprel tarixli qərarı ilə Dövlət Universitetinin nəzdində Qiyabi Pedaqoji fakültə də yaradılmışdı. Qiyabi Pedaqoji fakültənin Azərbaycan və rus bölmələrində məktəbəqədər, fizika-riyaziyyat, Azərbaycan dili və ədəbiyyatı, rus dili və ədəbiyyatı ixtisasları üzrə müəllimlər hazırlanırdı.

Dövlət Universiteti 1930-cu ildə müstəqil sahə institutlarına bölünəndə Qiyabi Pedaqoji fakültə ayrıca Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutuna çevrildi. Müstəqil fəaliyyət göstərdiyi illərdə orada 4 ixtisasdan əlavə, kimya-biologiya şöbəsi də təşkil edildi. 1931–1932-ci tədris ilində institutda daha üç yeni ixtisas üzrə şöbələr yaradıldı və təhsil alanların sayı 3 mindən artıq oldu. İnstitutun yay sessiyaları əvvəllər Gəncə, Şəki və Şuşada keçirilirdi. Sonralar sessiya Bakı məktəblərində də keçirilməyə başladı. 1932-ci ildə Qiyabi Pedaqoji İnstitut Xalq Maarif Kadrlarının İxtisasını Artırma İnstitutunun tərkibinə daxil edildi. Hər iki institut isə 1933-cü ilin əvvəlində APİ-yə birləşdirildi. Bundan sonra Azərbaycan Pedaqoji İnstitutunda bir sıra ixtisaslarla bağlı yeni şöbələr təşkil edildi. Qiyabi təhsil yolu ilə tarix, dil-ədəbiyyat, fizika-riyaziyyat, kimya-biologiya və ibtidai sinif müəllimlərinin yetişdirilməsi nəzərdə tutuldu.

Moskvada – Kremldə işləyən ermənipərəst qüvvələrin, xüsusilə də A.İ.Mikoyanın yaxından yardımı ilə 30-cu illərin əvvəllərində Levon Mirzoyan Azərbaycan Partiya Təşkilatının rəhbərliyində sözü keçən simalardan birinə çevrildi. O, qısa zamanda bütün erməni millətçilərini ətrafına topladı. Bundan sonra respublikanın partiya, sovet, inzibati-təsərrüfat orqanlarında, maarif, elm, təhsil sistemində, o cümlədən ali məktəblərdə ermənilərin yüksək və məsul vəzifələrə «irəli çəkilməsi» prosesi başlandı. Bu xətt çox «incə metodlarla» və məkrlə həyata keçirilirdi. 1932–1933-cü tədris ilində APİ-nin bütün fakültələrində erməni şöbələrinin açılması bu «məkrli siyasətin» nəticəsi idi. Erməni şöbələrinin təşkili institutun tələbə və professor-müəllim heyəti tərkibində ermənilərin ildən-ilə artıb genişlənməsinə və möhkəmlənməsinə səbəb oldu.

1937–1938-ci illərin kütləvi repressiyaları zamanı APİ-nin kafedralarına rəhbərlik edən istedadlı və təcrübəli milli elmi-pedaqoji qüvvələrlə yanaşı, Azərbaycan xalqının tarixini və mədəniyyətini yüksək qiymətləndirən görkəmli rus alimlərinin də bir qrupu sıradan çıxarıldı. İnstitutun kafedralarında məsul vəzifələrə maneəsiz olaraq ermənilər yerləşdirildi. 30-cu illərin sonu – 40-cı illərin əvvəllərindən başlayaraq bu proses sürətlə həyata keçirilməyə başlandı. Nəticədə APİ-nin SSRİ tarixi kafedrasına rəhbərlik etmək heç bir elmi dərəcəsi olmayan M.Q.Əsriyana tapşırıldı. O, professor vəzifəsini icra etmək hüququna malik oldu. Eləcə də siyasi iqtisad kafedrasına T.A.Petrosyan müdir təyin edildi və professor elmi adına layiq bilindi. 40-cı illərin əvvəlində İngilis dili kafedrasına rəhbərlik tədris və elmi yaradıcılıq işində heç bir səriştəsi, təcrübəsi və elmi dərəcəsi olmayan T.O.Akopovaya tapşırıldı. 30–60-cı illərdə İqtisadi coğrafiya kafedrasına T.A.Koçaryan, Marksizm-leninizm kafedrasına Q.A.Simonyan rəhbər qoyuldu. Həmin dövrdə Ümumi tarix kafedrasında S.P.Ağayan, A.A.Paidikyan, A.S.İonesyan, Sov.İKP Tarixi kafedrasında Q.S.Aslanyan, Dialektik və tarixi materializm kafedrasında A.A.Balayan, Pedaqogika və psixologiya kafedrasında Q.Q.Karamyan, A.M.Tevosyan, Fiziologiya kafedrasında N.A.Mandelyan, Rus dili kafedrasında V.Z.Keramyan, Dil-ədəbiyyat fakültəsində A.A.Qəribyan və A.A.Balayan çalışırdılar. Yeri gəlmişkən, qeyd edək ki, bu proses 60-cı illərədək davam etmişdir. Belə ki, bəhs olunan dövrdə, Riyaziyyat fakültəsində X.O.Qayamova, A.A.Kartaşyan, S.A.Xaçiyan, E.S.Qriqoryan, Fizika kafedrasında S.S.Baqdasaryan, T.A.Qakisov, Botanika kafedrasında V.M.Vartanov millətçiliyə köklənən siyasi ambisiyalarını gizlində gerçəkləşdirməyə can atırdılar. Fəlsəfə kafedrasında çalışan dos. Sarkisov İnstitut Partiya təşkilatının katibi kimi məsul vəzifəyə irəli çəkilmişdi. O, 70-ci illərin əvvəlində institutun Xankəndi filialının direktoru, 80-ci illərin başlanğıcında isə Xankəndi Pedaqoji İnstitutunun rektoru təyin edilmişdi. Ermənilər təkcə Azərbaycanın bir ali məktəbinin bu qədər mühüm işlərini əllərində cəmləşdirib faydalanmalarına, həmişə ön cərgələrə çəkilmələrinə baxmayaraq, sonralar nankorluqla bütün dünyaya bağırdılar ki, ölkəmizdə «əzilir», «sıxışdırılırlar»...

30-cu illərin əvvəllərində respublikada 593 nəfər ali, 6872 nəfər isə natamam orta təhsilli müəllim var idi. Lakin bu artım hələ də respublikada milli müəllim kadrlarına olan böyük ehtiyacı ödəmirdi. Həmin vəzifənin müvəffəqiyyətlə həyata keçirilməsi üçün respublika hökuməti APİ-nin büdcəsini daim artırırdı. 1934-cü ildə institutun təsərrüfat, tədris, elmi işlər və tələbələrin

maddi təminatı üçün 284996 manat vəsait ayrılmışdır ki, bunun 576115 manatı pedaqoji heyətə, 1144554 manatı isə tələbələrin maddi təminatına sərf edilmiş, 226657 manatı inzibati və təsərrüfat xərclərinə, 137670 manatı tədris və elmi işlərə xərclənmişdi.

İnstitutda tədris işlərinin yaxşılaşması nəticəsində təlim keyfiyyəti yüksəldi. 1933–34-cü tədris ilində APİ tədris keyfiyyətinə görə Ümumittifaq ali məktəbləri içərisində üçüncü yer tutdu.

Azərbaycan Pedaqoji İnstitutu 30-cu illərin I yarısında sürətli inkişaf yoluna qədəm qoydu, tələbələrin sayı xeyli artdı. 1930–1931-ci tədris ilində institutda 950 tələbə olduğu halda, 1934–35-ci dərs ilində onların sayı 1316 nəfərə çatdı. Təkcə 1931–1934-cü illərdə buranı 833 nəfər uğurla başa vurub, müəllim adına layiq görüldü. Həmin məzunların 764 nəfəri azərbaycanlı idi. 30-cu illərin II yarısından başlayaraq institutun maddi bazası da möhkəmləndi. Artıq 1934–35-ci tədris ilində tələbələrin 96 faizi təqaüdlə təmin edilir, ailəli tələbələr üçün yüksək təqaüd müəyyən olunurdu.

Tələbələrin məişət şəraiti tədricən yaxşılaşırdı. 1934-cü ildə ümumi yataqxananın I hissəsi tikilib istifadəyə verildi və orada 300 tələbə yerləşdirildi.

Elmi biliklərin əsaslarına yiyələnmələri üçün tələbələrin yeni dərslik, dərs vəsaiti və başqa ədəbiyyatla təchiz edilməsində də irəliləyiş nəzərə çarpırdı. 1934-cü ildə institutun kitabxanasında Azərbaycan, rus və b. dillərdə 100 mindən artıq dərslik, dərs vəsaiti və bədii ədəbiyyat vardı.

1934-cü ildə Tarix-ictimaiyyat fakültəsi (1930-cu ildən fəaliyyət göstərirdi) nəzdindəki tarix şöbəsi müstəqil fakültəyə çevrildi. İnstitutda coğrafiya şöbəsi və ümumi coğrafiya kafedrası yarandı və prof. A.Cavaxaşvili coğrafiya kafedrasının müdiri təyin edildi. Tədris planında ciddi dəyişiklik aparıldı, ayrı-ayrı fənlərə verilən saatların miqdarı artırıldı.

Keçmiş SSRİ-də əsas ünsiyyət vasitəsi rus dili idi. İdarələrdə sənədləşmə rus dilində aparılırdı. Rus dilini öyrənmədən mərkəzlə əlaqə yaratmaq mümkün deyildi. Buna görə də 30-cu illərin ortalarından respublikada ali təhsilli rus dili müəllimlərinə «böyük ehtiyac» vardı. 1935-ci ilin yanvar ayında çağırılmış VIII Ümumazərbaycan Sovetlər Qurultayı pedaqoji texnikum və pedaqoji institutlar vasitəsilə rus dili müəllimlərinin hazırlanmasına və məktəblərdə rus dilinin tədrisi vəziyyətinin yaxşılaşdırılmasına xüsusi diqqət verməyi qərara aldı. Qurultayın çıxardığı qərara əsasən 1936-cı ildə APİ-nin Filologiya fakültəsi nəzdində rus dili və ədəbiyyatı şöbəsi açıldı. Həmin dövrdə respublikanın ali pedaqoji institutlarını vahid bir mərkəzdə birləşdirmək qərara

alındı, tarix-filoloji, fizika-riyaziyyat və təbiyyat şöbələrindən ibarət İkiilik Müəllimlər İnstitutu APİ-nin tərkibinə daxil edildi.

İnstitut əməkdaşları müxtəlif fənlərin tədrisi və elmin ayrı-ayrı sahələrinin aktual problemləri haqqında maraqlı tədqiqat əsərləri yazıb çap etdirirdilər. «APİ Xəbərləri»nin 1935-ci ildən nəşrə başlaması bu sahədə mühüm addım idi. Nəşrin məsul redaktoru o zamanlar institutun direktoru işləyən Mirzə Məmmədov idi.

Qiyabi ali pedaqoji təhsil sistemində tez-tez təşkilati dəyişikliklər baş verir, onun normal fəaliyyətinə mane olunurdu. Azərbaycan Xalq Maarif Komissarlığının 1936-cı il 8 avqust tarixli 66 saylı əmrinə əsasən qiyabi şöbə yenidən APİ-dən ayrılıb Xalq Maarif Kadrlarının İxtisasını Artırma İnstitutuna birləşdirildi. Lakin yerdəyişmə problemin həllinə o qədər də yardım etmədi. Çünki qiyabi şöbədə ixtisasların və tələbələrin sayı sürətlə artırdı. Bu, qiyabi təhsilin təşkilinin yeni formalarını arayıb tapmaq zərurətini meydana gətirirdi. 1936–37-ci tədris ilində qiyabi təhsilə cəlb olunan tələbələrin sayı 4 min nəfərə yaxın idi. Azərbaycan Xalq Komissarları Soveti obyektiv vəziyyəti nəzərə alaraq 1937-ci ildə qiyabi şöbənin müstəqil Qiyabi Pedaqoji İnstituta çevrilməsi haqqında xüsusi qərar qəbul etdi və APİ-də iki ali məktəb fəaliyyət göstərməyə başladı:

a) təhsil müddəti dörd il olan Pedaqoji İnstitut;

b) təhsil müddəti bir və iki il olan Müəllimlər İnstitutu.

1937–38-ci tədris ilində APİ nəzdində fəaliyyət göstərən Müəllimlər İnstitutunda tələbə kontingenti aşağıdakı kimi idi.

| Fakültələr | Qəbul | Kontingent | Buraxılış |
|---|---|---|---|
| Ədəbiyyat | 56 | 255 | 169 |
| Tarix | – | 73 | 73 |
| Təbiyyat-coğrafiya | 73 | 125 | 52 |
| Fizika-riyaziyyat | 55 | 164 | 109 |
| **Cəmi:** | **184** | **617** | **403** |

Orta məktəblərdə xarici dil fənlərindən dərs deyən yüksəkixtisaslı müəllimlər hazırlamaq üçün Azərbaycan Xalq Maarif Komissarlığının 1937-ci il 5 mart tarixli 171 saylı əmri ilə V.İ.Lenin adına APİ-də və İkiillik Müəllimlər İnstitutunda həmin ilin sentyabr ayının 1-də Xarici dillər fakültəsi və kafedrası açıldı. Kafedraya rəhbərlik etmək prof. O.Neffə tapşırıldı. İkiillik Müəllimlər İnstitutu 1938-ci ilə kimi APİ-nin nəzdində fəaliyyət göstərdi.

Orta məktəblərdə ixtisaslı müəllim kadrlarının çatışmaması ilə əlaqədar olaraq Azərbaycan Xalq Maarif Komissarlığı 1938-ci il 2 noyabr tarixli əmrlə APİ-nin nəzdindəki İkiillik Müəllimlər İnstitutunu ayırıb müstəqil instituta çevirdi.

Azərbaycan Dövlət Pedaqoji İnstitutunda tələbələrin sayı artdıqca ayrı-ayrı ixtisaslar üzrə kadr hazırlığı da genişlənirdi. İnstitutda ondan artıq ixtisas üzrə kadr hazırlandı.

İnstitutun maddi-texniki bazasının möhkəmləndirilməsinə respublika hökuməti xüsusi qayğı göstərirdi. 1933–1934-cü tədris ilində institutun kadr hazırlığına və təsərrüfat işlərinə 2186869 manat vəsait ayrıldığı halda, 1936–1937-ci dərs ilində Azərbaycan XKS-nin göstərişi ilə bu məbləğ üç dəfəyə yaxın artırılıb 6775414 manata çatdırıldı. Bu, institutun genişləndirilib böyüməsinə, professor-müəllim heyətinin və tələbələrin tərkibinin durmadan artmasına səbəb oldu. Tələbələrin sayı 1936–1937-ci tədris ilində 1512 nəfər idi.

30-cu illərin ortalarında APİ-yə tələbə qəbulu, onların ümumi sayı və buraxılışı belə idi:

| **Tədris ili** | **Qəbul** | **Tələbələrin sayı** | **Buraxılış** |
|---|---|---|---|
| 1932–33 | 550 | 823 | 63 |
| 1933–34 | 416 | 1300 | 165 |
| 1934–35 | 482 | 1288 | 213 |
| 1935–36 | 682 | 1192 | 164 |
| 1936–37 | 710 | 1512 | 213 |

ADPİ-ni 1935–1937-ci illərdə 377 nəfər bitirərək respublikanın məktəblərində müəllimliyə göndərildi. Məzunlardan bir qrupu – Əsəd İbrahimov, Zəkəriyyə Mehdizadə, Xanmurad Mirzəyev, Məmmədiyyə Əfəndiyev təhsildə fərqləndikləri üçün institutun aspiranturasında saxlandılar.

Tarix fakültəsini 1936–1937-ci tədris ilində Nəzər Paşayev, Kərim Əbdürrəhimov, Əhməd Cəfərov, Yunis Ələsgərov, Həmzə Bineyev; Ədəbiyyat fakültəsini Mirzağa Quluzadə, Mirdavud Seyidov bitirdilər. Sonralar onların hamısı maarif və ali təhsil məktəblərində çalışan peşəkar müəllimə və tanınmış alimə çevrildilər.

İnstitutda 1937–1938-ci tədris ilində 1533 tələbə təhsil alırdı.

1938–1939-cu dərs ilində illik, altıaylıq və üçaylıq hazırlıq kursları yaradıldı. Kurslarda 850 nəfərə qədər gənc oxuyurdu. Tədris ilinin əvvəlində tələbələrin sayı 1934 nəfər idi. Onlardan 670-i yeni qəbul edilmişdi. İnstitutun tarixində ilk dəfə idi ki, tələbə qəbulunda müsabiqə üsulundan istifadə olunurdu. Həmin tədris ili bir də onunla əlamətdardır ki, ədəbiyyat şöbəsi müstəqil fakültəyə çevrildi. Dil və ədəbiyyat fakültəsinin nəzdində qeyri-rus məktəblərində dərs demək üçün rus dili müəllimi hazırlayan beynəlmiləl şöbə fəaliyyətə başladı. Xeyli genişləndirilən şöbədə 118 nəfər tələbə təhsil alırdı. Eyni zamanda xarici dillər üzrə müəllim kadrlarının yetişdirilməsi yaxşılaşdırıldı. 1941-ci ilin iyun ayında Xarici dillər fakültəsində 190 nəfər tələbə vardı. Onların yalnız 24 nəfəri azərbaycanlı qadın idi. 1940–1941-ci tədris ilində Azərbaycan Pedaqoji İnstitutunda 95 nəfər tələbə xarici dil ixtisası üzrə ali təhsilini başa çatdırdı.

Əgər 1932–1933-cü tədris ilində cəmi üç fakültədə 1097 tələbə oxuyurdusa, 1940–1941-ci tədris ilində orada təhsil alanların sayı təxminən iki dəfə artaraq 2055 nəfərə çatdı.

1932–1933-cü tədris ilində fakültə və qruplar üzrə tələbə kontingentinin dinamikası belə idi:

| **Fakültələr** | **İnstitutda ümumi tələbə kontingenti** | **O cümlədən kurslar üzrə** | | | |
|---|---|---|---|---|---|
| | | **I** | **II** | **III** | **IV** |
| Təbiyyat-riyaziyyat | 508 | 179 | 178 | 131 | 20 |
| İctimaiyyat-ədəbiyyat | 331 | 136 | 128 | 48 | 19 |
| Pedaqogika | 288 | 158 | 62 | 44 | 24 |
| **Cəmi:** | **1127** | **473** | **368** | **223** | **63** |

Lakin 30-cu illərin ikinci yarısından etibarən institutun fakültələrində və ixtisas profillərində ciddi dəyişikliklər edildi, şöbələr şəklində birləşmiş fakültələrin bazası əsasında müstəqil fakültələr yaradıldı. Nəticədə müəllim kadrlarının hazırlanmasında kəmiyyət və keyfiyyət dəyişiklikləri baş verdi. Bunu aşağıdakı cədvəldən aydın görmək olar:

| Tədris illəri | Dərs ilinin əvvəlində tələbə kontingenti | Qəbul | Buraxılış |
|---|---|---|---|
| 1930–31 | 1039 | 350 | 126 |
| 1931–32 | 1531 | 455 | 265 |
| 1932–33 | 921 | 555 | 256 |
| 1933–34 | 1015 | 500 | 63 |
| 1934–35 | 1339 | 800 | 224 |
| 1935–36 | 1867 | 960 | 389 |
| 1936–37 | 2154 | 1030 | 365 |
| 1937–38 | 1533 | 560 | 218 |
| 1938–39 | 1934 | 1050 | 334 |
| 1939–40 | 2045 | 600 | 261 |
| 1940–41 | 2055 | 600 | 571 |

APİ-də 1940–1941-ci tədris ilində yeni qəbul olunanlarla birlikdə 2055 nəfər tələbə oxuyurdu. Bunların 758 nəfəri azərbaycanlı, 760 nəfəri erməni, 331 nəfəri rus, 186 nəfəri başqa millətlərin nümayəndələri idi. Ermənilərin apardığı mənfur siyasətin yekunu göz qabağındadır. Onların sayının yerli millətlərin hamısından çoxluğu məhz sonralar bütün Azərbaycana sahib çıxmaq ideyasının mayasında duran məkrli tədbirlərdən biri idi.

İnstitutun əsaslı kitabxanası 1930–1940-cı illərdə yenidən quruldu, onun fondları yeni tədris ədəbiyyatı və elmi-tədqiqat əsərləri ilə zənginləşdirildi. 1940–1941-ci dərs ilində kitabxanada 150 min nüsxə kitab vardı. Onun ayrı-ayrı fondlarından 2177 oxucu istifadə edirdi.

Azərbaycan Pedaqoji İnstitutu 30-cu illərdə tədris işinin yenidən təşkilini başa çatdırmaqla, yüksəkixtisaslı pedaqoji kadrlar hazırlamaqla respublikada əsas və aparıcı ali məktəbə çevrildi. Xalq maarifi sistemi üçün kadrlar hazırlayan pedaqoji təhsil ocaqlarının səyi nəticəsində respublikada yeni müəllimlər ordusu yarandı. 1939–1940-cı tədris ilində Azərbaycan məktəblərində çalışan 21310 müəllimin 4386 nəfəri ali təhsilli idi. Bunun da əsas hissəsini Azərbaycan Pedaqoji İnstitutunu bitirənlər təşkil edirdi. Ümumiyyətlə, 30-cu illərdə respublikanın ali və orta ixtisas pedaqoji təhsil ocaqlarını başa vurmuş 13 minə qədər müəllimin 12500 nəfəri azərbaycanlı, o cümlədən 10 min nəfəri kişi, 2500 nəfəri qadın idi.

## 1.4. AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ İNSTİTUTUNDA ELMİ-PEDAQOJİ KADR HAZIRLIĞI
### *(1930–1941-ci illər)*

Azərbaycan Dövlət Pedaqoji İnstitutu 30-cu illərdən başlayaraq milli elmi-pedaqoji kadrların hazırlanmasında yaxından iştirak edirdi. Digər ali məktəblərdə olduğu kimi, burada da zəngin təcrübə toplamış, yaşlı nəslə mənsub görkəmli pedaqoq alimlərlə yanaşı, 20-ci illərdə Bakı Universitetini və Azərbaycan Pedaqoji İnstitutunu bitirmiş gənc, istedadlı müəllimlər çalışırdılar. Onların səyi sayəsində tədrislə bərabər səmərəli elmi axtarışlar da aparılırdı. Elmi axtarışların əksəriyyətində yenilik ruhu, tələbkarlıq əzmi duyulurdu.

Respublikada elmi-pedaqoji kadrların aspirantura yolu ilə hazırlanması qarşıda duran vacib məsələlərdən biri sayılırdı. SSRİ hökumətinin 1929-cu il 26 iyun tarixli «Elmi kadrlar haqqında» qərarından və ÜİK (b)P MK-nın 1929-cu il noyabr Plenumunun «Fəhlə və kəndlilər içərisindən gənc elmi qüvvələrin irəli çəkilməsi, elmi-pedaqoji kadrların keyfiyyətinin yaxşılaşdırılması və sayının artırılmasına dair» qətnaməsindən sonra SSRİ-də aspirantura sistemi yenidən təşkil edildi. Gənc elmi qüvvələrə böyük ehtiyac olduğunu nəzərə alıb 1933-cü ildə APİ-nin nəzdində də aspirantura şöbəsi yarandı. Şöbəyə ilk dəfə Əşrəf Quliyev müdir təyin edildi. Sonralar Ə.Nəzərli, Q.Qorski, Mir Cəlal da bu vəzifədə işlədilər. 1933-cü ilin mart ayının 7-də instituta 25 nəfər aspirant (4 nəfər riyaziyyat, 4 nəfər qeyri-üzvi kimya, 2 nəfər üzvi kimya, 5 nəfər ədəbiyyat, 2 nəfər zoologiya, 2 nəfər partiya tarixi və leninizm, 12 nəfər pedaqogika ixtisası üzrə) qəbul edildi. Aspiranturaya daxil olanların arasında Səməd Vurğun, Osman Sarıvəlli, Əziz Əsgərov, Şamxal Məmmədov, Cəfər Xəndan, Həmid Araslı, Mir Cəlal, Mehdi Mehdizadə, Əhməd Seyidov vardı. Oktyabr ayında Əbdüləzəl Dəmirçizadə, Muxtar Hüseynzadə, Həsi Abdullayev, Şamil Əliyev, İmran Babayev, İsmayıl Əfəndiyev, Salman Quluzadə və b. əlavə olaraq aspiranturaya çağırıldılar. Aspirantların çoxu sonralar Azərbaycanda elm, ədəbiyyat və pedaqoji fikir sahəsində tanınmış görkəmli şəxsiyyətlər kimi yetişdilər.

Yenidən müstəqil fəaliyyətə başlaması institutun elmi-pedaqoji kadrlarının tərkibində kəmiyyət dəyişikliklərinə səbəb olsa da, hələ də müəllimlərin milli tərkibi qaneedici, elmi potensialı yüksək deyildi. 1930–1931-ci tədris ilində 164 nəfərlik elmi-pedaqoji heyətin cəmi 19 nəfəri professor, 57 nəfəri dosent idi, bunların arasında elmlər doktoru və elmlər namizədi azlıq təşkil edirdi.

| Tədris illəri | Akademik heyətinin ümumi sayı | O cümlədən: | | | | | |
|---|---|---|---|---|---|---|---|
| | | azərb.-lar | başqa millət. nümay. | Prof. | dos. və dos. əvəzi | baş müəllimlər | assist. və müəllimlər |
| 1 | 2 | 3 | 4 | 5 | 6 | 7 | 8 |
| 1930–31 | 164 | 76 | 88 | 19 | 57 | 49 | 39 |
| 1931–32 | 178 | 87 | 91 | 17 | 46 | 50 | 65 |
| 1932–33 | 173 | 93 | 80 | 14 | 34 | 45 | 79 |
| 1933–34 | 186 | 101 | 85 | 12 | 36 | 42 | 108 |
| 1934–35 | 190 | 96 | 94 | 10 | 39 | 47 | 104 |
| 1935–36 | 198 | 102 | 96 | 13 | 42 | 51 | 105 |
| 1936–37 | 201 | 114 | 83 | 16 | 35 | 63 | 103 |
| 1937–38 | 208 | 106 | 102 | 10 | 16 | 76 | 96 |
| 1938–39 | 197 | 97 | 100 | 13 | 58 | 65 | 59 |
| 1939–40 | 241 | 109 | 132 | 8 | 45 | 123 | 58 |
| 1940–41 | 240 | 109 | 131 | 8 | 57 | 131 | 44 |

APİ-nin başlıca vəzifəsi müəllim kadrları hazırlamaq idi. Bununla belə görülən tədbirlər sayəsində elmi-tədqiqat işlərinin səmərəsi yüksəldi və institut elmi-pedaqoji kadr hazırlayan elmi mərkəzə çevrildi. Kafedralarda elmin müxtəlif sahələrində ciddi elmi axtarışlar geniş vüsət aldı.

**Fizika-riyaziyyat fakültəsində elmi-tədqiqat işləri.** Fizika-riyaziyyat fakültəsi 1930-cu ildə yenidən təşkil edildi. Fakültənin nəzdində bir neçə kafedra yarandı. Dəqiq elmlər sırasında öz yeri və xüsusi çəkisi olan fizika kafedrasına 1922–1934-cü illərdə dos. R.M.Məlikov, 1934–1936-cı illərdə prof. V.İ.Tixomirov, 1936–1937-ci ildə dos. A.Q.Alfimov rəhbərlik etdilər. Görkəmli professorlar: S.N.Usatıy, E.B.Lopuxin, V.P.Juze və dos. N.N.Popov kafedrada fizika sahəsində gənc azərbaycanlı elmi-pedaqoji qüvvələri (B.R.Mirzəyev, M.S.Əliyev, Z.İ.Əlizadə, A.A.Axundov, M.H.Ramazanzadə, A.Q.Abbaszadə, R.Q.Həsənov, M.Q.Abdullayev və b.) formalaşdırdılar. Fizika üzrə tədqiqatların təşkili üçün zəmin hazırlandı. Kafedra respublikada fizika sahəsində yeni elmi-tədqiqat mərkəzlərinin yaradılmasında da yaxından iştirak edirdi. Öz tədqiqatlarını genişləndirən A.Q.Abbaszadə 1937-ci ildə «Xəzər dənizinin istilik tutumu və buxarlanma əmsalının tədqiqi» mövzusunda nami-

zədlik dissertasiyası müdafiə etdi. Əsər dövrün səmərəli və təcrübi əhəmiyyətli probleminin həllinə həsr olunmuşdu. Kafedra əməkdaşlarının bir sıra əsərləri işıq üzü gördü. Prof. Y.B.Lopuxin «Dəmir və poladın gərilməsi prosesində maqnit hadisələri» (1936), Y.B.Lopuxin, N.N.Popov, A.Q.Abbaszadə «Radiumun əsasında Bakı rayonlarının neftinin tədqiqi» (1936), M.H.Ramazanzadə «Xəzər dənizi sularının temperatur sıxlığının müəyyən edilməsi» və B.R.Mirzəyev «Molekulyar fizika» (1933), «Fizikadan praktikum» (1935) kimi kitablar çap etdirdilər. Aparılan tədqiqatların tədricən genişlənməsi kafedranın nüfuzunu nəinki respublikada, hətta keçmiş İttifaqda artırdı. 1938–1939-cu illərdə kafedranın müdiri, dos. A.Q.Abbaszadə SSRİ EA-nın Xəzər dənizini Öyrənən Komissiyasının tapşırığı ilə tədqiqatlar aparırdı. Nəticədə Xəzər dənizi sularının fiziki tərkibi öyrənildi, onun istilikkeçiriciliyi, elektrikkeçirmə qabiliyyəti və istilik əmsalı müəyyən edildi. Tədqiqatın yekunları 1938–1939-cu illərdə SSRİ EA-nın Azərbaycan filialının əsərlərində dərc olundu. A.Q.Abbaszadənin «Mayelərin daxili sürtünməsinin müasir metodları» (1939), «Fizikadan terminlər» (Z.İ.Əlizadə ilə birlikdə, 1939), «Aşağı temperaturda neft məhsullarının özlülüyünün tədqiqi» monoqrafiyalarının nəşri Azərbaycanda fizika elminin o dövrdəki mühüm nailiyyəti idi.

Fizika-riyaziyyat fakültəsinin Riyaziyyat kafedrasında da istedadlı elmi-pedaqoji kadrlar – professorlar: A.S.Kovanko, A.A.Bukşpan, A.A.Ammosov, M.R.Əfəndiyev kimi təcrübəli riyaziyyatçılarla birlikdə elmi perspektivli gənc dosentlər: Z.İ.Xəlilov, Ə.İ.Hüseynov, M.Ə.Cavadov, İ.İ.İbrahimov, H.İ.Əmirxanov, M.L.Rəsulov, C.N.Qasımov, T.H.Abdullayev, B.M.Yusifzadə, H.İ.Rzayev, B.Ə.Ağayev və M.A.Şeydayev çalışır, tədris işində fəallıq göstərir, səmərəli elmi axtarışlar aparırdılar.

Fakültənin Azərbaycan bölməsi əməkdaşlarının təşəbbüsü ilə ana dilində riyaziyyatdan ilk dərslik və tədris vəsaitləri – prof. M.R.Əfəndiyevin «Riyaziyyatdan məsələlər» (1932), A.M.Ammosovun «Riyaziyyatdan əyani vəsait» (1936) çap edildi. 1939–1940-cı dərs ilində Riyaziyyat kafedrası iki yerə: riyazi analiz (müdiri prof.M.R.Əfəndiyev) və həndəsə (müdiri V.M.Əfəndiyev) kafedralarına bölündü.

**Təbiyyat-kimya fakültəsində elmi-tədqiqat işləri.** Fakültənin Botanika, Zoologiya, İnsan və Heyvan fiziologiyası, Biologiya, Geologiya, Təbiətşünaslıq kafedralarında görkəmli alimlər çalışırdılar. Botanika kafedrası daha yüksəkixtisaslı elmi-pedaqoji qüvvələrdən komplektləşmişdi. Kafedraya 1930–1935-ci illərdə görkəmli rus alimi, akademik A.A.Qrossheym, 1936-cı ildə prof. A.A.Şutov, 1937–1941-ci illərdə isə dos. M.M.Ağamirov başçılıq etmiş-

dir. Kafedrada habelə dos. S.X.Osmanzadə, M.Hacıyev, Y.M.İsayev və b. elmi axtarışlarla məşğul idilər. Kafedranın əməkdaşları tədris prosesi və laboratoriya məşğələlərini təmin etmək üçün herbari fondu yaratmaqla bərabər, respublikanın zəngin bitki aləmini öyrənir, Azərbaycan dilində ilk dərslik və vəsaitlərin hazırlanmasında, elmi və elmi-metodiki ədəbiyyatın tərcümə edilməsi və tərtibində yaxından iştirak edirdilər. İnstitutun bioloq-alimləri aktual problemlərin həllində və tətbiqində fəallıq göstərir, səmərəli elmi-tədqiqat işlərini ümumiləşdirib çapına nail olurdular. Prof. F.Ə.Rzabəylinin yazdığı «Ümumi biologiya» (1931), «Biologiya terminləri lüğəti» (1934), akademik A.A.Qrossheymin hazırladığı dörd cilddən ibarət «Qafqazın florası» (1924–1934), onun ümumi redaktəsi altında meydana gələn «Abşeron bitkilərinin təyinatı» (1939) və üçcildlik «Azərbaycan florası» (1934–1936) kimi fundamental əsərlər dövrün ən böyük elmi nailiyyəti idi və Azərbaycanda biologiya elminin inkişafı tarixində bu gün də mühüm əhəmiyyət kəsb edir.

Zoologiya kafedrası təşkil olunduqdan (1930) sonra professorlardan F.Ə.Rzabəyli (1930–1932), V.S.Yelpatevski (1933–1936), S.Y.Veysiq (1936–1937), Z.M.Şahtaxtinskaya (1937-ci ildən sonra) ona rəhbərlik etmişlər. Kafedrada təcrübəli elmi-pedaqoji qüvvələr: Ə.M.Əlizadə, K.K.Qəmbəroğlu, M.A.Hüseynov, A.Ə.Şirinov, V.M.Hacıyev və b. çalışırdılar. S.Y.Veysiqin 1936-cı ildə Leninqrad Universitetinin Biologiya fakültəsinin Elmi Şurasında «Qafqazın su mikrofaunası və onun zooloji-coğrafi təhlili» mövzusunda doktorluq, 1937-ci ildə isə Z.M.Şahtaxtinskayanın institutun Elmi Şurasında «Azərbaycanın gövşəyən heyvanlarında parazit infuzorları» mövzusunda namizədlik dissertasiyaları müdafiə etmələri kafedranın elmi həyatında mühüm hadisə oldu. Uzun müddət kafedraya rəhbərlik edən Z.M.Şahtaxtinskayanın «Onurğasızlar zoologiyasının qısa kursu» (1937), «Darvinizmdən terminlər» (1939) adlı tədris vəsaitləri nəşr olundu.

İnsan və heyvan fiziologiyası kafedrasına 9 il (1930-cu ildə təşkil edilmişdir) görkəmli fizioloq-alim, prof. A.A.Əmirov başçılıq etmişdir. O, respublikada fiziologiya sahəsində yeni milli elmi məktəbin əsasını qoymuş, məşhur fizioloqlar nəsli yetişdirmişdir. Akademik A.İ.Qarayev, professorlar: K.Ə.Balakişiyev, S.R.Ocaqverdizadə, M.Q.Mustafayev, dos. Z.A.Muğanlinskaya kimi tədqiqatçılar məhz onun rəhbərliyi altında elmi cəhətdən formalaşmış və respublikada fiziologiya elminə böyük nüfuz və şöhrət gətirmiş, ittifaq və dünya miqyaslı elmi məclislərdə Azərbaycanı ləyaqətlə təmsil etmişlər. Fizioloqların 1935-ci ildə keçirilən XV Ümumdünya konqresində respublikanı 5 fizioloq alim təmsil edirdi. Onlardan 4-ü kafedranın əməkdaşları (professorlar:

P.Y.Rostovtsev, A.A.Əmirov, S.R.Ocaqverdizadə, A.İ.Qarayev və M.Q.Mustafayev) idi. Prof. A.A.Əmirovun «Qanda və əzələlərdə şəkərlə qlükogen arasında qarşılıqlı əlaqələr», A.İ.Qarayevin «Diafraqmanın fiziologiyası məsələsinə dair» (namizədlik dissertasiyası), «Əzələlərin elektrikləşməsində karbohidratların əhəmiyyəti», S.R.Ocaqverdizadənin «İstiqanlı heyvanların əzələ fəaliyyətinə şəkərin təsiri» kitabları müvəffəqiyyətli elmi axtarışlarının nəticəsi idi.

Üzvi və qeyri-üzvi kimya kafedralarının (1930-cu ildə yenidən təşkil edilmişdir) əməkdaşları tədrisin keyfiyyətini yaxşılaşdırmağa çalışmaqla yanaşı, elmi-tədqiqat işlərinin genişləndirilməsinə də səy göstərirdilər. Bu illərdə qeyri-üzvi kimya kafedrasının müdiri prof. S.C.Hüseynovun təşəbbüsü və köməyi ilə M.K.Əhmədli, X.Ş.Kələntərli, X.Ə.Sultanov, Y.M.İsmayılov, S.N.Quluzadə kimi istedadlı gənc kimyaçılar elmi işə cəlb edildilər. 30-cu illərin ikinci yarısında X.Ş.Kələntərli «Neft destilatlarındakı solventlərin selektiv edilməsi nəticəsində alınmış karbohidrogenlərin hava ilə oksidləşməsi yolu ilə karbon turşularının alınması» mövzusunda dissertasiya müdafiəsinə görə qeyri-üzvi kimya sahəsində ilk elmlər namizədi alimlik dərəcəsinə layiq görüldü.

Üzvi kimya kafedrasına 1933–1937-ci illərdə görkəmli kimyaçı alim, SSRİ EA-nın müxbir üzvü, prof. K.A.Krasusski (1867–1937) başçılıq edirdi. Onun rəhbərliyi altında M.M.Mövsümzadə, Ş.Ə.Məmmədov, Ş.B.Əliyev, V.M.Hacıyev, S.N.Quluzadə kimi tanınmış görkəmli alimlər yetişmişdir. K.A.Krasusski kimyadan bir sıra dərslik və tədris vəsaitinin müəllifi idi.

Kimya-biologiya fakültəsinin kimya şöbəsində çalışan prof. P.P.Kuznetsov (1888–1938) kimyaçı kadrların hazırlanmasına böyük əmək sərf etmişdir. Onun rəhbərliyi altında fakültənin məzunları P.F.Rzazadə, İ.H.Əlizadə, A.Q.Misgərli, S.A.Ələkbərova və b. ciddi elmi axtarışlara başladılar və sonralar respublikada və ölkədə görkəmli kimyaçı alim kimi tanındılar.

Ümumi kimya kafedrasının əməkdaşları mühüm elmi və təcrübi əhəmiyyətli problemlər üzərində çalışırdılar. Məhz kafedranın elmi axtarışları nəticəsində respublikada ilk dəfə olaraq 1932-ci ildə «Böyük Şor sularından yodun alınması»na nail olundu. Üzvi kimya kafedrasının üzvləri isə «Çöküntülərin tərkibi»ni tədqiq edib maraqlı elmi nəticələr əldə etdilər.

Qeyri-üzvi kimya kafedrasına görkəmli Azərbaycan kimyaçısı, prof. S.X.Hüseynov rəhbərlik edirdi və kollektivlə birlikdə ciddi elmi axtarışlar aparırdı. Alimin çap olunmuş «Qeyri-üzvi kimya terminləri» (1931), «Üzvi kimya terminləri» (1936), «Ümumi kimya praktikumu» (1936), «Azərbaycan kimya terminalogiyası» (1937) kimi sanballı dərslik və tədris vəsaitləri kimyaçı müəllim kadrlarının hazırlanmasında mühüm rol oynadı.

**Dil-ədəbiyyat fakültəsinin elmi-tədqiqat işləri.** Ədəbiyyat fakültəsi və onun kafedraları 30-cu illərdə Azərbaycanda filologiya elminin mərkəzinə çevrildi. Azərbaycan ədəbiyyatı, folklorşünaslıq, dialektologiya, müasir Azərbaycan dili, Azərbaycan ədəbiyyatı tarixi kimi elm sahələri məhz APİ-də təşəkkül tapıb formalaşmışdır. 1930-cu ildə İctimaiyyat-ədəbiyyat fakültəsi tərkibində yalnız Dil və ədəbiyyat kafedrası mövcud idi. Ona dos. Əli Nəzmi rəhbərlik edirdi.

Dil-ədəbiyyat fakültəsi 1938–1939-cu tədris ilində müstəqil şəkildə fəaliyyətə başladı. Fakültənin genişlənməsi ilə əlaqədar Dil və Ədəbiyyat kafedrasının bazası əsasında üç müstəqil kafedra: Azərbaycan ədəbiyyatı tarixi (müdiri dos. Ə.Nəzmi), Linqvistika (müdiri prof. B.V.Çobanzadə) və Ümumi ədəbiyyat tarixi (müdiri dos. H.H.Nəzərli) yarandı. Yeni kafedraların təşkili fakültədə tədris prosesinin və elmi-tədqiqat işlərinin keyfiyyətinin yüksəlməsinə səbəb oldu. Fakültədə görkəmli alimlərlə birlikdə yeni elmi qüvvələr – gənc və istedadlı alimlər: Ə.Ə.Sultanlı, H.M.Araslı, M.H.Rəfili, M.Ə.Dadaşzadə, M.Ş.Şirəliyev, F.S.Qasımzadə, M.Ə.Paşayev, Ə.M.Dəmirçizadə, C.Z.Hacıyev (C.Xəndan), İ.R.Əfəndiyev, M.Ə.Hüseynzadə, C.F.Bağırov və b. çalışırdılar. Fakültənin əməkdaşlarından İ.Q.Həsənovun «Dil və təfəkkür», Z.N.Tağızadənin «Azərbaycan dilinin morfoloji əsasları», Ə.M.Dəmirçizadənin «Azərbaycan ədəbi dilinin tarixi oçerkləri» (1938), M.Ə.Hüseynzadənin «Qrammatika» (1939), M.İ.Şirəliyevin «Azərbaycan dialektologiyası» (1940), Ə.Cəfərin «Müasir Azərabycan dilçiliyinin oçerkləri» (1940) əsərləri nəşr edildi.

Həmin dövrdə fakültədə Azərbaycan və dünya ədəbiyyatı ilə bağlı maraqlı elmi axtarışlar aparılırdı. Prof. M.H.Rəfilinin «Nizami (həyat və yaradıcılığı)» (1939), «M.F.Axundov» (1939), «Taras Şevçenko» (1939), «Qədim Azərbaycan ədəbiyyatı» (1940); dos. F.S.Qasımzadənin «M.F.Axundov (həyat və yaradıcılığı)»; dos. C.M.Hacıyevin (Xəndan) «Nizaminin estetik görüşləri», «Sabir», «XX əsr Azərbaycan ədəbiyyatı (sovet dövrü)» (1939); M.C.Cəfərovun «M.Y.Lermontovun həyat və yaradıcılığı», M.A.Dadaşzadənin «Lenin və Plexanov rus ədəbiyyatının xəlqiliyi haqqında», Ümumi ədəbiyyat kafedrasının müdiri A.M.Muradovun «İ.Q.Çernişevski və Qərbi Avropa yazıçıları», P.V.Litvinovun «Q.Floberin «Madam Bovari» əsərində obrazlar» (1939), N.Q.Ağazadənin «XVIII əsrin sonunda alman klassik balladası (Şiller və Hötenin əsərləri əsasında)» əsərləri bu gün də Azərbaycan filologiyası üçün qiymətli elmi töhfə sayılır və həmin dövrdə institutda güclü elmi potensiala malik filoloqların formalaşdığına dəlalət edir.

Azərbaycan Pedaqoji İnstitutunun nəzdində 1937-ci ilin sentyabrın 1-dən üçillik təhsil müddəti olan Xarici dillər fakültəsinin təşkili filologiya sahəsində elmi-tədqiqat işlərinin genişlənməsinə səbəb oldu. Yeni fakültənin əməkdaşları Qərb klassiklərinin yaradıcılığı, Qərb və Şərq dillərinin qrammatikası ilə bağlı problemlərin araşdırılmasında diqqətəlayiq uğurlar qazandılar.

APİ-də Dilçilik kafedrasına 1939–1940-cı dərs ilində dos. M.Ş.Şirəliyev rəhbərlik edirdi. Onun «Azərbaycan dialektologiyası» adlı ilk dərsliyi və proqramı çap olundu. Bakı Dövlət Universitetində 1941-ci ilin may ayının 13-də namizədlik dissertasiyası müdafiə edərkən Elmi Şura və Ali Attestasiya Komissiyası onun «Azərbaycan dilinin Bakı dialekti» əsərini Azərbaycan dilçiliyini inkişaf etdirmək sahəsində ən uğurlu addım saydı və həmin əsərə görə M.Ş.Şirəliyevə birbaşa filologiya elmləri doktoru alimlik dərəcəsi verdi.

İnstitutun Filologiya fakültəsində 1939–1940-cı dərs ilində 8 kafedra: ümumi ədəbiyyat (müdiri dos. A.M.Muradov), Azərbaycan dili (dos. M.Ş.Şirəliyev), Azərbaycan ədəbiyyatı (müdiri dos. F.S.Qasımzadə), rus dili (müdiri dos. A.V.Lukyanova), erməni dili və ədəbiyyatı (müdiri prof. əvəzi A.Q.Termatevosyan), alman dili (müdiri dos. M.İ.Rax), fransız dili (müdiri Y.Z.Qrişqorn) – fəaliyyət göstərirdi. Fakültə Azərbaycan filologiyası sahəsində yüksək potensiala malik elmi mərkəzə çevrilmişdi.

**Tarix və coğrafiya sahəsində elmi araşdırmalar.** Respublikada coğrafiya sahəsində ilk kadrlar APİ-nin coğrafiya şöbəsində hazırlandı. Şöbədə bir neçə kafedra fəaliyyət göstərirdi. İqtisadi coğrafiya kafedrasına dos. M.Q.Cuvarlinski rəhbərlik edirdi. İlk vaxtlar elmi-pedaqoji kadrlar az olduğundan Gürcüstandan akademik A.N.Cavaxaşvili (1934-cü ildə), prof. A.F.Lyaster APİ-yə işləməyə dəvət olundular. Tədris və elmi işlə professorlar – M.M.Əliyev, A.Z.Vəzirzadə, dosentlər – M.H.Bənanyarlı, H.İ.Əliyev, B.N.Maxles və başqaları məşğul idilər. Lakin şöbənin elmi pedaqoji kadr potensialı kəmiyyət və keyfiyyətcə zəif idi.

Tarix fakültəsində qədim və orta əsrlər, SSRİ, Azərbaycan və Şərq ölkələri tarixlərinə dair ilk elmi axtarışlar aparıldı. Çünki fakültə güclü elmi-pedaqoji potensiala malik idi. Orada professorlar – Y.S.Nikolayev, V.M.Zummer, V.M.Xuluflu, A.P.Kuzovenko, E.A.Poxomov, P.P.Fridolin, Y.A.Rathauzer, N.N.Pçelin, Ə.S.Übeydulin, B.N.Tixomirov; dosentlər – A.Q.Salamzadə, Ə.S.Sumbatzadə, H.İ.Abdullayev, M.Ə.Mahmudov, M.M.İrəvanlı, C.Ə.Rəhimov, K.Əbdülrəhimov, M.S.Səlimov, Ş.R.Əliyev, M.X.Şərifli, Ə.N.Şükürzadə; baş müəllimlər – S.Ə.Əyyubova, H.İ.Sultanova, H.Q.Qasımzadə və b. çalışırdılar.

SSRİ tarixi kafedrasının müdiri prof. B.N.Tixomirov «Rusiyada feodalizm», dos. Ə.Q.Salamzadə «Azərbaycanda rəhbərlik» problemləri ilə bağlı elmi-tədqiqat işi aparırdılar. Hər ikisi sovet tarixçilərinin Leninqradda keçirilən Ümumittifaq müşavirəsində (1934) iştirak etmiş, prof. B.N.Tixomirov isə «Rusiyada feodalizmin meydana gəlməsi» mövzusunda məruzə oxumuşdu.

Tarix fakültəsi 30-cu illərin sonunda respublikada tarixçi kadrlar hazırlayan əsas tədris-pedaqoji təhsil və elm mərkəzinə çevrildi. Fakültənin fəaliyyətində başlıca yeri milli tarixçi kadrların yetişdirilməsi tuturdu. Əgər ilk on il ərzində (1921–1930) tarix şöbəsini cəmi 17 nəfər tarixçi bitirmişdisə, artıq 1930–1940-cı illərdə fakültənin məzunlarının sayı 313 nəfərə çatırdı. Məzunlar arasında sonralar respublikanın bir sıra ali məktəblərində və elmi-tədqiqat institutlarında çalışan tanınmış alimlər, ictimai xadimlər, yazıçılar, o cümlədən Azərbaycanın Xalq yazıçıları – M.Ə.Hüseynov (Mehdi Hüseyn), S.H.Rəhimov, S.Rəhman, professorlar – M.Y.Vəkilov, İ.A.Hüseynov, N.A.Paşayev, dosentlər – S.N.İmanzadə, İ.N.Şıxlı, İ.Q.Şükürzadə, Y.Y.Ələsgərov, S.N.İmanov, Ə.Ə.Cəfərov və b. vardı.

Azərbaycan tarixinin tədqiqi sahəsində səmərəli elmi-tədqiqat işləri aparılırdı. Dos. Ə.S.Sumbatzadənin «Quba əyalətində 1837-ci il kəndli üsyanı» əsəri xüsusilə maraq doğururdu.

İnstitutda ÜİK(b)P tarixi kafedrasına dos. M.Ə.Məmmədov, Dialektik materializm kafedrasına prof. A.B.Çiçikalov, fəlsəfə kafedrasına görkəmli Azərbaycan filosofu, akademik H.İ.Hüseynov, Siyasi iqtisad kafedrasına prof. B.B.Həsənbəyov başçılıq edirdilər.

İctimai elmlər üzrə yeni kafedraların yaradılması və mütəxəssislərin düzgün seçilməsi nəticəsində elmi işlərin keyfiyyəti yaxşılaşmağa və yüksəlməyə başladı.

**Pedaqogika və psixologiya sahəsində elmi axtarışlar.** İnstitutun Pedaqoji fakültəsi respublikada elmi-pedaqoji fikrin əsas mərkəzlərindən biri idi. Burada professorlar – A.O.Makovelski, H.B.Şahtaxtinski, dosentlər – M.Ə.Rəhimli, Z.N.Zəkuzadə, Ə.Y.Seyidov, F.Ə.İbrahimbəyli, V.L.Arxarova, baş müəllimlər – Ə.R.Qaraşov, S.H.Hacıyev, V.İ.Mustafayev, D.Ş.Mustafazadə və b. pedaqogika, psixologiya, fəlsəfə, məntiq və s. fənlərdən dərs deyirdilər.

Pedaqogika kafedrasının əməkdaşları tədris prosesinin təşkili, proqramların hazırlanması kimi sırf təlim məsələləri ilə bağlı maraqlı elmi-tədqiqatlar aparırdılar. Pedaqogika kafedrasının müdiri M.Ə.Rəhimlinin «Pedaqogikaya dair» (1932), «Azərbaycanda ali pedaqoji təhsil» (1934), «Azərbaycanda poli-

texnik məktəblərin inkişafı» (1935); Ə.Y.Seyidovun «Tarix dərslərində xronologiyanın yeri və rolu» (1936), «A.A.Bakıxanovun pedaqoji görüşləri» (1939), M.M.Mehdizadənin «Politexnik məktəblərdə təlimin əsas prinsipləri» (1932), «Azərbaycan məktəblərində ana dilində savad təliminin inkişafı tarixi» (1936), S.X.Xəlilovun «1918–1920-ci illərdə Azərbaycanda xalq maarifi» (1939), F.Ə.İbrahimbəylinin «Pedaqoji baxışlar» (1938) əsərləri ilə Azərbaycanda pedaqogika elminin əsası qoyulurdu. Ə.Y.Seyidov görkəmli rus pedaqoqu, prof. E.N.Medinskinin rəhbərliyi altında namizədlik dissertasiyası hazırlayıb müdafiə etmişdir. O, respublikada ilk pedaqoji elmlər namizədi (1939) və ilk elmlər doktoru (1946) elmi dərəcəsi alan alim kimi yadda qalır. Ə.Y.Seyidov «XIX əsrdə Azərbaycanda pedaqoji fikir tarixindən» əsərinə görə 1947-ci ildə SSRİ EA-nın Azərbaycan filialının mükafatına layiq görülmüşdü.

Pedaqogika kafedrasının elmi həyatında diqqəti cəlb edən mühüm cəhət ondan ibarətdir ki, yeni yetişən alimlər 30-cu illərin sonunda pedaqogikanın nəzəri problemləri ilə bərabər, görkəmli Azərbaycan mütəfəkkirlərinin pedaqoji irsinin tədqiqinə də diqqət yetirirdilər. Ə.Y.Seyidovun «A.A.Bakıxanovun pedaqoji görüşləri», «XIX əsrin sonunda Azərbaycanda pedaqoji fikir»; Z.Q.Axundovun «M.Ə.Sabirin pedaqoji baxışları»; M.Ə.Muradxanovun «Nizaminin pedaqoji fikirləri»; M.M.Mehdizadənin «Azərbaycan məktəblərində tədrisin təşkili və inkişafı tarixi»; Ə.K.Zəkuzadənin «Uşaqlarda məntiqi təfəkkürün inkişafı»; D.M.Mustafayevanın «N.K.Krupskaya tərbiyə haqqında» mövzularındakı elmi-tədqiqat işləri indi də əhəmiyyətini itirməmişdir.

## 1.5. AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ İNSTİTUTU ŞƏXSİYYƏTƏ PƏRƏSTİŞ VƏ KÜTLƏVİ REPRESSİYA DÖVRÜNDƏ

*(30-cu illərin ikinci yarısı)*

Bütün ölkəni qara bulud kimi bürüyən şəxsiyyətə pərəstişin ağır nəticələrindən – kütləvi repressiya və həbslərdən ali məktəblərin professor-müəllim heyəti, tələbələr, hətta texniki işçilər belə yaxa qurtara bilmədilər. Vicdan və namusla işləyən yüzlərlə adam heç bir günahı olmadan həbs edildi. Azərbaycan Pedaqoji İnstitutunun respublikada və onun hüdudlarından kənarda yaxşı tanınan görkəmli alimləri, həmçinin həyatda ilk addımlarını atan tələbələri 1937–1938-ci illərdə «xalq düşməni» hesab edilib heç bir dəlil, sübut göstə-

rilmədən həbsxanalara salındı. Çoxları güllələndi. Onların böyük bir qrupu isə müxtəlif müddətlərə sürgünlərdə türmələrdə cəza çəkməyə məcbur edildilər. Akademik A.N.Cavaxaşvili, professorlar: Ə.S.Übeydulin, B.V.Çobanzadə, B.B.Həsənbəyov, A.B.Çiçikalov, V.M.Xuluflu, A.S.Bukşpan, V.İ.Tixomirov, B.N.Tixomirov, Ç.M.Hacıyev, A.S.Kovanko, V.S.Yelpatevski, A.F.Lyaster, N.S.Nikolayev, S.Y.Veysiq, P.İ.Kuznetsov, A.P.Kuzovenko, dosentlər: M.Q.Bayramov, H.B.Nəzərli, Ə.Nəzmi, Ə.Q.Salamzadə, İ.Q.Həsənov, H.Q.Qasımzadə, Q.L.Xalfin, M.Rəhimli və b. günahsız tutulanlar arasında idilər.

Yüzlərlə təhsil və elm xadiminin təqib və cismən məhv edilməsi ali təhsil sisteminə, Azərbaycan elminə ağır zərbə vurdu. Bu, Azərbaycan Pedaqoji İnstitutunda da tədrisin və elmi-tədqiqat işlərinin normal aparılmasına ciddi mənfi təsir göstərdi.

Şəxsiyyətə pərəstiş və repressiya bütün cəmiyyəti əhatə etsə də, daha çox ziyalı təbəqəsini əhatə edirdi. 30-cu illərdə başlanan repressiya dalğası, ifşa iclasları, «izhari-nifrət» mitinqləri ali məktəblərdə prinsipsizlik, yaltaqlıq, satqınlıq, ikiüzlülük kimi çirkin, eybəcər halların baş verməsinə zəmin yaratdı. Bu, şübhəsiz, təhsil müəssisələrinin normal fəaliyyətinə ciddi maneçilik göstərirdi. Vurulan maddi, mənəvi və cismani zərbənin ağır nəticələri institutların sonrakı bütün fəaliyyətində öz dərin izlərini buraxdı.

Acınacaqlı hadisələrin baş alıb çoxalmasına baxmayaraq, ali təhsil ocaqlarının işçiləri yaranmış çətinlikləri aradan qaldırmaq, vəziyyətdən çıxmaq üçün özlərində əzm və cəsarət tapdılar, yenidən kadr hazırlanması işini və elmi axtarışlarını davam etdirdilər. Təsadüfi deyil ki, APİ-də 1939-cu ilin fevral ayının 26-dan mart ayının 2-nə kimi respublika ali məktəbləri tarixində ilk dəfə elmi-tədqiqat işlərinin yekunlarına həsr olunmuş elmi sessiya keçirildi. M.Q.Əhmədlinin «Neftdən alınan yüksək molekulyar karbohidrogenlər», A.Q.Abbaszadənin «Aşağı temperaturda qatı məhsulların yeni ölçü metodları», A.Q.Əsgərovun «Azərbaycanın şimal-şərq rayonlarında mineral su mənbələri», S.R.Ocaqverdizadənin «Mədəaltı vəzlərin funksiyasına karbohidrogenlərin təsiri», S.N.Quluzadənin «İzoamilbramatın ali homoloqlarının xlorlu aliminiumun təzyiqi altında naftalinə təsiri», M.C.Paşayevin «Füzuli poeziyası», C.Z.Hacıyevin (Xəndan) «M.Ə.Sabir və 1905-ci il inqilabı», A.V.Popovun «N.Q.Çernışevski və folklor» mövzularında oxuduqları məruzələr dinləyicilərin böyük marağına səbəb oldu.

Azərbaycan Pedaqoji İnstitutunun fəaliyyətinin ikinci onilliyini (1931–1941) bütövlükdə nəzərdən keçirib ümumiləşdirsək, görərik ki, kollektiv zid-

diyyətli və çətin bir şəraitdə fəaliyyət göstərsə də, ümdə elmi məsələlərin həllində yaxından iştirak etmiş, Azərbaycanda elmin bir çox sahələrinin formalaşmasında və inkişafında mühüm rol oynamışdır.

## 1.6. AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ İNSTİTUTU BÖYÜK VƏTƏN MÜHARİBƏSİ İLLƏRİNDƏ *(1941–1945-ci illər)*

Müharibə illərində respublikanın ali məktəblərinin öhdəsinə düşən mühüm vəzifələrdən biri sənaye, kənd təsərrüfatı, elm və mədəniyyətimiz üçün yüksəkixtisaslı kadrlar hazırlamaq idi. Bunun əsaslı surətdə həll edilməsi bir sıra təşkilati-struktur dəyişikliklərin həyata keçirilməsi ilə bağlı idi. Ali məktəblərin müharibə dövrü şəraitinə uyğunlaşdırılması – yenidən qurulması lazım gəlirdi.

Müharibə ərəfəsində (1940–1941-ci tədris ilinin sonuna yaxın) respublikanın 16 ali məktəbində 14612 nəfər tələbə təhsil alırdı.

Müharibənin ilk aylarında məlum oldu ki, respublikanın pedaqoji yönümlü ali məktəblərində, o cümlədən APİ-də tədris prosesi və kadr hazırlığı məsələləri ilə bağlı bir sıra qüsurlar var. Birincisi, ölkənin müdafiəsi problemlərinə institutlarda az diqqət yetirilirdi. İkincisi, tələbələrin pedaqoji və istehsalat prosesində iştirakı zəif idi.

Respublikanın pedaqoji ali məktəblərində, o cümlədən APİ-də pedaqoji kadrların hazırlanması dinamikasını 1941-ci ilin sentyabr ayının 1-nə olan məlumata əsasən nəzərdən keçirək:

| Ali pedaqoji məktəblər | 1941-ci il sentyabrın 1-də tələbələrin sayı | Buraxılış |
|---|---|---|
| Azərbaycan Dövlət Universiteti | 1842 | 225 |
| Azərbaycan Dövlət Pedaqoji İnstitutu | 1476 | 397 |
| Xarici Dillər İnstitutu | 256 | Yoxdur |
| **Cəmi:** | **3574** | **622** |

Müharibənin ağır və dəhşətli dövründə – 1941-ci ilin ikinci yarısı və 1942-ci ilin əvvəlində 2,5 mindən artıq ali məktəb tələbəsi tədris işini pozmadan gündə 5–6 saat Bakının sənaye müəssisələrində, xüsusən cəbhə üçün neft

emal edən mədən və zavodlarda çalışırdı. Ali məktəblərin 20 mindən artıq müəllimi və tələbəsi isə istirahət günlərində zavodlarda, fabriklərdə cəbhəyə getmiş fəhlə, mühəndis-texniki işçiləri əvəz edirdi.

Müharibə ölkənin bütün ali təhsil ocaqları kimi, Azərbaycan Pedaqoji İnstitutunu da ciddi sınağa çəkdi. Müharibə başlanan günün səhəri (23 iyun 1941-ci ildə) institutun direktoru Ələsgər Həşimovun (o, 14.03.1940-cı ildən 13.01.1942-ci ilə qədər institutun direktoru olmuşdur) iştirakı ilə ümuminstitut etiraz mitinqi keçirildi, tələbə, müəllim və texniki heyət alman faşistlərinin cinayətkar hərəkətlərini pislədilər və hamılıqla düşmənə qarşı mübarizəyə hazır olduqlarını bildirdilər. 1940–1941-ci dərs ilinin əvvəlində APİ-nin 240 nəfərlik akademik heyətinin tərkibində 109 nəfər azərbaycanlı vardı, 131 nəfər isə başqa millətlərin nümayəndələri idilər. Onların 8-i elmlər doktoru, professor, 57-si elmlər namizədi, dosent, 131-i baş müəllim, 44-ü assistent və müəllim idi.

Müharibənin ilk günlərində institutun yüzlərlə tələbəsi, müəllimi və digər əməkdaşları Vətəni düşməndən qorumaq üçün döyüşə yola düşdü. Arxa cəbhədə qalan tələbə və müəllimlər isə dərsdən sonra Bakının sənaye müəssisələrində müdafiə xarakterli xüsusi işlərdə fəal iştirak etməyə başladılar. Onlar həm də əhali arasında təbliğat və təşviqat xarakterli tədbirlər həyata keçirir, Bakının sənaye müəssisələrində, hərbi komissarlıqlarda, hospitallarda müharibə əleyhinə məruzə və söhbətlər aparır, əhalini mübarizəyə ruhlandırır, faşizmə nifrətlərini ifadə edirdilər. İnstitutda iş şəraiti günün tələblərinə uyğun qurulmuşdu. Doğrudur, obyektiv səbəblərdən APİ-nin maliyyələşdirilməsində və kadr hazırlığında xeyli çətinliklər yaranmışdı. Tədris və yataqxana binaları döyüşən ordu hissələri və hərbi hospitalların sərəncamına verilmişdi. APİ müharibə dövrünün qanunları, tələbləri ilə yaşayır və fəaliyyət göstərirdi. Müharibənin törətdiyi çətinliklər üzündən tələbələrin tədrisdən yayınması halları çoxalmışdı. Maddi və məişət şəraitinin ağırlığı üzündən çoxları təhsili buraxıb istehsalata getməyə məcbur olmuşdu.

Hərbi sınaq illərində tədris prosesi, əsasən, müharibənin tələblərinə uyğun quruldu. Tədris plan və proqramları sıxışdırıldı, hərbi təlim məsələlərinə diqqət artırıldı, xüsusilə Kimya-biologiya, Fizika-riyaziyyat fakültələrinin tədris plan və proqramlarına hərbi fənn və kurslar daxil edildi. İnstitutun Fizika-riyaziyyat fakültələrində müdafiə və hərbi xarakterli biliklər öyrədilməsinə diqqət artırıldı, tələbələrə ballastika, aerodinamika, hava və dəniz astronomiyası, hərbi topoqrafiya və kartoqrafiya, bakteriologiya və cərrahiyyənin əsasları haqqında ətraflı məlumat verilməyə başlandı. Humanitar şöbə və fakültələrdə isə hərbi-siyasi vərdişlər aşılanmasına xidmət edən fənlər – «SSRİ xalq-

larının hərb və qəhrəmanlıq tarixi», «Qızıl Orduda siyasi tərbiyə işi» tədris olunurdu. «Dialektik və tarixi materializm», «Siyasi iqtisad» və «SSRİ tarixi» kimi ictimai-siyasi fənlərə «Sovet İttifaqının Böyük Vətən müharibəsi» mövzusunda yeni bölmə artırıldı. Bütün ali məktəblərdə olduğu kimi, Azərbaycan Pedaqoji İnstitutunda da tələbələrin hərbi vərdişlərə yiyələnməsi üçün tədris prosesinə hərbi iş, yanğın əleyhinə mübarizə, kimyəvi-bakterioloji, zəhərləyici silahlardan və maddələrdən mühafizə kursları əlavə edildi.

Ali məktəblərin çoxminli kollektivlərinin öhdəsinə yeni vəzifələr düşürdü. Müharibə külli miqdarda xərc tələb edirdi. Ona görə də dövlət büdcəsi ciddi şəkildə dəyişdirildi, sosial-mədəni tədbirlər arxa plana keçirilir, ali məktəblərin büdcəsi ilbəil azalır, bir sıra ali məktəblərin bağlanmaq təhlükəsi, yaxud onların başqa, nisbətən iri ali məktəblərin tərkibində birləşdirilməsi zərurəti yaranırdı. Əgər müharibə ərəfəsində – 1940-cı ildə Xalq Maarif Komissarlığı üçün kadr hazırlanmasına respublika dövlət büdcəsindən 46 mln. 244 min manat vəsait ayrılmışdısa, 1941-ci ildə bu rəqəm 25 mln. 574 min, 1942-ci ildə isə artıq 15 mln. 829 min manata endirilmişdi.

Respublikanın bütün ali məktəblərinin tam və səmərəli tədris və elmi fəaliyyətini qoruyub saxlamaq imkanları məhdudlaşırdı. Bu səbəbdən də Azərbaycan Xalq Komissarlığı 5 sentyabr 1941-ci il tarixli əmri ilə Azərbaycan Dövlət Qiyabi Pedaqoji İnstitutu Azərbaycan Dövlət Pedaqoji İnstitutunun qiyabi şöbəsinə və 1936-cı ildə APİ-nin Xarici dillər fakültəsinin bazası əsasında təşkil edilmiş Xarici Dillər İnstitutu müvəqqəti olaraq Xarici dillər fakültəsinə çevrildi. APİ-nin tərkibində ingilis, fransız, alman şöbələri fəaliyyətə başladı.

Müharibə əməliyyatları genişlənib ciddi xarakter aldıqca respublikanın bir çox ali məktəblərinin, o cümlədən APİ-nin maddi-maliyyə imkanları tamam tükənir, tələbə və müəllim heyətinin vəziyyəti ağırlaşırdı. İnstitutun müstəqil fəaliyyəti qeyri-mümkün idi. Ona görə də Azərbaycan XKS və Azərbaycan K(b)P MK 19 sentyabr 1941-ci il tarixdə «V.İ.Lenin adına APİ-nin S.M.Kirov adına ADU ilə birləşdirilməsi haqqında» qərar qəbul etdi.

Pedoqoji İnstitut bir ildən artıq Bakı Universitetinin Pedaqoji fakültəsi tərkibində fəaliyyət göstərdi. 1942-ci ilin sonu 1943-cü ilin əvvəllərində Qızıl Ordu uğurlu hərbi əməliyyatlara başladı, müharibənin gedişində əsaslı dönüş yarandı. Respublikada xalq maarifi və kadr hazırlığına ayrılan vəsaitin artırılmasına imkan tapıldı. Bu, müvəqqəti olaraq müvafiq ali məktəblərin tərkibinə verilmiş sahə institutlarının ayrılıb təzədən müstəqil fəaliyyət göstərmələrini gündəmə gətirdi.



*__Ağamməd Səməd oğlu Abdullayev__ 1908-ci ildə Bakı şəhərində anadan olmuşdur. Bakı Pedaqoji Texnikumunu bitirmiş (1926), Azərbaycan Dövlət Universitetinin Ədəbiyyat fakültəsinə qəbul olmuşdur. Orta məktəb və texnikumlarda Azərbaycan dili və ədəbiyyatı müəllimi (1929), Azərbaycan K(b)P MK-nın nəzdindəki kommunist ali məktəbində kafedra müdiri, Azərbaycan Pedaqoji İnstitutunda dekan (1939– 1941), direktor (1943–1944), Azərbaycan Qiyabi Pedaqoji İnstitutunda kafedra müdiri (1944–1949), ADPİ-də rektor vəzifələrində işləmişdir (1966–1970). Elmlər namizədi (1942), elmlər doktoru alimlik dərəcələri (1959), professor elmi adı almışdır (1960). APİ-də Azərbaycan dilinin tədrisi metodikası kafedrasının müdiri olmuşdur (1970–1976).*

*Azərbaycan dilinin tədrisi metodikası ilə bağlı 150-dən çox elmi əsərin müəllifidir. Azərbaycan SSR Ali Sovetinin Fəxri fərmanı, müxtəlif orden və medallarla təltif edilmişdir.*

*Abdullayev Ağamməd Səməd oğlu 1976-cı ildə vəfat etmişdir.*

Azərbaycan Dövlət Pedaqoji İnstitutu 1943-cü ilin oktyabr ayının 1-dən etibarən Bakı Universitetinin tərkibindən ayrıldı, müstəqil ali təhsil ocağı kimi beş fakültə ilə:

1) *fizika-riyaziyyat (dekan dos. A.Abbaszadə);*
2) *təbiyyat (dekan dos. M.A.Qasımov);*
3) *tarix (dekan S.Əfəndiyeva, az sonra baş müəl. C.M.İbrahimov);*
4) *dil-ədəbiyyat (dekan prof. M.H.Rəfili, az sonra baş müəl. C.F.Bağırov);*
5) *xarici dillər(dekan dos. Ə.Xudaverdiyev) fəaliyyətini davam etdirməyə başladı.*

1943-cü ilin oktyabrında yenidən təşkilindən sonra APİ-nin direktoru vəzifəsində dos. ***Ağamməd Abdullayev*** (01.10.1943 – 18.01.1944), Məmmədkazım Ələkbərli (01.01.1944 – 03.06.1944), ***Əhməd Seyidov*** (24.06.1944 – 07.05.1950) çalışdılar.

Müharibə şəraitinin doğurduğu maddi çətinliklər institutu buraxaraq müxtəlif iş dalınca gedən tələbələrin sayının artmasına səbəb oldu. Əgər 1943–1944-cü tədris ilinin əvvəlində institut 936 nəfər tələbə ilə tədrisə başlamışdısa, ilin sonunda orada oxuyanların sayı cəmi 610 nəfər idi. Sonrakı iki ildə vəziyyət dəyişmədi. Belə ki, 1944–1945-ci tədris ilinin əvvəlində institutda təhsil alan 756 tələbənin yalnız 550 nəfəri, 1945–1946-cı tədris ilində isə 879 tələbənin 647 nəfəri axıradək dərslərə davam edə bildi.



***Əhməd Yusif oğlu Seyidov*** *1892-ci ildə Qazax qəzasının Aslanbəyli kəndində anadan olmuşdur. Qori Müəllimlər Seminariyasında təhsil almışdır (1911–1917). 1930-cu ildə ADU-nu bitirmişdir. 1937-ci ildə namizədlik dissertasiyası müdafiə etmişdir. Qazax qəza xalq maarif şöbəsində inspektor, Aslanbəyli, Musaköy və Kosalar kənd məktəbində direktor, Lənkəran qəza xalq maarif şöbəsinin müdiri, Azərbaycan XMK-da dəmiryolu məktəbləri üzrə inspektor vəzifələrində çalışmışdır. 1947-ci ildə doktorluq dissertasiyası müdafiə etmişdir. ADPİ-də dosent, professor, fakültə dekanı, kafedra müdiri, elmi işlər üzrə prorektor, rektor (1944–1948) vəzifələrində çalışmışdır. Əməkdar elm xadimi adına layiq görülmüşdür. 2 monoqrafiyanın, «Pedaqogika tarixi» dərs vəsaitinin və 200-dən artıq elmi məqalənin müəllifidir.*

*Seyidov Əhməd Yusif oğlu 1977-ci ildə vəfat etmişdir.*

Tələbələrin sayının azalması həm də azərbaycanlı gənclərin könüllü şəkildə cəbhəyə getmələri ilə əlaqədar idi.

1943–1944-cü tədris ilində Coğrafiya fakültəsi yenidən təşkil edildi. 1944–1945-ci tədris ilində isə hazırlıq şöbəsi yaradıldı və oraya 230 tələbə qəbul olundu.

Yenidən təşkil ediləndən (1943) müharibənin sonuna kimi APİ-yə tələbə qəbulu, tələbələrin ümumi kontingenti və buraxılışın göstəriciləri aşağıdakı şəkildə idi:

| Tədris ili | Qəbul | İlin əvvəlində tələb. ümumi sayı | Kişi | Qadın | O cümlədən: | | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | | | | Azərb. kişilər | Azərb. qadın | İlin sonunda tələb. sayı | Buraxılış |
| 1943–1944 | –* | 936 | 273 | 663 | 253 | 473 | 610 | 33 |
| 1944–1945 | 340 | 756 | 112 | 644 | 164 | 337 | 551 | 46 |

İnstitutun yenidən təşkilindən sonra orada 25 kafedra yaradıldı. Həmin kafedralara tanınmış alimlərlə bərabər, gənc, istedadlı milli elmi-pedaqoji qüvvələr rəhbərlik etməyə başladılar.

Dil-ədəbiyyat fakültəsinin nəzdində 10 kafedra – Azərbaycan dili (müdiri əvvəl dos. İ.R.Əfəndiyev, az sonra baş müəllim S.A.Fərəcov), Azərbaycan dilçiliyi (müdiri prof. Ə.M.Dəmirçizadə), Azərbaycan ədəbiyyatı (müdiri prof. M.H.Rəfili), ümumi ədəbiyyat (müdiri dos. Ə.A.Sultanlı), ingilis dili (müdiri b/m N.K.Jukov), alman dili (müdiri b/m N.H.Ağazadə), fransız dili (müdiri M.A.Qlikman) yaradılmışdır.

Fizika-riyaziyyat fakültəsində iki kafedra – riyaziyyat (müdiri dos. B.M.Yusifzadə) və fizika (müdiri dos. A.Q.Abbaszadə), Təbiyyat-kimya fakültəsində beş – üzvi kimya (müdiri prof. Ş.B.Əliyev), qeyri-üzvi kimya (müdiri dos. X.Ş.Kələntərli), zoologiya (müdiri dos. Z.M.Şahtaxtinskaya), botanika (müdiri dos. M.Z.Qasımov), geologiya (müdiri M.A.Hacinski) kafedra fəaliyyət göstərir və tədris-metodiki və elmi işlərlə məşğul olurdu. Bunlardan əlavə, ümuminstitut fənləri üzrə 6 kafedra – marksizm-leninizm (müdiri dos. Ə.S.Əlizadə), pedaqogika (müdiri dos. Ə.Y.Seyidov), xüsusi fənlər metodikası (müdiri dos. A.S.Abdullayev), psixologiya (müdiri dos. Ə.K.Zəkuzadə), hərbi hazırlıq (müdiri podpolkovnik K.Y.Babayev) və bədən tərbiyəsi (müdiri b/m H.A.Mirzəyev) kafedraları vardı.

APİ-də Azərbaycan tarixi kafedrası da 1943-cü ildə təşkil edilmişdi. Onun ilk müdiri dos. İ.A.Hüseynov idi. Orada istedadlı tarixçi-alimlər: Z.İ.İbrahimov, Y.A.Tokarjevski, M.Ə.Qazıyev, M.X.Şərifli, C.M.İbrahimov, Ş.Məmmədbəyli və b. işləyirdilər.

Böyük Vətən müharibəsi illəri Azərbaycan Dövlət Pedaqoji İnstitutunun həyatında mühüm mərhələlərdən birini təşkil edir.

Müharibənin başlandığı ilk günlərdən institutun yüzlərlə məzunu, tələbələri və əməkdaşları könüllü sürətdə cəbhəyə yola düşdülər, döyüş meydanlarında igidlik və qəhrəmanlıq göstərdilər. Bunların arasında institutun 4 nəfər məzunu və tələbəsi – Filologiya fakültəsinin xarici dillər şöbəsinin 1941-ci il məzunu, əfsanəvi partizan Mehdi Hüseynzadə, Xıdır Mustafayev, institutun Fizika-riyaziyyat fakültəsinin 1941-ci il məzunu Səlahəddin Kazımov və Filologiya fakültəsinin rus dili və ədəbiyyatı şöbəsinin 1940-cı il məzunu Fariz Səfərov düşmənə qarşı mübarizədə göstərdikləri misilsiz qəhrəmanlıq və igidliyə görə Sovet İttifaqı Qəhrəmanı adına layiq görüldülər. İnstitutun bir çox müəllimləri, o cümlədən Musa Rəcəbov, Bəhram Sultanov, Aqil Salayev, Mehdi Mahmudov, İsmayıl Şıxlı, Həmzə Əliyev, İncixanım Rüstəmova və b. hərb meydanlarında düşmənə qarşı qəhrəmanlıqla vuruşmuş, faşizm üzərində

qələbənin əldə edilməsində öz vəzifələrini layiqincə yerinə yetirmişlər. Onlarla tələbə və müəllim vətən və xalq uğrunda mübarizədə qəhrəmancasına həlak oldu.

Müharibə illərində institutun əməkdaşları arxa cəbhədə də səmərəli ideya-siyasi iş aparırdılar. Yüzdən artıq professor-müəllim tədris işinin nümunəvi təşkilinə görə orden və medallarla, eləcə də 54 nəfər institut əməkdaşı «Qafqazın müdafiəsi» və «Böyük Vətən müharibəsində nümunəvi əməyə görə» medalı ilə təltif olunmuşdur. İsmayıl Əfəndiyev, Əhməd Zəkuzadə, Əhməd Seyidov, V.L.Arxarova və b. əməyi xüsusilə yüksək qiymətləndirildi.

İnstitutun əməkdaşları müharibənin ilk günlərindən başlayaraq cəbhənin ehtiyac və tələbatını ödəmək məqsədi ilə «Ümumxalq cəbhəyə kömək» hərəkatına qoşulmuş, bütün imkan və səylərini birləşdirib döyüşən orduya yardım etməyə çalışmışdılar. Onlar müharibənin ilk aylarında hərbi müdafiə xarakterli tədbirlərdə yaxından iştirak edir, pul ehtiyatlarını, qızıl və gümüş əşyalarını, şəxsi dövlət istiqrazlarını «Qızıl Orduya yardım fondu»na verirdilər.

İnstitut əməkdaşları Qızıl Ordunun daha yaxşı silahlanması üçün başlanan ümumxalq hərəkatında da yaxından iştirak edirdi. 1945-ci ilin yanvarında yeni tank dəstələrinin yaradılması üçün kollektivin könüllü topladığı 30 min manat nəğd pul və 50 min manatlıq istiqraz cəbhəyə göndərilmişdir. Ali pedaqoji məktəb əməkdaşlarının Qızıl Ordunun Ali baş komandanlığına göndərdiyi məktubda xahiş olunurdu ki, mümkünsə, toplanmış vəsait Azərbaycan xalqının şanlı oğlu, iki dəfə Sovet İttifaqı Qəhrəmanı, tank qoşunları general-mayoru Həzi Aslanovun komandanlıq etdiyi cəbhəyə hərbi sursat alınmasına sərf edilsin.

Kollektiv dərsdən sonra müdafiə xarakterli sənaye müəssisələrində işləyir, əhali arasında siyasi tərbiyə və hərbi vətənpərvərlik mövzularında söhbətlər aparırdı. Tələbə və müəllimlər hərbi hospitallara, sənaye obyektlərinə himayədarlıq edir, cəbhədən qayıtmış yaralı əsgər və zabitlərə qayğı və diqqət göstərirdilər.

SSRİ Silahlı Qüvvələrinin Ali Baş Komandanlığı Azərbaycan Dövlət Pedaqoji İnstitutunun bu hərbi vətənpərvərlik təşəbbüsünü yüksək qiymətləndirərək kollektivə təşəkkür məktubu göndərdi.

Böyük Vətən müharibəsi illərində ADPİ-də tədris işlərinin nümunəvi təşkili üçün Ə.Sultanlı SSRİ Ali Soveti Rəyasət Heyəti tərəfindən «Əmək igidliyinə görə» medalı ilə təltif olundu.

## 1.7. AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ İNSTİTUTU XX ƏSRİN 40-60-cı İLLƏRİNDƏ

Müharibədən sonrakı illərdə Sovet imperiyası Azərbaycanda siyasi və iqtisadi dayaqlarını daim möhkəmləndirməyə çalışırdı. Məqsəd bu idi ki, adamlar ölkədə «ən ədalətli» cəmiyyət quruculuğuna, Kommunist partiyasına və onun liderlərinə inansın, sovet həyat tərzini səadət kimi qəbul etsin, vacib əmək vərdişlərinə, politexniki təhsilə yiyələnsin və daha məhsuldar işləyə bilsinlər. Hakim bolşevik ideologiyasının uydurma ehkamlarının ictimai şüurun bütün formaları – təhsil, elm, əxlaq, din, hüquq, ədəbiyyat, incəsənət və s. üzərində rəsmi inhisarlarını təmin etmək bu işdə ən mühüm vasitə idi. Məktəb məhsuldar işləmək, vacib bilik və bacarığa, müəyyən əmək vərdişlərinə yiyələnmək üçün vasitə, mövcud rejimə sadiq icraçı işçilər, kadrlar hazırlanmasında mühüm pillə idi. İstehsal və texnologiya mürəkkəbləşdikcə işçilərin ümumtexniki təhsil səviyyəsinə olan tələbatı daha da artırdı. Milli regionlarda ruslaşdırılma istiqamətində ciddi addımlar atılırdı. Dövlət idarələrində işlərin rus dilində aparılması, bu dili mükəmməl bilməyənlərin vəzifə nərdivanı ilə yüksəlmək imkanının olmaması adamları təhsili rus dilində almağa meyilləndirirdi. Rus məktəblərinin şəhərlərdə sayı xeyli artmışdı. Bu məktəblərdə Azərbaycan dilinə, Azərbaycan tarixi və coğrafiyasına az saat ayrılır, çox yerlərdə onun tədrisi formal xarakter daşıyırdı.

Ali məktəblərdə tədrisin məzmunu mövcud rejimin məqsədlərinə müvafiq şəkildə müəyyən olunur, ictimai elmlərin tədrisinə üstünlük verilirdi. «Sov.İKP tarixi», «Elmi kommunizm», «Marksist-leninçi fəlsəfə» və «Siyasi iqtisad»ın tədrisinə diqqət artırılırdı.

Müharibədən sonrakı illərdə şəxsiyyətə pərəstiş daha geniş vüsət aldı. İctimai şüurun bütün formaları üzərində kommunist ideologiyasının hegemonluğu təmin olundu. «Formaca milli, məzmunca sosialist mədəniyyət» formulu dəmir buxova çevrilib milli mədəniyyətlərə özünəməxsus ənənələrini açıb göstərməyə imkan vermirdi.

Ali məktəblərdə 40-cı illərin ikinci yarısından başlayaraq «Azərbaycan tarixi»nə barmaqarası baxıldı, onun tədrisinə ayrılan saatların həcmi azaldığından kursu tam öyrənməyə imkan vermirdi. Eləcə də fənn ciddi şəkildə saxtalaşdırılmış dərsliklər və proqramlar üzrə tədris olunurdu. «SSRİ tarixi» əvvəllər olduğu kimi, yenə də, əsasən, Rusiyanın tarixini əks etdirirdi.

ADPİ-də 1948-ci ildə «qəbulun azaldılması» bəhanəsi ilə Azərbaycan tarixi kafedrası əsassız olaraq bağlandı. 50-ci illərin sonunda onu yenidən bərpa etmək

cəhdlərinə baxmayaraq, bu «təşəbbüs» baş tutmadı. Yalnız respublikanın rəhbərliyinə gələn Heydər Əliyevin yaxından köməyi ilə 1971-ci ildə ADPİ-də «Azərbaycan tarixi» kafedrası yenidən təşkil edilib fəaliyyət göstərə bildi.

Müharibədən sonra respublikada ümumtəhsil məktəblərinin artması ilə əlaqədar ali təhsilli müəllimlərə böyük ehtiyac vardı. 1945–46-cı tədris ilində bu məktəblərdə çalışan 21873 nəfər müəllimin yalnız 2288 nəfəri (9,6 faizi) ali təhsilli idi. Müharibə Xalq Maarif sisteminin və ali təhsilli müəllimlər hazırlayan pedaqoji institutların fəaliyyətinə mənfi təsir göstərmişdi. Odur ki, qələbədən sonra qəbul olunmuş beşillik planlarda xalq maarifi sahəsində başlıca vəzifə məktəb şəbəkəsini bərpa edib genişləndirmək, onların işini yaxşılaşdırmaq və müəllim kadrları hazırlamaqdan ibarət idi.

Bu sahədə əsaslı dəyişikliklərin edilməsi nəticəsində ali məktəblər, o cümlədən pedaqoji institutlar müəllim kadrları yetişdirmək işində nailiyyətlər əldə etdi. Bunu aşağıdakı cədvəldən daha aydın görmək olar:

| **Pedaqoji kadrların sayı** | **1940** | **1952** | **1958** | **1959** | **1960** | **1961** | **1962** |
|---|---|---|---|---|---|---|---|
| Ali məktəbi bitirənlərin sayı | 2543 | 5541 | 5141 | 6474 | 5545 | 6073 | 6441 |
| O cümlədən ali pedaqoji məktəbi bitirənlər | 910 | 3726 | 1627 | 3191 | 2653 | 3362 | 3907 |

ADPİ-nin Xarici dillər fakültəsi 1948–1949-cu tədris ilindən etibarən müstəqil Xarici Dillər Pedaqoji İnstitutuna çevrildi və ADPİ-yə tələbə qəbulu azaldıldı. Həmin tədris ilində institutda Rus dili və ədəbiyyatı fakültəsi, 1949–1950-ci tədris ilində isə Bədən tərbiyəsi fakültəsi təşkil edildi.

1945–1950-ci illərdə ADPİ-də tələbə qəbulu, tələbələrin sayı və tərkibi, buraxılışı aşağıdakı kimi idi:

| **Tədris ili** | **Qəbul** | **Cəmi (ilin əvvəli üçün)** | **O cümlədən:** | | | **Cəmi (ilin axırı üçün)** | **Buraxılış** |
|---|---|---|---|---|---|---|---|
| | | | **Azərb.** | **Qadın** | **Azərb. qadın** | | |
| 1945–1946 | 340 | 879 | 389 | 651 | 236 | 647 | 53 |
| 1946–1947 | 608 | 1168 | 727 | 709 | 325 | 861 | 171 |
| 1947–1948 | 655 | 1497 | 1006 | 788 | 422 | 1396 | 176 |
| 1948–1949 | 600 | 1532 | 1050 | 681 | 344 | 1468 | 200 |
| 1949–1950 | 600 | 1858 | 1245 | 758 | 473 | 1720 | 337 |

Azərbaycan Dövlət Pedaqoji İnstitutu 1946-cı ildə özünün 25 illiyini təntənə ilə bayram etdi. Respublikamızda maarifin, elm və mədəniyyətin inkişafında böyük xidmətlər göstərən ali pedaqoji təhsil müəssisəsi bu vaxta qədər müxtəlif bölmə və ixtisaslar üzrə 7000 nəfərə qədər müəllim hazırlamışdı. Bu o demək idi ki, o zaman respublikanın 454 orta məktəbində dərs deyən ali təhsilli müəllimlərin 80 faizindən çoxu ADPİ-nin məzunları idilər.

ADPİ-də 1932–1946-cı illərdə təkcə Azərbaycandan deyil, Gürcüstan, Özbəkistan, Türkmənistan, Dağıstan və başqa respublikalardan da onlarla gənc gəlib təhsil alırdı.

İnstitutda 25 il müddətində 600 nəfərdən artıq fizika-riyaziyyat müəllimi hazırlanmış, 1937–1946-cı illərdə isə alman, fransız və ingilis dili ixtisasları üzrə 200-ə qədər mütəxəssis yetişmişdi. Respublikamızın ali məktəbləri və elmi müəssisələrində 40-cı illərin ikinci yarısında riyaziyyat və fizika ixtisasları üzrə çalışan mütəxəssislərin çoxu ADPİ-nin yetirmələri idilər. Onların bir çoxu respublikanın ali məktəblərində və elmi müəssisələrində rəhbər vəzifələrə seçilmişdilər. Ə.Əlizadə Respublika Elmlər Akademiyası Zoologiya İnstitutunun direktoru, Ş.A.Əliyev ADPİ-nin Üzvi kimya kafedrasının müdiri, K.Qəmbərov ADU-nun Zoologiya kafedrasının müdiri, Ə.Ə.Əsgərov ADPİ-nin və ADU-nun dosenti vəzifəsində işləmişlər.

ADPİ-nin Dil və ədəbiyyat fakültəsini bitirənlərdən M.Rahim, M.Dilbazi, C.Xəndan, H.Araslı, O.Sarıvəlli, Ə.Əbülhəsən, M.Cəfər, M.H.Təhmasib, M.C.Paşayev və başqaları artıq institutun 25 illik yubileyi günlərində respublikamızda tanınmış alim və yazıçı səviyyəsinə yüksəlmişdilər.

Azərbaycanda rəhbər partiya və hökumət vəzifələrində işləyənlərin, elm və mədəniyyət xadimlərinin böyük bir qrupu, o cümlədən Azərbaycan EA prezidentinin müavini akademik Heydər Hüseynov, Azərbaycan Nazirlər Soveti yanında Siyasi Maarif İşləri Komitəsinin sədri, yazıçı S.Rəhimov, yazıçı Mehdi Hüseyn, SSRİ Ali Soveti Millətlər Soveti sədrinin müavini, Azərbaycan K(b)P MK-nın məktəblər şöbəsinin müdiri Çimnaz Aslanova, Azərbaycan maarif naziri M.Ələkbərov, bəstəkar S.Rüstəmov, Azərbaycan Nazirlər Soveti yanında Baş Mətbuat İdarəsinin rəisi C.Cəfərov, Azərbaycan K(b)P Bakı Şəhər Komitəsi katibi Ə.Rəhimli və başqaları da ADPİ-də təhsil almışdılar.

Respublikamızda elm, maarif və mədəniyyətin inkişafında Azərbaycan Dövlət Pedaqoji İnstitutu 50-ci illərdə də fəal rol oynayırdı.

50–70-ci illərdə bir çox görkəmli elm və maarif xadimləri: *prof.* ***Cəfər Xəndan Hacıyev*** (07.05.48–16.08.50), *dos.* ***Mehdi Mehdizadə*** (19.08.50–14.12.51), *dos.* ***Həmid Qədirov*** (14.12.51–24.06.54), *dos.* ***Cəbrayıl Ələsgə-***



***Cəfər Xəndan Zeynal oğlu Hacıyev*** *1910-cu ildə İrəvan şəhərində anadan olmuşdur. Müəllimlər İnstitutunda Dil və ədəbiyyat fakültəsinin dekanı, Azərbaycan Dövlət Pedaqoji İnstitutunda kafedra müdiri, rektor, Azərbaycan EA-nın Dil və Ədəbiyyat İnstitutunda şöbə müdiri, Azərbaycan Yazıçılar Birliyində təşkilat katibi, «Ədəbiyyat qəzeti»nin məsul katibi vəzifəsində çalışmışdır. Doktorluq dissertasiyası müdafiə etmiş, filologiya elmləri doktoru (1948) elmi dərəcəsi və professor elmi adı almışdır (1949). Azərbaycan Dövlət Universitetində Filologiya fakültəsinin dekanı, rektoru (1950–1954) və Sovet ədəbiyyatı kafedrasının müdiri(1958–1961) vəzifələrində işləmişdir. Qırmızı Ulduz (1942), Qırmızı Əmək Bayrağı (1946) ordenləri ilə təltif edilmişdir. Çoxlu sayda bədii əsərin və tərcümə ədəbiyyatının müəllifidir. Hacıyev Cəfər Xəndan Zeynal oğlu 1961-ci ildə vəfat etmişdir.*



***Mehdi Məmməd oğlu Mehdizadə*** *1903-cü ildə Cəbrayıl rayonunun Daşkəsən kəndində anadan olmuşdur. İbtidai və orta məktəblərdə müəllim (1921–1930), V.İ.Lenin adına APİ-də dosent, professor, kafedra müdiri, dekan, prorektor (1932–1937) və rektor (1950–1951), Azərbaycan SSR maarif naziri (1952–1954; 1960–1980) vəzifələrində işləmişdir. UNESCO-da müxtəlif illərdə yaşlıların təhsil işləri üzrə məsləhət komitəsinin daimi üzvü (1961–1965) olmuş, UNESCO konfranslarında iştirak etmişdir. Qısa fasilələrlə «Azərbaycan məktəbi» jurnalı redaksiya heyətinin üzvü (1976–1984) olmuşdur. 1980-ci ildə həmmüəllifi olduğu «Azərbaycan xalq maarifinin sürətli inkişafı» adlı monoqrafiyası Azərbaycan və rus dillərində nəşr edilmişdir. 1982-ci ildə ona Əməkdar elm xadimi fəxri adı verilmişdir. 1984-cü ildə müəlliflərindən biri olduğu «Xalq maarifinin inkişafında sovet Azərbaycanının təcrübəsi» kitabı UNESCO tərəfindən ingilis və fransız dillərində kütləvi tirajla nəşr edilmişdir. Azərbaycanda məktəb təhsilinin tarixi və inkişafı problemlərinin tədqiq edilməsində, xalq maarifi və pedaqogikanın inkişafında, yüksəkixtisaslı müəllim və elmi kadrlar hazırlanmasında böyük xidmətləri vardır.*

*Mehdizadə Mehdi Məmməd oğlu 1984-cü ildə vəfat etmişdir.*



***Həmid Musa oğlu Qədirov** Şamaxı şəhərində anadan olmuşdur. 18 saylı Pedaqoji təmayüllü orta məktəbi bitirmişdir (1921). Azərbaycan Politexnik İnstitutunun Kənd Təsərrüfatı fakültəsində (1927–1929), Daşkənd şəhərindəki Pambıq İnstitutunda təhsil almışdır (1930–1932). Azərbaycan SSR EA-nın Botanika İnstitutunun aspiranturasını bitirmişdir. Botanika bağının direktoru (1943–1949), Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru (1951–1954), elmi işlər üzrə prorektor (1954–1962), Botanika kafedrasının müdiri (1950–1984), həmin kafedranın professoru (1968) vəzifələrində fəaliyyət göstərmişdir. 65-dən artıq elmi əsərin müəllifidir. Pedaqoji və elmi-pedaqoji kadr hazırlığındakı xidmətlərinə görə Əməkdar elm xadimi fəxri adına layiq görülmüşdür. Qırmızı Əmək Bayrağı, Şərəf nişanı ordenləri və medallarla təltif olunmuşdur.*

*Qədirov Həmid Musa oğlu 1990-cı ildə vəfat etmişdir.*

***rov*** (28.06.54–19.12.56), *dos.* ***Mehdixan Vəkilov*** (19.12.56–17.09.62), *prof.* ***Mehdi Əliyev*** (17.09.62–03.02.65), *prof.* ***Şövqi Ağayev*** (11.02.65–14.07.70) ADPİ-nin direktoru vəzifəsində işləmişlər.

ADPİ-də 1950–1951-ci tədris ilində Tarix, Dil-ədəbiyyat, Fizika-riyaziyyat, Təbiyyat-kimya, Rus dili və ədəbiyyatı, Coğrafiya fakültələri vardı. Bədən tərbiyəsi şöbəsi tələbələrinin sayı az olduğuna görə (cəmi 32 nəfər) müvəqqəti olaraq Coğrafiya fakültəsinin tərkibinə verildi.



***Cəbrayıl Ağəli oğlu Ələsgərov** 1907-ci ildə Şamaxıda anadan olmuşdur. Azərbaycan Sənaye İnstitutunu bitirmişdir. 1937-ci ilin noyabrında Bakı Dövlət Universitetinin rektoru vəzifəsinə təyin edilmişdir. 1938-ci ildə Azərbaycan SSR Ali Sovetinə deputat seçilmişdir.*

*Müharibə illərində maarif nazirinin müavini vəzifəsində çalışmışdır. Azərbaycan K(b)P MK bürosunun 1-3 aprel 1944-cü il tarixli qərarına əsasən Təbrizdə açılmış azərbaycandilli 10 illik məktəbin direktoru vəzifəsinə təyin edilmişdir.*

*Ələsgərov Cəbrayıl Ağəli oğlu 1969-cu ildə vəfat etmişdir.*



***Mehdixan Yusif oğlu Vəkilov*** *1902-ci ildə Qazax rayonunun Yuxarı Salahlı kəndində anadan olmuşdur. Qazax Müəllimlər Seminariyasını və Azərbaycan Dövlət Universitetini bitirmişdir. Azərbaycan Dövlət Pedaqoji İnstitutunda rektor (1956–1962), Sov.İKP tarixi kafedrasının müdiri (1956–1969), həmin kafedranın professoru (1969–1975) işləmişdir. 1969-cu ildə doktorluq dissertasiyası müdafiə etmiş, elə həmin ildə də professor seçilmişdir. 1973-cü ildə Əməkdar elm xadimi fəxri adını almışdır. Azərbaycanın sovet dövrü tarixinin tədqiqatçılarındandır. Azərbaycan SSR Ali Sovetinin (5-ci çağırış) deputatı olmuşdur. Müxtəlif orden və medallarla təltif olunmuşdur.*

*Vəkilov Mehdixan Yusif oğlu 1975-ci ildə vəfat etmişdir.*

Respublikanın bütün ali məktəblərində 50-ci illərin ortalarından başlayaraq struktur dəyişiklikləri edildi. Bu, ADPİ-də də nəzərə çarpırdı. Hələ 1952-ci ildə ADPİ-nin Rus dili və ədəbiyyatı fakültəsi M.F.Axundov adına Rus Dili və ədəbiyyatı İnstitutu tərkibinə verilmişdi. İnstitutda 1954-cü ilin oktyabr ayında yeni Bədən tərbiyəsi fakültəsi yaradıldı. Pedaqoji institutlar 1956–1957-ci tədris ilindən beşillik təhsil müddətinə keçildi və fakültələrin ixtisaslaşdırma təmayülü genişləndirildi. İnstitutda Tarix-filoloji, Fizika-riyaziyyat,

***Mehdi Sadiq oğlu Əliyev*** *1907-ci ildə Kirovabad (Gəncə) şəhərində anadan olmuşdur. Gəncə Müəllimlər Seminariyasını (1920–1924) və Azərbaycan Dövlət Universitetinin Fizika-riyaziyyat (1925–1930) fakültəsini bitirmişdir. 1931-ci ildən etibarən Azərbaycan Pedaqoji İnstitutunda, Azərbaycan Tibb İnstitutunda, Azərbaycan Kənd Təsərrüfatı İnstitutunda, Azərbaycan Dövlət Universitetində pedaqoji fəaliyyət göstərmişdir. Fizika-riyaziyyat elmləri namizədi elmi dərəcəsi və dosent, professor elmi adlarını almışdır. Azərbaycan Dövlət Universitetində Fizika-riyaziyyat fakültəsinin dekanı (1945–1952), tədris işləri üzrə prorektor (1952–1959), Molekulyar fizika kafedrasının müdiri, Azərbaycan Pedaqoji İnstitutunun rektoru (1962–1965), Azərbaycan Dövlət Universitetinin rektoru (1965–1970) vəzifələrində çalışmışdır.*



*Əliyev Mehdi Sadiq oğlu 1969-cu ildə vəfat etmişdir.*



***Şövqi Süleyman oğlu Ağayev*** *1926-cı ildə Şamaxı şəhərində anadan olmuşdur. Azərbaycan Tibb İnstitutunu və Bakı ikiillik Müəllimlər İnstitutunu bitirmişdir. 1954-cü ildə «Fikri məqsədin xarakterindən asılı olaraq görmə qavrayışının dinamikası» mövzusunda namizədlik, 1967-ci ildə isə «Əmək, tərbiyə və inkişaf» mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. O, Azərbaycanda psixologiya sahəsində ilk elmlər doktorudur.*

*ADPİ-də kafedra müdiri, tədris işləri üzrə prorektor və rektor (1965–1970) vəzifələrində çalışmışdır. 5 kitabın və 100-dən artıq elmi məqalənin müəllifidir.*

*Ağayev Şövqi Süleyman oğlu 1975-ci ildə vəfat etmişdir.*

Ədəbiyyat-coğrafiya və Bədən tərbiyəsi fakültələri (sonuncuda təhsil 4 il idi) yenidən təşkil olundu. Tədbirlərin həyata keçirilməsi nəticəsində institutu bitirən gənclər təhsil müddəti ərzində iki ixtisas qazanmaq imkanı əldə etdilər.

İnstitutda 1951–1958-ci tədris illərində tələbələrin ümumi sayı və buraxılışı aşağıdakı kimi idi:

| **Tədris ili** | **Qəbul** | **İnstitut üzrə tələbələrin ümumi sayı** | **Buraxılış** |
|---|---|---|---|
| 1950–1951 | 600 | 1987 | 370 |
| 1951–1952 | 600 | 2057 | 407 |
| 1952–1953 | 700 | 2230 | 478 |
| 1953–1954 | 807 | 2509 | 690 |
| 1954–1955 | 800 | 2490 | 387 |
| 1955–1956 | 625 | 2662 | 478 |
| 1956–1957 | 628 | 2734 | 681 |
| 1957–1958 | 675 | 2623 | 691 |
| 1958–1959 | 775 | 3256 | 621 |

ADPİ-də 50-ci illərdə müəllim kadrları hazırlığında ciddi uğurlar əldə edildi. Əgər təşkil olunduğu 1921-ci ildən 1946-cı ilədək olan 25 il müddətində ali məktəbi 7000 nəfər bitirmişdisə, bərpa ediləndən – ilk buraxılış ilindən (1947) sonra keçən 12 il ərzində (1958) oranı 4466 nəfər qurtarmışdı.

ADPİ-də 50-ci illərdə professor-müəllim heyətinin tərkibi aşağıdakı kimi idi:

| Tədris ili | Cəmi (ilin əvvəli üçün) | Professor | O cümlədən elmlər doktoru | Dosent | O cümlədən elmlər doktoru | O cümlədən elmlər namizədi | Baş müəllim | O cümlədən elmlər namizədi | Assistent və müəllim | O cümlədən elmlər namizədi |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| 1950–1951 | 189 | 10 | 9 | 49 | – | 46 | 69 | 20 | 60 | – |
| 1951–1952 | 183 | 7 | 6 | 39 | – | 38 | 73 | 16 | 64 | – |
| 1952–1953 | 207 | 6 | 5 | 49 | – | 48 | 84 | 20 | 68 | – |
| 1953–1954 | 232 | 9 | 8 | 49 | – | 49 | 71 | 10 | 103 | – |
| 1954–1955 | 242 | 11 | 10 | 67 | – | 66 | 63 | 16 | 101 | 7 |
| 1955–1956 | 245 | 15 | 13 | 78 | 1 | 78 | 58 | 15 | 94 | 9 |
| 1956–1957 | 258 | 10 | 9 | 72 | – | 72 | 66 | 29 | 110 | 6 |
| 1957–1958 | 248 | 11 | 11 | 70 | – | 70 | 66 | 26 | 101 | 5 |
| 1959–1960 | 312 | 10 | 10 | 72 | – | 2 | 95 | 37 | 135 | 1 |

Azərbaycanın xüsusiyyətlərini nəzərə alan respublika Ali Soveti 1959-cu ilin mart ayının 26-da ali təhsilin əsaslı surətdə yenidən qurulması haqqında qanun qəbul etdi. Müəllimlərin hazırlanması işini yaxşılaşdırmaq məqsədilə ali pedaqoji məktəblərin quruluşunda bir sıra dəyişikliklər edilməsi zərurəti nəzərə alındı. Pedaqoji institutlar vasitəsilə müəllim kadrları yetişdirilməsinin keyfiyyətini yaxşılaşdırmaq işində respublika Nazirlər Sovetinin 1959-cu il 26 may tarixli «Azərbaycanda ali pedaqoji məktəblərin profilləri haqqında» qərarının böyük əhəmiyyəti oldu. ADPİ-nin Bədən tərbiyəsi fakültəsi Bədən Tərbiyəsi İnstitutuna çevrildi. Təbiyyat-coğrafiya fakültəsinin coğrafiya və biologiya ixtisasları isə ADU-nun müvafiq fakültələri ilə birləşdirildi.

Azərbaycan Qiyabi Pedaqoji İnstitutu bütünlüklə, Gəncə Pedaqoji İnstitutunun Tarix-filoloji fakültəsi isə həmin ilin iyul ayının 1-də ADPİ-yə birləşdirildi. İnstitutda bir sıra yeni fakültə, şöbə, kafedra, laboratoriya və kabinələr təşkil edildi. Tədrisin və elmin səviyyəsini yüksəltmək imkanları çoxaldı. Eləcə də qiyabi təhsil yenidən qurulub genişləndirildi. Ali qiyabi təhsilə nəzarəti gücləndirmək məqsədilə qiyabi şöbə üzrə prorektor vəzifəsi yaradıldı.

M.S.Tahirli uzun müddət Pedaqoji İnstitutun qiyabi tədris şəbəkəsinə rəhbərlik etdi. Əvvəl qiyabi şöbə üzrə direktor müavini, sonra bu sahəni tənzimləyən prorektor vəzifəsinə təyin edildi.

ADPİ-nin yenidən qurulması onun maddi-texniki bazasının xeyli möhkəmlənməsinə, tələbələrin sayının artmasına imkan verdi. Əgər 1958–1959-cu tədris ilində institutda cəmi 3256 nəfər tələbə oxuyurdusa, 1959–1960-cı tədris ilində burada təhsil alanların sayı 7208 nəfərə çatdı. Tədrisin təşkili xalq maarifi orqanlarının yüksəkixtisaslı müəllimlərə ehtiyacını təmin etməyə istiqamətləndirildi. 1958–1959-cu tədris ilində institutu 552 nəfər bitirmişdisə, 1959–1960-cı tədris ilində respublikanın orta məktəbləri üçün 962 nəfər müəllim hazırlanmışdı ki, onlardan da 486 nəfəri qiyabi yolla təhsilini başa vuranlar idi.

Qiyabi şöbənin tələbələrinin institutun laboratoriya və kitabxanasından, professor-müəllim heyətinin elmi-pedaqoji təcrübəsindən istifadə etmələri üçün şərait yaradıldı, onlar üçün metodik göstəriş, dərs vəsaitləri hazırlamaq işinə diqqət artırıldı.

Nazirlər Soveti «Məktəbin həyatla əlaqəsini möhkəmlətmək və ölkədə Xalq Maarifi sistemini daha da inkişaf etdirmək haqqında» qərar verdi. İbtidai məktəblər üçün müəllimlər hazırlanması işini yaxşılaşdırmaq məqsədilə 1958–1959-cu tədris ilində institutda İbtidai təhsil pedaqogikası və metodikası fakültəsi açıldı. 1960–1961-ci tədris ilində institutun nəzdində axşam şöbəsi və 1962-ci ildə İbtidai təhsil pedaqogikası və metodikası fakültəsi nəzdindəki məktəbəqədər tərbiyə şöbəsi əsasında yeni fakültə yaradıldı. İnstitutda ibtidai məktəb pedaqogikası və metodikası, pedaqogika tarixi, əl əməyi və onun tədrisi metodikası, rəsm, musiqi və onların tədrisi metodikası kimi mürəkkəb və çoxcəhətli fənləri özündə birləşdirən İbtidai təhsil pedaqogikası kafedrası var idi. Bu qədər müxtəlif fənni əhatə etmək kafedra üçün çətin idi. Ona görə də 1962–1963-cü tədris ilində Məktəbəqədər tərbiyə fakültəsində musiqi və rəsm kafedrası, 1966–1967-ci tədris ilində isə Hesab və onun tədrisi metodikası kafedrası təşkil edildi.

Qiyabi və axşam şöbələrində oxuyan tələbələr üçün şərait yaradılması və güzəştlər edilməsi istehsalatdan ayrılmadan gənclərin ali təhsil almasına imkan verdi. Axşam şöbəsinə daxil olanların sayı artdıqca, yeni-yeni ixtisaslar da yaradılırdı.

Respublikanın beynəlxalq əlaqələrinin genişləndirilməsi ilə əlaqədar 60-cı illərdə xarici dillərin öyrənilməsini əsaslı surətdə təkmilləşdirmək qərara alındı. 1962–1963-cü tədris ilindən institutda Xarici dillər kafedrası (müdiri

dos. Ə.R.Yaqubi) yenidən təşkil edildi. Psixologiya pedaqogika kafedrası tərkibindən ayrılıb müstəqil kafedraya çevrildi. Bu təşkilati tədbirlər həmin fənlərin tədrisi keyfiyyətini yüksəltməklə bərabər, ixtisas sahələri üzrə dərslik, dərs vəsaiti yaradılmasına və elmi-tədqiqat işlərini genişləndirməyə imkan verdi.

Respublika hökumətinin 1963-cü il 11 iyun tarixli qərarında ali pedaqoji məktəblərin fakültələrində ümumtəhsil məktəbləri üçün yalnız bir ixtisas üzrə müəllim hazırlanması təklif olundu və beşillik təhsil müddəti dördillik təhsillə əvəz olundu.

1964–1965-ci tədris ilindən başlayaraq ADPİ-də mütəxəssislərin hazırlanması bir ixtisas üzrə təşkil edildi. Tarix-filoloji fakültəsi əsasında 1966-cı ildə müstəqil Tarix və filologiya, Fizika-riyaziyyat fakültəsi əsasında Fizika və riyaziyyat, Kimya-biologiya fakültəsi əsasında Kimya və Bilologiya-coğrafiya fakültələri yaradıldı. Coğrafiya şöbəsi 1968-ci ildə Biologiya fakültəsindən ayrılıb müstəqil fakültəyə çevrildi. Bu tədbirlər institutu bitirənlərə konkret bir ixtisas üzrə daha ətraflı bilik qazanmaq imkanı verdi, ümumtəhsil məktəblərinin müəllimə olan ehtiyacını tez və səmərəli şəkildə ödəməyə geniş imkanlar açıldı.

ADPİ-nin Azərbaycan dili və ədəbiyyatı, tarix və riyaziyyat ixtisaslarından ibarət Naxçıvan filialı 1967–1968-ci tədris ilində təşkil olundu. Naxçıvanın müəllim kadrlarına olan ehtiyacını nəzərə alaraq ilk dəfə həmin filialın üç ixtisası üzrə 100 nəfər tələbə qəbul edildi.

ADPİ-nin keçmiş ittifaq və sosialist ölkələrinin elmi müəssisələri və ali pedaqoji məktəbləri ilə əlaqələri xeyli genişləndi. Bakıda elmi ezamiyyətdə olan görkəmli alim – məşhur macar riyaziyyatçısı, prof. Geza Frayd, Çexoslovakiya riyaziyyatçısı, prof. Alons Kufner, SSRİ PEA-nın akademiki N.K.Qonçarov, M.V.Lomonosov adına MDU-nun professorları: A.İ.Busev, A.K.Kuroş, B.K.Kərimov, Y.A.Qorin, Moskva Pedaqoji İnstitutunun professoru B.M.Yavorski və başqaları fizika, riyaziyyat, kimya və pedaqogikanın aktual məsələlərinə dair maraqlı məruzələrlə institutun professor-müəllim və tələbə heyəti qarşısında çıxış etdilər.

Müharibədən sonra institutda elmi-pedaqoji kadrlara ciddi ehtiyac vardı. Cəbhəyə getmiş müəllimlərin xeyli hissəsi geri qayıtmamışdı. Onları əvəz edə biləcək gənc elmi-pedaqoji kadrlar hazırlamaq lazım idi. İnstitutda aspirantura yenidən təşkil ediləndən sonra (1944) elmi kadrlar probleminin həlli yolları tapıldı.

ADPİ-də 1945–1950-ci tədris illərində professor-müəllim heyətinin tərkibi belə idi:

| Tədris ili | Cəmi (ilin əvvəli üçün) | Professor | O cümlədən elmlər doktoru | Dosent | O cümlədən elmlər doktoru | O cümlədən elmlər namizədi | Baş müəllim | O cümlədən elmlər namizədi | Assistent və müəllim |
|---|---|---|---|---|---|---|---|---|---|
| 1945–1946 | 156 | 10 | 7 | 41 | – | 34 | 69 | 20 | 36 |
| 1946–1947 | 202 | 11 | 9 | 42 | – | 35 | 64 | 17 | 85 |
| 1947–1948 | 208 | 12 | 10 | 42 | – | 36 | 81 | 24 | 79 |
| 1948–1949 | 200 | 19 | 8 | 41 | – | 37 | 86 | 26 | 64 |
| 1949–1950 | 207 | 10 | 9 | 41 | – | 39 | 86 | 26 | 68 |

1945–1950-ci illərdə institutun müəllimlərindən 6 nəfər doktorluq, 30 nəfər isə namizədlik dissertasiyası müdafiə etdi.

Ayrı-ayrı illər üzrə doktorluq və namizədlik dissertasiyası müdafiələrinin vəziyyətini aşağıdakı cədvəldən aydın görmək olar:

| Tədris ili | Cəmi | O cümlədən namizədlik dissertasiyası | Doktorluq dissertasiyası |
|---|---|---|---|
| 1945–1946 | 5 | 4 | 1 |
| 1946–1947 | 4 | 2 | 2 |
| 1947–1948 | 10 | 7 | 3 |
| 1948–1949 | 7 | 7 | – |
| 1949–1950 | 9 | 9 | – |
| **Cəmi:** | **35** | **29** | **6** |

Filologiya fakültəsinin əməkdaşlarının yazdıqları elmi-tədqiqat işləri respublika ictimaiyyəti tərəfindən böyük rəğbətlə qarşılanırdı. ADU-nun Filoloji fakültəsinin Elmi Şurasında İ.Ə.Babayev «Füzulinin yaradıcılığı və Azərbaycan ədəbiyyat tarixində onun yeri» (1945), institutun Ümumi ədəbiyyat kafedrasının müdiri, dos. Ə.Sultanlı isə «Azərbaycan dramaturgiyasının inkişaf tarixi» (1946) mövzularında doktorluq dissertasiyası müdafiə etdilər. Ə.Sultanlının əsərində Azərbaycan dramaturgiyasının 1850–1932-ci illəri əhatə edən böyük bir dövrü ilk dəfə tədqiq edilib ümumiləşdirilirdi. Z.X.Tağızadə «XIX

və XX əsrlərin əvvəllərində Azərbaycan nəsrində tabeli mürəkkəb cümlə» (1949), B.M.İbrahimov isə «Mərəzə rayonunun şivələri» (1949) mövzularında namizədlik dissertasiyaları müdafiə etdilər.

Psixologiya kafedrasının müdiri Ə.K.Zəkuzadə ADU-nun Elmi Şurasında «IX–XI əsrlərdə Şərqdə fəlsəfə və psixoloji təlimin tarixindən» mövzusunda (1947-ci il oktyabrın 1-də), Pedaqogika kafedrasının müdiri dos. Ə.Y.Seyidov RSFSR PEA-nın Pedaqogika Nəzəriyyəsi və Tarixi Elmi-Tədqiqat İnstitutunda «XIX əsrdə Azərbaycanda pedaqoji fikrin əsas nümayəndələri» mövzusunda (1947-ci il dekabrın 11-də) doktorluq dissertasiyaları müdafiə etdilər. Bu, o zaman bütün respublikada pedaqogika və psixologiya elminin inkişafında mühüm bir hadisə idi. Ə.Y.Seyidov respublikada pedaqogika sahəsində ilk elmlər namizədi və ilk elmlər doktoru alimlik dərəcəsi alan alimdir. Onun doktorluq dissertasiyasında M.Ş.Vazeh, M.F.Axundov, S.Ə.Şirvani və H.B.Zərdabinin pedaqoji görüşləri ətraflı tədqiq edilmişdir.

Tarixçilərin və filosofların hazırladıqları dissertasiya işləri, əsasən, Azərbaycan tarixinə, xalqımızın mütəfəkkir nümayəndələrinin irsinin öyrənilməsinə həsr edilirdi. C.M.İbrahimov ADU-nun Elmi Şurasında «Gülüstan sülh müqaviləsi və Azərbaycan xalqının tarixi taleyində onun əhəmiyyəti» (1945) mövzusunda namizədlik, Azərbaycan tarixi kafedrasının müdiri, dos. İ.A.Hüseynov MDU-nun Elmi Şurasında «Azərbaycanda Sovet hakimiyyətinin qələbəsi» (1947-ci il iyun ayında) mövzusunda doktorluq dissertasiyaları müdafiə etdilər. İ.A.Hüseynov tarix elmləri doktoru alimlik dərəcəsi alan ilk azərbaycanlı alim idi. Marksizm-leninizm kafedrasının müdiri H.Əfəndiyev «SSRİ-də kəndli sinfinin ictimai təbiətinin dəyişilməsi» (1947) və M.M.Ağamirov «M.Ə.Sabirin ictimai-siyasi görüşləri» (1947), Ə.Əhmədli «Hipoteza və elmin inkişafında onun rolu» (1950) mövzularında namizədlik dissertasiyaları müdafiə etdilər. Akademik İ.A.Hüseynov ADPİ-nin Azərbaycan tarixi kafedrasının müdiri işlədiyi dövrdə (40-cı illərdə) xalqımızın tarixinin bir sıra mühüm məsələlərinə dair qiymətli tədqiqat əsərləri yazıb nəşr etdirdi. Onun «1918-ci ildə Azərbaycanda kəndli üsyanı» (1946), «1917–1918-ci illərdə Azərbaycanda Sovet hakimiyyəti uğrunda mübarizə tarixindən» (1947), «Bakı 1918-ci ildə ingilis imperialistlərinin işğalçılıq planında» (1949) və başqa kitabları o zaman Oktyabr çevrilişi probleminin öyrənilməsi üçün əhəmiyyətli idi. Ümumi tarix kafedrasının müdiri, dos. Ə.S.Sumbatzadənin «Azərbaycanın Rusiyaya birləşdirilməsi, onun iqtisadi və mədəni sahədə nəticələrinə və XIX əsrdə Azərbaycan iqtisadiyyatına təsiri», dos. C.M.İbrahimovun «XV əsrdə Azərbaycanda feodal dövlətlərinin tarixi», Y.Y.Ələsgərovun «XIX əsr-

də Zaqatala vilayətinin ictimai-iqtisadi vəziyyəti» və digər tədqiqat əsərləri elm aləmində böyük maraqla qarşılandı.

Riyaziyyat, fizika, kimya və onların tədrisi metodikası, coğrafiya və geologiya sahəsində də maraqlı dissertasiya işləri yazıldı. A.Ə.Verdizadə «Sulfat turşusu mühitində yodun üzvi həllediciIərinin iştirakı ilə üçvalentli dəmirin mikroyodometrik təyini» (1945), Üzvi kimya kafedrasının müdiri, dos. M.Əhmədli «Katalizin polyarizasiya nəzəriyyəsi baxımından birnüvəli və ikiqat əlaqəli karbohidrogenlərin qarışıq katalizator mühitində hidrogenləşməsi» (1947) mövzusunda doktorluq dissertasiyası müdafiə etdilər. Riyazi analiz kafedrasının müdiri, dos. İ.İ.İbrahimov Moskvada Steklov adına Riyaziyyat İnstitutunun Elmi Şurasında «Analitik funksiyaların bəzi interpolyasiya və aproksimasiya problemləri» (1948-ci il fevralın 12-də) mövzusunda doktorluq, Y.Məmmədov «Neft məhsullarının daxili sürtünmə əmsalının və xüsusi çəkisinin dərinlik və yataqdan asılı olaraq tədqiqi» (1948), fizika və riyaziyyatın tədrisi metodikası kafedrasının müdiri B.A.Ağayev «Natamam orta məktəblərdə cəbrin tədris edilməsi məsələsinə dair» (1949) mövzularında namizədlik dissertasiyaları müdafiə etdilər. B.A.Ağayev Azərbaycanda riyaziyyatın tədrisi metodikasına aid dissertasiya müdafiə etmiş ilk mütəxəssis idi.

O.Osmanov «Kür-Araz ovalığının fiziki coğrafiyası» (1947), S.Ş.Şükürov ADU-nun Geoloji-coğrafiya fakültəsinin Elmi Şurasında «Qutqaşen-Vartaşen rayonlarının iqtisadi coğrafiyası» (1949), M.Ə.Axundov «Ağdam rayonunun iqtisadi coğrafiyası» (1949), H.Ə.Sadıqlı Gürcüstan Elmi-Tədqiqat Pedaqogika İnstitutunda «Orta məktəblərdə Azərbaycan coğrafiyasının tədrisində əyanilik» (1950), S.M.Süleymanov ADU-nun Geologiya-mineralogiya fakültəsinin Elmi Şurasında (1947) və M.N.Rəcəbov Azərbaycan EA Geologiya İnstitutunun Elmi Şurasında (1949) namizədlik dissertasiyaları müdafiə etdilər. Bundan başqa, M.Ə.Qarayevin tarixə, Z.H.Cahangirovun siyasi iqtisada, A.Roşalın rus ədəbiyyatına, K.H.Ağazadənin alman dilinə, C.Cəbrayılbəylinin təbiətşünaslığın tədrisi metodikasına, M.Mustafayevanın pedaqogikaya, V.Hacıyevin zoologiyaya, N.Terentyevanın rus dili və ədəbiyyatı tədrisi metodikasına dair namizədlik dissertasiyası müdafiə etmələri ADPİ-də tədqiqat işlərinin genişləndiyini nümayiş etdirdi. Eləcə də Azərbaycan Dövlət Pedaqoji İnstitutunun professor və müəllimləri tərəfindən elmin müxtəlif sahələrinə aid çoxlu kitab, məqalə və dərs vasitələri yazılıb işıq üzü gördü.

ADPİ-nin elmi əsərlərinin yeni cildinin nəşr edilməsi (1946) institutun tədris və elmi həyatında əlamətdar hadisə oldu. Burada Ə.Y.Seyidovun «Azərbaycan ədəbiyyatında vətənpərvərlik və qəhrəmanlıq», Ə.K.Zəku-

zadənin «Məktəbəqədər və məktəbyaşlı uşaqlarda abstrakt təfəkkürün inkişafı», M.X.Şəriflinin «Eldəgizlər dövləti haqqında», İ.A.Hüseynovun «1918-ci ildə Azərbaycanda kəndli üsyanı», Ə.M.Dəmirçizadənin «Ədəbi dil», Ə.A.Sultanlının «Xalq draması, onun quruluşu və xüsusiyyətləri», Z.M.Şahtaxtinskayanın «Azərbaycanın çöl quşlarının daxili parazitləri (helmintləri) haqqında» məqalələri «Əsərlər»ə salındı.

Elmlər Akademiyasının buraxdığı «Azərbaycan dilinə aid tədqiqlər» (1947) kitabında «Fonetika» və «Sifət» bəhslərini institutun Azərbaycan dilçiliyi kafedrasının müdiri prof. Ə.Dəmirçizadə, «Fel» bəhsini isə dil və ədəbiyyat fakültəsinin dekanı, dos. İ.Əfəndiyev yazdı.

Prof. Ə.M.Dəmirçizadənin 1947-ci ildə «Müasir Azərbaycan dili» əsəri çap edildi. Bu, Azərbaycan dilinin sintaksisinə aid ilk elmi kitab idi, dilçilik sahəsində yaranmış boşluğu qismən doldurmağa xidmət edirdi. Alimin həmin il başqa monumental əsəri də («Azərbaycan dilinin tarixi» – I cild) tələbələrin ixtiyarına verildi. Müəllif ilk dəfə olaraq, Azərbaycan dilinin köklərinə nüfuz etmiş, ən qədim dövrlərdən başlayaraq tarixini müəyyənləşdirməyə, inkişaf yollarını və xüsusiyyətlərini təhlil etməyə təşəbbüs göstərmişdi.

Prof. M.Ş.Şirəliyevin qiymətli tədqiqatı – «Bakı dialekti» monoqrafiyası 1949-cu ildə nəşr olundu. Bu kitab sonra yazılan bütün dialektoloji əsərlər üçün nümunə rolunu oynadı və ən yaxşı dialektoloji tədqiqat kimi indi də elmi əhəmiyyətini saxlayır.

Orta məktəblərdə Azərbaycan dili tədrisinin metodikasına dair araşdırmalara olan ehtiyacı ödəmək üçün A.S.Abdullayev «Orta məktəbdə Azərbaycan dili» metodik vəsaitini nəşr etdirdi.

Azərbaycan və dünya ədəbiyyatının görkəmli tədqiqatçısı prof. M.H.Rəfilinin elmi-nəzəri səviyyəsinə görə seçilən «Ədəbiyyat nəzəriyyəsi» dərsliyi bu sahədə Azərbaycan dilində ilk tədris vəsaiti kimi böyük əhəmiyyətə malikdir. Alim rus dilində hazırladığı əsərləri vasitəsilə Azərbaycan ədəbiyyatını rus və keçmiş SSRİ-nin başqa xalqlarına tanıtdırmaqda əvəzsiz xidmətlər göstərdi. M.Rəfili Azərbaycan oxucularının rus ədəbiyyatının görkəmli nümayəndələri ilə tanış olması üçün də xeyli zəhmət sərf etdi.

Respublikamızda dünya ədəbiyyatının mahir bilicisi və tədqiqatçısı kimi şöhrət qazanmış prof. Ə.A.Sultanlı həm də tədris işlərinin istedadlı təşkilatçısı idi. Onun «Ü.Hacıbəyovun dramaturgiyası» (1945) məqaləsi və «Antik dünyada estetika və ədəbiyyatşünaslıq məsələləri» (1946) kitabçası ədəbi fikir tariximizdə diqqətəlayiq əsərlər və antik ədəbiyyatı elmi baxımdan öyrənməyin ilk nümunələri idi.

Fizika kafedrasının müdiri, dos. A.Abbaszadə müharibədən sonrakı illərdə səmərəli elmi fəaliyyət göstərdi, molekulyar və istilik fizikası sahəsində bir çox mühüm nəticələr əldə etdi. Fizika kafedrasının əməkdaşları uğurlu elmi əsərlərin çapına nail oldular. B.M.Yusifzadənin «Həndəsənin əsasları», A.Pobedinskinin Azərbaycan dilində «Elementar həndəsə metodikası» (1947) adlı dərs vəsaitləri və A.Abbaszadənin «Termodinamika» (1948) kitabı dövrün ən yaxşı araşdırmaları sayılır.

Təbiyyat fakültəsinin müəllimləri – S.C.Hüseynov «Embriologiya kursu», M.Ə.Axundov «Darvinin həyat və yaradıcılığı», S.X.Osmanzadə «Bitkilər sistematikası» adlı dərs vəsaitləri hazırladılar.

İngilis dili kafedrasının müdiri R.A.Qayıbova, filoloji elmlər namizədi Y.Y.Reçitskaya və baş müəllim A.Q.Mdivani tərəfindən Azərbaycan qrupları üçün «İngilis dili» və N.Q.Ağazadənin «Alman dili» dərslikləri meydana gəldi. Bunlar xarici dillər üzrə yeganə tədris vəsaitləri idi.

ADPİ-nin rektorluğu aspirantura yolu ilə yüksəkixtisaslı mütəxəssislər hazırlanmasına, fakültə və kafedra rəhbərlərinin, professor-müəllim heyətinin tərkibinin yeni elmi-pedaqoji qüvvələr hesabına möhkəmləndirilməsinə və elmi-tədqiqat işlərinin kəmiyyət və keyfiyyətinin artırılmasına, yüksəldilməsinə xüsusi əhəmiyyət verirdi. İnstitutun aspiranturasında ixtisas sahələri ilbəil daha da genişləndirilirdi. ADPİ-də 1952–1953-cü tədris ilində 15 kafedra üzrə 40 nəfər aspirant təhsil alırdı. Aspirantların əksəriyyəti institutun öz məzunları idilər.

İnstitutda 50-ci illərdə aspirantların qəbulu, ümumi sayı və buraxılışı belə idi:

| **Tədris ili** | **Qəbul** | **Cəmi** | **Buraxılış** |
|---|---|---|---|
| 1950–1951 | 15 | 36 | 9 |
| 1951–1952 | 11 | 36 | 7 |
| 1952–1953 | 14 | 40 | 13 |
| 1953–1954 | 11 | 36 | 12 |
| 1954–1955 | 9 | 35 | 11 |
| 1955–1956 | 10 | 30 | 15 |
| 1956–1957 | 10 | 30 | 12 |
| 1957–1958 | 11 | 30 | 11 |
| 1958–1959 | 10 | 30 | 12 |

ADPİ 50-ci illərdə də respublikada filologiya elminin ön sıralarında gedirdi. Burada Azərbaycan ədəbiyyatı tarixinin görkəmli tədqiqatçıları prof. M.H.Rəfili və prof. F.S.Qasımzadə çox məhsuldar işləyir, yeni-yeni əsərlər meydana gətirirdilər. M.H.Rəfilinin irihəcmli «M.F.Axundov», «Görkəmli inqilabçı və yazıçı Nəriman Nərimanov», «Mirzə Şəfi dünya ədəbiyyatında», F.S.Qasımzadənin «Nəcəf bəy Vəzirov» (1945), «XIX əsr Azərbaycan ədəbiyyatı» (1956), «Abbasqulu Ağa Bakıxanov (Qüdsi)» (1956) və s. monoqrafiya və dərslikləri məhz həmin dövrün yaradıcılıq məhsulları idi.

Azərbaycan ədəbi əlaqələrinə dair Ş.Q.Qurbanovun «Puşkin və Azərbaycan poeziyası», F.S.Qasımzadənin «A.S.Puşkin və M.F.Axundov», A.M.Məmmədovun «M.Qorki və Azərbaycan ədəbiyyatı» əsərlərində bir çox aktual məsələlər özünün elmi təhlilini tapdı. Bunlarla yanaşı, Azərbaycan dili və ədəbiyyatına, ədəbi əlaqələri tarixinə dair bir sıra əhəmiyyətli elmi-tədqiqat işləri hazırlanıb müdafiə edildi. İ.Q.Şıxlı «Mehdi Hüseynin nəsri», Ş.Q.Qurbanov «Puşkin və Azərbaycan poeziyası», P.Ş.Əfəndiyev «Koroğlu Azərbaycan xalqının qəhrəmanlıq eposudur», A.M.Hüseynov «Vartaşen rayonu şivələri», A.A.Məhərrəmov «Sovet dövründə Azərbaycan mətbuatında ədəbi dilin başlıca məsələlərinin (əlifba, orfoqrafiya, terminologiya) müzakirəsi», B.M.Rəhimova «Müasir Azərbaycan dilində tamamlıq» və M.M.Rzazadənin «M.P.Vaqifin qoşma, deyişmə və təcnislərinin leksikası» mövzularında müdafiə olunan namizədlik dissertasiyalarında filologiya elminin müxtəlif problemlərinə aydınlıq gətirilirdi.

Azərbaycan türkologiya elminin görkəmli nümayəndələrindən biri, prof. Ə.M.Dəmirçizadənin rəhbərliyi altında Azərbaycan dilçiliyi sahəsində qiymətli tədqiqatlar aparıldı, məzmunlu elmi əsərlər meydana gəldi. Xüsusilə prof. Ə.M.Dəmirçizadənin «Azərbaycan ədəbi dilinin inkişaf yolları» (1958), «Kitabi-Dədə Qorqud» dastanlarının dili» (1959) monoqrafiyaları gərgin və ciddi əməyin məhsulu idi. Bundan başqa, İ.R.Əfəndiyev, B.M.İbrahimov və H.Abdullayevin müştərək yazdıqları «Azərbaycan dili» kitabının I cildi (1957), A.S.Abdullayevin «Orta məktəbdə Azərbaycan dili metodikası» (1957), A.M.Hüseynovun pedaqoji institutlar üçün hazırladığı «Azərbaycan dialektologiyası» (1958) dərsliyi çap edildi.

İnstitutun professor-müəllim heyəti Azərbaycan tarixi, siyasi iqtisad və fəlsəfəyə aid maraqlı mövzularda tədqiqat işləri aparırdılar. Tarixçi-alimlərdən – dos. M.R.Qasımov ADPİ-də işlədiyi müddətdə «1906–1917-ci illərdə «Molla Nəsrəddin» jurnalının ictimai-siyasi ideyaları», M.N.Şıxlı «1871–1921-ci illərdə Sovet-İran münasibətləri», dos. M.Y.Vəkilov və N.A.Paşa-



*Pedaqoji fakültənin ilk tələbələri*

yev «Azərbaycanda mədəni quruculuğun inkişafı tarixi», Ş.Ə.Sadıqov «Zaqafqaziya federasiyasının Qafqaz xalqlarının iqtisadi və mədəni inkişafında rolu», S.S.İbrahimov «İkinci beşillik illərində kənd təsərrüfatında sosializm yarışının təşkili», Ə.P.Əliyev «Neft sənayesində sosializm yarışı», İ.Q.Şükürzadə «Böyük Vətən müharibəsi illərində arxa cəbhədə təşkilatçılıq işi», Y.Y.Ələsgərov «XIX əsrdə Zaqatala vilayətinin ictimai-iqtisadi əlaqələri tarixi», H.Z.Əliyev «İkinci Dünya müharibəsindən sonra Türkiyədə amerikan ekspansiyası», Ə.K.Dilbazi «Bərpa dövründə Azərbaycanın kənd təsərrüfatı» kimi ciddi məsələləri tədqiq edərək qiymətli dissertasiya işləri hazırladılar.

Çap edilmiş tədqiqat işləri içərisində Pedaqogika və psixologiya kafedrasının üzvlərindən dos. M.Ə.Muradxanovun «A.S.Makarenkonun pedaqoji irsi və ondan istifadə edilməsi yolları» (1955), T.İ.Əfəndiyevin «Müəllim və komsomol təşkilatı» (1955), prof. Ə.Y.Seyidov, prof. Ə.K.Zəkuzadə, dos. M.Ə.Muradxanov və dos. Ş.S.Ağayevin «Pedaqogika və psixologiya terminləri lüğəti» (1958), Ə.Seyidov və Ə.Tağıyevin «Pedaqogika tarixi» (1958), H.Əhmədovun «İbtidai məktəb şagirdlərinin kommunist tərbiyəsində nümunənin rolu» (1958) əsərləri xüsusi əhəmiyyət kəsb edirdi. Elmi-tədqiqat işlə-

rinin bir hissəsini namizədlik və doktorluq dissertasiyaları təşkil edirdi. Kafedranın dosentləri M.Mehdizadə «Azərbaycan SSR-də məktəb quruculuğu tarixinin xülasələri» (1957) və A.S.Abdullayev «Azərbaycan dilinin tədrisi tarixi» (1958) mövzusunda doktorluq dissertasiyaları müdafiə etdilər. Respublikada pedaqogika sahəsində prof. Ə.Y.Seyidovdan sonra ikinci elmlər doktoru M.Mehdizadə, üçüncüsü isə A.S.Abdullayev idi. A.S.Abdullayev Azərbaycan dilinin tədrisi metodikası ixtisası üzrə birinci doktorluq dissertasiyası müdafiə etmiş, bu sahədə elmi kadrların yetişməsində böyük rol oynamışdır. Gənc elmi kadrların hazırlanması üçün hər cür şərait yaradılırdı.

Psixologiya sahəsində A.K.Abdullayev «İbtidai məktəbin I–II sinif şagirdlərində idrak maraqlarının inkişafı» (1953), Ş.S.Ağayev «Fikri məqsədin xarakterindən asılı olaraq görmə qavrayışının dinamikası» (1954), M.Ə.Həmzəyev «İbtidai məktəbin ikinci sinif şagirdlərində samitlər üzrə yazı vərdişlərinin təşəkkül etməsi və inkişafının psixoloji xüsusiyyətləri» (1955) mövzularında namizədlik dissertasiyası müdafiə etdilər.

Zoologiya kafedrasına 1937-ci ildən başçılıq edən prof. Z.M.Şahtaxtinskayanın rəhbərliyi altında heyvanların parazit faunasını öyrənmək sahəsində tədqiqat işləri aparılırdı. Alim özü 1953-cü ilin mayında ADU-nun Elmi Şurasında «Azərbaycan ev və çöl quşlarının helmint faunası» mövzusunda doktorluq dissertasiyası müdafiə etdi.

Botanika kafedrasına 1950-ci ildən dos. H.M.Qədirov rəhbərlik etməyə başladı. İnstitutun Təbiyyat fakültəsini bitirmiş dos. Z.Q.Qayıbov, Q.İbadzadə, T.Nəsirli və başqaları da bu kafedrada işləyirdilər.

Fiziologiya kafedrası 1951-ci ildə yenidən təşkil olundu. Kafedraya dos. T.D.Qayıbov rəhbərlik edirdi. Burada dos. R.Z.Qafarova, biologiya elmləri namizədi K.X.Əzizbəyova, tibb elmləri namizədi İ.M.Süleymanov və başqa tanınmış mütəxəssislər çalışırdılar. Kafedranın əməkdaşları, əsasən, yaş fiziologiyası probleminə dair tədqiqat işi aparırdılar.

Kimya kafedrasında 40-cı illərin sonu və 50-ci illərdə akademik M.F.Nağıyev, professorlardan – X.Ş.Kələntərli, M.Q.Əhmədli, Ş.Ə.Məmmədov, dosentlərdən – Ə.M.İsmayılzadə, S.N.Quluzadə, institutun keçmiş məzunları A.Ə.Verdizadə, Ə.Ö.Əbdürrəhimov kimi tanınmış mütəxəssislər dərs deyirdilər. Fakültənin yetişdirmələri R.Y.Əliyev, B.H.Həsənov və İ.O.Nəsibov da aspiranturanı bitirib dissertasiya müdafiə etdikdən sonra kafedrada işləməyə başladılar.

Ümumi kimya kafedrasına 1946–1956-cı illərdə prof. X.Ş.Kələntərli rəhbərlik edirdi. 1956-cı ildə institutun yetişdirməsi prof. Ş.Ə.Məmmədov

onun yerinə kafedraya müdir təyin olundu. Bundan sonra bir sıra mühüm mövzularda elmi-tədqiqat əsərləri, elmi-metodiki kitablar, dərs vəsaitləri hazırlandı. Dos. Ə.Ə.Əbdürrəhimovun «Kimya məsələlərinin həlli üsulu» (1954), «Kimya tədrisi üsulu» (1959), «Yeddinci sinifdə kimya təcrübələrinin qoyuluşu» (1953), dos. A.Ə.Verdizadənin «Yarım mikrokimyəvi analiz» (1958) adlı dərs vəsaitləri, X.Ş.Kələntərlinin qeyri-üzvi və üzvi kimya kurslarında katalizə dair elmi araşdırmaları kimya elminin inkişafında mütərəqqi rol oynadı.

Fizika və riyaziyyat elmləri və onların tədrisinin metodikası sahəsində də ciddi tədqiqat işləri aparılaraq mühüm elmi nəticələr əldə edildi. Respublikamızın elmi-tədqiqat müəssisələri içərisində neft və mayelər fizikasının inkişaf etdirildiyi əsas elm müəssisəsi ADPİ-nin Fizika kafedrası idi. Görkəmli tədqiqatçı və elm təşkilatçısı A.Abbaszadənin rəhbərlik etdiyi fizika kafedrası mayelər problemi üzrə M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin molekulyar fizika və istilik hadisələri kafedrası ilə yaxından əlaqə saxlayır, həmin kafedranın iştirakı və yaxından köməyi ilə səmərəli elmi axtarışlar aparırdı. Fizika kafedrasının müdiri, dos. A.Abbaszadə 1953-cü ilin mart ayında M.V.Lomonosov adına MDU-da fizika-riyaziyyat elmləri doktoru elmi dərəcəsi almaq üçün müvəffəqiyyətlə dissertasiya müdafiə etmişdir.

Fizika kafedrasının üzvlərindən A.Əmiraslanov, P.A.Paşayev, M.Ü.İsmayılov, Ə.Xəlilov və başqaları maraqlı tədqiqatlar aparırdılar.

Riyazi analiz kafedrasının müdiri vəzifəsində 1947-ci ildən çalışan prof. İ.İ.İbrahimovun rəhbərliyi altında funksiyalar nəzəriyyəsi sahəsində elmi-tədqiqat işləri aparılırdı. Respublikamızın ali məktəblərində işləyən riyaziyyatçılardan 14 nəfəri öz namizədlik dissertasiyasını ADPİ-nin Riyazi analiz kafedrasında hazırlamışdı. Onların içərisində institutun baş müəllimləri, fizika-riyaziyyat elmləri namizədləri M.R.Əfəndiyev, Ə.Ə.Cəfərli, Ə.S.Cəfərov, Q.Ə.Orucov, R.H.Məmmədov və başqaları da vardı.

Fizika və riyaziyyatın tədrisi metodikası sahəsində aparılan tədqiqat işlərinin ünvanı 1946-cı ildən etibarən Fizika və riyaziyyatın tədrisi metodikası kafedraları idi. Dos. B.Şəfizadə 1951-ci ildə kafedraya müdir təyin edildi. Bundan sonra B.Şəfizadə, B.Sultanov, S.Osipov, T.Xasməmmədov, M.Əfəndiyev və C.Xələfov prof. A.Q.Abbaszadənin rəhbərliyi altında fizika metodikasının aktual məsələlərinə dair dissertasiyalar yazdılar.

B.Ə.Ağayev, Ə.Y.İbrahimov, M.Ə.Məmmədov və başqaları riyaziyyatın metodikası üzrə dissertasiya müdafiə etdilər. ADPİ respublikada riyaziyyat və fizika metodikası üzrə dissertasiya müdafiə edilən yeganə elmi müəssisə idi.

Ali və orta məktəblərdə fizika və riyaziyyatın tədrisini yaxşılaşdırmaq üçün ADPİ-nin professor-müəllim heyəti tərəfindən bir çox dərs vəsaitləri hazırlandı. A.Abbaszadənin Y.Ə.Əmənzadə ilə birlikdə yazdığı «İstilikkeçirmə nəzəriyyəsinə giriş» (1955) əsərinin I hissəsini və İ.İbrahimovun «Ədədlər nəzəriyyəsinin əsasları» (1956) kitablarının əhəmiyyətini xüsusilə qeyd etmək lazımdır. Bundan başqa, B.Ə.Ağayevin «İbtidai məktəbdə hesabdan metodik vəsait», «Orta məktəbdə riyaziyyat tədrisinin ümumi metodikası» (1951), T.K.Xasməmmədovun «Azərbaycan məktəbi» məcmuəsində «Fizika terminləri» (1953), B.Ş.Sultanov və T.K.Xasməmmədovun «Fizikadan maraqlı təcrübələr», B.M.Şərifzadənin «Fizikanın təlimində politexnik təlimin keçirilməsi yolları», B.Ş.Sultanovun «Orta məktəbdə optika kursunun tədrisində politexniki təlim elementlərinin verilməsi» və başqalarının maraqlı tədris vəsaitləri nəşr edildi.

«ADPİ-nin elmi əsərləri»nin müntəzəm çapdan çıxması tədqiqat işlərinin inkişafına müsbət təsir göstərirdi. Məcmuənin 1953-cü ildə I cildi, 1955-ci ildə II cildi, 1957-ci ildə III cildi, 1958-ci ildə isə IV, V və VI cildləri işıq üzü gördü. Cildlərə institutun professor-müəllim və aspirantlarının müxtəlif elm sahələrinə aid dəyərli tədqiqat işləri daxil edilirdi.

İnstitutun professor-müəllim heyəti tərkibində 60-cı illərdə əsaslı kəmiyyət və keyfiyyət dəyişiklikləri baş verdi. Bu işdə elmi hissə və onun nəzdində fəaliyyət göstərən aspirantura şöbəsinin rolu böyük idi. ADPİ-də elmi işlər üzrə direktor müavini vəzifəsinin təşkil edilməsindən sonra (1957-ci ilin oktyabrında) elmi-tədqiqat işlərinin keyfiyyətinin yaxşılaşdırılmasına, mühüm nəzəri və təsərrüfat əhəmiyyətli problemlərin işlənib hazırlanmasına imkan yarandı. Prof. A.Abbaszadə institutda elmi işlər üzrə ilk direktor müavini oldu. Sonralar həmin vəzifədə prof. T.D.Qayıbov və prof. A.S.Abdullayev fəaliyyət göstərdilər. 1967-ci ildən isə həmin vəzifədə prof. R.Ə.Rəcəbov çalışdı.

Elmi-pedaqoji kadrların hazırlanmasında institutun müdafiə şuralarının böyük rolu oldu. ADPİ-də 1965-ci ildə dörd ixtisaslaşmış Müdafiə Şurası yaradıldı. Həmin şuralarda 1965–1968-ci illər ərzində 150 nəfər aspirant və dissertant elmlər namizədi alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə etdi. Onların 62 nəfəri institutun öz aspirantları və dissertantı, 40 nəfəri isə respublikanın başqa elmi müəssisələrindən və digər respublikalardan gələnlər idi. Ümumiyyətlə, Müdafiə Şurasında 240 nəfərdən artıq aspirant və müəllim müvəffəqiyyətlə namizədlik dissertasiyası müdafiə etmişdir. İnstitutun dosentlərindən C.M.İbrahimov, A.Ə.Mustafayev, N.A.Paşayev, A.Ə.Verdizadə,

Ş.Ə.Sadıqov, Ş.A.Haqverdiyev, M.H.Cavadov, Z.X.Tağızadə, T.S.Vəliyev, R.Z.Qafarova, N.K.Kərimov, Ş.S.Ağayev, A.M.Qurbanov, F.Q.Fərhadov, Ə.S.Bayramov, M.Y.Vəkilov, R.Ə.Rəcəbov, C.S.Quliyev və başqaları isə 60-cı illərdə müvəffəqiyyətlə doktorluq dissertasiyası müdafiə etdilər.

ADPİ-ni 1945–1969-cu illərdə bitirənlər arasında görkəmli alimlər, ictimai xadimlər, siyasətçilər, hakimiyyət orqanlarının rəhbərləri, xalq yazıçıları və şairlər var. Onların xeyli hissəsi bu gün də ali məktəblərdə, elmi-tədqiqat institutlarında çalışırlar. İnstitutun məzunları və aspirantları sırasında RF Təhsil Akademiyasının əcnəbi üzvləri Sədi İmanov və Hüseyn Əhmədov, Azərbaycan MEA-nın müxbir üzvü Afad Qurbanov, onlarla professor, əməkdar elm və maarif xadimlərini qeyd etmək olar. Filologiya fakültəsinin 1947-ci il məzunu görkəmli ictimai xadim, yazıçı, alim Şıxəli Qurbanov, xalq yazıçısı İsmayıl Şıxlı, xalq şairi Məmməd Araz, istedadlı şairlər – İlyas Tapdıq, Tofiq Bayram, Məstan Əliyev, Kələntər Kələntərov, yazıçı Sabir Əhmədov və başqaları da APİ-nin yetirmələridirlər.

Aparılan fundamental araşdırmalar, yazılan monoqrafiya, dərslik və dərs vəsaitləri, çap edilən yüzlərlə elmi məqalələr, müdafiə olunan namizədlik və doktorluq dissertasiyaları sübut edir ki, Azərbaycan Dövlət Pedaqoji İnstitutu müharibədən sonrakı iyirmi il ərzində (1945–1965) respublikanın ali məktəbləri içərisində elmi-tədqiqat fəaliyyəti sahəsində əsaslı nailiyyətlər əldə etmiş təhsil ocaqlarından biridir.

## GÖRKƏMLİ MƏZUNLARIMIZ



HEYDƏR HÜSEYNOV
*akademik*



YUSİF MƏMMƏDƏLİYEV
*akademik*



ZAHİD XƏLİLOV
*akademik*



İBRAHİM İBRAHİMOV
*akademik*



ƏŞRƏF HÜSEYNOV
*akademik*



MƏCİD RƏSULOV
*akademik*



HƏSƏN ABDULLAYEV
*akademik*



MƏMMƏDAĞA
ŞİRƏLİYEV
*akademik*



ŞIXƏLİ QURBANOV
*Dövlət Mükafatı laureatı*



MAQSUD CAVADOV
*AMEA-nın müxbir üzvü*



MAİS CAVADOV
*AMEA-nın müxbir üzvü*



FEYZULLA QASIMZADƏ
*akademik*



ƏLİSÖHBƏT SUMBATZADƏ
*akademik*



ABDULLA QARAYEV
*akademik*



MƏMMƏD ARİF DADAŞZADƏ
*akademik*



MƏMMƏDCƏFƏR CƏFƏROV
*akademik*



CÜMŞÜD ZÜLFÜQARLI
*AMEA-nın müxbir üzvü*



ƏBDÜLƏZƏL DƏMİRÇİZADƏ
*AMEA-nın müxbir üzvü*



**MİRZAĞA QULUZADƏ**
*AMEA-nın müxbir üzvü*



**MƏMMƏD MÖVSÜMZADƏ**
*AMEA-nın müxbir üzvü*



**HƏMİD ARASLI**
*akademik*



**BUDAQ BUDAQOV**
*akademik*



**ZƏRİFƏ BUDAQOVA**
*akademik*



**QƏRİB MƏMMƏDOV**
*akademik*



**ZARA ŞAXTAXTİNSKAYA**
*professor*



**İSMAYIL HACIYEV**
*akademik*



SƏMƏD VURĞUN
*xalq şairi*



MİKAYIL MÜŞFİQ
*şair*



MEHDİ HÜSEYN
*xalq yazıçısı*



İSMAYIL ŞIXLI
*xalq yazçısı*



SÜLEYMAN RƏHİMOV
*xalq yazıçısı*



EYYUB ABBASOV
*yazıçı*



SƏİD RÜSTƏMOV
*bəstəkar*



ZEYNAL XƏLİL
*şair*



GƏRAY FƏZLİ
*yazıçı*

# AZƏRBAYCAN RESPUBLİKASININ ƏMƏKDAR ELM XADİMLƏRİ



**MEHDİ MEHDİZADƏ**
***SSRİ PEA-nın həqiqi üzvü***



**ƏHMƏD SEYİDOV**
***professor***



**MƏRDAN MURADXANOV**
***professor***



**ROZA QAFAROVA**
***professor***



**NƏZƏR PAŞAYEV**
***professor***



**HƏMİD QƏDİROV**
***professor***



**SƏDİ İMANOV**
***SSRİ PEA-nın müxbir üzvü***



**MEHDİXAN VƏKİLOV**
***professor***



**AFAD QURBANOV**
***AMEA-nın müxbir üzvü***



**YUSİF MƏMMƏDOV**
*AMEA-nın müxbir üzvü*



**NİZAMİ XUDİYEV**
*professor*



**HƏSƏN MİRZƏYEV**
*Prezident təqaüd-çüsü, professor*



**PAŞA ƏFƏNDİYEV**
*professor*



**SÜLEYMAN MƏMMƏDOV**
*professor*

## AZƏRBAYCAN RESPUBLİKASININ PREZİDENT TƏQAÜDÇÜLƏRİ



**ƏBDÜL ƏLİZADƏ**
*professor*



**ƏDALƏT FƏRƏCOV**
*professor*

## AMEA-nın MÜXBİR ÜZVÜ



**VƏLİ ƏLİYEV**
*professor*

## AZƏRBAYCAN RESPUBLİKASININ ƏMƏKDAR ALİ MƏKTƏB İŞÇİLƏRİ



HÜSEYN ƏHMƏDOV
*RTA-nın əcnəbi üzvü, Prezident təqaüdçüsü*



NƏMİDƏ ABBASOVA
*professor*



GÖVHƏR TARVERDİYEVA
*professor*



SADIX ƏLİYEV
*professor*

## AZƏRBAYCAN RESPUBLİKASININ ƏMƏKDAR MÜƏLLİMLƏRİ



MƏMMƏDSƏLİM TAHİRLİ
*dosent*



ABDULLA TƏMRAZLI
*dosent*



ƏLİF ƏHMƏDOV
*dosent*



BƏYLƏR AĞAYEV
*professor*



İNCİ RÜSTƏMOVA



İBRAHİM ZEYNALOV
*xalq rəssamı*



MİRZƏLİ MURQUZOV
*professor*



**HƏSƏN BALIYEV**
*professor*



**MƏLİKMƏMMƏD CƏBRAYILOV**
*professor*



**MƏMMƏDƏLİ ƏBDÜLOV**
*dosent*



**YUSİF ƏHMƏDOV**
*professor*



**MUSTAFA ƏLİYEV**
*dosent*



**RƏHİM ƏLİYEV**
*dosent*



**VİLAYƏT ƏLİYEV**
*professor*



**TİNATİN ƏLİYEVA**
*dosent*



**SEYİDAĞA HƏMİDOV**
*professor*



**ŞAHƏLİ HƏSƏNOV**
*professor*



**ƏLİ HÜSEYNOV**
*professor*



**MƏBUD İSMAYILOV**
*dosent*



**ƏSAB QULİYEV**
*dosent*



**ƏLƏKBƏR QURBANOV**
*professor*



**DƏRGAH QÜDRƏTOV**
*professor*



**VƏLİ MUSAYEV**
*professor*



**QARDAŞXAN ORUCOV**
*professor*



**ZEMFİRA TAHİRLİ**
*dosent*



**NAİLƏ VERDİZADƏ**
*professor*

# «TƏRƏQQİ» MEDALLI ƏMƏKDAŞLARIMIZ



ƏDNAN AĞALAROV
*dosent*



RAFİQ BAXŞƏLİYEV
*professor*



ABBAS HACIYEV
*professor*



ALLAHVERDİ HACIYEV
*dosent*



HƏŞİM HƏŞİMOV
*professor*



BALAXAN HÜSEYNOV
*professor*



KAMAL HÜSEYNOV
*professor*



BULUDXAN XƏLİLOV
*professor*



ZAHİD XƏLİLOV
*professor*



HİMALAY QASIMOV
*professor*



NƏSRƏDDİN MUSAYEV



MAQSUD NƏCƏFOV
*dosent*



**TƏRLAN NOVRUZOV**
*professor*



**ƏMRULLA PAŞAYEV**
*professor*



**FƏRRUX RÜSTƏMOV**
*professor*



**OQTAY SULTANOV**
*professor*

## ƏMƏKDAR MƏDƏNİYYƏT İŞÇİSİ



**VAQİF ƏLİYEV**
*dosent*

## ƏMƏKDAR BƏDƏN TƏRBİYƏSİ VƏ İDMAN XADİMİ



**GÜLBABA QULİYEV**
*dosent*

# VƏTƏN DAŞI OLMAYANDAN, OLMAZ ÖLKƏ VƏTƏNDAŞI!

## SOVET İTTİFAQI QƏHRƏMANLARI



MEHDİ HÜSEYNZADƏ



XIDIR MUSTAFAYEV



FARİZ SƏFƏROV



SƏLAHƏDDİN KAZIMOV

## AZƏRBAYCANIN MİLLİ QƏHRƏMANLARI



MƏTLƏB QULİYEV



MİRƏLƏKBƏR İBRAHİMOV

## SOSİALİST ƏMƏYİ QƏHRƏMANLARI



ZƏRBƏLİ SƏMƏDOV



SƏFA İMANOV



RÜSTƏM SƏFƏRƏLİYEV

## II FƏSİL

# AZƏRBAYCAN PEDAQOJİ İNSTİTUTUNUN (ADPU-nun) İNKİŞAFINDA YENİ MƏRHƏLƏ

***(1969–2011-ci illər)***

## 2.1. HEYDƏR ƏLİYEV VƏ AZƏRBAYCANDA MİLLİ OYANIŞ, İQTİSADİ VƏ SOSİAL TƏRƏQQİ

14 iyul 1969-cu il Azərbaycanın ən yeni tarixinə dönüş mərhələsi kimi daxil oldu. Azərbaycan cəmiyyətinin mövcudluğunun, fəaliyyətinin, bütövlükdə həyatının ideya konseptual prinsiplərinin yeni milli-mənəvi dəyərlərinin təməli qoyuldu. İqtisadi və mənəvi tənəzzül dövrünü yaşayan Azərbaycanın tərəqqiyə dönüşü, cəmiyyətin keyfiyyətcə irəliyə, milli özünüdərkə, milli özünəqayıdışa dönüşün başlanğıcı oldu. Heydər Əliyevin hakimiyyətə gəlişi ilə qısa müddətdə cəmiyyət həyatının bütün sahələrinin sürətli yüksəlişi, istehsalın, elmin, mədəniyyətin, mənəviyyatın tərəqqisi əslində daha böyük nailiyyətlərə – milli ruhun inkişafına, milli özünüdərkin və milli qürurun yüksəlməsinə səbəb oldu. Bunlar gələcəkdə müstəqil Azərbaycan dövlətinin yaranmasına xidmət edən əzəmətli planın tərkib hissələrini təşkil etdi.

Azərbaycan xalqının Ümummilli lideri Heydər Əliyevin 30 ildən artıq davam edən ictimai-siyasi fəaliyyətində elmə, təhsilə göstərilən qayğı mühüm yer tutmuşdur. Heç də təsadüfi deyildir ki, Ümummilli liderin Azərbaycana rəhbərlik etdiyi illər elm və təhsil sahəsində intibahın yeni dövrü kimi səciyyələndirilir. Müxtəlif ali təhsil ocaqlarının yaranması, xalqın ali təhsilə cəlb olunması, elmi-tədqiqat institutlarının yaradılması, tədqiqat işlərinin genişlənməsi və AMEA-nın gərgin axtarışlarla zəngin fəaliyyəti məhz bu illərə təsadüf edir. Bütün bunlar təbii ki, ulu öndərimiz Heydər Əliyevin adı ilə bağlıdır.

Mübaliğəsiz demək olar ki, müasir Azərbaycan dövlətinin bünövrəsi məhz Heydər Əliyevin respublikaya rəhbərliyinin ilk mərhələsində (1969–1982) qoyulmuş, həmin dövrdə ölkə iqtisadiyyatının sürətli inkişafı, milli-mənəvi dəyərlərimizə yüksək həssaslıqla yanaşma, məqsədyönlü kadr hazırlığı bugünkü müstəqil Azərbaycanı uzaqgörənliklə öz hədəfinə almışdır. Ümummilli lider Heydər Əliyev XX əsrin sonu və XXI əsrin əvvəllərində böyük siyasi məharətlə Azərbaycanı, dövlətçiliyimizi, müstəqilliyimizi hədələyən bütün bəlaları dəf etmiş, iqtisadiyyatımızın, beynəlxalq əlaqələrimizin, milli birliyimizin möhkəm özülünü quraraq bizlərə əmanət etmişdir. Azərbaycanda təhsil sisteminin, o cümlədən ali təhsil ocaqlarının formalaşmasında, dövrün tələblərinə uyğun yenidən qurulmasında, sürətlə in-

kişafında, milli kadrların hərtərəfli hazırlanmasında bu tarixi şəxsiyyətin çox böyük və əvəzsiz xidmətləri vardır. O, XX əsrin 70-ci illərindən etibarən quruculuq missiyasını cəsarətlə öz üzərinə götürdü, siyasi strateq olaraq güclü kadr potensialı yaratmaqla sonrakı uğurların əsasını qoydu, milli təhsili sürətli inkişaf yoluna istiqamətləndirdi. Keçdiyimiz yola nəzər salarkən görürük ki, Azərbaycanda təhsilin, məktəbin tarixi çox qədim dövrlərdən başlasa da, tərəqqisi XX əsrlə bağlı olmuş və inkişafı 70-ci illərdən sonra daha geniş vüsət almışdır.

Məhz bu illərdə təhsil ölkəmizin iqtisadiyyatının, elm və mədəniyyətinin, sosial sahələrinin yüksəlməsinə təkan verən daha güclü qüvvəyə çevrildi, vətəndaşların təhsil almaq imkanlarının artırılması istiqamətində təsirli tədbirlər həyata keçirildi. Azərbaycana rəhbərlik edən Heydər Əliyevin daimi diqqət və qayğısı sayəsində respublikamızda məktəbəqədər tərbiyə müəssisələrindən tutmuş, ali məktəblərə qədər bütün təhsil müəssisələrinin şəbəkəsi ilbəil genişləndi, təhsil sisteminin maddi-texniki bazası ardıcıl surətdə möhkəmləndirildi. Bütün bunlar Heydər Əliyevin şəxsi təşəbbüslərinin nəticəsi idi. Onun məruzə, nitq və çıxışlarında Azərbaycan elminə, təhsilinə, mədəniyyətinə, zəngin mədəni-mənəvi irsinə qayğı ilə yanaşı, böyük hörmət və ehtiram mühüm yer tutur. Maarifin, təhsilin, elmin insanın həyatında, mənəvi aləminin zənginləşməsində, şəxsiyyətin formalaşmasında mühüm əhəmiyyət kəsb etdiyini vurğulayan Heydər Əliyev öz əməli fəaliyyəti ilə bunu bir daha sübut etmişdir. O, haqlı olaraq qeyd edirdi ki, savadı, təhsili olmayan gənc həyatda layiqli yer tuta bilməz. O, 1997-ci ildə respublikamızın və xarici ölkələrin ali məktəblərinə qəbul olunmuş tələbələrin bir qrupu ilə görüşündəki nitqində deyirdi ki, ***müasir həyat və dünyanın gələcəyi insanlardan daha çox bilik tələb edir, çünki gələcək bilikli, elmli insanların çiyinləri üzərində qurulacaqdır***.

Heydər Əliyevin Azərbaycanda təhsilin, maarifin inkişafına qayğısı onun SSRİ hökumətinin rəhbərliyində olduğu illərdə də zəifləməmiş, əksinə, daha da artmışdır. Tamamilə qanunauyğun haldır ki, yüksək ziyalılığı, intellektual səviyyəsi, maarifə hədsiz məhəbbəti ilə həmişə fərqlənən müdrik öndərimiz vaxtilə SSRİ Nazirlər Soveti sədrinin I müavini vəzifəsində çalışarkən keçmiş Sovet imperiyasında həm də təhsil sahəsinə ümumi rəhbərliyi həyata keçirmişdir. 1983–1984-cü illərdə SSRİ-də məktəb islahatının Heydər Əliyevin rəhbərliyi altında aparılması təsadüfi deyildir. O zaman Heydər Əliyevin SSRİ Ali Sovetinin sessiyasında etdiyi «Ümumtəhsil və peşə məktəbi islaha-

tının əsas istiqamətləri haqqında» tarixi məruzəsində irəli sürülmüş bir çox müddəalar indi Azərbaycanda həyata keçirilən təhsil islahatlarının aparıcı ideyasını, nəzəri mənbəyini təşkil edir. Ümumi orta təhsilə 6 yaşdan başlamaq və təhsilin müddətinin 11 il müəyyən edilməsi təklifi Heydər Əliyev tərəfindən irəli sürülmüş və bu ideya sonralar müstəqil Azərbaycanın milli təhsil quruculuğunda reallığa çevrilmişdir.

Heydər Əliyevin Azərbaycan təhsilinin inkişafındakı böyük xidmətlərindən biri də 1970–1980-ci illərdə şəxsi təşəbbüsü və qayğısı sayəsində Azərbaycandan kənarda – keçmiş Sovet İttifaqının 50-dən çox şəhərinin 170-dən artıq məşhur ali məktəblərində ən zəruri ehtiyac duyulan 250-dən çox ixtisas üzrə 15 mindən artıq azərbaycanlı gəncin təhsil almasıdır. Müqayisə üçün deyək ki, 1970-ci ildə Azərbaycandan başqa respublikaların ali məktəblərinə cəmi 60 nəfər tələbə göndərilmişdirsə, 1975-ci ildə 674 nəfər, yəni 11 dəfədən çox tələbə göndərilmişdir. Bu, böyük tarixi-mədəni nailiyyət idi və bu tarixi uğur Heydər Əliyevin adı ilə bağlıdır. Heydər Əliyev Azərbaycandan kənarda təhsil almış yüksəkixtisaslı mütəxəssisləri «Azərbaycanın yetirmələri, Azərbaycanın milli sərvəti» kimi yüksək qiymətləndirərək onların potensial imkanlarının bir istiqamətdə cəmləşdirilməsi, müstəqil Azərbaycanın sosial-iqtisadi və mədəni quruculuğunda səmərəli istifadə olunması üçün dəyərli tövsiyələr vermişdir.

Qətiyyətlə demək olar ki, Heydər Əliyevin Azərbaycana uzunmüddətli rəhbərliyinin ən sanballı göstəricilərinin bir istiqaməti respublikada azərbaycançılıq məfkurəsinin və milli ruhun hədsiz yüksəlişi, milli özünüdərkin keçmişin bütün buxovlarından azad olması, xalqın tarixi yaddaşının özünə qaytarılması kimi fundamental prinsiplər əsasında milli dövlətçilik arzularının və hislərinin güclənməsi, real siyasi amilə çevrilməsidir. Azərbaycanın intibah dövrü kimi səciyyələndirilən 70–80-ci illər xalqımızın qəlbində, düşüncələrində illərlə yığılıb qalmış milli ideyanın – azadlıq, müstəqillik, suveren Azərbaycan dövləti ideyalarının canlanmasına, gələcəkdə qüdrətli milli azadlıq hərəkatının ideya-mənəvi əsası və hərəkətverici özəyi dərəcəsinə yüksəlməsinə zəmin yaratdı.

Müstəqillik dövründə onun yenidən böyük siyasətə qayıdışı Azərbaycan təhsilini durğunluqdan və əldə edilmiş nailiyyətlərin itirilməsindən xilas etdi. 1995-ci ildə təhsilə ayrılan vəsait ümumi dövlət büdcəsinin 10, 1997-ci ildə 20, 2001-ci ildə 23 faizini təşkil etmişdir. Bu müddətdə müəllim və tərbiyəçilərin əməkhaqqı 9 dəfə artmışdır.



*Böyük maarifçi Heydər Əliyevə*
*təhsil naziri Misir Mərdanov «Xalq müəllimi»*
*fəxri adının diplomunu təqdim edərkən (25 sentyabr 1998-ci il)*

Heydər Əliyevin 1998-ci ilin mart ayında Təhsil İslahat Komissiyası, 1999-cu ilin iyun ayında Təhsil İslahat Proqramı, 2000-ci ilin iyun ayında «Respublika təhsil sisteminin təkmilləşdirilməsi haqqında» məlum fərmanları Azərbaycan Respublikasının təhsil siyasətinin ideoloji-konseptual əsaslarını təşkil etməklə, onun beynəlxalq təhsil sisteminə inteqrasiyasına təkan verdi. Bütün bunlar onu deməyə əsas verir ki, ***Heydər Əliyev Azərbaycan təhsilinin qurucusu, inkişafetdiricisi və əvəzsiz hamisi olmuşdur***.

## 2.2. HEYDƏR ƏLİYEV AZƏRBAYCAN PEDAQOJİ İNSTİTUTUNDA

Azərbaycanın XX əsr tarixində respublikanın heç bir dövlət rəhbəri ali məktəblərin həyatı, onun fəaliyyəti ilə Heydər Əliyev qədər ciddi maraqlanmamış, onun çətinliklərini, problemlərini yerindəcə öyrənib, işinin yenidən qurulmasına xüsusi qayğı, maddi və mənəvi kömək göstərməmişdir.

Heydər Əliyev respublikaya rəhbərlik etdiyi ilk günlərdən ali məktəblərə qayğısını əsirgəmədi, dövlətin maddi və mənəvi dəstəyini göstərdi, təhsil işçilərinə hər cür köməklik etməyi özünün başlıca vəzifəsi bildi. Respublikanın bütün ali məktəbləri kimi, Azərbaycan ali pedaqoji təhsilinin öncülü və bayraqdarı olan Azərbaycan Dövlət Pedaqoji Universitetinin elmi və pedaqoji kadr hazırlığı sahəsində uğurları bilavasitə Heydər Əliyevin adı və yorulmaz fəaliyyəti ilə bağlıdır. Böyük öndərimiz ADPU-nun tədris və elmi həyatı ilə daim maraqlanmış, Pedaqoji Universitetin yenidən qurulması, genişlənib möhkəmlənməsi üçün ciddi tədbirlər həyata keçirmişdir.

Heydər Əliyevin APİ-yə ilk gəlişi 1971-ci ilin dekabrına təsadüf edir. O, kollektivin yığıncağında hərtərəfli və dərin məzmunlu nitq söylədi, institutun fəaliyyətini təhlil etdi, ətraflı şəkildə professor-müəllim heyəti qarşısında duran vəzifələrdən danışdı. Heydər Əliyev bildirdi ki, Azərbaycan Dövlət Pedaqoji İnstitutunun və digər ali məktəblərin inkişafı üçün bütün bilik və bacarığını sərf edəcəkdir.

Azərbaycan rəhbərinin şəxsən Pedaqoji İnstituta gəlməsi, tələbə, professor-müəllim heyəti və digər əməkdaşlar qarşısında çıxışı kollektivin böyük ruh yüksəkliyinə və yaradıcılıq əzminin artmasına səbəb oldu. Onun ADPİ-yə ikinci gəlişi 1973-cü ilin mart ayının 2-də baş verdi. İnstitutun 50 illiyi münasibətilə indiki Şəhriyar adına Mədəniyyət sarayında təntənəli yığıncaq keçirilirdi. Heydər Əliyev yubileydə iştirak etdi və Pedaqoji İnstitutun yarıməsrlik yubileyi münasibətilə nitq söylədi. Sonra APİ-nin yüksək dövlət mükafatı – Qırmızı Əmək Bayrağı Ordeni ilə təltif edilməsi haqqında SSRİ Ali Soveti Rəyasət Heyətinin fərmanını elan etdi və ordeni institutun bayrağına sancdı.




V.İ.Lenin adına Azərbaycan
Dövlət Pedaqoji İnstitutunun
Qırmızı Əmək Bayrağı Ordeni
ilə təltif edilməsi haqqında
SSRİ Ali Soveti Rəyasət heyətinin

**FƏRMANI**

Müəllim kadrları hazırlamaq və pedaqogika elmini inkişaf etdirmək sahəsində qazandığı müvəffəqiyyətlərə görə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutu Qırmızı Əmək Bayrağı Ordeni ilə təltif edilsin

***SSRİ Ali Soveti Rəyasət heyətinin Sədri***
***SSRİ Ali Soveti Rəyasət heyətinin Katibi***
**Moskva, Kreml,**
**26 may 1972-ci il**

Bu, əlamətdar və yaddaqalan tarixi hadisə idi. Müəllim kadrları hazırlığında və pedaqoji elmin inkişafında xidmətlərinə görə ADPİ-nin professorları M.Y.Vəkilov, Ə.Dəmirçizadə, C.M.İbrahimov, H.M.Qədirov, R.Z.Qafarova, M.Ə.Muradxanov respublikanın əməkdar elm xadimi, institutun qocaman müəllimləri F.C.Əliyev, Ə.İ.Əhmədov, H.Ə.Hacıyev, İ.Ə.Rüstəmov, S.H.Sadıqov, İ.P.Stepanov, B.Ş.Sultanov, A.F.Tamrazlı, T.R.Tahirzadə və S.A.Əfəndiyeva respublikanın əməkdar müəllimi adına, prof. Z.H.Cahangirov isə əməkdar iqtisadçı fəxri adına layiq görüldülər. Azərbaycan Ali Sovetinin 2 mart 1973-cü il fərmanı ilə institut əməkdaşlarının böyük bir qrupu fəxri fərmanla təltif edildi. Heydər Əliyev yüksək dövlət mükafatlarına layiq görülənləri şəxsən təbrik etdi, onlara cansağlığı, təhsildə və elmdə, yaradıcılıq işlərində daha böyük nailiyyətlər qazanmalarını arzuladı. Əmin olduğunu bildirdi ki, kollektiv üzvləri bundan sonra da bütün bilik və bacarıqlarını respublikada yeni müəllim kadrlarının hazırlanmasına sərf edəcək, elmin müxtəlif sahələrində uğurlar qazanacaqlar.

İnstitutun qocaman müəllimi prof. Z.M.Şahtaxtinskaya və tələbə Fəridə İsmayılova ali məktəbin çoxminli kollektivi adından çıxış edərək Azərbay-



*Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev Azərbaycan Dövlət Pedaqoji İnstitutunda qəbul imtahanları zamanı*

canda ali məktəbin və xalq maarifinin inkişafına partiya və hökumətin göstərdikləri böyük qayğıdan razılıqla danışdılar. Əmin etdilər ki, yüksək hökumət mükafatı ali məktəbin müəllimlərini və tələbələrini əmək və təhsil işini daha da təkmilləşdirməyə həvəsləndirəcəkdir.

Heydər Əliyevin ADPİ-yə üçüncü gəlişi 1978-ci ilin avqust ayında respublika ali məktəblərində keçirilən qəbul imtahanlarının vəziyyəti ilə tanış olmaq məqsədi daşıyırdı.

Heydər Əliyev 1979-cu ilin yayında Sovet nümayəndə heyətinin başçısı kimi Yuqoslaviya və Bolqarıstanda olanda – Sofiyada ADPİ-nin tələbə-inşaat dəstəsində çalışan 16 nəfər tələbə ilə görüşüb söhbət etdi. Respublika başçısının tələbə nümayəndələrinə tövsiyə və məsləhətləri onları daha da ruhlandırdı, plan və öhdəlikləri yerinə yetirmələri üçün güc və enerji verdi.

Heydər Əliyevin APİ-yə dördüncü gəlişi 1981-ci ilin dekabr ayının 23-də APİ-nin 60 illik yubileyi ilə əlaqədar idi. Təntənəli mərasimdən əvvəl Azər-

baycan rəhbəri İnstitutu gəzib onun həyatı, tədris və elmi fəaliyyəti ilə tanış oldu. Sonra indiki Şəhriyar adına Mədəniyyət sarayında təşkil olunmuş təntənəli yığıncaqda dərin məzmunlu nitq söylədi, 60 ildə institutun keçdiyi çətin və şərəfli yolun bəzi anlarını xatırladaraq onun respublikanın mədəni və elmi həyatında xidmətlərini yüksək qiymətləndirdi.

Yığıncağı Ali və Orta İxtisas Təhsili naziri Q.H.Əliyev açdı.

Sov.İKP MK Siyasi Bürosu üzvlüyünə namizəd, Azərbaycan KP MK-nın birinci katibi H.Ə.Əliyevə söz verildi. Yığıncağa toplaşanlar onu hərarətlə qarşıladılar.

Respublika rəhbərinin dediklərindən:

*«60 il ərzində institutunuz şanlı yol keçmiş və Sovet Azərbaycanının gözəl nailiyyətlər qazanmasında böyük rol oynamışdır. Həmin dövrdə 65 min nəfərdən artıq alitəhsilli mütəxəssis hazırlanmışdır. İnstitutun yetirmələri indi respublika həyatının bütün sahələrində fəal işləyirlər. İnstitut tərəfindən hazırlanmış və indi xalq maarifi sahəsində çalışan mütəxəssislər 60 il ərzində respublikanın gənc nəslinin təlim və tərbiyəsi işinin əsas aparıcılarıdır. Eyni zamanda institutun yetişdirmələri elmi-tədqiqat institutlarında, müxtəlif müəssisələrdə, mədəniyyət sahəsində və başqa sahələrdə müvəffəqiyyətlə fəaliyyət göstərirlər. Demək olar ki, respublikada elə bir sahə yoxdur ki, institutun diplomunu almış mütəxəssislər orada işləməsinlər. Sizin yetişdirmələriniz hər bir şəhərdə, hər bir kənddə yaşayır və çalışırlar, hər bir məktəbdə işləyirlər. Mənə elə gəlir ki, bu sizin 60 illik şanlı yolunuzun ən gözəl yekunudur.*

*İnstitutun 60 illik fəaliyyəti onu respublikanın həyatının bütün sahələrilə sıx bağlamışdır və bu gün böyük razılıq hissi ilə qeyd edə bilərik ki, V.İ.Lenin adına Pedaqoji İnstitut Sovet Azərbaycanında xalq maarifinin təşəkkülü və inkişafı üçün, respublikada ali təhsilin yaradılması və inkişafı üçün çox böyük iş görmüşdür və bu sahələrdə görkəmli yer tutur».*

H.Ə.Əliyev daha sonra dedi:

*«Ali məktəbinizin yubileyinin qeyd edilməsi respublikada ümumxalq bayramı olmuşdur. Bu yubileyi qeyd edərkən hər kəs öz şəxsi həyatında institutun rolunu böyük iftixar hissi ilə xatırlayır və qeyd edir. Buna görə də bu gün mən respublikanın bütün əməkçilərinin ürək sözlərini ifadə edərək Azərbaycan Pedaqoji İnstitutunun kollektivinə respublika qarşısında böyük xidmətlərinə görə dərin təşəkkürümüzü və minnətdarlığımızı bildirirəm.*






*Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev ADPİ-nin 60 illik yubileyində (1981-ci il)*




*Azərbaycan KP MK-nın birinci katibi Heydər Əliyev ADPU-nun rektoru Afad Qurbanova Azərbaycan SSR Ali Soveti Rəyasət heyətinin Fəxri fərmanını təqdim edərkən (1981-ci il)*

*İnstitutda professor və müəllimlərin böyük kollektivi çalışır və altmış il ərzində bu kollektivdə bir neçə nəsil dəyişmişdir. Bu gün biz 20-ci illərdən bu günədək institutla birlikdə şanlı yol keçmiş, onun ölkədə ən böyük ali məktəblərdən birinə çevrilməsinə kömək etmiş, bütün kollektiv üzvlərinə, xüsusən respublikada xalq maarifinin inkişafında xidmətlərinə görə minnətdarlığımızı bildirmək istəyirik».*

Gurultulu alqışlardan sonra Heydər Əliyev sözünə davam edərək dedi:

*«Ali məktəb işçiləri qarşısında məsul vəzifələr qoyulmuşdur. Bizim qarşımızda həm iqtisadiyyat və mədəniyyət sahəsində, həm də sosial problemlərin həllində çox böyük vəzifələr durur və bu vəzifələrin müvəffəqiyyətlə yerinə yetirilməsi sizdən və sizin fəaliyyətinizdən asılıdır.*

*50 illiyi ilə əlaqədar olaraq və müəllim kadrları hazırlamasında böyük xidmətlərinə görə V.İ.Lenin adına Pedaqoji İnstitut Qırmızı Əmək Bayrağı Ordeni ilə təltif olunmuşdur. O vaxtdan 10 il keçmişdir. Bu müddətdə sizin ali məktəbiniz yeni müvəffəqiyyətlər qazanmışdır və deyə bilərəm ki, 70-ci illərdə onun fəaliyyəti daha da güclənmiş, daha səmərəli və daha faydalı olmuşdur. Bizim respublikamızın həyatında son 10 illikdə baş vermiş müsbət dəyişikliklərdə institutun rolunu böyük razılıq hissi ilə qeyd edirik. İndi institutunuz Azərbaycan SSR Ali Sovet Rəyasət Heyətinin Fəxri Fərmanı ilə təltif olunmuşdur. Mən səmimi-qəlbdən sizi bu mükafat münasibətilə də təbrik edir və onu sizə təqdim etmək istəyirəm».*

H.Ə.Əliyev Azərbaycan SSRİ Ali Soveti Rəyasət Heyəti Fərmanının mətnini oxudu və gurultulu, sürəkli alqışlar altında Fərmanı institutun rektoru prof. A.Qurbanova təqdim etdi. Sonra dedi:

*«Müəllimlik işi həm şərəfli, həm də çətin işdir. Ali məktəb müəllimi olmaq, müəllimlər hazırlamaq, yəni müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda ikiqat məsuliyyətli işdir. Biz yaxşı bilirik ki, 65 min nəfərdən artıq müəllim hazırlamaq üçün professor və müəllimlərin bütün nəsilləri nə qədər zəhmət çəkmişlər».*

İnstitutun rektoru, prof. A.M.Qurbanov ali məktəbin fəaliyyətinə yüksək qiymət verdiyi üçün respublika rəhbərliyinə və hökumətinə institutun kollektivi adından səmimi təşəkkürünü bildirdi. O, ADPİ-nin tarixindən danışıb qeyd etdi ki, kollektiv IX və X beşilliklər ərzində daha böyük müvəffəqiyyətlər qazanmışdır. Həmin müddətdə 18 yeni kafedra, 3 yeni fakültə – Bədii qrafika, Bədən tərbiyəsi, Texniki fənlər fakültələri yaradılmış və indi 10 fakültədə 10 min nəfərədək tələbə 20 ixtisasa yiyələnir. Rektor əmin etdi ki, gəncləri tərbiyə etmək, ideyaca mətinləşdirmək üçün ali məktəbin kollektivi var qüvvəsini, bilik və təcrübəsini sərf edəcəkdir.

Azərbaycan Respublikası XX əsrin sonunda dövlət müstəqilliyi əldə etdikdən sonra Heydər Əliyev 1993-cü ilin iyunundan etibarən yenə də respublikanın idarəetmə sükanı arxasında durdu və bütün sahələrdə olduğu

kimi, ali məktəblərin fəaliyyəti ilə də ciddi şəkildə maraqlanmağa başladı. Vaxtının azlığına baxmayaraq, 1998-ci ilin sentyabr ayının 28-də Azərbaycan Tibb Universitetinin yeni korpusunun istifadəyə verilməsinə həsr olunmuş təntənəli mərasimdə şəxsən iştirak etdi. Yeni binanın tədris və təchizatı ilə tanış oldu, məsləhətlərini, tövsiyələrini verdi. Bakı Dövlət Universitetinin 80 illiyi münasibətilə 1999-cu il sentyabr ayının 28-də BDU-nun tələbələri, professor-müəllim heyəti və əməkdaşları ilə görüşü müdrik rəhbərimizin xalq maarifinə və təhsil işinə hamiliyini göstərən çox mühüm amillərdəndir. 2000-ci ilin iyun ayında Azərbaycan Dövlət Tibb Universitetinin 70 illiyi münasibətilə göndərdiyi təbrik məktubunda respublikada ali təhsil və elm sahəsində böyük xidmətləri olan təhsil və elm məbədgahlarını «Azərbaycan xalqının milli və mənəvi sərvəti» adlandırdı.

## 2.3. AZƏRBAYCAN PEDAQOJİ İNSTİTUTUNDA TƏDRİS VƏ ELMİ FƏALİYYƏTİN TƏŞKİLİ
### *(XX əsrin 70-80-ci illəri)*

XX əsrin 70–80-ci illərində APİ-nin strukturunda müəyyən dəyişiklik edildi. 1969–70-ci tədris ilində Azərbaycan dili və ədəbiyyatı, erməni dili və ədəbiyyatı, fizika-riyaziyyat şöbələrindən ibarət Xankəndi filialı yaradıldı. Tədrisi Azərbaycan və erməni dillərində aparılan filialın əyani və qiyabi şöbələrinə ilk dəfə 245 nəfər tələbə qəbul olundu. İnstitutda riyaziyyat kafedralarının quruluşunda da ciddi dəyişikliklər edildi. Riyaziyyat fənlərinin tədrisi işini daha səmərəli və məzmunlu qurmaq məqsədilə institutun rektorluğu Riyazi analiz və Ali cəbr, Həndəsə kafedraları bazası əsasında Həndəsə kafedrası, Riyazi analiz kafedrası, Ali cəbr və ədədlər nəzəriyyəsi kafedrası, Hesablama riyaziyyatı və ehtimal nəzəriyyəsi kafedrası təşkil etməyi məqsədəuyğun hesab etdi. Həmin tədris ilində Ümumi coğrafiya kafedrasının bazası əsasında Fiziki coğrafiya, İqtisadi coğrafiya və Coğrafiyanın tədrisi metodikası kafedraları, APİ-nin Naxçıvan filialında isə Tarix və ictimai fənlər, habelə Dil və ədəbiyyat kafedraları təşkil edildi. İnstitutda 1970–71-ci tədris ilində daha dörd yeni kafedra – Azərbaycan tarixi, Məktəb gigiyenası, Ümumi riyaziyyat, Ümumi texniki fənlər kafedraları yaradıldı.



***Həşim Nizami oğlu Ağayev*** *1916-cı ildə Lənkəranda anadan olmuş, Azərbaycan Dövlət Universitetinin Fizika-riyaziyyat fakültəsini (1936–1941) bitirmişdir.*

*1943-cü ildən 1970-ci ilədək Elmlər Akademiyasının Riyaziyyat və Mexanika İnstitutunda kiçik elmi işçi, böyük elmi işçi, şöbə müdiri, elmi işlər üzrə direktor müavini və direktor vəzifələrində çalışmış, eyni zamanda respublikanın müxtəlif institutlarında pedaqoji fəaliyyətini davam etdirmişdir.*

*Azərbaycan Dövlət Pedaqoji İnstitutunun rektoru (1970–1981) vəzifəsində işləmişdir. 50-dən artıq elmi işin, çoxsaylı dərslik və dərs vəsaitinin müəllifidir. 1947-ci ildə namizədlik dissertasiyası müdafiə etmiş, 1972-ci ildə professor elmi adını almışdır. 1975-ci ildə doktorluq dissertasiyası müdafiə etmişdir.*

*Ağayev Həşim Nizami oğlu 1988-ci ildə vəfat etmişdir.*

1971–1972-ci tədris ilində institutun Naxçıvan filialı, 1973-cü ildə isə Xankəndi filialı müstəqil institutlara çevrildi. İnstitutda tədris və elmi fəaliyyətin səviyyəsini yüksəltmək, yüksəkixtisaslı müəllim kadrları hazırlamaq, maddi-texniki bazanı genişləndirmək, yeni tədris korpuslarını və tələbə yataqxanalarını inşa etmək istiqamətində konkret tədbirlər həyata keçirildi. APİ-nin rəhbərliyi dəyişdirildi.

1970-ci ilin yayında E.A.Riyaziyyat İnstitutunun direktor müavini, dos. ***Həşim Ağayev*** APİ-nin rektoru, prof. Ş.Ə.Sadıqov tədris işləri üzrə prorektor, prof. N.M.Kazımov isə elmi işlər üzrə prorektor vəzifələrinə təyin edildilər. Kollektivin qüvvəsi tədris və elmi işlərin səviyyəsini yüksəltməyə, yüksəkixtisaslı müəllim kadrlarının hazırlanmasına, tələbələrin müasir biliklərə yiyələnməsi və tərbiyə olunmasına yönəldildi. 1500 yerlik tələbə yataqxanası istifadəyə verildi. Kimya, fizika, biologiya və digər tədris laboratoriyaları yeni avadanlıqla komplektləşdirildi. Pedaqoji təcrübənin təşkilinə və tələbələrin müstəqil işlərinə diqqət artırıldı.

Azərbaycan Pedaqoji İnstitutunun SSRİ-nin digər ali pedaqoji məktəbləri, SSRİ Elmlər Akademiyasının müvafiq institutları və SSRİ Pedaqoji Elmlər Akademiyası ilə elmi-pedaqoji əlaqələri gücləndirildi. Görkəmli rus alimləri (B.A.Sadoviç, A.İ.Busev, A.İ.Sokolov, M.İ.Vişkin,

B.A.Qorin, Y.A.Saukin, V.F.Nozdrev və b.) mühazirə oxumaq üçün institutа dəvət olundular.

1970-ci illərin sonunda APİ-nin on fakültəsində 20 ixtisas üzrə kadr hazırlığı həyata keçirilirdi. İnstitutda 53 kafedra fəaliyyət göstərirdi. SSRİ Nazirlər Sovetinin 25 avqust 1978-ci il tarixli qərarına əsasən orta ümumtəhsil məktəblərində ibtidai hərbi hazırlığın inkişafı məqsədilə APİ-də «İbtidai hərbi və fiziki təlim» adlı fakültə təşkil olundu.

1970–71-ci tədris ilində institutda coğrafiya, fizika, riyaziyyat və kimya ixtisasları üzrə hazırlıq şöbəsi fəaliyyətə başladı. Birinci il şəhər və rayon rəhbər təşkilatlarının göndərişinə əsasən 119 nəfər dinləyici qəbul edildi. Səkkizaylıq məşğələlərdən sonra həmin müdavimlərin çoxu müvəffəqiyyətlə imtahan verib, təhsil aldıqları ixtisaslar üzrə müvafiq fakültələrə qəbul edildi. Hazırlıq şöbəsi nəzdində 1970–71-ci tədris ilindən tarix və ədəbiyyat ixtisasları üzrə də müdavimlər hazırlandı.

Bu şöbə fəhlə və kəndli gənclərin ümumtəhsil hazırlığı səviyyəsinin yüksəlməsində əsaslı rol oynadı. Tələbə hazırlıq şöbəsinin işi institutun elmi şurasında, rektorluğun və partiya komitəsinin iclaslarında müzakirə edilirdi. Hazırlıq şöbəsində tədris prosesinə rəhbərlik edən müstəqil pedaqoji şura fəaliyyət göstərirdi.

Fəaliyyətinin 10 ili müddətində (1970/71–1980/81-ci illər) hazırlıq şöbəsinə qəbul olunmuş 1639 dinləyicidən 1542 nəfəri müvəffəqiyyətlə buraxılış imtahanı verərək institutun I kursuna qəbul olundu. İnstitutun tələbələrinin 70%-i fəhlə və kəndli ailələrindən idi.

O dövrdə APİ-də istehsalatdan ayrılmadan təhsilalmanın zəngin ənənələri, forma və üsulları mövcud idi. Bu kateqoriyadan olanlar üçün tədris prosesi qiyabi və axşam şöbələri vasitəsilə həyata keçirilirdi. Bu təhsil forması böyük sayda istehsalatda çalışan gənclərin əməyini təhsillə əlaqələndirirdi, onlara istehsalatdan ayrılmadan təhsil almaq imkanı yaradırdı. 1970-ci illərdə APİ-nin Tarix, Filologiya, Riyaziyyat, Fizika, Biologiya, İbtidai təhsil və Məktəbəqədər fakültələrində qiyabi şöbə fəaliyyət göstərirdi. 1980–81-ci tədris ilində qiyabi şöbədə 3997 dinləyici təhsil alırdı.

**1970/1971–1980/1981-ci tədris ilində APİ-nin hazırlıq şöbəsində təhsil alan dinləyicilərin inkişaf dinamikası**

| Tədris illəri | Qəbul | Kontingent | Buraxılış | Partiyalar | | | Sosial tərkibi | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | | | | Sov.İKP üzvləri və üzvlüyə namizədlər | ÜKKGİ | Bitərəflər | Sənaye işçiləri | Kolxozçu və fəhlələr | Sovxoz işçiləri | Ordudan tərxiz olunanlar |
| 1970–71 | 44 | 119 | 44 | 7 | 109 | 3 | 27 | 60 | 17 | 15 |
| 1971–72 | 125 | 150 | 123 | 19 | 124 | 7 | 34 | 53 | 28 | 10 |
| 1972–73 | 150 | 150 | 145 | 18 | 123 | 9 | 42 | 66 | 34 | 8 |
| 1973–74 | 145 | 145 | 145 | 21 | 111 | 9 | 37 | 46 | 32 | 48 |
| 1974–75 | 175 | 175 | 158 | 14 | 148 | 13 | 33 | 74 | 56 | 12 |
| 1975–76 | 175 | 146 | 126 | 15 | 105 | 6 | 31 | 46 | 25 | 24 |
| 1976–77 | 175 | 133 | 117 | 13 | 104 | 16 | 22 | 40 | 28 | 27 |
| 1977–78 | 175 | 175 | 145 | 33 | 134 | 8 | 29 | 51 | 64 | 31 |
| 1978–79 | 175 | 194 | 167 | 24 | 136 | 7 | 37 | 43 | 64 | 23 |
| 1979–80 | 200 | 178 | 175 | 25 | 145 | 5 | 36 | 57 | 46 | 37 |
| 1980–81 | 200 | 197 | 197 | 26 | 164 | 7 | 51 | 55 | 71 | 20 |

1970–1981-ci illərdə APİ respublikamızın ümumtəhsil məktəbləri üçün 25870 nəfər yüksəkixtisaslı kadr hazırlamışdır ki, onlardan da 8494 nəfəri əyani şöbənin məzunu idi. Pedaqoji kadr hazırlığında 660 nəfər çalışırdı ki, onlardan da 42 nəfəri elmlər doktoru, professor, 340 nəfəri fəlsəfə doktoru, dosent idi.

Pedaqoji institutun həyatının səciyyəvi cəhətlərindən biri də professor-müəllim heyətinin ixtisaslarının artırılması sahəsində səmərəli işlərin görülməsi idi. O dövrdə müəllimlərin sistematik olaraq ixtisasartırma kurslarına göndərilməsi institutun yüksəkixtisaslı kadr hazırlığının mühüm tərkib hissəsi olmaqla bütün tədris-tərbiyə prosesinə həlledici təsir

göstərirdi. İnstitutun professor-müəllimləri sistematik olaraq Bakı, Moskva, Leninqrad (Sankt-Peterburq), Kazan, Kiyev, həmçinin SSRİ Pedaqoji Akademiyasının müvafiq institutlarında öz ixtisaslarını artırırdılar. 1976–1980-ci illərdə institutun 678 müəllimi ixtisasartırma kurslarına cəlb edilmişdi.

**1976–1980-ci illərdə APİ-nin ixtisasartırma kursundan keçən əməkdaşlarının sayı**

| İllər | Professor-müəllim heyəti | İxtisasartırma kursundan keçənlər |
|---|---|---|
| 1976 | 698 | 104 |
| 1977 | 673 | 121 |
| 1978 | 670 | 134 |
| 1979 | 676 | 127 |
| 1980 | 665 | 192 |

Həmin illərdə APİ-də 20-dən artıq yeni kabinet, elmi-tədqiqat və tədris laboratoriyaları təşkil olundu: ali məktəb pedaqogikası (rəhbəri prof. Hüseyn Əhmədov), təlimin texniki vasitələri (rəhbəri prof. Həsən Balıyev), texniki vasitələrin tədris prosesində tətbiqi (rəhbəri prof. Sədi İmanov), linqafon kabinetləri (rəhbərləri Afad Qurbanov, Həsən Mirzəyev, Balaxan Hüseynov) və s.

1971-ci ildə APİ-də ali təhsil müəssisələrinə qəbul olunmaq istəyənlər üçün kurslar təşkil edildi. 10 il ərzində həmin kursları 4757 nəfər dinləyici bitirdi. Həmin illərdə institutun əməkdaşları tərəfindən Əli Bayramlı (Şirvan), Neftçala, Kürdəmir, Salyan şəhər və rayonlarında hazırlıq kursları təşkil olundu ki, orada 2288 nəfər dinləyici ali məktəblərə hazırlıq kursları keçdi.

1974-cü ildə institutda orta məktəb müəllimlərinin ixtisasartırma fakültəsi təşkil edildi. Fakültənin fəaliyyət göstərdiyi illərdə 5 mindən artıq orta məktəb müəllimi Azərbaycan dili və ədəbiyyatı, tarix, riyaziyyat ixtisasları üzrə biraylıq kurs keçdilər. 15 mart 1976-cı ildə ümumtəhsil kursları təşkil olundu. 5 il müddətində həmin kursları 1641 dinləyici bitirdi.

1975-ci ildə institutda «Şagirdlərin peşəyönümü» elmi-tədqiqat laboratoriyası (elmi rəhbər professor Hüseyn Əhmədov) təşkil olundu. Laboratoriyada həmin illərdə aşağıdakı problemlər araşdırılmışdır: 1) Şagirdlərin peşəseçməyə istiqamətləndirilməsində məktəbdənkənar müəssisələrin rolu (1975–1980-ci illər); 2) Şagirdlərin məktəblərarası, tədris-istehsalat kombinatlarında öyrədilən əmək təlimi profilini seçməyə hazırlanması (1980–1985-ci illər); 3) Məktəbdə pedaqoji peşəyönümünün sistemi (1985–1990-cı illər).

70-ci illərdə ali pedaqoji təhsilin məzmununda müəyyən dəyişikliklər edildi. Yeni tədris plan və proqramları tətbiq edildi. Əsas fənlərlə yanaşı, xüsusi kursların, seminarların, fakültativ məşğələlərin aparılması planlaşdırılmışdı. Respublikanın ali pedaqoji məktəblərində «Pedaqogikaya giriş» adlı xüsusi kursun tədrisinə başlandı. Professor Hüseyn Əhmədovun rəhbərliyi ilə kursa dair dərs vəsaiti hazırlandı və nəşr edildi. Bu illərdə Azərbaycanda pedaqogika tarixinin tədrisində ciddi dönüş yarandı.

SSRİ məkanında ilk dəfə respublikamızda prof. Hüseyn Əhmədovun təşəbbüsü, prof. Mərdan Muradxanovun, dos. Əyyub Tağıyevin iştirakı ilə milli məktəb və pedaqoji fikir tarixindən xüsusi kurs hazırlandı. Kursun proqramı Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyi tərəfindən təsdiq edildikdən sonra Azərbaycan və rus dillərində nəşr olundu. Milli məktəb və pedaqoji fikrimizin öyrənilməsi sahəsində ilk təşəbbüs elmi-pedaqoji ictimaiyyət tərəfindən təqdir edildi. Həmin proqram ən qədim dövrlərdən başlayaraq zəmanəmizə qədər Azərbaycanda təlim, tərbiyə, məktəb təhsilinin meydana gəlməsi və inkişafı, görkəmli maarifpərvərlərin və pedaqoqların fikirlərinin sistemli tədrisində mühüm rol oynadı. Həmin proqram üzrə ADPU-da, Naxçıvan Dövlət Universitetində, Tbilisi Dövlət Pedaqoji İnstitutunda xüsusi kurs və seminar sınaqdan keçirilmişdi. Proqram İttifaq Maarif Nazirliyinin pedaqogika üzrə elmi-metodik şurasının pedaqogika tarixi komissiyasının 1981-ci il 15 dekabr tarixli iclasında xüsusi müzakirə edilərək bəyənilmiş, qabaqcıl təcrübə kimi digər regionlarda da yayılması məsləhət bilinmişdi.

Tədris işlərinin yüksək səviyyədə qurulmasının nəticəsi idi ki, institutda ildən-ilə imtahan sessiyasında tələbələrin müvəffəqiyyət göstəriciləri artırdı. 1970-ci illərin axırında imtahan verən əyani şöbənin tələbələrinin 40%-i əlaçı və zərbəçi idi. Ali məktəbi fərqlənmə diplomu ilə bitirənlərin sayı xeyli artmışdı. Əgər 1976-cı ildə institutu tələbələrin yalnız 4%-i fərq-

lənmə diplomu ilə bitirmişdisə, 1980-ci ildə bu rəqəm 8,5%-ə yüksəlmişdi. O dövrdə respublika üzrə orta göstərici (Ali və Orta İxtisas Təhsili Nazirliyi üzrə) 6,8% idi.

Belə yüksək nailiyyətlər qazanan professor-müəllimlərin əməyi dövlət tərəfindən yüksək qiymətləndirilmiş, professorlar Afad Qurbanov, Roza Qafarova, Nəzər Paşayev, Mais Cavadov Əməkdar elm xadimi, Nəmidə Abbasova, Kövhər Tarverdiyeva, Hüseyn Əhmədov əməkdar ali məktəb işçisi fəxri adlarına layiq görülmüşdülər.

O dövrdə ADPİ-də filologiya, riyaziyyat, fizika, kimya, biologiya, tarix, pedaqogika və psixologiya elmlərinin inkişafında, pedaqoji və elmi-pedaqoji kadr hazırlığında Əhməd Seyidov, Abbasqulu Abbaszadə, Tələt Qayıbov, Feyzulla Qasımzadə, Mikayıl Rəfili, Ağamməd Abdullayev, İsmayıl Şıxlı, Əbdüləzəl Dəmirçizadə, Allahverdi Verdizadə, Şövqi Ağayev, Zəhra Şaxtaxtinskaya, Həmid Qədirov, Mais Cavadov, İbrahim İbrahimov, Əhməd Kərədi Zəkuzadə, Mərdan Muradxanov, Nəzər Paşayev, Şükür Sadıqov, Roza Qafarova, Əli Cəfərov, Bəylər Ağayev, Afad Qurbanov, Yusif Yusifov, Hüseyn Əhmədov, Əbdül Əlizadə, Həsən Mirzəyev, Nəmidə Abbasova, Dərgah Qüdrətov, Fərhad Fərhadov, Zeynal Tağızadə, Süleyman Məmmədov və b-nın mühüm xidmətləri olmuşdur. Qeyd etmək lazımdır ki, SSRİ Pedaqoji Elmlər Akademiyasının üzvləri seçilmiş 4 nəfər azərbaycanlı alimin hamısı (Mehdi Mehdizadə (həqiqi üzv), Abbasqulu Abbaszadə, Sədi İmanov, Hüseyn Əhmədov (müxbir üzvlər)) ADPİ-nin əməkdaşlarıdır.

70-ci illərin ikinci yarısından inşasına başlanılan 14 mərtəbəli tədris korpusu 80-ci illərin əvvəllərində istifadəyə verildi. Auditoriya fondunun vəziyyəti xeyli yaxşılaşdı. Riyaziyyat, Fizika, Kimya-biologiya fakültələri həmin tədris korpusuna köçürüldü. Tədrisin vəziyyəti yüksəldi. Təcrübi məşğələləri aparmaq üçün laboratoriyalar yenidən təşkil və təchiz edildi. Şəhərin Bakıxanov və Səməd Vurğun küçələrinin kəsişdiyi yerdə institutun iki saylı tələbə yataqxanası yenidən quruldu, təmir edilib tədris korpusu vəziyyətinə gətirildi. Pedaqoji, Coğrafiya, Ümumi texniki fənlər fakültələri həmin tədris korpusuna köçürüldü. İnstitutda tədrisin səmərəli təşkili üçün geniş imkanlar açıldı. Üçüncü tədris korpusu isə 1985-ci ildə yararlı vəziyyətə gətirildi, Hərbi hazırlıq fakültəsi (o zaman belə adlanırdı) həmin korpusa köçürüldü.



***Afad Məhəmməd oğlu Qurbanov*** *1929-cu ildə Ermənistan SSR-in Kalinino rayonunda anadan olmuşdur. Tbilisi Müəllimlər İnstitutunu (1946–1948), ADPİ-ni (1949–1952) bitirmişdir. Namizədlik (1962), doktorluq (1968) dissertasiyası müdafiə etmiş, ADPİ-nin Filologiya fakültəsinin dekanı (1968–1981), rektoru (1981–1989), Azərbaycan dilçiliyi kafedrasının müdiri (1979–2009) vəzifələrində çalışmışdır. Əməkdar elm xadimi adına layiq görülmüşdür (1981). Azərbaycan EA-nın müxbir üzvü seçilmişdir (1983). Azərbaycan SSR Ali Sovetinin deputatı olmuşdur (1990–1995). AMEA-nın Terminologiya Komitəsinin, Adlar və Soyadlar üzrə Xüsusi Komissiyanın, Dövlət dili haqqında qanun layihəsinin hazırlanması üzrə Komissiyanın və digər komissiyaların üzvü olmuşdur (1980–2009). Dilçiliyə dair 70-dən artıq kitabı, 500-ə qədər məqaləsi dərc olunmuşdur. Azərbaycan Dövlət mükafatına layiq görülmüşdür (1989). Azərbaycan Əlifba Komissiyasının sədri (1990) olmuşdur.*

*Qurbanov Afad Məhəmməd oğlu 2009-cu ildə vəfat etmişdir.*

1979-cu ildən fəaliyyət göstərən İbtidai hərbi və fiziki təlim fakültəsi 80-ci illərdə tələbə kontingentinin sayına görə digər fakültələrdən fərqlənirdi. 1979–1985-ci illərdə fakültənin 2500-dən çox məzunu zabit rütbəsinə layiq görülmüşdü.

1981-ci ilin avqust ayında *prof.* **Afad Qurbanov** institutun rektoru, prof. K.D.Hüseynov elmi işlər üzrə prorektoru vəzifələrinə təyin edildilər, prof. Ş.Ə.Sadıqov öz işində – tədris işləri üzrə prorektor vəzifəsində qaldı.

1980–1981-ci ildən respublikada ilk dəfə APİ-də musiqi və nəğmə ixtisası üzrə müəllim hazırlığına başlandı. İnstitutda ən müasir avadanlıqla, diapozitiv, diafilm və kinofilmlərlə təchiz edilmiş 14 ixtisaslaşdırılmış kabinet təşkil olundu. O dövrdə institutun filmotekasında 15,5 min tədris diafilmləri və kinofraqmentləri saxlanılırdı. Tədris prosesində televiziyadan və elektron hesablama maşınlarından geniş istifadə olunurdu. Riyaziyyat, Fizika, Biologiya, Kimya fakültələrində tələbələrin elmin son nailiyyətləri ilə tanış olmasında APİ-nin elmi-tədqiqat hesablama mərkəzi mühüm rol oynayırdı. O dövrdə institutda əyani, qiyabi və axşam şöbələrində 9867 nəfər tələbə təhsil alırdı. 1980–1981-ci tədris ilində institutda 67 laboratoriya, 8 tədris emalatxanası, milyon nüsxədən artıq kitab

fondu olan elmi kitabxana, nəşriyyat, mətbəə, zoologiya muzeyi fəaliyyət göstərirdi.

1981–1982-ci tədris ilində APİ-nin I kursuna 2205 nəfər tələbə qəbul olunmuşdu ki, onun böyük əksəriyyəti regionlardan gələn gənclər idi. Əgər 1970-ci ilin ortalarında institutda 15 ixtisas üzrə kadr hazırlanırdısa, 1980–81-ci tədris ilində ixtisasların sayı 20-yə çatmışdı. 5 il müddətində (1975–1980) 500-dən artıq tələbə iki ixtisas üzrə (kimya və biologiya, biologiya və kimya, riyaziyyat və fizika, fizika və riyaziyyat) təhsil alırdı.

**1970/71–1980/1981-ci tədris illərində APİ-də tələbə kontingentinin inkişaf dinamikası**

| Tədris illəri | Əyani şöbə | | | Qiyabi şöbə | | | Axşam şöbəsi | | | İnstitut üzrə | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Qəbul | Kontingent | Burax. | Qəbul | Kontingent | Burax. | Qəbul | Kontingent | Burax. | Qəbul | Kontingent | Burax. |
| 1970/71 | 2258 | 7350 | 1113 | 238 | 1445 | 291 | 50 | 191 | 136 | 2546 | 8986 | 1540 |
| 1971/72 | 2260 | 8203 | 1318 | 794 | 4671 | 833 | 175 | 873 | 254 | 3229 | 13746 | 2405 |
| 1972/73 | 1878 | 7862 | 1560 | 742 | 4371 | 919 | 160 | 671 | 292 | 2780 | 12904 | 2771 |
| 1973/74 | 1822 | 7837 | 1627 | 575 | 3430 | 720 | 175 | 746 | 60 | 2572 | 12013 | 2407 |
| 1974/75 | 1682 | 7189 | 1648 | 606 | 3351 | 617 | 152 | 779 | 72 | 2440 | 11359 | 2337 |
| 1975/76 | 1625 | 6959 | 1512 | 625 | 3342 | 553 | 100 | 722 | 132 | 2350 | 11014 | 2197 |
| 1976/77 | 1675 | 6775 | 1598 | 770 | 3480 | 622 | – | 565 | 158 | 2445 | 4722 | 2378 |
| 1977/78 | 1508 | 6551 | 1404 | 818 | 3555 | 717 | – | 326 | 137 | 2326 | 10432 | 2258 |
| 1978/79 | 1483 | 6516 | 1668 | 850 | 3804 | 539 | – | 252 | 150 | 2333 | 10572 | 2357 |
| 1979/80 | 1429 | 6106 | 1480 | 684 | 3840 | 580 | – | 191 | 156 | 2113 | 10137 | 2216 |
| 1980/81 | 1428 | 5899 | 1398 | 725 | 3176 | 596 | – | – | – | 2153 | 9075 | 1994 |

1981–1990-cı illərdə Azərbaycan Pedaqoji İnstitutunun tələbə kontingentinin inkişaf dinamikası aşağıdakı kimi olmuşdur:

**1981/82–1990/91-ci tədris ilində institutda tələbə kontingentinin inkişaf dinamikası**

| İllər | Qəbul | | Buraxılış | | Cəmi | |
|---|---|---|---|---|---|---|
| | əyani | qiyabi | əyani | qiyabi | qəbul | buraxılış |
| 1981/82 | 1480 | 725 | 1028 | 728 | 2205 | 1756 |
| 1982/83 | 1298 | 610 | 1126 | 814 | 1908 | 1940 |
| 1983/84 | 1110 | 503 | 1225 | 784 | 1613 | 2009 |
| 1984/85 | 1113 | 470 | 1051 | 664 | 1583 | 1715 |
| 1985/86 | 991 | 605 | 1403 | 797 | 1596 | 2200 |
| 1986/87 | 950 | 569 | 1238 | 999 | 1519 | 2237 |
| 1987/88 | 842 | 295 | 1230 | 914 | 1137 | 2144 |
| 1988/89 | 815 | 335 | 1192 | 972 | 1150 | 2164 |
| 1989/90 | 1403 | 710 | 1151 | 849 | 2113 | 2000 |
| 1990/91 | 1068 | 592 | 1052 | 675 | 1660 | 1727 |

Pedaqoji İnstitutun həyatının səciyyəvi cəhətlərindən biri də professor-müəllim heyətinin ixtisaslarının artırılması sahəsində səmərəli işlərin görülməsi idi. Bu işin düzgün təşkilində Pedaqoji İnstitut həm öz, həm Respublika Elmlər Akademiyasının, həm Bakı Dövlət Universitetinin, həm də keçmiş İttifaqın təhsil və elm mərkəzlərinin imkanlarından geniş istifadə edirdi. APİ-də ixtisasartırma kursları 70-ci illərdən fəaliyyət göstərirdi, sonralar xüsusi fakültəyə çevrildi. Prof. H.M.Əhmədov 1974–1979-cu illərdə ümumtəhsil məktəblərinə kömək göstərmək məqsədilə orta məktəb müəllimlərinin ixtisasartırma fakültəsinin (1974-cü ildə yaradılmışdır) dekanı vəzifəsində çalışdı. Fakültənin orta məktəb müəllimlərindən ibarət dinləyicilərinin sayı 5 min nəfərdən çox idi. Eləcə də fakültə nəzdində Azərbaycan dili və ədəbiyyatı, tarix və riyaziyyat üzrə biraylıq kurslar təşkil olundu.

Respublikanın müstəqil inkişaf yoluna qədəm qoymasından sonrakı illər Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixində yeni mərhələ təşkil edir.

Azərbaycanın müstəqillik yolunda əzablı və ağrılı irəliləyişi, Qarabağ münaqişəsi ilə bağlı başlanmış müharibənin doğurduğu fəlakətlər Azərbaycan Pedaqoji İnstitutunda tədris və elmi fəaliyyətin təşkilində ciddi çətinliklərə səbəb oldu. Yüzlərlə tələbə müharibə gedən regionlarda vətənin azadlığı və istiqlaliyyəti uğrunda döyüşlərdə igidlik nümunəsi göstərdi. Məzunlarımız olan Azərbaycanın Milli Qəhrəmanları Mirələkbər İbrahimov, Mətləb Quliyev, Azərbaycan Bayrağı ordenli Malik Bayramov, Mürşid Məmmədov bu gün igidlik, hünər, vətənpərvərlik rəmzi kimi xatırlanırlar. Onlarla şəhid məzunlarımız Pedaqoji Universitetin professor-müəllim və tələbə heyətinin xatirəsində həyatlarını vətənə, xalqa fəda edən sədaqət və igidlik rəmzi kimi əbədiləşdilər. Biz həmin gənclərin qarşısında baş əyir və onların ölməz, nəcib əməllərinin kollektivin yaddaşında həmişəlik qalacağına inanırıq.

Pedaqoji Universitetin rəhbərliyi yataqxanada müvəqqəti yerləşdirilmiş qaçqın ailələrinə öz fondundan dəfələrlə maddi kömək göstərmişdir.

Respublikanın iqtisadiyyatında, sosial-mədəni həyatında olduğu kimi, ali məktəblərdə, o cümlədən ADPU-nun tədris prosesi və elmi-tədqiqat işlərində də geriləmə 80-ci illərin sonu və 90-cı illərin əvvəlinə kimi davam etdi.

Pedaqoji İnstitutun həyatında 90-cı illərin əvvəlində baş verən əlamətdar hadisələrdən birini xüsusi qeyd etmək lazımdır. ***Azərbaycan Respublikası Nazirlər Kabinetinin 1991-ci il tarixli qərarı ilə Azərbaycan Dövlət Pedaqoji İnstitutuna «universitet» statusu verildi.***

Bu, ADPU-ya müstəqil fəaliyyət göstərmək, kadr siyasətini sərbəst həyata keçirmək, təhsil müəssisəsinin büdcəsinə daxil olan vəsaitdən tələbata müvafiq şəkildə istifadə etmək, xarici ölkələrin ali təhsil müəssisələri və elmi mərkəzləri ilə sərbəst əlaqə saxlamaq, mütəxəssis və qarşılıqlı tələbə mübadiləsi aparmaq imkanı verdi. Halbuki buna qədər rəsmi universitet statusunun olmaması ali pedaqoji təhsil ocağının müstəqil fəaliyyət göstərmək imkanını məhdudlaşdırır, tədris planları və proqramları yalnız keçmiş SSRİ-nin mərkəzi orqanlarından – ilk növbədə, SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyindən verilən sərəncamlarla, inzibati amirlik metodu ilə qurulur, nəticədə, Pedaqoji İnstitutun fəaliyyəti yuxarı təşkilatlardan tam asılı vəziyyətdə qalırdı. Digər ali məktəblərlə sərbəst əlaqələr yaratmağın mümkün olmaması onun bütün həyat sferalarına mənfi təsir göstərirdi.



***Səlvər Rza oğlu Aslanov*** *1930-cu ildə Bakıda anadan olmuşdur. Azərbaycan Dövlət Universitetinin Tarix fakültəsinə daxil olmuş (1949), ikinci kursdan Moskva Dövlət Universitetinə köçürülmüşdür. Azərbaycan KP Bakı şəhər Partiya Komitəsinin katibi (1964–1966), Azərbaycan Xalq Təsərrüfatı İnstitutunun rektoru (1966–1973), Azərbaycan Dövlət Pedaqoji İnstitutunda professor, kafedra müdiri (1973), rektor vəzifələrində çalışmışdır (1989–1994).*

*AMEA-nın müxbir üzvü seçilmiş, Milli Münasibətlər İnstitutunda böyük elmi işçi vəzifəsində fəaliyyət göstərmişdir (1995–2000).*

*1970 və 1990-cı illərdə Azərbaycan SSR Ali Sovetinə deputat seçilmişdir.*

*Aslanov Səlvər Rza oğlu 2000-ci ildə vəfat etmişdir.*

Həmin illərdə (1989–1994-cü illərdə) universitetə AMEA-nın müxbir üzvü, *prof.* ***Səlvər Aslanov*** rəhbərlik etmişdir.

Bu dövrdə prof. N.M.Xudiyev tədris işləri üzrə prorektor, prof. E.Ə.Eyvazov elmi işlər üzrə prorektor vəzifəsində çalışmışlar. *Prof.* ***Nizami Xudiyev*** 1994-cü ildə universitetin rektoru, prof. B.İ.Ağayev isə tədris işləri üzrə prorektor vəzifəsinə irəli çəkildilər.

Prof. N.M.Xudiyevin 1996-cı ilin sentyabr ayının 5-də Azərbaycan Respublikası Dövlət Radio və Televiziya Verilişləri Şirkəti rəhbərliyinə təyin edilməsindən sonra *prof.* ***Bəhlul Ağayev*** ADPU-nun rektoru, prof. M.S.Cəbrayılov tədris işləri üzrə prorektor, prof. V.H.Əliyev elmi işlər üzrə prorektor təyin edildilər.

2006-cı ilin aprel ayında Universitetin rəhbərliyi dəyişdirildi, Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamı ilə AMEA-nın müxbir üzvü, fizika-riyaziyyat elmləri doktoru, Əməkdar elm xadim, *prof.* ***Yusif Məmmədov*** Azərbaycan Dövlət Pedaqoji Universitetinə rektor vəzifəsinə təyin olundu.

ADPU-nun maddi-texniki bazasının möhkəmləndirilməsi, ali pedaqoji təhsilin məzmununun təkmilləşdirilməsi, professor-müəllim və tələbə kollektivi arasında mənəvi-psixoloji mühitin sağlamlaşdırılması, keyfiyyətli kadr hazırlığı yeni rəhbərliyin fəaliyyətinin əsas istiqamətlərindən birinə çevrildi.



***Nizami Mənaf oğlu Xudiyev*** *1949-cu ildə Naxçıvan Muxtar Respublikasının Şahbuz rayonunda anadan olmuşdur. 1966–1970-ci illərdə APİ-nin Filologiya fakültəsində təhsil almışdır. 1978-ci ildə namizədlik, 1990-cı ildə doktorluq dissertasiyası müdafiə etmişdir. Filologiya elmləri doktoru, professor, Əməkdar elm xadimidir. 1979–1991-ci illərdə ADPU-nun Həmkarlar İttifaqı Komitəsinin sədri, 1991–1994-cü illərdə I prorektor, 1994–1996-cı illərdə rektor vəzifəsində çalışmışdır. 1996–2005-ci illərdə Azərbaycan Dövlət Televiziya və Radio Verilişlələri Şirkətinin, 2005–2006-cı illərdə isə «Azərbaycan Televiziya və Radio Verilişləri» Qapalı Səhmdar Cəmiyyətinin sədri olmuşdur. Hazırda Müasir Azərbaycan dili kafedrasının müdiridir.*

*İki dəfə Azərbaycan Respublikası Milli Məclisinə deputat seçilmişdir. 60-dan artıq monoqrafiya, dərslik və dərs vəsaitinin, 350 elmi məqalənin, 40-dan artıq sənədli televiziya filminin ssenari müəllifidir. 2009-cu ildə «Şöhrət» ordeni ilə təltif olunmuşdur.*



***Bəhlul İsfəndiyar oğlu Ağayev*** *1937-ci il oktyabrın 28-də Qərbi Azərbaycanın Qafan rayonunun Pəyəhan kəndində anadan olmuşdur. 1956-cı ildə Qafan rayonunun Gığı kənd orta məktəbini, 1963-cü ildə BDU-nu bitirmişdir. 1971-ci ildə namizədlik, 1990-cı ildə doktorluq dissertasiyası müdafiə etmişdir. 1970-ci ildən ADPU-nun Zoologiya kafedrasında laborant, assistent, baş müəllim, 1973–1977-ci illərdə Kimya-biologiya fakültəsində dekan müavini vəzifəsində işləmişdir. 1977-ci ildə B.İ.Ağayev dosent, 1991-ci ildə professor elmi adı almışdır. 1977-ci ildən Zoologiya kafedrasının müdiridir. 1994-cü ildə ADPU-nun tədris işləri üzrə prorektoru, 1996–2006-cı illərdə Universitetin rektoru vəzifəsində işləmişdir. 2000–2006-cı illərdə Ali Attestasiya Komissiyasının «Ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi», «Təlim və tərbiyənin nəzəriyyəsi və metodikası» ixtisasları üzrə Müdafiə Şurasının sədri olmuşdur.*

*2001-ci ildə Beynəlxalq Elmlər Akademiyasının akademiki, 2002-ci ildə Beynəlxalq Pedaqoji Elmlər Akademiyasının akademiki seçilmişdir.*

*Prof. B.İ.Ağayev 70-dən çox elmi əsərin, 5 dərsliyin, 8 dərs vəsaitinin, 4 monoqrafiyanın müəllifi, həmçinin fənn proqramlarının tərtibçisidir.*

## 2.4. HEYDƏR ƏLİYEVİN TƏHSİL SİYASƏTİNİN UĞURLU DAVAMI

Ümummilli lider Heydər Əliyevin müəyyənləşdirdiyi strateji kurs və dövlətimizin başçısı möhtərəm cənab İlham Əliyevin bu kursu uğurla davam etdirməsi, təhsilə göstərdiyi müntəzəm diqqət və qayğı sayəsində son illərdə Azərbaycanda təhsilin, o cümlədən ali pedaqoji təhsilin dinamik inkişafında böyük nailiyyətlər əldə edilmişdir. Sürətli dəyişikliklərin baş verdiyi hazırkı vaxtda məhz təhsil sosial-iqtisadi və mədəni sahələrdə davamlı inkişafa təkan verən real qüvvə hesab edilir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev təhsili Azərbaycanın davamlı inkişaf strategiyasının ən öncül istiqamətlərindən biri hesab edərək demişdir: *«Azərbaycanın gələcək inkişafı məhz təhsillə bağlıdır. Bilikli, savadlı uşaqlar, gənclər gələcəkdə Azərbaycanı idarə edəcəklər. Təhsil bilik, elm, tərəqqi deməkdir. Təhsilə qoyulan vəsait ölkəmizin gələcəyinə qoyulan vəsaitdir. Bütün inkişaf etmiş ölkələrin uğurlarının səbəbi də məhz ziyalı təbəqəsidir, elmi-texniki tərəqqidir, texnoloji yeniliklərdir. Biz də bu yolu seçmişik»*. Bu konseptual fikirlər Azərbaycanda təhsilin inkişafının strategiya və konsepsiyasını müəyyənləşdirir.

Prezident İlham Əliyevin rəhbərliyi ilə Azərbaycanda siyasi, sosial-iqtisadi, hüquqi islahatların həyata keçirilməsində, vətəndaş cəmiyyətinin qurulmasında, milli və Avropa dəyərlərinin bərqərar edilməsində, insan hüquqlarının və azadlıqlarının təmin olunmasında, demokratik təsisatların yaradılmasında, bazar iqtisadiyyatına keçid prosesində əldə edilən nailiyyətlərin mühüm bir hissəsi təhsilin payına düşür. Təcrübə göstərir ki, cəmiyyətin ahəngdar inkişafında, onun intellektual potensialının formalaşmasında, cənab Prezidentin qeyd etdiyi kimi, maddi sərvətlərin insan kapitalına çevrilməsində əsas ağırlıq məhz təhsil sistemi üzərinə düşür. Təhsil cəmiyyətin inkişafının özülünü təşkil etməklə yanaşı, həm də ölkənin təhlükəsizliyinin, sabitliyinin təmin edilməsində mühüm amil kimi çıxış edir.

Son illərdə təhsil sahəsində ən mühüm hadisələrdən biri «Təhsil haqqında» Azərbaycan Respublikası Qanununun qəbul edilməsi olmuşdur. Bu qanunun qəbul edilməsi, ilk növbədə, ölkədə və dünyada dinamik inkişaf tendensiyaları, o cümlədən təhsil sahəsində əsaslı dəyişikliklərin olması, Azərbaycanın keyfiyyətcə yeni inkişaf mərhələsinə qədəm qoyması, Avropa və dünya



*Prezident İlham Əliyev Bakı şəhəri 6 №-li məktəbin açılışında öz müəllimləri ilə görüşərkən (15 sentyabr 2011-ci il)*
*Soldan: müəllimlər Emma Kazımova, Lyudmila Franseva və məktəbin direktoru Gülşən Orucova*

təhsil məkanına inteqrasiya istiqamətində mühüm addımlar atması ilə bağlıdır. Ölkə Prezidentinin 19 iyun 2009-cu il fərmanı ilə qüvvəyə minən «Təhsil haqqında» Qanun ölkəmizdə təhsil siyasəti və strategiyasının əsas istiqamətlərini əks etdirir. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin təhsil sahəsində qarşıya qoyduğu vəzifələrə uyğun olaraq, Təhsil Nazirliyi təhsilin problemlərinin həllinə istiqamətlənmiş dövlət proqramının həyata keçirilməsi sahəsində bir sıra ciddi nailiyyətlər əldə etmişdir. Azərbaycan Respublikasının konseptual xarakterli sənədi – ümumi təhsilin Konsepsiyası – Milli kurikulumun qəbulu da Prezident İlham Əliyevin məq-

sədyönlü inkişaf strategiyası sahəsində milli təhsilimizin əldə etdiyi ən ciddi nailiyyətlərdən biridir. Elə bu səbəbdən də Azərbaycanda təhsil sahəsində əldə olunan uğurlar beynəlxalq ekspertlər tərəfindən yüksək qiymətləndirilmişdir. Dünya Bankının hesabatında qeyd edilmişdir ki, Azərbaycan təhsil sistemi əhəmiyyətli nailiyyətlər əldə etmişdir. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev bu sahədə aparılan islahatları yüksək qiymətləndirərək demişdir: «Təhsil Nazirliyində düşünülmüş proqram, konsepsiya vardır». Dövlətin müəyyənləşdirdiyi bu strategiya və konsepsiya təhsil naziri Misir Mərdanovun bilavasitə rəhbərliyi və şəxsi iştirakı ilə uğurla həyata keçirilir. Azərbaycan təhsilinin yeniləşdirilməsi, milli və bəşəri dəyərlər zəminində Avropa və Dünya təhsil sisteminə uğurla inteqrasiyası həmin strategiya və konsepsiyanın əsas istiqamətlərini təşkil edir.

Azərbaycan təhsilinin inkişaf strategiyası məktəbəqədər təhsilin düzgün qurulmasına yönəlmiş fəaliyyətdən başlanır. Azərbaycan Respublikasının Prezidentinin 12 aprel 2007-ci tarixli sərəncamı ilə «Məktəbəqədər təhsilin yeniləşdirilməsi Proqramı» təsdiq edilmişdir. Həmin proqramın icrası nəticəsində məktəbəqədər təhsil sahəsində ciddi uğurlar qazanılmış, son illərdə 17 yeni uşaq bağçası tikilmiş, 16 müəssisə əsaslı, 32 müəssisə cari təmir edilmiş, 134 məktəbəqədər təhsil müəssisəsi müvafiq avadanlıqla, təlim vasitələri ilə təmin edilmişdir. Bu gün 1600-dən artıq dövlət məktəbəqədər təhsil müəssisəsində 108 minə yaxın uşaq tərbiyə olunur.

İnsan şəxsiyyətinin formalaşmasında, zəruri-həyati bacarıqlara yiyələnməsində, cəmiyyətdə müstəqil fəaliyyətə hazırlanmasında ümumi təhsil müstəsna əhəmiyyətə malikdir. Elə bu səbəbdən də cənab Prezident İlham Əliyevin sərəncamları ilə təhsil sahəsində həyata keçirilən inkişafyönlü proqram və layihələrin böyük əksəriyyəti ümumi təhsilə həsr olunmuşdur.

Hazırda respublikamızda 4545 ümumtəhsil məktəbi, o cümlədən 31 ümumtəhsil internat məktəbi, 50 lisey, 8 gimnaziya fəaliyyət göstərir. Qürur hissi ilə qeyd etməliyəm ki, son illərdə həmin məktəblərin 2000-dən çoxu üçün Respublika Prezidenti cənab İlham Əliyevin sərəncamı ilə müasir tələblərə cavab verən binalar tikilmiş və ya əsaslı şəkildə təmir edilmişdir. Çox əlamətdar haldır ki, genişmiqyaslı məktəb tikintisi ilə yanaşı, məktəblərin təmirinə və təchizatına da dövlət qayğısı günü-gündən artır. Yeni ümumtəhsil




*UNESCO, Heydər Əliyev Fondu və Təhsil Nazirliyi arasında texniki peşə təhsili sahəsində əməkdaşlıq sazişinin imzalanması (18 iyun 2007-ci il)*

məktəblərinin tikintisi, mövcud məktəblər üçün əlavə korpusların inşası, onların əsaslı təmiri, müasir avadanlıq və laboratoriyalarla təmin edilməsi, istilik sisteminin bərpası nəticəsində bir milyondan artıq şagirdin təlim şəraiti yaxşılaşdırılmışdır. İkinövbəli məktəblər 73%-dən 44%-ə, ikinci növbədə təhsil alan şagirdlərin sayı isə 34,5%-dən 21%-ə enmişdir. Təhsilin keyfiyyəti yüksəlmiş, orta məktəb məzunlarının ali məktəblərə qəbul imtahanlarında göstərdikləri nəticələr ilbəil yaxşılaşmış, 600-dən çox bal toplayan məzunların sayı xeyli artmışdır. İstedadlı uşaqların təhsilinin daha səmərəli təşkili nəticəsində Azərbaycan məktəbliləri dünya və beynəlxalq fənn olimpiyadalarında 11 qızıl, 28 gümüş, 60 bürünc medal qazanmışdır. Fəxrlə qeyd etmək lazımdır ki, medalların sayına görə Azərbaycan dünya ölkələri arasında ilk onluqda yer almışdır.

Təhsilin informasiyalaşdırılması sahəsində də ciddi nailiyyətlər əldə edilmişdir. Əgər 2004-cü ildə məktəblərimizdə 1063 şagirdə 1 kompyuter

düşürdüsə, 2010-cu ildə 20 şagirdə 1 kompyuter nisbəti təmin olunmuşdur. Hazırda «bir müəllim – bir kompyuter», «bir şagird – bir kompyuter» layihəsinin əhatə dairəsi genişləndirilmiş, «Elektron məktəb» layihəsinə əlavə məktəblərin cəlb edilməsi əsas perspektivlər kimi müəyyənləşdirilmişdir. Dövlət başçısının sərəncamı ilə təsdiq olunmuş «Təhsil sisteminin informasiyalaşdırılması üzrə Dövlət Proqramı (2008–2012-ci illər)» məhz bu məqsədə xidmət edir. Görülən bu işlər müasir təhsil tariximizin ən parlaq səhifələrindən biridir.

Məktəblərin infrastrukturunun yeniləşdirilməsi sahəsində Heydər Əliyev Fondunun, şəxsən onun prezidenti UNESCO-nun və ISESCO-nun xoşməramlı səfiri, Milli Məclisin deputatı Mehriban xanım Əliyevanın müstəsna xidmətləri olmuş, Fondun təşəbbüsü ilə «Yeniləşən Azərbaycana yeni məktəb» proqramı çərçivəsində 300-ə yaxın yeni məktəb, uşaq bağçası, uşaq evi, internat məktəbi binası tikilib istifadəyə verilmiş, əsaslı təmir və bərpa olunmuş, müasir avadanlıqla təchiz edilmişdir.

Heydər Əliyev Fondu tərəfindən xüsusi qayğıya ehtiyacı olan, kimsəsiz, valideyn himayəsindən məhrum, müəyyən mənada cəmiyyətin diqqətindən kənarda qalan uşaqların təhsilinin inkişafı, onların təhsil aldığı müəssisələrin maddi-texniki və tədris bazasının möhkəmləndirilməsi istiqamətində də məqsədyönlü işlər görülmüşdür.

Azərbaycan təhsilinin, elminin inkişafına, milli-mənəvi dəyərlərimizin qorunmasına, bütün dünyada təbliğinə önəmli töhfələr verən Mehriban xanım Əliyevanın həyata keçirdiyi layihələr, humanitar yönümlü proqramlar Azərbaycandan çox-çox uzaqlarda da böyük rəğbətlə qarşılanır. Heydər Əliyev Fondunun təşəbbüsü və dəstəyi ilə 2010-cu ildə Gürcüstanda azərbaycanlı soydaşlarımızın yaşadığı bölgələrdə 3 məktəb – Tbilisi şəhərindəki 73, Qardabani şəhər 3 və Dmanisi şəhər 2 nömrəli məktəblər əsaslı təmir və bərpa edilmiş, müasir avadanlıqla təchiz olunmuşdur. Xarici ölkələrdə (Pakistan, Rusiya, Fransa və s.) Fondun vəsaiti hesabına inşa olunan məktəb binaları, təmir edilən mədəniyyət abidələri Mehriban xanım Əliyevanın çoxşaxəli fəaliyyətinin bariz nümunəsidir. Onun əsrlərin miras qoyduğu maddi və mənəvi dəyərləri yaşatmaq amalı tarixi dəyərə malikdir.

Azərbaycan müəllimlərinin əməyi dövlət tərəfindən həmişə yüksək qiymətləndirilmiş, əməkhaqları son illərdə bir neçə dəfə artırılmış, təhsil-

də uğur qazananlar dövlət təltiflərinə layiq görülmüşlər. Son 5 ildə Prezident sərəncamları ilə dövlət təltiflərinə layiq görülənlərin sayı bütövlükdə Sovet dövründə təltif olunanların sayından artıqdır. «Ən yaxşı ümumtəhsil məktəbi» və «Ən yaxşı müəllim» müsabiqələrinin keçirilməsi, qalib adı qazanmış 50 məktəbin və 100 müəllimin yüksək məbləğdə pul mükafatı ilə mükafatlandırılması məktəblər və müəllimlər arasında sağlam rəqabəti, yaradıcılıq və təşəbbüskarlıq meyillərini gücləndirməklə nəticə etibarı ilə təhsilin keyfiyyətinin yüksəlməsinə müstəsna dərəcədə müsbət təsir göstərmişdir.

Azərbaycanda ali təhsilin inkişafı ilə bağlı son illərdə ciddi nailiyyətlər əldə edilmişdir. Bu gün Azərbaycan öz təhsil sisteminin inkişaf prioritetlərini dünyada, o cümlədən Avropa məkanında gedən proseslərə inteqrasiya olunmaqla müəyyənləşdirir. Artıq ali təhsildə ikipilləli təhsil sisteminə keçilmiş, kredit sistemi tətbiq edilməsinə başlanılmış, təhsilin keyfiyyətinə nəzarət gücləndirilmiş, tələbə və professor-müəllim heyətinin mobilliyinin təmin edilməsi istiqamətində uğurlu addımlar atılmış, təhsilin sosial yönümlüyü təmin edilmişdir.

Ölkə Prezidentinin diqqət və qayğısı sayəsində ali təhsil müəssisələrinin, o cümlədən ADPU-nun infrastrukturunun inkişafı sahəsində əhəmiyyətli işlər görülmüşdür. Son illərdə 5 universitet üçün əlavə korpuslar, Tibb Universiteti üçün ən müasir tələblərə cavab verən klinika inşa edilmiş, 21 universitet əsaslı təmir olunmuş, 3 ali məktəb üçün yeni kampus tikilməkdədir.

Ulu öndər Heydər Əliyev Azərbaycandan kənarda təhsil almış yüksəkixtisaslı mütəxəssisləri «Azərbaycanın yetirmələri, Azərbaycanın milli sərvəti» adlandırmışdı. Heydər Əliyevin hakimiyyəti illərində hər il yüzlərlə gənclərimiz ali təhsil almaq üçün keçmiş sovetlər birliyinin aparıcı ali təhsil müəssisələrinə göndərilirdi. Heydər Əliyev tərəfindən XX əsrin 70– 80-ci illərində həyata keçirilmiş siyasət Respublika Prezidenti İlham Əliyevin 16 aprel 2007-ci il tarixli sərəncamı ilə təsdiq etdiyi «2007–2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı» ilə bu gün daha geniş coğrafiyada davam etdirilir. Dövlət Proqramının əsas məqsədi ölkənin müasir tələblərə cavab verən kadrlara ehtiyacının ödənilməsi, istedadlı gənclərin dünyanın aparıcı ölkələrində təhsil almaq imkanlarının genişləndirilməsi prosesinin mütəşəkkilliyi və sə-

mərəliliyinin artırılmasını təmin etməkdən ibarətdir. İndiyə kimi dünyanın aparıcı universitetlərində təhsil alan Azərbaycan gənclərinin sayı 10 mini ötmüşdür. Onlardan 816 nəfəri dövlətlərarası müqavilələrə, 712 nəfəri isə «2007–2015-ci illərdə Azərbaycan gənclərinin xaricdə təhsili üzrə Dövlət Proqramı»na əsasən dünyanın aparıcı universitetlərində təhsil alırlar. Ölkəmizdə təhsil alan əcnəbi tələbələrin sayı da ilbəil artır, hazırda onların sayı 7 min nəfərdən artıqdır.

Prezident İlham Əliyevin rəhbərliyi ilə son illərdə ölkəmizdə ictimai-siyasi sabitliyin qorunmasını təmin edən əsaslar daha da möhkəmləndirilmiş, dünyanın örnək kimi qəbul etdiyi milli, dini, mədəni tolerantlıq mühiti daha da yaxşılaşdırılmış, Bakı Avropa və dünya idman yarışlarının keçirildiyi məkana çevrilmiş, Azərbaycanın siyasi nüfuzunun ən yüksək pilləsinə qalxmış, BMT-nin Təhlükəsizlik Şurasının qeyri-daimi üzvü seçilmişdir. Bakının «Eurovision» mahnı müsabiqəsinə ev sahibliyi etməsi ölkəmizdə gəncliyə göstərilən diqqət və qayğının bariz nümunəsidir.

Elmimizin və təhsilimizin inkişafı, bu sahədə aparılan məqsədyönlü islahatlar, həyata keçirilən məqsədli proqramlar, beynəlxalq təşkilatlarla səmərəli əməkdaşlıq, onu deməyə əsas verir ki, Azərbaycan elmi və təhsili özünün zəngin mütərəqqi ənənələrinə, milli-mənəvi və ümumbəşəri dəyərlərə, beynəlxalq təcrübəyə əsaslanaraq Ümummilli liderimiz Heydər Əliyevin müəyyənləşdirdiyi və möhtərəm Prezidentimiz cənab İlham Əliyevin uğurla davam etdirdiyi strateji kursla inkişaf edir. Bu inkişafın etibarlı təməl üzərində qurulması Azərbaycan təhsilinin dünya təhsil məkanına uğurla inteqrasiyasını təmin edəcəkdir.

## 2.5. KEYFİYYƏTLİ PEDAQOJİ KADR HAZIRLIĞI: MADDİ-TEXNİKİ BAZANIN VƏ ELMİ-METODİK TƏMİNATIN GÜCLƏNDİRİLMƏSİ

Boloniya prosesinin prinsiplərinə uyğun olaraq, yeni standartların tələbləri gözlənilməklə ali pedaqoji təhsilin məzmununun zamanın tələblərinə uyğun qurulması, keyfiyyətin yüksəldilməsi, maliyyələşdirilmə və idarəolunmanın təkmilləşdirilməsi, beynəlxalq əməkdaşlığın genişləndirilməsi,

pedaqoji kadr hazırlığında yeni modellərin tətbiqi sahəsində Azərbaycanın ali təhsil müəssisələrində, o cümlədən Universitetimizdə diqqətəlayiq uğurlar qazanılmışdır. Dövlətin ali təhsillə bağlı müəyyənləşdirdiyi strategiya və konsepsiya uğurla həyata keçirilir. On altı inkişafyönümlü dövlət proqramı uğurla həyata keçirilir. Təhsilin ayrı-ayrı sahələrinin inkişafı üzrə real vəziyyətin təhlili əsasında hazırlanıb təsdiq edilmiş bu proqramın reallaşdırılması nəticəsində təhsilin infrastrukturu müasir tələblərə uyğun qurulmuş, təhsilin məzmunu yeniləşdirilmiş, yeni dərslik siyasəti reallaşdırılmış, təhsil alanların nailiyyətlərinin qiymətləndirilməsi üzrə yeni model və mexanizmlər tətbiq edilmiş, əmək bazarının tələbatına uyğun kadr hazırlığı və təminatı yaxşılaşdırılmış, təhsil müəssisələri informasiya-kommunikasiya texnologiyaları ilə təmin edilmiş, təhsil sisteminin informasiyalaşdırılması, məktəbəqədər, texniki-peşə, ali təhsil, xaricdə təhsil, istedadlı uşaqların inkişafı, xüsusi qayğıya ehtiyacı olan uşaqların təhsilinin təşkili, de-institutlaşdırma və digər bu kimi sahələrdə əhəmiyyətli nailiyyətlər əldə olunmuş, cənab Prezidentin tələbi və göstərişi ilə maddi dəyərlərdən əldə edilən kapital ölkədə insan kapitalının inkişafına yönəldilmişdir.

2006–2007-ci tədris ilində Universitetimizin Kimya və Filologiya, 2007–2008-ci tədris ilində Biologiya və Fizika, 2008–2009-cu tədris ilində Pedaqoji, Tarix, Riyaziyyat, 2009–2010-cu tədris ilində Pedaqogika-psixologiya, Coğrafiya və çağırışaqədər hazırlıq, Mühəndis-pedaqoji və bədii qrafika fakültələrində Kredit Transfer Sistemi tətbiq edilmişdir. Bu məqsədlə bir sıra işlər görülmüş, kredit sisteminin tələblərinə cavab verən yeni tədris proqramları, fənlərin reyestri, tədris qrafikləri, sillabuslar, fənlərin semestrlər üzrə bölgüsünü göstərən sənədlər hazırlanmış, «Tyutor hazırlığı layihəsi» reallaşdırılaraq 40 nəfər tyutor tədris prosesinə cəlb olunmuşdur. Fakültə dekanları kredit sisteminin təşkili qaydaları, tələbə nailiyyətlərinin yeni metodlarla qiymətləndirilməsi, yay məktəbinin təşkili mexanizmi, kollokviumların keçirilməsi, sərbəst işlərin yoxlanılması, laboratoriya, kurs və buraxılış işlərinin müdafiəsi ilə bağlı mütəmadi olaraq maarifləndirmə işləri aparır, imtahanaqədərki və imtahan ballarının dəqiq, obyektiv və şəffaf hesablanmasını təmin edirlər.

2007–2008-ci tədris ilində Universitetimizdə «Kompyuter Mərkəzi» təşkil edilmişdir. «Kompyuter Mərkəzi» öz fəaliyyətini «2007–2012-ci il-



*«Kompyuter Mərkəzi»ndə imtahan zamanı*

lərdə ADPU-da təhsilin informasiyalaşdırılması üzrə 5 illik strategiya»nın tələblərinə uyğun qurmağa çalışır. Bu strategiyaya uyğun olaraq universitetin «informasiya-təhsil portalı»nın yaradılması istiqamətində iş aparılır.

Universitetimizdə müasir tələblərə cavab verən kompyuter mərkəzinin təşkili kollokviumların və imtahanların test üsulu ilə keçirilməsinə şərait yaratmışdır. Belə ki, tələbələrin biliklərinin qiymətləndirilməsində son 20 ildə bir çox qabaqcıl dünya universitetlərində uğurla tətbiq edilən «Elektron-test sistemi» layihəsi hazırlanıb müvəffəqiyyətlə sınaqdan çıxarılmışdır. 2007–2008-ci tədris ilinin qış-yaz sessiya və buraxılış imtahanları universitet tarixində ilk dəfə olaraq elektron test üsulu ilə aparılmışdır. İmtahan prosesində 5 kompyuter sinfində olan 180 kompyuterdən istifadə edilir. İmtahanlarda şəffaflığı təmin etmək üçün hər bir kompyuter sinfində xüsusi vebkamera quraşdırılmışdır. Mərkəzdə qoyulmuş monitorlar

vasitəsilə valideyn və ictimaiyyətin nümayəndələri imtahanın gedişini canlı izləyə bilirlər. Kollokviumların və imtahanların keçirilməsinə kameralar vasitəsilə ciddi nəzarət olunur.

Universitetimizdə tələbələrin biliyi çoxballı sistemə uyğun olaraq 100 balla qiymətləndirilir. Tələbələr 30 bal kollokviuma, 10 bal davamiyyətə, 5 bal mühazirə mətninin tərtibinə, 5 bal isə seminar məşğələlərindəki cavablarına görə toplayırlar. İmtahan zamanı maksimum 50 bal toplana bilər ki, bu zaman keçid balının (minimum 17 bal) toplanması zəruridir. Test metodunun tətbiqi tələbələrdə çox böyük razılıq hissi doğurmuşdur. Bizimlə görüş zamanı həm valideynlər, həm də tələbələrin özləri də təsdiq edirlər ki, dərslərdə müntəzəm iştirak etməyən, əlavə məşğələlərə gəlməyən tələbələrin qiymət alma ehtimalı yoxdur. Müəllim və tələbələrlə ardıcıl əlaqə yaratmaq, onların təklif, arzu və istəklərini araşdırıb, yerindəcə həll etmək məqsədi ilə ayrı-ayrı fakültə əməkdaşları ilə rektorun müntəzəm görüşü keçirilir.

Hazırda Universitetimizin 12 fakültəsində (Tarix, Filologiya, Pedaqoji, Riyaziyyat, Fizika, Kimya, Biologiya, Pedaqogika və psixologiya, Mühəndis-pedaqoji və bədii qrafika, Coğrafiya və çağırışaqədər hazırlıq, Əcnəbi tələbələr üzrə dekanlıq, Əlavə təhsil) bakalavr və magistratura pilləsi üzrə 8800-dən artıq tələbə təhsil alır. Universitetin 12 fakültəsində ali təhsilin bakalavr pilləsində 23 ixtisas üzrə 8000-ə yaxın tələbə, magistratura pilləsində 11 istiqamət, 39 ixtisas üzrə 802 nəfər magistr təhsil alır.

2002–2004-cü illərdə bakalavr pilləsi üzrə 20, 2004–2007-ci illərdə 21, 2007–2008-ci ildə 22, 2008–2009-cu ildə 24, 2009–2010-cu ildə 25 ixtisas, magistratura pilləsində 11 istiqamət, 39 ixtisas üzrə kadr hazırlığı aparılmışdır. 2007–2008-ci tədris ilində universitetdə ilk dəfə Təhsilin təşkili və idarə olunması (menecment), 2008–2009-cu tədris ilində isə Ekologiya ixtisası üzrə kadr hazırlığına başlanmışdır.

1991/92–2010/2011-ci tədris illərində ADPU-da tələbə kontingentinin inkişaf dinamikası aşağıdakı kimi olmuşdur:

| İllər | Əyani | | Qiyabi | | Axşam | |
|---|---|---|---|---|---|---|
| | qəbul | buraxılış | qəbul | buraxılış | qəbul | buraxılış |
| 1991–1992 | 1128 | 944 | 522 | 330 | 252 | - |
| 1992–1993 | 797 | 978 | 317 | 214 | 68 | - |
| 1993–1994 | 906 | 625 | 207 | 600 | 123 | - |
| 1994–1995 | 798 | 980 | 91 | 660 | 110 | 84 |
| 1995–1996 | 780 | 1035 | 171 | 570 | 105 | 177 |
| 1996–1997 | 1185 | 1508 | 304 | 422 | 209 | 47 |
| 1997–1998 | 1089 | 1168 | 555 | 379 | - | 112 |
| 1998–1999 | 1194 | 935 | 580 | 233 | - | 8 |
| 1999–2000 | 1101 | 1170 | 569 | 590 | - | 14 |
| 2000–2001 | 1135 | 1219 | 578 | 550 | - | 8 |
| 2001–2002 | 1155 | 1159 | 674 | 749 | - | - |
| 2002–2003 | 1007 | 1154 | 556 | 620 | - | - |
| 2003–2004 | 1009 | 1076 | 515 | 610 | - | - |
| 2004–2005 | 1124 | 1122 | 619 | 617 | - | - |
| 2005–2006 | 1214 | 971 | 612 | 658 | - | - |
| 2006–2007 | 1062 | 990 | 560 | 581 | - | - |
| 2007–2008 | 1222 | 1078 | 527 | 493 | - | - |
| 2008–2009 | 1308 | 1170 | 494 | 647 | - | - |
| 2009–2010 | 1350 | 1142 | 486 | 672 | - | - |
| 2010–2011 | 1357 | 1232 | 472 | 609 | - | - |

Həmin illərdə Universitetimizdə çalışan professor-müəllim heyətinin sayı artmış, tərkibi elmi dərəcəlilərin hesabına xeyli yaxşılaşmışdır. Əgər 1991-ci ildə universitetin 58 kafedrasında 701 nəfər (57 nəfər elmlər doktoru, professor, 387 nəfər fəlsəfə doktoru, dosent, 257 nəfər baş müəllim), 2000-ci ildə 62 kafedrasında 743 nəfər (76 nəfər elmlər doktoru, professor, 332 nəfər fəlsəfə doktoru, dosent, 335 nəfər baş müəllim) çalışırdısa, 2009-cu ildə 53 kafedrasında 730 nəfər (54 nəfər elmlər doktoru, professor, 232 nəfər fəlsəfə doktoru, dosent, 444 nəfər baş müəllim) çalışırdı. Universitetdə təhsil alan tələbələrin sayında artım müşahidə olunmuş, professor-müəllim

heyətinin sayı isə əksinə azalmışdır. 1991–2010-cu illərdə ADPU-da elmi-pedaqoji kadr potensialının inkişaf dinamikası aşağıdakı kimi olmuşdur:

| **İllər** | **Kafedraların sayı** | **Əməkdaşların sayı** | **O cümlədən:** | | **Baş müəllim və müəllim** |
|---|---|---|---|---|---|
| | | | **Elmlər doktoru, professor** | **Fəlsəfə doktoru, dosent** | |
| 1991 | 58 | 701 | 57 | 387 | 257 |
| 1992 | 58 | 699 | 57 | 370 | 272 |
| 1993 | 58 | 842 | 73 | 274 | 495 |
| 1994 | 60 | 701 | 54 | 291 | 356 |
| 1995 | 60 | 36 | 52 | 288 | 396 |
| 1996 | 61 | 708 | 80 | 330 | 298 |
| 1997 | 61 | 717 | 49 | 290 | 378 |
| 1998 | 61 | 700 | 66 | 298 | 336 |
| 1999 | 61 | 727 | 80 | 332 | 315 |
| 2000 | 62 | 743 | 76 | 332 | 335 |
| 2001 | 50 | 797 | 70 | 347 | 380 |
| 2002 | 50 | 786 | 67 | 314 | 405 |
| 2003 | 50 | 767 | 57 | 297 | 413 |
| 2004 | 50 | 779 | 59 | 287 | 433 |
| 2005 | 50 | 750 | 59 | 277 | 414 |
| 2006 | 51 | 749 | 54 | 236 | 459 |
| 2007 | 51 | 763 | 54 | 247 | 462 |
| 2008 | 52 | 733 | 54 | 242 | 437 |
| 2009 | 53 | 730 | 54 | 232 | 444 |
| 2010 | 53 | 730 | 52 | 230 | 448 |

Həmin illərdə universitetdə pedaqoji və elmi-pedaqoji kadr hazırlığındakı xidmətlərinə görə Afad Qurbanov (1926–2009), Vəli Əliyev Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, Hüseyn Əhmədov, Sədi İmanov isə Rusiya Təhsil Akademiyasının xarici üzvü seçilmişlər. Onlarla əməkdaş Nyu-York Akademiyasının, Beynəlxalq Pedaqoji Akademiyanın, Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi və müxbir üzvləridir.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin «Magistr hazırlığı haqqında» 13 fevral 1997-ci il tarixli qərarına uyğun olaraq 1997-ci ilin sentyabrında ADPU-da aspirantura şöbəsinin bazası əsasında magistratura və doktorantura şöbəsi yaradılmışdır. ADPU-da magistraturanın ilk buraxılışı 1999–2000-ci tədris ilində olmuşdur.

Hazırda magistraturanın əyani və qiyabi şöbələrində 11 istiqamət (riyaziyyat, fizika, kimya, biologiya, coğrafiya, tarix, filologiya, dilşünaslıq, maarif, psixologiya, musiqişünaslıq), 39 ixtisas üzrə 802 nəfər magistr təhsili alır. ADPU-nun magistraturasına BDU, ƏDU, NDU, BSU, LDU, ADU, BQU kimi dövlət və qeyri-dövlət ali məktəblərinin məzunları qəbul olunmuşlar ki, bu da ADPU-nun elmi nüfuzunun günbəgün artdığını sübut edir.

ADPU-nun magistraturasında Türkiyə Ruspublikasından 4 nəfər, İran İslam Respublikasından isə 1 nəfər müxtəlif ixtisaslar üzrə təhsil almışdır.

1997–2011-ci illərdə ADPU-da magistraturaya qəbulun inkişaf dinamikası aşağıdakı kimi olmuşdur:

| İllər | İxtisaslar | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Riyaziyyat | | Fizika | | Kimya | | Biologiya | | Coğrafiya | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 1997 | 8 | - | 4 | - | 3 | - | 5 | - | 7 | - |
| 1998 | 9 | - | 6 | - | 9 | - | 9 | - | 10 | - |
| 1999 | 11 | - | 1 | - | 1 | - | 9 | - | 9 | - |
| 2000 | 13 | - | - | - | 2 | - | 17 | - | 8 | - |
| 2001 | 12 | - | 2 | - | 3 | - | 11 | - | 4 | - |
| 2002 | 11 | - | 4 | - | 6 | - | 16 | 2 | 6 | - |
| 2003 | 5 | - | 2 | - | 6 | - | 9 | 9 | 4 | - |
| 2004 | 7 | - | 5 | - | 8 | - | 15 | 10 | - | 2 |
| 2005 | 1 | - | 11 | - | 8 | - | 20 | 14 | 9 | 7 |
| 2006 | 13 | 10 | 6 | - | 12 | - | 19 | 18 | 9 | 8 |
| 2007 | 29 | 11 | 20 | - | 13 | - | 15 | 19 | 7 | 9 |
| 2008 | 17 | 15 | 17 | 8 | 19 | - | 18 | 13 | 7 | 9 |
| 2009 | 29 | 16 | 26 | 6 | 19 | - | 18 | 14 | 10 | 9 |
| 2010 | 21 | 20 | 21 | - | 19 | - | 24 | 18 | 9 | 11 |
| 2011 | 24 | 18 | 24 | 7 | 23 | - | 20 | 17 | 10 | 15 |

| İllər | İxtisaslar | | | | | | | | | | | |
|---|---|---|---|---|---|---|---|---|---|---|---|---|
| | Filologiya | | Dilşünaslıq | | Tarix | | Psixologiya | | Maarif | | Musiqişünaslıq | |
| | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | | Qəbul | |
| | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi | əyani | qiyabi |
| 1997 | 6 | - | 6 | - | 12 | - | 4 | - | 9 | - | - | - |
| 1998 | 12 | - | 8 | - | 24 | - | 13 | - | 20 | - | - | - |
| 1999 | 10 | - | 12 | - | 15 | - | 1 | - | 8 | - | - | - |
| 2000 | 7 | - | 13 | - | 11 | - | 5 | - | 16 | - | - | - |
| 2001 | 8 | 1 | 8 | - | 14 | - | 6 | - | 29 | - | - | - |
| 2002 | 13 | - | 12 | 3 | 19 | 2 | 6 | - | 12 | 6 | - | - |
| 2003 | 8 | 7 | 8 | 5 | 19 | 3 | 6 | - | 18 | 15 | - | - |
| 2004 | 8 | 6 | 7 | 5 | 11 | 8 | 4 | - | 7 | 11 | - | - |
| 2005 | 7 | 13 | 15 | 13 | 15 | 10 | 16 | 3 | 20 | 18 | - | - |
| 2006 | 8 | 9 | 18 | 9 | 18 | 13 | 18 | - | 37 | 48 | - | - |
| 2007 | 9 | 8 | 18 | 8 | 15 | 13 | 6 | - | 53 | 47 | - | - |
| 2008 | 8 | 8 | 15 | 8 | 18 | 12 | 10 | - | 22 | 26 | 3 | - |
| 2009 | 10 | 11 | 20 | 11 | 23 | 14 | 9 | - | 48 | 41 | 2 | - |
| 2010 | 13 | 10 | 24 | 10 | 21 | 10 | 9 | - | 26 | 38 | 4 | 1 |
| 2011 | 13 | 11 | 24 | 13 | 23 | 15 | 13 | - | 48 | 55 | 5 | 3 |

Magistratura və doktorantura şöbəsi doktorant və dissertantların hazırlığı ilə də məşğul olur. 2011-ci ildə universitetimizə fəlsəfə proqramı üzrə 24 nəfər doktorant, 19 nəfər dissertant, elmlər doktoru proqramı üzrə 18 nəfər doktorant qəbul edilmişdir.

**1991–2010-cu illərdə ADPU-da təhsil alan aspirantlar haqqında məlumat**

| İllər | Qəbul | | Cəmi | Buraxılış | | Cəmi |
|---|---|---|---|---|---|---|
| | əyani | qiyabi | | əyani | qiyabi | |
| 1991 | 3 | 17 | 20 | 6 | - | 6 |
| 1992 | 9 | 7 | 16 | 12 | - | 12 |
| 1993 | - | - | - | 13 | 13 | 26 |
| 1994 | 1 | 9 | 10 | 3 | 7 | 10 |
| 1995 | 3 | 4 | 7 | 12 | 17 | 29 |
| 1996 | 3 | 7 | 10 | - | 7 | 7 |
| 1997 | 1 | 1 | 2 | 2 | - | 2 |
| 1998 | 2 | 4 | 6 | 3 | 8 | 11 |
| 1999 | 1 | - | 1 | 4 | 5 | 9 |
| 2000 | 2 | - | 2 | 1 | 5 | 6 |
| 2001 | 3 | 1 | 4 | 1 | 1 | 2 |
| 2002 | 3 | 1 | 4 | 2 | 5 | 7 |
| 2003 | 2 | 1 | 3 | - | - | - |
| 2004 | 3 | - | 3 | 3 | - | 3 |
| 2005 | 3 | - | 3 | 2 | 1 | 3 |
| 2006 | 2 | 3 | 5 | 2 | - | 2 |
| 2007 | 9 | 3 | 12 | 3 | 1 | 4 |
| 2008 | 6 | 7 | 13 | 3 | 1 | 4 |
| 2009 | - | - | - | 1 | - | 1 |
| 2010 | - | - | - | - | - | - |
| 2011 | 8 | 16 | 24 | - | - | - |

Hazırda universitetimizdə fəlsəfə doktoru proqramı üzrə 31 nəfər doktorant və 42 nəfər dissertant, elmlər doktoru proqramı üzrə 30 nəfər dissertasiya üzərində çalışır.







*Ulu öndər Heydər Əliyevin abidəsi önündə*




*Ulu öndər Heydər Əliyevin abidəsi önündə*

2011-ci ildə İxtisasartırma və yenidənhazırlanma fakültəsinin bazası əsasında Əlavə təhsil fakültəsi təşkil olunub. İndiyə kimi 2685 nəfərdən fakültədə ixtisasını dəyişmiş, 1965 nəfər isə ixtisasartırma kurslarfında iştirak etmişdir.

Universitetin professor-müəllim və inzibati-köməkçi heyətinin kompyuter kurslarına cəlb edilməsi istiqamətində də iş aparılır. Son bir ildə yüz nəfərə yaxın əməkdaş bu kurslarda təlim keçmişlər. Pedaqoji universitetlər üçün elektron dərsliklərin yaradılması, tədris resurslarının hazırlanması, elektron kitabxananın, universitetin avtomatlaşdırılmış idarəetmə sisteminin yaradılması da nəzərdə tutulur.

Ulu öndər Heydər Əliyevin xatirəsini əbədiləşdirmək, onun nəzəri irsini öyrənmək, təbliğ etmək, gələcəyin müəllimlərini dövlətçiliyə sədaqət və azərbaycançılıq ruhunda tərbiyə etmək ADPU-nun professor-müəllim heyətinin ən ümdə vəzifəsidir. Heydər Əliyev irsində Vətən sevgisi, Azərbaycan sevgisi – azərbaycançılıq hissi, xalq, millət sevgisi, dil sevgisi, milli mədəniyyət sevgisi, insanın insana, insanın Vətəninə, xalqına, dövlətinə sədaqət hissi mühüm yer tutur. Bu irsin qorunması və gələcək nəsillərə çatdırılması, hər bir gəncdə azərbaycançılıq hissinin formalaşdırılması gənc nəslin



*ADPU-da tədbir*

dövlətçilik ənənələrinə sədaqət ruhunda tərbiyə olunması ən vacib şərtlərdən biridir. Bu məqsədlə universitetimizdə geniş tədbirlər həyata keçirilmiş və keçirilməkdədir. Ulu öndərin xatirəsinə ehtiram əlaməti olaraq universitetimizin foyesində abidəsi qoyulmuş, nadir eksponatlarla təchiz edilən, professor-müəllimlərin, tələbələrin və universitetimizin qonaqlarının ziyarət məkanına çevrilən xatirə muzeyi yaradılmış, zəngin irsinin gənc nəslə çatdırılması məqsədi ilə «Heydər Əliyev Məktəbinin Lektoriyası» təşkil edilmişdir. Heydər Əliyevin nəzəri irsini dərindən öyrənmək məqsədi ilə universitetimizin professor-müəllim, magistr və doktorantları üçün xüsusi kurslar təşkil edilmiş, «Heydər Əliyev milli tərbiyə və təhsil nəzəriyyəçisidir», «Azərbaycanda elm və təhsilin inkişafında Heydər Əliyev mərhələsi», «Heydər Əliyev və Azərbaycanda təhsil quruculuğu məsələləri», «Heydər Əliyev və Azərbaycandan kənarda təhsil», «Heydər Əliyev müstəqil Azərbaycanda təhsil islahatının memarı və rəhbəridir», «Heydər Əliyev və Azərbaycan dövlətçiliyi», «Heydər Əliyevin təhsil siyasətinin uğurlu davamı», «Heydər Əliyev və Azərbaycan gəncliyi» və s. mövzularda məruzələr dinlənilmiş, həmin məruzələrin materialları xüsusi toplu şəklində nəşr olunmuşdur.

Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin xüsusi diqqət və qayğısı ilə əhatə olunmuş universitetimiz öz inkişafının yeni



*Türkiyə səfirliyinin əməkdaşları ADPU-da*

mərhələsinə qədəm qoymuş, elmi fəaliyyətin həm strukturu, həm də məzmununda əhəmiyyətli keyfiyyət dəyişiklikləri baş vermişdir. Mövcud elmi-tədqiqat laboratoriyalarının maddi-texniki bazası gücləndirilmiş, zəruri avadanlıqla təchiz edilmiş, gerçəkliyə maksimum adekvat olan elmi nəticələrin alınması üçün tədqiqat mövzuları müasir dövrün tələblərinə uyğunlaşdırılmış, «Türk dili və ədəbiyyatı okuma odası» və «Dədə Qorqud elmi-tədqiqat laboratoriyası»nın strukturunda əsaslı dəyişikliklər edilmiş, yeni elmi-tədqiqat laboratoriyaları («Pedaqoji təhsilin problemləri», «Bioinformatika») yaradılmışdır.

Universitetimizdə BMT-nin İnkişaf Proqramı, ADPU və Lider Qadın ictimai Birliyi tərəfindən Gender Təhsili Araşdırma Mərkəzi, UNICEF tərəfindən isə «Müasir təlim texnologiyaları, təlim və resurs mərkəzi» təşkil edilmişdir.

Universitetimizdə professor-müəllimlərin, magistr və doktorantların apardıqları elmi-tədqiqat işləri daha çox pedaqoji təhsilin məzmununun yeniləşdirilməsinə, pedaqoji kadr hazırlığının nəzəri və praktik məsələlərinin araşdırılmasına, yeni dərslik, dərs vəsaiti və metodik tövsiyələrin hazırlanmasına istiqamətlənmişdir. Elmi-tədqiqatların metodoloji bazasının

məqsədyönlü istiqamətdə təkmilləşdirilməsi son illərdə elmi potensialın kəmiyyət və keyfiyyət artımına səbəb olmuşdur.

1990-cı illərin əvvəllərindən başlayaraq universitetin əməkdaşları yaxın və uzaq xaricdə müxtəlif konfrans və simpoziumlarda iştirak etmişlər. Əgər 1991–2000-ci ildə xarici ölkələrdə konfrans və simpoziumlarda 79 nəfər iştirak etmişdirsə, 2001–2010-cu illərdə onların sayı 191 nəfər olmuşdur. 2006-cı ildə Türkiyə Cümhuriyyətinin Hacəttəpə Universiteti ilə əməkdaşlıq müqaviləsi bağlanmışdır.

Son illərdə ADPU-nun beynəlxalq əlaqələri xeyli genişlənmiş, müxtəlif ölkələrlə müəllim-tələbə mübadiləsi, birgə elmi tədqiqatlar, beynəlxalq forum, konqres və simpoziumlarda iştirak, beynəlxalq və regionlararası təhsil proqramlarına qoşulmaq və onların işində fəal iştirak etmək kimi istiqamətlərdə həyata keçirilən tədbirlərdə keyfiyyət dəyişikliyi xüsusi ilə nəzərə çarpmaqdadır. Bu mənada ADPU ilə Türkiyənin Hacəttəpə Universiteti arasında yaradılmış pedaqoji və elmi istiqamətlərə söykənən əlaqələrin gündən-günə daha da gücləndiyini xüsusi qeyd etmək yerinə düşər. Türkiyənin Hacəttəpə Universitetinin nümayəndələri bir neçə dəfə universitetimizdə olmuşlar. Eləcə də ADPU-nun nümayəndə heyəti Hacəttəpə Universitetinin iş təcrübəsi ilə tanış olmaq üçün Türkiyə Cümhuriyyətində olmuşdur. Hər iki universitetin əməkdaşlarının iştirakı ilə dörd dəfə beynəlxalq konfrans keçirilmişdir. 2007-ci ilin may ayının 12–14-də Bakıda Azərbaycan xalqının Ümummilli lideri Heydər Əliyevin 84-cü ildönümünə həsr olunmuş «Müəllim hazırlama siyasəti və problemləri» Beynəlxalq Elmi Konfransı xüsusi qeyd etmək lazımdır. Türkiyənin, Şimali Kipr Türk Respublikasının, Almaniyanın, Qırğızıstanın, Amerikanın 29 universitetindən və Azərbaycanın 21 universitetindən ümumilikdə 175 nəfərin iştirak etdiyi həmin konfransda 11 bölmə üzrə 300-dən artıq məruzə dinlənilmişdir. Konfransın materialları Türkiyədə 2 cilddə, toplu halında nəfis şəkildə çap edilmişdir.

Həmçinin 2008-ci ilin mayın 17–19-da ADPU-da Təhsil Nazirliyinin Pedaqoji Təhsil üzrə Koordinasiya Şurası, ADPU və Hacəttəpə Universiteti ilə birlikdə «Təhsildə qloballaşma və İKT» mövzusunda Beynəlxalq elmi konfrans keçirilmişdir. Həmin konfransda Hacəttəpə və Ortadoğu Texniki Universitetlərinin 32 əməkdaşı, Dağıstan Dövlət Pedaqoji Universitetinin, Təhsil Nazirliyinin, Təhsil Problemləri İnstitutunun, Azərbaycan Milli Elmlər Akademiyasının İnformasiya Texnologiyaları və Riyaziyyat institutlarının, Kosmik Tədqiqatlar Agentliyinin İnformatika və

Ekologiya institutlarının, həmçinin respublikamızın 8 ali təhsil müəssisəsinin əməkdaşları iştirak etmişlər. Eyni zamanda konfransda 5 nazirliyin, bir sıra nüfuzlu yerli və xarici şirkətlərin, o cümlədən «İntel» və «Reyn» şirkətlərinin nümayəndələri də təmsil olunmuşlar. 2 gün davam etmiş konfrans zamanı 50-dən artıq məruzə dinlənilmişdir. Onlardan 22-si Hacəttəpə, Ortadoğu Texnik və Dağıstan Universitetlərinin alimləri tərəfindən, qalanları isə Azərbaycan tədqiqatçıları tərəfindən edilmişdir. 2010-cu ilin may ayında ADPU-nun 34 nəfər əməkdaşı Hacəttəpə Universitetində keçirilən «Müəllim hazırlama siyasəti və problemləri» Beynəlxalq elmi konfransında iştirak etmiş, məruzələrlə çıxış etmişlər. Pedaqoji Universitetin Pedaqoji fakültəsinin 50 illik yubileyinə həsr olunmuş tədbirdə Hacəttəpə Universitetinin 22 nəfər əməkdaşı iştirak etmişdir.




*ADPU-nun 85 illik yubiley tədbirində*

15 aprel 2011-ci ildə Azərbaycan Dövlət Pedaqoji Universitetində Ümummilli lider Heydər Əliyevin anadan olmasının 88-ci ildönümünə həsr olunmuş «Boloniya» prosesində ali təhsildə keyfiyyətin idarə olunması» mövzusunda Fasiləsiz Pedaqoji Təhsil üzrə Koordinasiya Şurası və Qafqaz Universitetinin birgə iştirakı ilə beynəlxalq elmi konfrans keçirilmişdir. Təhsil Nazirliyinin, ADPU-nun və Qafqaz Universitetinin təşkilatçılığı ilə keçirilən konfransda Mərmərə Universitetinin rektoru prof. Zafer Gül «Boloniya prosesinə ümumi bir baxış», Qara Dəniz Texniki Universitetinin prorektoru prof. Miraç Akçay «Proqram və dərs öyrənmə vasitələri ilə dərs kreditlərinin hesablanması», Sakarya Universitetinin prorektoru prof. Muzaffer Elmas «Ali təhsildə keyfiyyətin inkişaf prosesi», Atatürk Universitetinin prorektoru prof.Fahri Yavuz «Boloniya prosesində tələbəyönümlü təlim və onun ictimai aspekti», Türkiyə Cümhuriyyəti Yüksək Öyrətim Kurumunun üzvü prof. Şaban Çalış «Boloniya prosesi haqqında» məruzələrlə çıxış etmişlər.

Qara Dəniz Hövzəsi Ölkələrinin Universitetləri Assosiasiyasının üzvü olan ADPU 2009-cu ildən Avropa Müəllim Hazırlığı Birliyinə üzv seçilmişdir.

Bütün bunlar Azərbaycan Dövlət Pedaqoji Universitetində elmin və təhsilin inkişafının real göstəriciləridir. Azərbaycan Dövlət Pedaqoji Universitetində aparılan islahatlara ən yüksək qiymət ali məktəbimizin 85 illik yubileyi ilə bağlı möhtərəm Prezidentimiz cənab İlham Əliyev tərəfindən verilmişdir. Prezidentin 26 dekabr 2006-cı il tarixli Sərəncamı ilə 2 nəfərə «Şöhrət» ordeni, 16 nəfərə «Tərəqqi» medalı, 2 nəfərə «Əməkdar elm xadimi», 19 nəfərə «Əməkdar müəllim» fəxri adı və 1 nəfərə Azərbaycan Respublikası Prezidentinin təqaüdü verilmişdir.

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin**
**əməkdaşlarının təltif edilməsi haqqında**
**Azərbaycan Respublikası Prezidentinin**
**S Ə R Ə N C A M I**

Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə Azərbaycan Dövlət Pedaqoji Universitetinin aşağıdakı əməkdaşları təltif edilsin:

**«Şöhrət ordeni» ilə**

Əlizadə Əbdül Əli oğlu
Murquzov Mirzəli İsmayıl oğlu

**«Tərəqqi medalı» ilə**

Ağalarov Ədnan Məmməd oğlu
Baxşəliyev Rafiq Məmmədbağır oğlu
Hacıyev Abbas Məmməd oğlu
Hacıyev Allahverdi Şəmistan oğlu
Həşimov Həşim İsaq oğlu
Hüseynov Balaxan Qaraxan oğlu
Hüseynov Kamal Dadaş oğlu
Xəlilov Buludxan Əziz oğlu
Xəlilov Zahid Abdulla oğlu
Qasımov Himalay Ənvər oğlu
Musayev Nəsrəddin İsa oğlu
Nəcəfov Maqsud Ağaqulu oğlu
Novruzov Tərlan Cabbar oğlu
Paşayev Əmrulla Xanməd oğlu

Rüstəmov Fərrux Abbas oğlu
Sultanov Oqtay Balaqadaş oğlu

**İLHAM ƏLİYEV,**
***Azərbaycan Respublikasının Prezidenti***
**Bakı şəhəri, 26 dekabr 2006-cı il**

**Azərbaycan Respublikası Prezidentinin**
**fərdi təqaüdlərinin verilməsi haqqında**
**Azərbaycan Respublikası Prezidentinin**
**S Ə R Ə N C A M I**

Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdünün təsis edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin 2010-cu il 11 iyun tarixli 715 nömrəli Fərmanına uyğun olaraq qərara alıram:

1. Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə aşağıdakı şəxslərə Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdləri verilsin:
   **Fərəcov Ədalət Nurulla oğlu**
2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.
3. Bu Sərəncam imzalandığı gündən qüvvəyə minir.

**İLHAM ƏLİYEV,**
***Azərbaycan Respublikasının Prezidenti***
**Bakı şəhəri, 26 dekabr 2006-cı il**

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin**
**əməkdaşlarına fəxri adların verilməsi haqqında**
**Azərbaycan Respublikası Prezidentinin**
**S Ə R Ə N C A M I**

Azərbaycanda təhsilin inkişafındakı xidmətlərinə görə Azərbaycan Dövlət Pedaqoji Universitetinin aşağıdakı əməkdaşlarına Azərbaycan Respublikasının fəxri adları verilsin:

**«Əməkdar elm xadimi» fəxri adı**

Əfəndiyev Paşa Şərif oğlu
Məmmədov Süleyman Abbas oğlu

**«Əməkdar müəllim» fəxri adı**

Balıyev Həsən Balı oğlu
Cəbrayılov Məlikməmməd Saday oğlu
Əbdülov Məmmədəli Şamil oğlu
Əhmədov Yusif Kərəm oğlu
Əliyev Mustafa Cahan oğlu
Əliyev Rəhim İbrahim oğlu
Əliyev Vilayət Hüseyn oğlu
Əliyeva Tinatin Məmməd qızı
Həmidov Seyidağa Sail oğlu
Həsənov Şahəli Gülmalı oğlu
Hüseynov Əli Məhərrəm oğlu
İsmayılov Məbud Üzeyir oğlu
Quliyev Əsab Astan oğlu
Qurbanov Ələkbər Nemət oğlu
Qüdrətov Dərgah Humay oğlu
Musayev Vəli Mustafa oğlu
Orucov Qardaşxan Əliməmməd oğlu
Tahirli Zemfira Cəlil qızı
Verdizadə Nailə Allahverdi qızı

**İLHAM ƏLİYEV,**
***Azərbaycan Respublikasının Prezidenti***
**Bakı şəhəri, 26 dekabr 2006-cı il**

Kollektivimizin əməyinə verilən bu yüksək qiymətə görə Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevə Universitetimizin müraciət məktubu ünvanlandırılıb.

**Azərbaycan Dövlət Pedaqoji Universiteti kollektivinin**
**Azərbaycan Respublikasının Prezidenti cənab İLHAM ƏLİYEVƏ**
**M Ü R A C İ Ə T İ**

*Möhtərəm cənab Prezident!*

85 illik yubiley təntənələrini yaşayan Azərbaycan Dövlət Pedaqoji Universitetinin professor-müəllim heyətinin böyük bir qrupunu Vətənin

yüksək orden və medalları, fəxri adları ilə təltif etməklə sevincimizə sevinc qatdığınıza görə, Sizə olan hörmət və ehtiramımızı, dərin minnətdarlığımızı ifadə etməkdən məmnunluq duyur, bundan sonra da, pedaqoji və elmi pedaqoji kadr hazırlığında əzmlə çalışacağımıza, Vətən elminin inkişafı üçün gərgin yaradıcılıq axtarışları aparacağımıza söz veririk.

*Möhtərəm cənab Prezident!*

Azərbaycan Dövlət Pedaqoji Universitetində yaşayan bayram əhval-ruhiyyəsi ulu öndərimizin, Ümummilli liderimiz Heydər Əliyevin qurub-yaratdığı, şah əsəri hesab olunan müstəqil Azərbaycanımızdakı sakitliyin, sabitliyin, tərəqqinin, sosial-iqtisadi inkişafın, təhsilə və təhsil işçilərinə verdiyiniz yüksək qiymətin təzahürüdür. Ulu öndərimizin, həmişəyaşar liderimizin uzun illər ərzində həyata keçirtdiyi təhsil siyasətinin uğurlu davamıdır.

*Möhtərəm cənab Prezident!*

Sizin müstəsna təşkilatçılığınız, siyasi uzaqgörənliyiniz, milli və bəşəri ideallara sadiqliyiniz nəticəsində Azərbaycan bütün sahələrdə inkişaf edərək böyük beynəlxalq nüfuz, siyasi və iqtisadi güc qazanmış və regionun lider dövlətinə çevrilmiş, iqtisadi inkişaf tempinə görə isə dünya dövlətləri arasında ön sıraya çıxmışdır. Sizin təhsili Azərbaycanın davamlı inkişaf strategiyasının ən öncül istiqamətlərindən biri hesab etməyiniz, maddi dəyərlərimizi, iqtisadi potensialımızı insan kapitalına çevirmək istiqamətində gördüyünüz işlər cəmiyyətimiz tərəfindən böyük razılıqla qarşılanır. Memarı ulu öndərimiz Heydər Əliyev olan təhsil islahatları sahəsində fəaliyyət Sizin rəhbərliyinizlə uğurla davam etdirilir. Yeni-yeni məktəb binaları tikilir, müasir avadanlıqla təchiz edilir, kompyuterləşdirilir, dərslik və dərs vəsaitləri, elmi-bədii kitablarla təmin olunur, istedadlı uşaqların üzə çıxarılması üçün yaradıcılıq müsabiqəsi keçirilir, müəllimlərin və tələbələrin sosial müdafiəsi istiqamətində məqsədyönlü işlər görülür. Bu gün Azərbaycanın ən ucqar dağ kəndlərində müasir tipli məktəblərin inşası Avropaya inteqrasiya edən təhsilimizin yaxın gələcəkdə daha yüksək inkişafından, Azərbaycan dövlətinin dünya dövlətləri birliyində daha mühüm yer tutacağından xəbər verir. Çünki təhsil bütün tərəqqinin və inkişafın mənbəyi, əsas şərtidir.

*Möhtərəm cənab Prezident!*

Biz Sizin Vətənə, xalqa dərin məhəbbətinizdən çox məmnun olur, qürur hissi duyur, əmin edirik ki, elmimizin, təhsilimizin inkişafında, dünyaya inteqrasiyasında, Azərbaycanımız üçün pedaqoji və elmi-pedaqoji kadr hazırlığı işində var qüvvəmizlə çalışacaq, bu istiqamətdəki şərəfli fəaliyyətinizin köməkçisi olacağıq.

*Möhtərəm cənab Prezident!*

Azərbaycan Dövlət Pedaqoji Universitetinin çoxminli professor-müəllim və tələbə kollektivinə göstərdiyiniz diqqət və qayğıya, əməyimizə verdiyiniz yüksək qiymətə görə Sizə dərin minnətdarlığımızı bildirir, qarşıdan gələn Dünya Azərbaycanlılarının Həmrəylik günü, Qurban bayramı və Yeni il münasibətilə Sizi ürəkdən təbrik edir, işlərinizdə böyük uğurlar arzulayırıq.

Sizi əmin edirik ki, qayğınıza əməli işimizlə cavab verəcək, Azərbaycan dövlətinin və dövlətçiliyinin inkişafı yolunda öz səyimizi, bilik və bacarığımızı heç vaxt əsirgəməyəcəyik.

**Müraciət Azərbaycan Dövlət Pedaqoji Universitetinin 85 illik yubileyi münasibəti ilə 2006-cı il dekabrın 28-də keçirilmiş təntənəli mərasimdə qəbul edilmişdir.**

**Rektor: YUSİF MƏMMƏDOV**

Yubileydən keçən dövr ərzində də əməkdaşlarımızın fəaliyyəti respublika Prezidenti möhtərəm cənab İlham Əliyev tərəfindən yüksək qiymətləndirilmiş, 2 nəfərə «Şöhrət» ordeni (prof. Yusif Məmmədov, prof. Nizami Xudiyev), 1 nəfərə Əməkdar elm xadimi (prof. Həsən Mirzəyev), 1 nəfərə Əməkdar mədəniyyət işçisi (Vaqif Əliyev), 1 nəfərə Əməkdar bədən tərbiyəsi və idman xadimi (Gülbaba Quliyev) fəxri adı, 2 nəfərə Azərbaycan Respublikası Prezidentinin təqaüdü (prof. Həsən Mirzəyev, prof. Hüseyn Əhmədov) verilmişdir.

**Y.Ə.Məməmmədovun «Şöhrət» ordeni ilə
təltif edilməsi haqqında
Azərbaycan Respublikası Prezidentinin
SƏRƏNCAMI**

Azərbaycan Respublikasında elm və təhsilin inkişafındakı xidmətlərinə görə **Yusif Əbülfət oğlu Məmmədov** «Şöhrət» ordeni ilə təltif edilsin.

**İLHAM ƏLİYEV,**
*Azərbaycan Respublikasının Prezidenti*
**Bakı şəhəri, 21 yanvar 2010-cu il**

**N.M.Xudiyevin «Şöhrət» ordeni ilə
təltif edilməsi haqqında
Azərbaycan Respublikası Prezidentinin
S Ə R Ə N C A M I**

Azərbaycan Respublikasının ictimai-siyasi və mədəni həyatında fəal iştirakına görə **Nizami Mənaf oğlu Xudiyev** «Şöhrət» ordeni ilə təltif edilsin.

**İLHAM ƏLİYEV,**
*Azərbaycan Respublikasının Prezidenti*
**Bakı şəhəri, 30 mart 2009-cu il**

**Azərbaycan Respublikası Prezidentinin fərdi
təqaüdlərinin verilməsi haqqında
Azərbaycan Respublikası Prezidentinin
S Ə R Ə N C A M I**

«Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdünün təsis edilməsi haqqında» Azərbaycan Respublikası Prezidentinin 2002-ci il 11 iyun tarixli 715 nömrəli fərmanına uyğun olaraq qərara alıram:

1. Azərbaycan təhsilinin inkişafında böyük xidmətləri olan aşağıdakı şəxslərə Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdləri verilsin:
   **Əhmədov Hüseyn Mustafa oğlu...**

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.
3. Bu sərəncam imzalandığı gündən qüvvəyə minir.

**İLHAM ƏLİYEV,**
***Azərbaycan Respublikasının Prezidenti***
**Bakı şəhəri, 3 oktyabr 2007-ci il**

**Azərbaycan Respublikasının təhsil işçilərinə fəxri adların verilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin**
**S Ə R Ə N C A M I**

Azərbaycan dilinin inkişafındakı xidmətlərinə görə aşağıdakı təhsil işçilərinə Azərbaycan Respublikasının fəxri adları verilsin.

«Azərbaycan Respublikasının əməkdar elm xadimi»

**Mirzəyev Həsən İbrahim oğlu…**

**İLHAM ƏLİYEV,**
***Azərbaycan Respublikasının Prezidenti***
**Bakı şəhəri, 3 oktyabr 2007-ci il**

**Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdlərinin verilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin**
**S Ə R Ə N C A M I**

«Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdünün təsis edilməsi haqqında» Azərbaycan Respublikası Prezidentinin 2002-ci il 11 iyun tarixli 715 nömrəli fərmanına uyğun olaraq qərara alıram:

1. Azərbaycanda mədəniyyət, səhiyyə və təhsilin inkişafında böyük xidmətləri olan aşağıdakı şəxslərə Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdləri verilsin:

**…Mirzəyev Həsən İbrahim oğlu**

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.
3. Bu sərəncam imzalandığı gündən qüvvəyə minir.

**İLHAM ƏLİYEV,**
***Azərbaycan Respublikasının Prezidenti***
**Bakı şəhəri, 13 aprel 2009-cu il**

## Azərbaycan Respublikasının idman mütəxəssislərinə fəxri adların verilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin SƏRƏNCAMI

Azərbaycanda bədən tərbiyəsi və idmanın inkişafında, tədrisi və təbliğində xidmətlərinə görə aşağıdakı şəxslərə Azərbaycan Respublikasının fəxri adı verilsin:

«Əməkdar bədən tərbiyəsi və idman xadimi»

**... Quliyev Gülbaba Balasoltan oğlu…**

**İLHAM ƏLİYEV,**
***Azərbaycan Respublikasının Prezidenti***
**Bakı şəhəri, 22 dekabr 2009-cu il**

## Təhsil İşçiləri Azad Həmkarlar İttifaqının bir qrup əməkdaşına «Əməkdar mədəniyyət işçisi» fəxri adının verilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin SƏRƏNCAMI

Azərbaycan Respublikasında təhsilin inkişafı sahəsindəki xidmətlərinə görə və Təhsil İşçiləri Azad Həmkarlar İttifaqının yaradılmasının 90 illiyi ilə əlaqədar aşağıdakı şəxslərə **«Əməkdar Mədəniyyət İşçisi»** fəxri adı verilsin:

**Əliyev Vaqif Kamil oğluna**

**İLHAM ƏLİYEV,**
***Azərbaycan Respublikasının Prezidenti***
**Bakı şəhəri, 4 iyun 2010-cu il**

## 2.6. UNİVERSİTETİN İDARƏETMƏ STRUKTURU

Bütün ali təhsil müəssisələrində olduğu kimi, ADPU-nun idarəetmə strukturunda da rektorluq mühüm rol oynayır. Rektorluq universitet üzrə tədris, elmi-tədqiqat, təhsil-tərbiyə, inzibati-təsərrüfat, sosial-mədəni və s. fəaliyyətin təşkili və idarəolunmasına, pedaqoji və elmi-pedaqoji kadr hazırlığının inkişaf strategiyasının müəyyənləşdirilməsinə və həyata keçirilməsinə ümumi rəhbərliyi həyata keçirir.

2006-cı ilin aprel ayında Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin Sərəncamı ilə AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, fizika-riyaziyyat elmlər doktoru, professor **Yusif Əbülfət oğlu Məmmədov** Azərbaycan Dövlət Pedaqoji Universitetinə rektor vəzifəsinə təyin edildi. Keyfiyyətli kadr hazırlığı onun fəaliyyətinin əsas istiqamətlərindən birinə, «Bilik yeganə meyardır» – devizi universitet tələbələrinin həyat kredosuna çevrildi.





***Yusif Əbülfət oğlu Məmmədov*** *24 yanvar 1950-ci ildə Qərbi Azərbaycanın Sisiyan rayonunun Dəstəgird qəsəbəsində anadan olmuşdur. 1966-cı ildə orta məktəbi «Qızıl medal»la bitirərək Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) Mexanika-riyaziyyat fakültəsinə daxil olmuş, universiteti əla qiymətlərlə bitirdikdən sonra 1971-ci ildə təyinatla ADU-nun Riyazi-fizika tənlikləri kafedrasında saxlanılmış, bu kafedrada assistentdən professor vəzifəsinədək yüksəlmişdir. 1993-cü ildə həmin kafedranın müdiri vəzifəsinə seçilmişdir. 2000–2004-cü illərdə BDU-nun Tətbiqi riyaziyyat və kibernetika fakültəsinin dekanı, 2004–2006-cı illərdə BDU-nun I prorektoru – Elmi işlər üzrə prorektoru vəzifələrində çalışmışdır.*

*2006-cı il aprelin 21-də isə Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin sərəncamı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektoru vəzifəsinə təyin edilmişdir. 1974-cü ildə namizədlik, 1990-cı ildə isə doktorluq dissertasiyası müdafiə etmişdir, fizika-riyaziyyat elmləri doktorudur.*

*O, 2000-ci ildə UNESCO-nun «Bioetika elmi biliklərin və texnologiyaların etikası» Azərbaycan Milli Komitəsinin üzvü seçilmişdir.*

*2000-ci ildə ulu öndər Heydər Əliyevin sərəncamı ilə «Əməkdar elm xadimi» fəxri adına layiq görülmüş, 2001-ci ildə Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü seçilmişdir. 2010-cu ildə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamı ilə «Şöhrət» ordeni ilə təltif edilmişdir.*

*Riyaziyyatçıdır, riyazi-fizika və diferensial tənliklər sahəsində tanınmış mütəxəssisdir. O, adi və xüsusi törəməli diferensial tənliklər nəzəriyyəsinin digər sahələrində bir sıra mühüm nəticələr əldə etmiş, adi diferensial operatorların rasional dəstəsi üçün requlyarlıq, sanki requlyarlıq, normallıq şərtlərini tapmış, məxsusi ədədlərin paylanması, məxsusi elementlər üzrə çoxqat ayrılış düsturunu vermişdir. Birölçülü qarışıq məsələlərin korrektivliyi üçün cəbri meyar tapmış, müstəvidə sonlu limit nöqtəsi olan məxsusi ədədlər çoxluğuna malik Sobolev-Qalperen tipli tənliklər üçün qarışıq məsələyə çıxıqlar üsulunun tətbiqini əsaslandırmışdır. Kompleks sıxlıq funksiyalı Şturm-Liuvill operatorunun məxsusi ədədlərinin asimptotik göstərişi ilk dəfə olaraq onun tərəfindən tapılmışdır. Ali Attestasiya Komissiyasında riyaziyyat elmləri üzrə ekspert komissiyasının sədri olmuşdur. Professor Y.Ə.Məmmədov Azərbaycan, Rusiya, Gürcüstan, ABŞ, Tacikistan, Belarus, Türkiyə, İran və digər ölkələrdə çap edilmiş 100-dən artıq elmi əsərin müəllifidir. Əsərlərinin xeyli hissəsi xarici ölkələrin nüfuzlu jurnallarında çap olunmuşdur. 14 nəfər elmlər namizədi, 1 nəfər elmlər doktoru yetişdirmişdir.*

Tədris işləri üzrə prorektor vəzifəsində 1996-cı ildən fizika-riyaziyyat elmləri doktoru, professor, Əməkdar müəllim **Məlikməmməd Saday oğlu Cəbrayılov** çalışır.



***Məlikməmməd Saday oğlu Cəbrayılov*** *15 may 1945-ci ildə Hacıqabul rayonunun Qızılburun kəndində anadan olmuşdur. 1967-ci ildə V.İ.Lenin adına APİ-nin Riyaziyyat fakültəsinin Lenin təqaüdçüsü olmuş və institutu fərqlənmə diplomu ilə bitirmişdir. 1966–70-ci illərdə institutun komsomol komitəsinin katibi olmuşdur.*

*1967-ci ildə institut Elmi şurasının qərarı ilə Riyazi analiz kafedrasında müəllim vəzifəsində saxlanılmışdır. O, müəllimlikdən professorluğadək şərəfli bir yol keçmişdir. 1991-ci ildən kafedranın professoru, 1998–2011-ci illərdə riyazi analiz kafedrasının müdiri olmuşdur.*

*1974-cü ildə «Çoxdəyişənli diferensiallanan funksiyalar nəzəriyyəsinin bəzi məsələləri» adlı namizədlik dissertasiyası, 1998-ci ildə isə «Vektor qiymətli diferensiallanan funksiyalar fəzalarında daxil olma teoremləri və onların diferensial-operator tənliklərə tətbiqi» mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir.*

*100-dən artıq elmi əsəri, 1 monoqrafiya və 12 tədris vəsaiti çap olunmuşdur.*

*Moskva, Kiyev, Odessa, Saratov, Teberda, Kaluqa şəhərlərindəki beynəlxalq konfranslarda məruzələrlə çıxış etmişdir. Məqalələri Rusiyanın, Ukraynanın nüfuzlu riyaziyyat jurnallarında çap olunmuşdur.*

*Prof. M.Cəbrayılov yüksəkixtisaslı kadrlar hazırlanması sahəsində də fəaliyyət göstərir. 4 aspirantı müvəffəqiyyətlə namizədlik dissertasiyası müdafiə etmişdir. Riyaziyyat institutunda AMEA müdafiə şuralarınının üzvü olmuşdur. Riyazi analiz kafedrasında fəaliyyət göstərən Elmi seminarın rəhbəridir.*

*Moskva Pedaqoji Dövlət Universitetinin əməkdaşları ilə birlikdə yazdığı «Riyazi analiz» (rus dilində) dərs vəsaiti Moskvada nəşr olunmuşdur. Rusiya pedaqoji Ali məktəbləri üçün dərslik kimi tövsiyə olunmuşdur. 1974–89-cu illərdə Riyaziyyat fakültəsində dekan müavini, 1989–92-ci, 1994–96-cı illərdə ADPU-nun qiyabi təhsil üzrə prorektoru, 1996-cı ildən bu günədək tədris işləri üzrə prorektordur. O, riyaziyyatın aktual məsələləri ilə yanaşı, ali təhsilin problemləri ilə də məşğul olur. Dəfələrlə Respublika Təhsil Nazirliyinin təhsil islahatı ilə məşğul olan komissiyalarının üzvü və işçi qruplarının rəhbəri olmuşdur. Pedaqoji fəaliyyətinə görə Beynəlxalq Pedaqoji Təhsil Elmləri Akademiyasının müxbir üzvü seçilmişdir.*

*M.Cəbrayılov «Metrik və normalı fəzalar» (dərs vəsaiti, 2004), «Riyazi analiz. I, II hissə» rus dilində (2005, 2006), «Ədədi üsullardan mühazirələr» (1991), «Riyazi analiz (birdəyişənli funksiyaların diferensial hesabı)» (2006) və s. adlı kitabların müəllifidir.*

Elmi işlər üzrə prorektor vəzifəsində 1997-ci ildən filologiya elmləri doktoru, professor, Əməkdar müəllim **Vilayət Hüseyn oğlu Əliyev** çalışır.



***Vilayət Hüseyn oğlu Əliyev*** *1938-ci il avqust ayının 23-də Şəki rayonunun Daşbulaq kəndində anadan olmuşdur. Ailəsi dəfələrlə repressiyaya məruz qalmışdır.*

*1962-ci ildə Bakı Dövlət Universitetinin Filologiya fakültəsini bitirmiş, elə həmin ildə Azərbaycan EA-nın Nəsimi adına Dilçilik İnstitutunun «Türkologiya» ixtisası üzrə aspiranturasına daxil olmuşdur. Tanınmış türkoloq, akademik Məmmədağa Şirəliyev Azərbaycan və özbək dillərinin müqayisəli qrammatikası üzrə mövzu müəyyənləşdirmiş və gənc tədqiqatçıya görkəmli türkoloq, akademik Qəni Əbdürrəhmanovu elmi rəhbər məsləhət bilmişdir. Elmi axtarışlar onu Daşkənd şəhərinə gətirmiş, türk dünyası ilə yaxından tanış olmağa, özbək dilini öyrənməyə imkan yaratmışdır. Daşkənd şəhərində çalışarkən tanınmış eloğlumuz, şair, dramaturq, professor Maqsud Şeyxzadə ilə yaxından tanış olmuşdur. Sonralar onun ikicildlik bədii irsinin Azərbaycan dilinə tərcüməsində fəal iştirak etmişdir. Bu dostluq və Özbəkistandakı türk mühiti onun bir şəxsiyyət kimi yetişməsinə təkan vermiş və gənc tədqiqatçını türkçülük, azərbaycançılıq ideyaları ilə zənginləşdirmişdir.*

*1965-ci ildə Daşkənd şəhərində «Özbək və Azərbaycan dillərində feli sifət» mövzusunda namizədlik, 1990-cı ildə isə Bakıda «Azərbaycan dilində felin təsriflənməyən formaları» mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir.*

*1960-cı illərdən dilçilik sahəsində fəaliyyət göstərir. Elmi tədqiqatları Azərbaycan dilçiliyi və türkologiya ilə bağlıdır. 200-dən çox elmi məqalənin, «Azərbaycan dilində felin təsriflənməyən formaları», «Məsdər», «Azərbaycan dilində feli sifət», «Azərbaycan dilində feli bağlama», «Azərbaycan dilində felin perifrastik formaları», «Toponimika», «Azərbaycan toponimiyası», «H.Əliyevin dil siyasəti», «Zəngəzurda qalan izimiz» kimi kitabların müəllifidir.*

*1997-ci ildən ADPU-nun elmi işlər üzrə prorektorudur. Azərbaycan MEA-nın Dilçilik İnstitutunun nəzdində fəaliyyət göstərən Azərbaycan Respublikası Təhsil Nazirliyi və Azərbaycan MEA-nın Birləşmiş İxtisaslaşdırılmış Müdafiə Şurasının həmsədridir.*

*1999-cu ilin iyun ayında Türkiyədə keçirilən türk dövlətləri və topluluqlarının VII qurultayının nümayəndəsi olmuşdur. Dəfələrlə Azərbaycanda və digər ölkələrdə keçirilmiş elmi konfranslarda iştirak etmişdir.*

*YAP-ın əsasını qoyan – «91» vətənpərvər ziyalıdan biridir. YAP Siyasi Şurasının və Azərbaycan Dövlət Dil Komissiyasının üzvüdür.*

2005-ci ildə ADPU-da ümumi işlər üzrə prorektor vəzifəsi təsis olunmuş, həmin vəzifəyə Təhsil Nazirliyinin Kollegiyasının qərarı ilə fizika-

riyaziyyat elmləri namizədi, dosent **Vüqar Abdulla oğlu Mehrabov** təyin edilmişdir.



***Vüqar Abdulla oğlu Mehrabov*** *1969-cu il avqustun 27-də Bakı şəhərində anadan olmuşdur.*

*1986-cı ildə Bakı şəhərindəki 20 saylı orta məktəbi «Qızıl medal»la bitirmişdir. 1985 və 1986-cı illərdə respublika məktəblilərinin riyaziyyat üzrə olimpiadasında I yer, 1986-cı ildə SSRİ məktəblilərinin riyaziyyat üzrə olimpiadasında isə IV yeri tutmuş, həmin il SSRİ EA-nın «Kvant» jurnalının qalibi olmuşdur.*

*1986–92-ci illərdə Bakı Dövlət Universitetinin Mexanika-riyaziyyat fakültəsində əyani təhsil almış, universiteti «fərqlənmə diplomu» ilə bitirmiş və 1992–95-ci illərdə BDU-nin aspiranturasında oxumuşdur. 1995-ci ildə EA-nın Riyaziyyat və Mexanika İnstitutundakı Elmi Şurada «Pauli operatorunun məxsusi ədədləri üçün asimptotik düsturlar» mövzusunda namizədlik dissertasiyası müdafiə etmiş və həmin il təsdiqini almışdır. 2003-cü ildə Ali Attestasiya Komitəsinin qərarı ilə ona dosent adı verilmişdir.*

*1995-ci ildən Bakı Dövlət Universitetinin Riyazi analiz kafedrasında müəllim, baş müəllim və dosent vəzifələrində işləmişdir.*

*2005-ci ildə Təhsil Nazirliyinin Kollegiyasının qərarı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinə ümumi işlər üzrə prorektor vəzifəsinə təyin olunmuşdur.*

*Elmi-pedaqoji işlərlə yanaşı, elmi-tədqiqat işləri də aparmışdır. Onun 6 dərs vəsaiti və monoqrafiyası, 20-dən artıq elmi məqaləsi vardır. Bunlardan bir neçəsini göstərmək olar: «Ümumiləşmiş funksiyalar» (1998), «О спектре периодического оператора Паули в параллелограмме (Гипотеза Бете-Зоммерфельда)» (2000), «Асимптотические формулы порядка O (1) для собственных значений периодического оператора Паули в параллелепипеде» (2003), «Трехмерный периодический оператор Паули. Асимптотические формулы высокого порядка» (2004), «Riyazi analiz» (2011, həmmüəllifliklə).*

*Vüqar Mehrabov 2012-ci ildən Azərbaycan Dövlət Pedaqoji Universitetində elmlər doktoru proqramı üzrə doktorantdır. O, «Pauli tipli operatorların spektral xassələri» mövzusunda doktorluq dissertasiyası üzərində çalışır.*

2010-cu ildə Təhsil Nazirliyinin Kollegiyasının qərarı ilə Azərbaycan Dövlət Pedaqoji Universitetində beynəlxalq əlaqələr üzrə prorektor vəzifəsi təsis olundu. Həmin vəzifəyə hüquq elmləri üzrə fəlsəfə doktoru **Abdullayev Mehdi Kamal oğlu** təyin edildi.



***Mehdi Kamal oğlu Abdullayev** 26 iyul 1980-ci ildə Bakı şəhərində anadan olmuşdur. Bakı Dövlət Universitetinin Hüquq fakültəsini və Dövlət Dillər Universitetinin Tərcümə fakültəsini fərqlənmə diplomu ilə bitirmişdir. Ədliyyə Nazirliyinin Hüquqi Şəxslərin Dövlət Qeydiyyatı İdarəsində aparıcı mütəxəssis və İstintaq İdarəsində müstəntiq işləmişdir. Daha sonra Milli Elmlər Akademiyasının İnsan Hüquqları İnstitutunda çalışmışdır. Müxtəlif illərdə Prezident Yanında Dövlət İdarəçilik Akademiyasında müəllim, baş müəllim, dekan müavini kimi vəzifələrdə çalışmışdır. 2005-ci ildə «Cinayət prosesində insan hüquqlarının müdafiəsi: Avropa Şurasının standartları və Azərbaycan Respublikasının qanunvericiliyi» mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir. 2009-cu ildə Azərbaycan Müəllimlər İnstitutunun beynəlxalq əlaqələr üzrə prorektoru vəzifəsinə təyin olunmuşdur. 5 iyun 2009-cu ildə «Dağlıq Qarabağ Bölgəsinin Azərbaycanlı İcması» İctimai Birliyinin qurultayında İcmanın Əlaqələndirmə Şurasının sədri seçilmişdir. 2010-cu ilin aprel ayında beynəlxalq əlaqələr üzrə prorektor vəzifəsinə təyin olunub. Bir sıra elmi məqalələrin, tədris vəsaitlərinin, proqramların və elmi monoqrafiyanın müəllifidir.*

Uzun müddətdir ki, tərbiyə işləri üzrə prorektor vəzifəsində professor **Rafiq Məmmədbağır oğlu Baxşəliyev** çalışır.



***Rafiq Məmmədbağır oğlu Baxşəliyev** 1939-cu il mayın 31-də Qərbi Azərbaycanın İrəvan şəhərində anadan olub. O, ADPU-nun tərbiyə işləri üzrə prorektoru, professor, SSRİ ali məktəb əlaçısı, Əməkdar məşqçi, Beynəlxalq dərəcəli hakimdir.*

*1948-ci ildə Ermənistandan deportasiya olunanda ailəsi ilə birlikdə Gəncə şəhərinə gəlmiş, 1958-ci ildə orada orta məktəbi bitirmiş və həmin il Azərbaycan Dövlət Pedaqoji İnstitutuna daxil olmuşdur.*

*1966–73-cü illərdə Bakı Dövlət Universitetində dosent, 1973–1981-ci illərdə Xarici Dillər Universitetində kafedra müdiri vəzifəsində işləyib.*

*1981-ci ildən hal-hazıra kimi ADPU-da işləyir. 1972-ci ildə namizədlik dissertasiyası müdafiə etmiş, 1973-cü ildə dosent, 2003-cü ildə professor elmi adı almışdır. R.Baxşəliyev 20 ildən artıq «İbtidai hərbi və fiziki təlim» fakültəsinin dekanı vəzifəsində çalışmışdır.*

*Onun 60-a yaxın elmi məqaləsi, 15 dərs vəsaiti və monoqrafiyası vardır. İndiyə kimi onun «Pedaqoji institutlarda boksun öyrədilməsi», «İbtidai siniflər üçün mütəhərrik oyunlar», «İdman məşqinin fizioloji əsasları» , «Физиологические основы физических и военно-производных упражнений», «Fiziki və hərbi-tətbiqi təlimlərin fizioloji əsasları», «Gənclərin hərbi hazırlığının formalaşmasında hərbi-tətbiqi təlimlərin fizioloji əsasları və onun tədrisi metodikası», «İbtidai-hərbi hazırlıq və fiziki tərbiyə» adlı əsərləri nəşr olunmuşdur.*

İnzibati təsərrüfat işləri üzrə prorektor vəzifəsinə 2006-cı ildə **Səfər Əhli oğlu Hüseynov** təyin olunmuşdur.



***Səfər Əhli oğlu Hüseynov*** *1965-ci il avqust ayının 1-də İmişli rayonunun Muradxanlı kəndində anadan olmuşdur. 1989-cu ildə Azərbaycan Mühəndis İnşaat İnstitutunu bitirərək, «Bakıbaştikinti»nin Sənayeləşdirilmiş Evtikmə İstehsalat Birliyində mühəndis kimi fəaliyyətə başlamışdır.*

*1991–92-ci illərdə Bakı şəhər Sovetinin Əsaslı Tikinti İdarəsində şöbə rəisi, 1992–95-ci illərdə «Bakıbaştikinti»nin Əsaslı Tikinti İdarəsində şöbə rəisi, 1995–2000-ci illərdə Nazirlər Kabinetinin TDLMTB-nin 5 saylı İxtisaslaşdırılmış Təmir-Tikinti İdarəsinin rəisi işləmişdir.*

*2000-ci ildən «İnşaatçı–2000» şirkətinin direktoru işləyir.*

*1997-ci ildə Bakı Dövlət Universitetinin Hüquq fakültəsinin hüquqşünaslıq ixtisasının qiyabi şöbəsinə (2-ci ali təhsil) daxil olmuş və 2001-ci ildə bitirmişdir.*

*1998–2001-ci illərdə TDLMTB-nin mərkəzi aparatında əvəzçilik üzrə hüquqşünas işləmişdir.*

*2001–2005-ci illərdə Sumqayıt Dövlət Universitetinin «Hüquq və sosiologiya» kafedrasında müəllim işləmişdir. 2010-cu ildə texnika elmləri üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün dissertasiya müdafiə etmişdir.*

Universitetin maliyyə-təchizat sisteminin nizama salınmasında və əməli fəaliyyətində mühasibat kollektivi (baş mühasib **Nəsrəddin Musayev**) böyük əmək sərf edir. Universitetin tədris-metodiki işlərinin təşkili və tədris yüklərinin normativ sənədlərə uyğun tərtib edilməsini tədris hissəsi (müdir dos. **Namiq Hacıyev**), qanunçuluğun gözlənilməsi, tələbələrin və əməkdaşların hüquqlarının qorunmasını baş hüquqşünas (**Zakir Nağıyev**) həyata keçirir. Universitetimizdə sənədlərin qəbulu, qeydiyyatı, sistemləşdirilməsində dəftərxana (müdir **Xuraman Əliyeva**), təhsil müəssisəsində çalışan kadrların sənədlərinin təlimata müvafiq tərtibi və saxlanılmasında kadrlar şöbəsi (müdir **Nigar Rəhimova**), sənədlərin mühafizəsində arxiv (müdir **Gülnarə Məmmədova**) cavabdehlik daşıyır.

## 2.6.1. ELMİ ŞURA

Elmi şura universitetimizin ali idarəetmə orqanıdır. Azərbaycan Respublikası Təhsil Nazirliyinin 10 noyabr 1997-ci il tarixli 792 saylı əmri ilə təsdiq olunmuş «Ali təhsil müəssisəsinin Elmi Şurası haqqında Əsasnamə»yə uyğun olaraq təşkil edilən Elmi şura ali kollegial orqan kimi universitetimizin elmi-pedaqoji, maliyyə-təsərrüfat fəaliyyətini tənzimləyir. Hazırda fəaliyyət göstərən Elmi şuraya rektorun 19 mart 2010-cu il 3/71 saylı əmrinə əsasən seçkilər keçirilmiş, Elmi Şuranın tərkibi Təhsil Nazirliyinin 12 iyun 2010-cu il tarixli 786 saylı əmri ilə təsdiq edilmişdir. Elmi şuranın 81 üzvü var ki, onlardan da 1 nəfəri Rusiya Təhsil Akademiyasının həqiqi üzvü, 2 nəfəri AMEA-nın müxbir üzvü, 39 nəfəri professor, 35 nəfəri dosentdir. Elmi şuranın sədri AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, fizika-riyaziyyat elmlər doktoru, professor Yusif Məmmədov, katib dos. Laçın Həsənovadır. Mövcud əsasnaməyə uyğun olaraq Elmi şuranın tərkibində 3 komissiya: təhsil və elm (prof. Ə.Əlizadə (sədr), prof. H.Əhmədov, prof. V.Əliyev, prof. H.Mirzəyev, prof. S.Həmidov, prof. H.Qasımov, prof. M.Balayev, prof. Ə.Qurbanov), sosial-iqtisadi komissiya (prof. Ə.Allahverdiyev (sədr), prof. N.Verdizadə, prof. T.Feyzullayeva, prof. Ə.Məmmədov, dos. L.Vəzirova), təsərrüfat fəaliyyəti (dos. S.Atayev, dos. S.Musayeva, A.Hüseynov, Ə.Şərifov) fəaliyyət göstərir. Son illərdə universitetimizdə həyata keçirilən genişmiqyaslı islahatların sistemli xarakter almasında, təhsilin məzmununun və tədris prosesinin təkmilləşdirilməsində, pedaqoji kadr hazırlığının Avropa standartlarına uyğunlaşdırılmasında, tələbə nailiyyətlərinin qiymətləndirilməsində yeni mexanizmin tətbiqində, elmi-tədqiqat işlərinin yeni istiqamət almasında, xarici ölkə universitetləri ilə əlaqələrin qurulmasında və inteqrasiyasında, universitet əməkdaşlarının sosial müdafiəsinin gücləndirilməsində, tələbə qəbulu planının müəyyən edilməsində, adlı təqaüdlərin təsis edilməsində, yeni elmi strukturların yaradılmasında, maddi-texniki bazanın yaxşılaşdırılmasında, tədris-metodika elmi fəaliyyətin keyfiyyətinin yüksəldilməsində Elmi Şurada qəbul edilən qərarlar əhəmiyyətli rol oynamışdır.

2007–2008-ci tədris ilində elmi şuranın iclaslarında 13 doktorluq, 28 fəlsəfə doktoru dissertasiyasının mövzusu təsdiq edilmiş, 14 dissertasiya mövzusunun adının dəyişdirilməsi barədə qərar qəbul edilmiş, 10 nəfərin dosent

vəzifəsini tutması üçün AAK qarşısında vəsadət qaldırılmışdır. 19 nəfər professor, 16 nəfər kafedra müdiri vəzifəsinə seçilmişdir.

2008–2009-cu tədris ilində 4 doktorluq, 26 fəlsəfə doktoru dissertasiyasının mövzusu təsdiq edilmiş, 5 dissertasiya mövzusunun adının dəyişdirilməsi barədə qərar qəbul edilmişdir. 19 nəfərin dosent, 6 nəfərin professor vəzifəsini tutması üçün AAK qarşısında vəsadət qaldırılmışdır. Vəzifə müddəti bitmiş 9 professor yenidən öz vəzifəsinə seçilmişdir.

2009–2011-ci tədris illərində isə 18 nəfər dosent, 12 nəfər professor, 3 nəfər laboratoriya müdiri vəzifələrinə seçilmişdir.

Elmi şuranın 2007-ci 11 may tarixli iclasının qərarı ilə Hacəttəpə Universitetinin rektoru, prof. Tumcal Özgen universitetin fəxri doktoru adına, həmin universitetin Pedaqoji fakültəsinin dekanı Buket Akkoyunlu universitetin fəxri diplomuna layiq görülmüşdür.

Elmi şuranın 2008-ci il 25 dekabr tarixli iclasında ADPU ilə Süleyman Dəmirəl adına İsparta Universiteti arasında münasibətlərin daha da dərinləşdirilməsi təşəbbüsü dəstəklənmiş, universitetlərə «Qardaşlaşmış universitetlər» statusunun verilməsi qərara alınmışdır.

Elmi şuranın 2009-cu il 2 oktyabr tarixli iclasında Türkiyənin Mehmet Akif Ersoy Universiteti, 31 may 2011-ci il tarixli iclasında Rumıniyanın Babeş Bolyai Universiteti ilə ADPU arasında əməkdaşlıq haqqında müqavilə imzalanmışdır.

Elmi şuranın fəaliyyətində ən mühüm istiqamətlərdən biri universitetin yeni Nizamnaməsinin qəbul olunmasıdır. Bu Nizamnamə universitetin fəaliyyəti ilə bağlı bütün məsələlərin qanunauyğun şəkildə tənzimlənməsinə imkan yaradır. Universitetimizdə elmi-pedaqoji fəaliyyəti stimullaşdırmaq, tədris işinin səviyyəsini və keyfiyyətini yüksəltmək, müəllimlərin pedaqoji işə yaradıcı münasibətini gücləndirmək məqsədilə Elmi Şuranın 2007-ci il 23 aprel tarixli iclasının qərarı ilə «İlin müəllimi» və «İlin alimi» layihələri üzrə müsabiqə elan olunmuş, müsabiqənin nəticələri təhlil edilərək qaliblər müəyyən edilmiş və onlar müvafiq şəkildə mükafatlandırılmışlar. «İlin müəllimi» müsabiqəsi 3 nominasiya (dəqiq və təbiət elmləri, humanitar elmlər, pedaqogika və metodika), «İlin alimi» müsabiqəsi isə 2 nominasiya (təbiət elmləri, humanitar elmlər) üzrə keçirilir. 2008–2011-ci illərdə «İlin alimi» müsabiqəsi üzrə 36 nəfər, 2007–2010-cu illərdə «İlin müəllimi» müsabiqəsi üzrə 27 nəfər mükafatlandırılmışdır.






*Elmi şuranın iclası*

## 2.6.2. İXTİSASLAŞDIRILMIŞ MÜDAFİƏ ŞURALARI

Elmi potensialın formalaşmasında Universitetimizdə fəaliyyət göstərən ixtisaslaşdırılmış Dissertasiya Şurası mühüm rol oynayır. ADPU-da ixtisaslaşdırılmış Müdafiə Şuraları yaranana kimi dissertasiyalar Böyük Elmi Şurada müdafiə olunurdu. 60-cı illərdən sonra SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyinin müvafiq əmri ilə universitetimizdə ayrı-ayrı ixtisaslar üzrə Müdafiə Şuraları təşkil edilmişdir. «Pedaqogikanın tarixi və nəzəriyyəsi və fənlərin tədrisi metodikası» ixtisası üzrə yaranan Müdafiə Şurası daha çox və uzun müddətli fəaliyyət göstərən şuralardan olmuşdur.

1998–2005-ci illərdə universitetimizdə «Pedaqogika və fənlərin tədrisi metodikası» ixtisası üzrə Müdafiə Şurası (sədr prof. Bəhlul Ağayev) fəaliyyət göstərmişdir. Hazırda universitetdə fəaliyyət göstərən fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim olunan dissertasiyaların müdafiəsini keçirən FD.02.061 dissertasiya şurası (sədr AMEA-nın müxbir üzvü, prof. Y.Ə.Məmmədov) Azərbaycan Respublikasının Prezidenti yanında Ali Attestasiya Komissiyasının 28 aprel 2009-cu il tarixli əmri ilə təsdiq edilmişdir. Dissertasiya şurasına müdafiə üçün aşağıdakı ixtisaslar üzrə dissertasiyaların qəbul edilməsinə icazə verilmişdir: 1) Ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi (13.00.01); 2) Təlim və tərbiyənin nəzəriyyəsi və metodikası (riyaziyyatın tədrisi metodikası, fizikanın tədrisi metodikası, biologiyanın tədrisi metodikası, tarixin tədrisi metodikası, Azərbaycan dilinin tədrisi metodikası, ədəbiyyatın tədrisi metodikası). 2010-cu ilin dekabr ayının sonuna kimi fəaliyyət göstərən müdafiə şurasında 34, o cümlədən 4 doktorluq işi müdafiə olunmuşdur. «Ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi» – ixtisası üzrə elmi dərəcə almaq üçün 22, «Təlim və tərbiyənin nəzəriyyəsi və metodikası» ixtisası üzrə elmi dərəcə almaq üçün 12 dissertasiya müdafiə olunmuşdur.

12 yanvar 2011-ci ildə ADPU-nun nəzdində fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim olunan dissertasiyaların müdafiəsini keçirən FD.02.061 dissertasiya şurasının tərkibi aşağıdakı kimi təsdiq olunmuşdur: AMEA-nın müxbir üzvü, prof. Yusif Məmmədov (sədr), prof. Fərrux Rüstəmov (sədr müavini), dos. Yaqut Rzayeva (elmi katib), prof. Hüseyn Əhmədov (üzv), prof. Məlikməmməd Cəbrayılov (üzv), prof. Mirzəli Murquzov (üzv), prof. Əjdər Ağayev (üzv), prof. Nadir Abdullayev (üzv), prof. İbrahim Bayramov (üzv), prof. Yusif Əhmədov (üzv), p.e.d. Mübariz Əmirov (üzv), prof. Seyidağa Hə-



*Müdafiə Şurasının iclasında*

midov (üzv), prof. Əli Hüseynov (üzv), prof. Rüfət Hüseynzadə (üzv), prof. Zahid Xəlilov (üzv), prof. Əmrulla Paşayev (üzv), prof. Əzizxan Tanrıverdiyev (üzv), prof. Məmməd Qarayev (üzv), prof. Elşad Qurbanov (üzv), prof. İramin İsayev (üzv), dos. Əsab Quliyev (üzv), dos. Nazir Əsədov (üzv), dos. Həqiqət Hacıyeva (üzv), dos. Ənvər Abbasov (üzv) və dos. Dəyanət Musayev (üzv). Dissertasiya şurasına təqdim olunan 95 dissertasiya işindən (4 doktorluq dissertasiyası) 24-ü artıq müdafiə olunmuşdur.



*ADPU-nun kollektivi Fəxri Xiyabanda*



*ADPU-nun kollektivi Şəhidlər Xiyabanında*




*ADPU-da azərbaycanlıların soyqırımına həsr olunmuş tədbir*




*ADPU-da 20 Yanvar faciəsinə həsr olunmuş tədbir*



*ADPU-da Ulu öndər Heydər Əliyevin xatirəsinə həsr olunmuş tədbir*




*Səbail rayon İcra Hakimiyyətində tədbir zamanı*





*ADPU-nun nümayəndə heyəti Suraxanı rayonundakı Heydər Əliyev Mərkəzində keçirilən «Heydər Əliyev: Uğurlu zirvələrə doğru» elmi-praktik konfransı zamanı*





*ADPU-da «Boloniya prosesində ali təhsildə keyfiyyətin idarə olunması» mövzusunda Beynəlxalq elmi-praktik konfrans*







*ADPU-da Ulu öndər Heydər Əliyevin anadan olmasının 84-cü ildönümünə həsr olunmuş «Müəllim hazırlama siyasəti və problemləri» mövzusunda Beynəlxalq elmi konfrans*



*ADPU-da görkəmli alim və yazıçı Mir Cəlal Paşayevin anadan olmasının 100 illiyinə həsr olunmuş tədbir*



*ADPU-da görkəmli alim Cəfər Xəndanın anadan olmasının 100 illiyinə həsr olunmuş tədbir*



ADPU-da Cəfər Xəndan adına auditoriyanın açılışında




ADPU-da akademik Zərifə Budaqovanın anadan olmasının
80 illiyinə həsr olunmuş tədbir




*ADPU-da BDU-nun 90 illik yubileyinə həsr olunmuş tədbir*




*ADPU-da BDU nəşrlərinin sərgisi*




*Hacəttəpə Universitetinin rektoru prof. Tuncalp Özgen və fakültə dekanı Buket Akkoyunlu ADPU-da*



*Rumıniyanın Babeş-Bolyai Universiteti ilə əməkdaşlıq müqaviləsi imzalanarkən*





*Rumıniyanın Babeş-Bolyai Universitetinin rektoru*
*prof. A.Marqaya ADPU-nun fəxri doktoru adı verilərkən*



*Rumıniyanın Babeş-Bolyai Universitetinin rektoru prof. A.Marqa ADPU-nun Heydər Əliyev muzeyi ilə tanış olarkən*



*Türkiyə Cümhuriyyəti YÖK-nin başqanı Yusuf Ziya ADPU-da*



*Tacikistanın A.Rudəki adına Kulyab Dövlət Universitetinin rektoru, prof. Nurali Salaxov ADPU-da*



*Türkiyənin Akif Ərsoy Universitetinin rektoru, prof. Gökay Yıldız ADPU-da*



*Tacikistan Respublikasının təhsil işçiləri ADPU-da*



*ADPU-da Gender Təhsili Araşdırma Mərkəzinin açılışında*





*ADPU-da Qırmızı Aypara Cəmiyyəti ilə birgə keçirilən tədbir*

*Xalq şairi Nəriman Həsənzadə ilə görüş zamanı*





*Görkəmli yazıçı Əlibala Hacızadə ilə görüş zamanı*



*Görkəmli yazıçı Çingiz Abdullayevlə görüş zamanı*




*Olimpiada qalibləri Elmi Şurada*



*Tələbə Elmi Cəmiyyətinin üzvləri elmi-praktik konfransdan sonra*



*Olimpiada qalibləri rektorluqda*



*ADPU-da Novruz bayramına həsr olunmuş tədbir*



*ADPU-da məzun günü*

## 3.1. TARİX FAKÜLTƏSİ



*Dekan*
*prof. Oqtay Sultanov*

Azərbaycan Pedaqoji İnstitutu təşkil olunduqdan az sonra 1922-ci ilin sentyabrında institutda «Tarix-ictimaiyyat» şöbəsi yaradıldı. 1925–1926-cı tədris ilində artıq institutda tarix-ədəbiyyat şöbəsi fəaliyyət göstərirdi. Həmin tədris ilinin əvvəlində bu şöbə iki müstəqil şöbəyə ayrıldı. Tarix şöbəsinin dekanı vəzifəsinə professor Əziz Übeydulin (1922–1927) təyin edildi. 1923–1924-cü tədris ilində şöbənin nəzdində «Tarix və etnoqrafiya» muzeyi təşkil edildi. 1926–27-ci tədris ilində institutu bitirən tələbələrin 16 nəfəri tarix-ictimaiyyat şöbəsinin məzunları idilər.

1930-cu ildə Pedaqoji İnstitut müstəqil ali məktəb kimi yenidən fəaliyyətə başlayanda «Tarix-ədəbiyyat» şöbəsi yenidən təşkil edildi. Az sonra həmin şöbənin bazasında eyniadlı fakültə yaradıldı. Həmin vaxtlar fakültədə işləyən gənc tarixçilər Həsi Abdullayev, Məhəmməd Bayramov, Həmzə Qasımzadə tariximizin müvafiq dövrlərinin tədqiqində, tarix elminin inkişafında, tarixçi kadrların hazırlanmasında böyük xidmətlər göstərdilər.

Kütləvi repressiyalar dövründə (1937–38) fakültənin görkəmli tarixçi alimləri professorlar B.N.Tixomirov (fakültənin dekanı), Ə.Übeydulin, A.S.Bukşpan, V.M.Xuluflu, P.P.Fridolin, dosentlər M.Bayramov, Ə.Salamzadə, H.Qasımzadə və onlarla başqaları qurbanlar arasında idilər.

Müharibə ərəfəsində fakültənin dekanı vəzifəsinə Səlimə Əfəndiyeva (1938–1941) təyin edilmişdi. Bu illərdə tarixçilərimiz xeyli elmi uğurlar əldə etdilər. 1946-cı ildə Ümumi tarix kafedrasının müdiri dos. Ə.S.Sumbatzadə, (1947) Azərbaycan tarixi kafedrasının müdiri İsmayıl Hüseynov, Zülfəli İbrahimov (1948) Moskva Dövlət Universitetinin Elmi Şurasında doktorluq dissertasiyası müdafiə etdilər.

50-ci illərdə Tarix fakültəsini 373 azərbaycanlı, 32 nəfər rus, 87 nəfər müxtəlif xalqlardan olan tələbə bitirdi.1957-ci ildə 5 illik təhsil sisteminə keçidlə əlaqədar olaraq Tarix və Filologiya fakültələri birləşdirildi. Birləş-



*Tarix fakültəsinin elmi şurasının iclasında*

miş fakültəyə rəhbərlik dos. A.Hüseynova, az sonra dos. Ş.Sadıxova tapşırıldı.

5 illik təhsil müddətində tələbələrin bir neçə ixtisasa yiyələnməsi təcrübəsi tədrisin keyfiyyətinə və kadrların hazırlanması işinə mənfi təsir göstərirdi. Yol verilən nöqsanları aradan qaldırmaq məqsədilə Respublika hökuməti 11 iyun 1963-cü ildə «Ali və orta ixtisas təhsilini daha da inkişaf etdirmək, mütəxəssislərin hazırlanmasını və onlardan istifadə edilməsini yaxşılaşdırmaq tədbirləri haqqında» qərar qəbul etdi. Həmin qərarda ali pedaqoji məktəblərdə ümumtəhsil məktəbləri üçün yüksəkixtisaslı tarix müəllimlərinin hazırlanması vəzifəsi irəli sürüldü.

Təhsil müddəti yenidən 4 ilə endirildi. Bununla əlaqədar olaraq 1963–64-cü tədris ilindən Tarix-filologiya fakültəsi iki müstəqil fakültəyə ayrıldı. Tarix fakültəsinə dos. H.Q.Qasımzadə (1963–74) dekan vəzifəsinə seçildi. Sonrakı dövrlərdə prof. Ə.Ş.Şahmirov (1974–1980), prof. Y.B.Yusifov (1981), prof. D.H.Qüdrətov (1981–1995), dosent R.İ.Əliyev (1995–2006) fakültəyə rəhbərlik etdilər. 2007-ci ildən fakültəyə prof. Oqtay Sultanov rəhbərlik edir.

Fakültədə 899 tələbənin (544 əyani, 355 qiyabi) təhsil-tərbiyəsi ilə 104 nəfər professor-müəllim heyəti məşğul olur. Son illərdə fakültədə 28 mono-

qrafiya, 189 məqalə, 64 dərslik, 96 dərs vəsaiti, 93 proqram çap olunmuşdur.

Hazırda fakültədə beş kafedra – Azərbaycan tarixi (kafedra müdiri prof. S.A.Məmmədov), Türk və Şərqi Avropa xalqları tarixi və tarixin metodikası (müdir dos.R.Ə.Əliyev), Ümumi tarix (müdir AMEA-nın müxbir üzvü, professor V.H.Əliyev), Ümumi pedaqogika (kafedra müdiri akademik H.M.Əhmədov), Fəlsəfə (kafedra müdiri prof. M.A.Balayev), İqtisadi və sosial fənlər (kafedra müdiri, prof. Ə.Q.Allahverdiyev) fəaliyyət göstərir.

### 3.1.1. AZƏRBAYCAN TARİXİ KAFEDRASI

1931-ci il sentyabrın 29-da V.İ.Lenin adına APİ-nin rektorluğunun iclasında 28 kafedra təsdiq edildi. Onların sırasında Azərbaycan tarixi kafedrası da vardı. Kafedraya prof. V.Xuluflu rəhbərlik edirdi.

Müstəqil Tarix fakültəsinin yaradılması Azərbaycan tarixi kafedrasının fəaliyyətinə güclü təkan vermiş və tarixçi müəllimlərin yetişməsində, habelə respublikada tarix elminin inkişafında mühüm rol oynamışdır.

Keçmiş SSRİ-də milli respublikaların tarixinin öyrənilməsinə laqeyd münasibət ucbatından Azərbaycan tarixi kafedrasının dərs yükləri tədricən azaldılmış və bir müddətdən sonra kafedra bağlanmışdır.

60-cı illərin sonunda respublikada siyasi rəhbərliyə gələn Heydər Əliyevin təşəbbüsü və şəxsi köməyi nəticəsində APİ-də Azərbaycan tarixi kafedrası yenidən təşkil edildi. Kafedra müdiri vəzifəsinə Əməkdar elm xadimi, professor N.A.Paşayev (1971–1987) seçildi. O, XX əsrin 20-40-cı illərində Azərbaycan mədəniyyəti tarixinin tədqiqi ilə məşğul olmuşdur.

1989-cu ilin əvvəlindən Azərbaycan tarixi kafedrasına Əməkdar elm xadimi, prof. Süleyman Məmmədov rəhbərlik edir. Kafedrada «Azərbaycanın arxeologiyası, etnoqrafiyası, diyarşünaslığı, mənbəşünaslığı, tarixşünaslığı», «Azərbaycan tarixi coğrafiyası», «Tarixi demoqrafiya» kimi fənlər tədris olunur. Son illərdə Azərbaycanın Avropa və Asiya ölkələri ilə əlaqələri tarixi, Azərbaycanın XIX–XX əsr tarixinin aktual problemləri (bakalavr) də tədris planına daxil edilmişdir.

Prof. S.A.Məmmədov Təhsil Nazirliyi nəzdində fəaliyyət göstərən Elmi Metodik şuranın, Ali Attestasiya Komissiyasının Ekspert Şurasının üzvüdür. Onun rəhbərliyi ilə 15 nəfər namizədlik dissertasiyası müdafiə etmişdir. Hazırda 8 nəfər aspirant və dissertant Azərbaycanın orta çağlar

dövrünün müxtəlif istiqamətləri üzrə axtarışlarını davam etdirir. Prof. S.Məmmədov 1976–1986-cı illərdə APİ-də ixtisaslaşdırılmış müdafiə şurasının katibi, BDU-nun Tarix fakültəsinin nəzdində fəaliyyət göstərən Dissertasiya şurasının həmsədri, Təhsil Problemləri İnstitutunun və Tarix İnstitutunun nəzdində fəaliyyət göstərmiş dissertasiya Şuralarının üzvü olmuş, onlarla əsərə rəy vermişdir.

Prof. S.A.Məmmədov mənbəşünas alim olaraq vaxtaşırı rus şərqşünas alimi V.V.Bartoldun xatirəsinə həsr olunmuş regional və beynəlxalq konfranslarda iştirak etmişdir. Onun məqalələri Moskva, Sankt-Peterburq, Tbilisi, İrəvan, Bakı, Suxumi, Kutaisinin akademik nəşrlərində çap olunmuşdur. 10 cildlik ASE-nin və 2 cildlik Naxçıvan ensiklopediyasının (2002, 2005) müəlliflərindən, AMEA-nın nəzarəti ilə hazırlamış AE-nin «Xüsusi cild»inin məsləhətçilərindən biridir. Onun yazıları – «Avropalı səyyahlar Osmanlı imperatorluğu və Azərbaycan haqqında (XIII–XIV yüzillər)» (Ankara, 2000), «Karakoyunlular və Batı Azərbaycan», «Yeni Türkiyə» dərgisi (Ankara, 2001), «Tarixdə erməni terroru (Birinci Dünya müharibəsi illərində)», «Uluslararası türk-erməni ilişkiləri» simpoziumu (İstanbul, 2001), «Kitabi-Dədə Qorqud dastanlarının tarixi-coğrafi arealı», «Türk dünyasına baxışlar» (İstanbul, 2003) toplularında və s. çap olunmuşdur.

S.A.Məmmədov Türk Cəmiyyətlərinin I qurultayında (İstanbul, mart, 1990), 19 Mayıs adına Samsun Universitetində (may, 1991), Osmanlı imperiyasının 700 illiyi ilə əlaqədar beynəlxalq konfransda (oktyabr, 1999) türk soyqırımına həsr edilmiş konfransda (İstanbul, 2002), «Naxçıvan Uluslararası qaynaqlarda» (Naxçıvan, aprel, 2002), «Naxçıvan – 75 ildə», Bakı Atatürk mərkəzinin keçirdiyi türk soyqırımı simpoziumunda («Erməni iddiası: dünən və bu gün») (Bakı, may, 2005) elmi məruzələrlə çıxış etmişdir.

O, 300-ə qədər əsərin, o cümlədən 5 monoqrafiya, ümumtəhsil məktəbləri üçün 15, ali məktəb üçün 5 dərsliyin, 20 fənn proqramının müəllifidir. «XVII əsrin II yarısında – XVIII əsrin I otuzilliyində Azərbaycanın sosial-iqtisadi həyatı və Azərbaycan-erməni münasibətləri» (1977), «Azərbaycan XV– XVIII əsrin I yarısı mənbələrində» (1993), «Erməni mənbələri XVII– XVIII əsr Azərbaycan tarixi haqqında, tarix, arxeologiya, etnoqrafiya» (1982), «Ermənistan azərbaycanlılarının tarixi coğrafiyası (1996) əsərləri xüsusi maraq doğurur. O, «Azərbaycan XV–XVIII əsrin I yarısında» (1981), «Azərbaycan tarixi» (1994), «Ortaq türk tarixi» (Ankara, 1995) və «Qafqaz tarixi» (London, 2006, ingilis dilində) dərsliklərinin müəlliflərindən biri və qrup rəhbəri olmuşdur. Onun şəxsi təşəbbüsü



*Azərbaycan tarixi kafedrasının əməkdaşları*

nəticəsində kafedranın AMEA-nın tarix, şərqşünaslıq, arxeologiya, etnoqrafiya institutları, BDU, Gürcüstanın tarix, etnoqrafiya və arxeologiya institutları, H.Sadasa adına Maxaçqala Tarix, Dil və Ədəbiyyat İnstitutu, Ankara Türk Tarix qurumu, İstanbul Universiteti tarix və ədəbiyyat bölümü ilə sıx əlaqəsi vardır.

S.A.Məmmədovun 1977-ci və 1993-cü illərdə nəşr etdirdiyi iki əsəri Nyu-York konqres kitabxanasının kataloquna düşmüşdür. O, AMEA Tarix İnstitutunun çap etdiyi irihəcmli «İrəvan xanlığı» tarixinin əsas müəlliflərindən biridir (2009, 2010, Azərbaycan, rus, ingilis dilində). 2007-ci ildə ADPU-da keçirilən «İlin müəllimi» müsabiqəsinin qaliblərindən biri olmuşdur. Prof. S.A.Məmmədov Azərbaycanda qədim erməni dili üzrə yeganə mütəxəssisdir. O, həm də Azərbaycan Respublikası Prezidenti yanında «Elmin inkişafı fondu»nun ekspertlərindən biridir. 2006-cı ildən Əməkdar elm xadimidir.

Kafedra əməkdaşları magistratura pilləsində «Azərbaycan epik abidələrinin mənbəşünaslıq problemləri», «Azərbaycan farsdilli qaynaqlarda», «Ağqoyunlu və Səfəvi dövlətlərinin Avropa dövlətləri ilə əlaqələri», «Orta əsr Azərbaycan dövlətçiliyi və idarəolunma sistemi», «Xanlıqlar, sultanlıqlar və Rusiya müstəmləkəçiliyi dövründə Azərbaycanda aqrar mü-

nasibətlər», «X–XII əsrlərdə Azərbaycan-Gürcüstan münasibətləri», «Azərbaycan qədim və orta əsrlər tarixinin tarixşünaslığı», «Azərbaycan qədim və orta əsrlər tarixinin mənbəşünaslığı», «Azərbaycan xalqının etnogenez problemi tarixi ədəbiyyatda», «Azərbaycanda kapitalizmin tarixi problemləri», «Azərbaycan tarixi demoqrafiyası, şəhər tarixi məsələləri», «Azərbaycan xalqının milli-azadlıq hərəkatı», «XIX–XX əsr mədəniyyət tarixi», «Azərbaycan Xalq Cümhuriyyəti», «Ən yeni dövr Azərbaycan tarixinin aktual problemləri», «Azərbaycan müstəqil inkişaf yollarında», «Azərbaycanın yeni və müasir tarixinin tarixşünaslığı», «Azərbaycanın müasir tarixinin mənbəşünaslığı» və digər fənləri tədris edirlər.

Son illərdə kafedrada 5 monoqrafiya, 19 dərslik, 15 dərs vəsaiti, 32 proqram və 98 məqalə nəşr olunmuşdur.

X.S.Köçərlinin «Azərbaycan Xalq Cümhuriyyətinin təhsil, elm və mədəniyyət sahəsində fəaliyyəti (1918–1920)» (1999), Ə.Ş.Haqverdiyevin «Azərbaycan tarixi (ən qədim zamanlardan VII əsrə qədər)» (1985), «Orta əsr Bərdə şəhəri» (1991), «Qədim dünya tarixi» (1997, şərikli), Ə.M.Məmmədovun «Müstəqil Azərbaycan dövlətinin bərpası və möhkəmləndirilməsi uğrunda mübarizə» (1999), «Azərbaycanda milli-azadlıq hərəkatı» (2009), F.H.Cümşüdlünün «Azərbaycan xilafətin hakimiyyəti altında» (1995), «İlk hərbiyyə məktəbi» (1997), «AXC dövründə Bakının müdafiəsi» (1999), «Qubalı Fətəli xanın birləşdirmə siyasəti» (2000), E.Ə.Hacıyevin «Cənubi Azərbaycanda babilər hərəkatı» (Bakı, 2002, şərikli), E.Süleymanovanın «Azərbaycan tarixi kursunda hərbi məsələlər» (Bakı, ADPU, 2011), «Azərbaycanda ordu quruculuğu tarixi (1991–2011)» (Bakı, 2011), İ.Qasımovanın «Qafqazda qadın fəallığının ənənələri» (2008), «Münaqişəyə giriş» (2008) adlı əsərləri nəşr olunmuşdur.

Kafedranın baş müəllimləri Naibə Əhmədova və Vurğun Məmmədov tarix üzrə fəlsəfə doktoru alimlik dərəcəsi almaq üçün bu yaxınlarda dissertasiya müdafiə etmişlər.

Hazırda kafedrada 19 nəfər – 3 nəfər elmlər doktoru, professor (Süleyman Məmmədov (kafedra müdiri), Xəlil Köçərli, Əli Məmmədov), 11 nəfər fəlsəfə doktoru, dosent (Rəhim Əliyev, Gülarə Qayıbova, Firudin Cümşüdlü, Əbdülhüseyn Mənsimov, Səfər Hacıbabayev, Zakir Kərimov, Nazir Əsədov, Elman Mirzəyev, Bəşir Quliyev, Müzəffər İsayev, İradə Qasımova), 2 nəfər fəlsəfə doktoru, baş müəllim (Eldar Hacıyev, Elmira Süleymanova), 3 nəfər fəlsəfə doktoru, müəllim (Naibə Əhmədova, Vurğun Məmmədov, Habil Həsənov) çalışırlar.

### 3.1.2. TÜRK VƏ ŞƏRQİ AVROPA XALQLARI KAFEDRASI

1930-cu ildə Azərbaycan Pedaqoji İnstitutu yenidən təşkil ediləndə fəaliyyət göstərən kafedralardan biri SSRİ tarixi kafedrası idi. Kafedraya müxtəlif illərdə prof. B.N.Tixomirov (1930–1937), dos. Ə.B.Şükürzadə (1938–1941), dos. C.Ə.Rəhimov (1941–1945), prof. C.M.İbrahimov (1945–1974), prof. İ.M.Həsənov (1975–1981), prof. Ş.Ə.Sadıxov (1981–1994), prof. D.H.Qüdrətov (1994–1999), prof. O.B.Sultanov (1999–2011) rəhbərlik etmişdir. 2011-ci ildən kafedraya dos. Rəcəb Əliyev rəhbərlik edir.

SSRİ-nin dağılması ilə əlaqədar kafedranın strukturunda və adında əsaslı dəyişiklik edilmiş, «Türk, Qafqaz və Şərqi Avropa xalqları tarixi» müstəqil fənn, eləcə də əvvəllər kafedrada tədris olunan «Tarixşünaslıq», «Mənbəşünaslıq», «Tarixin tədrisi metodikası» fənləri yenidən tədris planına daxil edilmişdir.

Prof. Ş.Ə.Sadıxov Zaqafqaziya respublikalarının iqtisadi və mədəni əlaqələri tarixini, prof. Ə.Ş.Şahmirov Azərbaycanda kimya sənayesi tarixini tədqiq edən ilk tarixçi-alim kimi yadda qalmışlar.

On ildən artıq kafedraya rəhbərlik etmiş prof. O.B.Sultanovun «XX əsrin 80-ci illərinin sonu – 90-cı illərin əvvəllərində Azərbaycanda siyasi mübarizə» (1995) adlı monoqrafiyasında Azərbaycan xalqının suverenlik və milli müstəqillik uğrunda mübarizə tarixi hərtərəfli tədqiq olunmuşdur. Onun «Xocalı soyqırımı əsrin faciəsidir» (1998) adlı əsərində Azərbaycan xalqının başına gətirilən müsibətlərdən bəhs olunur. O həm də BDU-nun Siyasi tarix kafedrası əməkdaşlarının hazırladıqları «Siyasi tarix» (1998) dərsliyinin müəlliflərindən biridir. O, dəfələrlə Türkiyə və Gürcüstanda keçirilən beynəlxalq elmi konfrans və simpoziumlarda iştirak etmiş, Kütahiyyə Universitetində isə «Müasir dünyanın inkişaf meyilləri» mövzusunda məruzə etmiş və həmin məruzə ingilis dilində çap olunmuşdur. Prof. O.Sultanov A.Bakıxanov adına Tarix İnstitutunun nəzdində fəaliyyət göstərən dissertasiya şurasının üzvü olmuşdur. Hazırda o, Ali Attestasiya Komissiyasında ekspert şurasının və Naxçıvanda fəaliyyət göstərən dissertasiya şurasının üzvü kimi fəaliyyət göstərir. Tarixçi kadrların hazırlanmasında onun xüsusi xidmətləri vardır.

Prof. D.H.Qüdrətovun hazırladığı «Türk xalqlarının tarixi» (2000) dərs vəsaiti bu sahədə respublikamızda mövcud boşluğu doldurmağa xid-



*Türk və Şərqi Avropa xalqları kafedrasının əməkdaşları*

mət edən ilk dərs vəsaitidir. Dos. S.X.Məmmədovanın «Krım xanlığı», «Qasım xanlığı» (1993), dos. P.Ş.Səfərovun «90-cı illərdə Azərbaycanın beynəlxalq vəziyyəti və xarici siyasəti» (1993), «Şərqi və Qərbi hunlar» (1997), Q.Bəşirovun «Osmanlı imperiyasının yaranması, onun daxili və xarici siyasəti» (2000), dos. S.M.Seyidovanın «Türk xalqlarının etnik mənşəyi» (1997) adlı əsərləri türk xalqlarının tarixinin ətraflı öyrənilməsinə xidmət edir. Dos. S.M.Seyidova 3 ay müddətində ABŞ-da ixtisasartırma təcrübəsində olmuş, 2010-cu ildə Moskvada keçirilən beynəlxalq elmi konfransda iştirak etmişdir.

Kafedranın «Tarixin tədrisi metodikası» fənnini tədris edən əməkdaşları insan və cəmiyyət fənlərinin tədrisi ilə əlaqədar da bir sıra dərs vəsaiti, tədris-metodik ədəbiyyat nəşr etdirmişlər. Pedaqoji elmlər doktoru M.Əmirovun «Azərbaycan Respublikası Konstitusiyasının əsasları» (1996), «İnsan və cəmiyyət» (VIII–XI siniflər üçün, 1996), «Tarixin tədrisində şagirdlərin müstəqil işlərinin təşkili» (2000), «Tarix təliminin metodikası» (2000), «Orta məktəbdə tarixin fəal interaktiv təlimi metodikası» (2011), dos. T.F.İsgəndərovun «Ümumtəhsil məktəblərində «Azərbaycan Xalq Cümhuriyyəti» mövzusunun tədrisinə dair» (1995) və s. əsərləri bu qəbildəndir.

Kafedra əməkdaşları «İnteraktiv təlim Resurs-mərkəzi» vasitəsi ilə yeni təlim texnologiyasının tədqiqi, tətbiqi və təbliği sahəsində uğurlu işlərini davam etdirirlər. Mərkəz Açıq Cəmiyyət İnstitutu – Yardım Fondunun respublikada keçirdiyi beynəlxalq konfrans və seminarlarda yaxından iştirak edir.

Prof. M.İ.Əmrahov 2010-cu ildən kafedrada professor vəzifəsində çalışır. O, «Azərbaycanda ali məktəb quruculuğu, ali pedaqoji təhsilin təşkili və inkişafı tarixinin oçerkləri» (1917–1941) (2007), «Qarabağ xanlığı» (2008), «XX əsrdə Azərbaycanda milli-azadlıq hərəkatı» (2009), «Azərbaycan İkinci Dünya müharibəsi dövründə» (2010), «Böyük İpək yolu» (2011), «Şərqi Avropada türk tayfaları birliyi» (2010) adlı dərslik və dərs vəsaitlərinin, 30-dan artıq elmi-metodiki məqalənin müəllifidir. 2010-cu ildə ADPU-da keçirilən «İlin müəllimi» müsabiqəsinin qaliblərindən biri olmuşdur.

Dos. P.Ş.Səfərovun «90-cı illərdə Azərbaycanın beynəlxalq vəziyyəti və xarici siyasəti» (1999), «Müstəqil Azərbaycan Rusiya, İran və Türkiyənin geosiyasi maraqlarında» (2011) monoqrafiyaları və 15 elmi məqaləsi çap etdirilmişdir. Dos. S.M.Seyidova «Azərbaycanın beynəlxalq əlaqələri (1920–1930-cu illər)» (1988), «Osmanlı imperiyasında milli münasibətlər məsələləri, erməni məsələsi (XIX əsrin II yarısı – XX əsrin I rübündə)» (2002), «Türk xalqlarının etnogenezi» (Orta Asiya, Qazaxıstan, Volqaboyu, Ukrayna və Sibirdə yaşayan türk xalqları) (2002) kitablarının, 30-dan artıq elmi-metodiki məqalənin müəllifidir.

Dos. Q.İ.Bəşirovun «Türk xalqları tarixi və Azərbaycan» (2000), dos. A.Y.Piriyevanın «Teymurilər dövlətində mədəniyyət» (2006), «Türk xalqlarının sovet dövrü tarixi» (şərikli, 2009), baş müəllim E.C.Qasımovanın «1920–30-cu illərdə Azərbaycanda ali pedaqoji təhsil» (2000), dos. E.Ə.Məmmədovun «Türk dünyasının görkəmli şəxsiyyətləri» (2010) adlı dərslik və dərs vəsaitləri, İ.S.Mahmudov, T.M.İsayeva, O.H.Sadıqzadənin Türk xalqları və tarixin tədrisi metodikasına dair elmi-metodiki məqalələri xüsusi maraq doğurur.

Son illərdə kafedra əməkdaşları tərəfindən 12 monoqrafiya, 13 dərs vəsaiti, 15 proqram çap edilmişdir. 2006–2011-ci illərdə kafedrada 1 doktorluq, 2 namizədlik dissertasiyası müdafiə edilmişdir. Prof. O.B.Sultanov, dos. M.Əmirov, dos.Q.Bəşirov Azərbaycan Respublikası Təhsil Nazirliyi nəzdində fəaliyyət göstərən Elmi Metodik şuranın üzvüdürlər.

Hazırda kafedrada 19 nəfər – 2 nəfər elmlər doktoru, professor (Oqtay Sultanov, Mais Əmrahov), 1 elmlər doktoru (Mübariz Əmirov), 12 nəfər fəlsəfə doktoru, dosent (Rəcəb Əliyev (kafedra müdiri), Səidə Məmmədova, Tahir İsgəndərov, Sevinc Seyidova, Pərviz Səfərov, Qabil Bəşirov, Afaq Piriyeva, Elmira Qasımova, İsmayıl Mahmudov, Eldəniz Məmmədov, Dəyanət Musayev, Səbinə Həziyeva), 2 nəfər baş müəllim (Ofelya Sadıqzadə, Təranə İsayeva), 2 nəfər müəllim (İsa Quliyev, Taleh Cəfərov) çalışır.

### 3.1.3. ÜMUMİ TARİX KAFEDRASI

Kafedra 1934-cü ildə Azərbaycan Pedaqoji İnstitutunun Tarix fakültəsi nəzdində fəaliyyət göstərən Qərb (müdir prof. P.P.Fridolin) və Yaxın Şərq tarixi (müdir prof. A.S.Bukşpan) kafedraları əsasında təşkil olunmuşdur. İlk illərdə kafedraya dos. Əşrəf Quliyev, Kərəm Əbdürrəhimov rəhbərlik etmişlər. 1939–1941 və 1945–1953-cü tədris illərində «Qədim və orta əsrlər tarixi» adlandırılan kafedraya dosent Ə.S.Sumbatzadə rəhbərlik etmişdir.

Sonrakı illərdə kafedraya dos. M.N.Şıxlı (1954–1971), prof. Y.B.Yusufov (1971–1998) rəhbərlik etmişdir. 1998-ci ildən kafedranın müdiri AMEA-nın müxbir üzvü, professor V.H.Əliyevdir.

Professor Y.B.Yusifov keçmiş SSRİ və dünya miqyasında öz tədqiqatları ilə tanınmış alim idi. O, Leninqrad (Sankt-Peterburq) Dövlət Universitetinin Şərq fakültəsini bitirmiş, orada görkəmli tarixçi, poliqlot, akademik İ.M.Dyakonovun rəhbərliyi altında aspirantura keçmiş, bir sıra mixi yazıları, qədim dilləri (şumer, akkad, elam, urartu, qədim fars, pəhləvi), müasir fars dilini öyrənmiş, alman və ingilis dillərinə yiyələnmiş, ərəb, tacik, əfqan, kürd, latın və Dağıstan dilləri ilə məşğul olmuşdur. O, rus və erməni dillərini mükəmməl bilirdi.

Professor Y.B.Yusifov mixi yazılı qaynaqları, bizans və qədim erməni mənbələrini araşdıraraq qədim Azərbaycan, İran, Urartu və Mesopotamiyanın Şimal əraziləri ilə əlaqədar bir çox türk mənşəli tayfa, ölkə, yer, hökmdarlarının adlarını müəyyənləşdirmişdir. O, türk etnoslarının qədimdən bu geniş ərazilərdə yaşadıqlarını elmi dəlillərlə əsaslandırmışdır. Y.B.Yusifovun «Qədim Şərq tarixi» (1993), «Toponimikanın əsasları» (1987, şərikli) dərslikləri yüksək elmi səviyyədə və ilk mənbələr əsasında

yazıldığından tədrisin müasir tələblərinə tam cavab verir. Onun tədqiqatlarına görə, Avropa irqinə mənsub olan prototürklər müxtəlif istiqamətlərdə, o cümlədən Şərq istiqamətində hərəkət etmiş və Altay onların ikinci vətəni olmuşdur. Burada prototürklər yerli Altay dilləri ilə ünsiyyətə girmiş, nəticədə burada monqol irqinə mənsub türk etnosları yaranmışdır.

Kafedra müdiri AMEA-nın müxbir üzvü, professor V.H.Əliyev Naxçıvan Muxtar Respublikasının qədim tarixi və maddi mədəniyyətinin tədqiqatçısıdır. O, Abşeron, Astara, Lerik, Qazax, Füzuli, Şəki-Balakən və b. bölgələrin qədim abidələrinin öyrənilməsi sahəsində də faydalı tədqiqat işləri aparmışdır.

Professor V.H.Əliyev Azərbaycanın e.ə. III–I minilliklərini əhatə edən qədim şəhər, ilk tunc dövrü Kür-Araz, orta tunc dövrü Boyalı qablar, son tunc və ilk dəmir dövrü, Cənubi Azərbaycanın tunc dövrü, qədim tayfa ittifaqlarının təkamülü, qayaüstü təsvirləri və s. tədqiq etmişdir, o, mühüm problem məsələlər üzrə bu gün də geniş planda elmi-tədqiqat işləri aparır. O, Naxçıvan Muxtar Respublikası ərazisində qədim şəhər mədəniyyəti abidələrini aşkara çıxarıb uzun illər ərzində gərgin elmi tədqiqatlar aparmış və Azərbaycan tarixinə çox mühüm elmi yeniliklər gətirmişdir. Professor V.H.Əliyev son illər ərzində Naxçıvan Muxtar Respublikası ərazisində 500-dən artıq yeni tarixi abidə aşkara çıxarmışdır.

Professor V.H.Əliyevin Naxçıvan Muxtar Respublikası ərazisində eneolit, tunc, ilk dəmir və antik dövr abidələrində apardığı tədqiqatlar nəticəsində əldə etdiyi elmi nailiyyətlər Azərbaycan, eləcə də Qafqaz və Yaxın Şərq ölkələrinin qədim tarixinin bir sıra mühüm problemlərinin öyrənilməsi üçün çox böyük əhəmiyyətə malikdir. Onun elmi əsərləri Azərbaycanda və xarici ölkələrdə (Pakistan, Rusiya, Ukrayna, Gürcüstan, Özbəkistanda və s.) nəşr edilmişdir. «Naxçıvan» (Bakı, 2001) monoqrafiyasında Naxçıvanın qədimdən bu günə qədər olan iqtisadi, ictimai, siyasi və mədəni tarixi sistemli şəkildə araşdırılmışdır.

Prof. V.H.Əliyev təhsil islahatının tələblərinə uyğun yazılmış «Azərbaycan tarixi» və «Qədim dünya tarixi» (6-cı sinif, Azərbaycan və rus dillərində, 2001) dərsliklərinin əsas müəllifi və elmi redaktorudur. Onun əsərlərindən akademik nəşrə hazırlanan «Azərbaycan tarixi» (7 cildlik), «Azərbaycan arxeologiyası» (6 cildlik) və «Azərbaycan incəsənət tarixi» folklor antologiyası və bir çox monoqrafiyaların yazılmasında istifadə olunmuşdur.



*Ümumi tarix kafedrasının əməkdaşları*

Prof. V.H.Əliyev UNESCO xətti ilə 1993-cü ildə Pakistan İslam Respublikasında keçirilən Beynəlxalq simpoziumda, 1994–1997-ci illərdə Azərbaycan Tarixi Tədqiqatçılarının Müstəqil Assosiasiyasının Yunikal Xəzər LTD (ABŞ) və Azərbaycan Respublikası EA-nın birgə Beynəlxalq Bakı simpoziumunda, «Qafqaz və Mərkəzi Asiya Beynəlxalq Araşdırmalar İnstitutu, Azərbaycan Tarixi Departamenti»nin konfransında, Naxçıvan şəhərində «Uluslararası qaynaqlarda Naxçıvan» beynəlxalq simpoziumunda, Tbilisi şəhərində (1997) «Qafqaz arxeologiyası: yeni kəşflər və perspektivlər»ə həsr olunmuş beynəlxalq konfransda, Ankarada keçirilən (2001) Beynəlxalq simpoziumda Azərbaycan tarixinin mühüm problemləri, mədəni-iqtisadi əlaqələri ilə bağlı məruzələr etmişdir.

Prof. V.H.Əliyev «Pakistan və Mərkəzi Asiya Elmi Assosiasiyasının» və «Azərbaycanşünaslar Müstəqil Birliyi Şurası»nın üzvüdür.

Kafedranın professoru M.S.Həsənovun «Almaniya məsələsinin həlli və Avropa təhlükəsizliyi», «Avropa təhlükəsizliyi problemi» (2000) monoqrafiyası, «Almaniya və Avstriyada 1848-ci il inqilabları» (1993) adlı metodik vəsaitində bu gün bütün dünyanı narahat edən ciddi siyasi və diplomatik məsələlər şərh edilir. Kafedranın dosenti İ.A.Məmmədovun «Bö-

yük İpək yolu və Azərbaycan» (2005) adlı monoqrafiyası aktuallığı ilə diqqəti cəlb edir. Son illərdə kafedra əməkdaşları 3 monoqrafiya, 71 məqalə, 17 proqram, 14 dərslik və 10 dərs vəsaiti nəşr etdirmişdir.

Kafedrada Tələbə Elmi Cəmiyyəti xətti ilə müntəzəm iş aparılır.

Kafedranın elmi əlaqələri genişdir. «Klio» Avropa tarixçilər cəmiyyəti, «Karitos» Fransa tarixçilər assosiasiyası, Gürcüstan, Rusiya Federasiyası, Türkiyə, Almaniyanın bir sıra ali təhsil müəssisələri ilə əməkdaşlıq edilir.

Hazırda kafedrada 11 nəfər – 1 nəfər AMEA-nın müxbir üzvü, elmlər doktoru, professor (Vəli Əliyev (kafedra müdiri)), 1 nəfər elmlər doktoru, professor (prof.Musa Həsənov), 8 nəfər dosent (Adilxan Nəbiyev, İbadulla Məmmədov, Şubay Nuruzadə, Səmayə Mustafayeva, Nahidə Hacınskaya, Bəxtiyar Bəxtiyarov, Ərrəhman Əhmədov, Aytən Mehdiyeva), 1 nəfər baş müəllim (Nahidə Hüseynova) çalışır.

### 3.1.4. İQTİSADİ VƏ SOSİAL FƏNLƏR KAFEDRASI

1930-cu ildə təşkil olunan Siyasi iqtisad kafedrasına əvvəllər prof. B.B.Həsənbəyov, sonralar isə respublikanın tanınmış iqtisadçı alimləri prof. Z.H.Cahangirov, prof. R.Ş.Qarayev rəhbərlik etmişlər. Prof. Z.H.Cahangirovun (1943–1974) Azərbaycan iqtisad elminin inkişafında böyük xidmətləri olmuşdur. Vaxtilə kafedrada çalışan prof. T.Z.Vəliyev, prof. N.Nərimanov, prof. İ.Qarayev, prof. F.Əmikişiyev iqtisadiyyatın müxtəlif problemlərinə aid sanballı elmi əsərlər yazmışlar. İlk iqtisadçı qadın alim dos. S.Ə.Rzayeva uzun müddət siyasi iqtisad kafedrasında çalışmışdır.

Kafedra 1990-cı ildən İqtisadi nəzəriyyə, 1998-ci ildən etibarən isə İqtisadi və sosial fənlər kafedrası adı altında fəaliyyətini davam etdirir.

1997-ci ildən etibarən kafedraya iqtisad elmləri doktoru, prof. Əli Allahverdiyev rəhbərlik edir. Onun müasir Azərbaycan iqtisadiyyatının vacib problemlərinə həsr edilmiş «Sosial-iqtisadi sistemin dəyişməsi şəraitində iqtisadi inkişafın səciyyəsindəki dəyişikliklər» (1998), «Bazar iqtisadiyyatının təşəkkülü prosesində makroiqtisadi dinamik və struktur dəyişikliklərin tənzimlənməsi problemləri» adlı monoqrafiyaları (2001), «Makroiqtisadiyyat: nəzəriyyə və praktika» (2010) dərs vəsaiti daha çox diqqəti cəlb edir.



*İqtisadi və sosial fənlər kafedrasının əməkdaşları*

Kafedra əməkdaşları «İqtisadi nəzəriyyə» ilə yanaşı, «Azərbaycan Respublikası Konstitusiyasının və hüququn əsasları», «Sosiologiya», «Politologiya» və s. müvafiq fənləri də tədris edirlər. «Azərbaycan Respublikasının Konstitusiyası və hüququn əsasları» fənnini prof. İ.İsmayılov, prof. E.H.Həsənov, prof. Ə.C.Seyidov tədris edirlər.

Son illərdə Prof. İ.İ.İsmayılovun «İnsan və vətəndaş hüquqlarının məhkəmə müdafiəsi» (2000), «Sosial təminat hüququ və onun tətbiqi problemləri» (2000), «Azərbaycan Respublikası Konstitusiyasının əsasları» (C.Cəfərli və M.Əmirovla birgə, 2002), «Azərbaycan Respublikasının Konstitusiyası və hüququn əsasları» (2002); prof. E.H.Həsənovun «Narkotiklərlə bağlı cinayətlər» (2000), «Narkotik vasitələrin, psixotor maddələrin və prekursorların qanunsuz dövriyyəsi ilə mübarizə haqqında» (2000), «Narkotik cinayətkarlıq və Avropa İttifaqında onunla mübarizə: siyasət və qanunvericilik» (2006), «Azərbaycan Dövlət Hüququnun əsasları» (2010), «Azərbaycan Respublikası Cinayət–Prosessual Məcəlləsinin Kommentariyası» (2010); prof. Ə.C.Seyidovun «Azərbaycan Respublikası Konstitusiyasının və hüququn əsasları» (2008), «Heydər Əliyev və Azərbaycan Respublikasının Konstitusiyası» (2009), «Azərbaycan Respublika-

sı Konstitusiyasının və hüququn əsasları» (2009); dos. İ.M.Rzayevin «Azərbaycan iqtisadiyyatının bəzi məsələləri» (prof. Ə.Q.Allahverdiyevlə şərikli) (1992); dos. K.Ş.Zeynalovun «Keçid dövründə bölgü münasibətlərinin ziddiyyətləri və onların həlli yolları» (1992); dos. M.Ə.İsayevin «Yenidənqurma və demokratiya şəraitində gənclərin zərərli adətlərinə qarşı mübarizə» (1991), «Siyasi sistemdə dövlət» (1991), «Sosiologiya» (1996), «Politologiya elm kimi» (1994), «Sosiologiya cəmiyyət haqqında elmdir» (1995); dos. A.H.Hacıyevin «XIX əsrin sonu – XX əsrin əvvəllərində dünyanın siyasi mənzərəsi» (1990), b/m Z.S.Nağıyevin «Hüququn əsasları» üzrə mühazirə mətnləri (2006) adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur. Kafedra əməkdaşlarının 25 monoqrafiya, 18 dərslik, 29 dərs vəsaiti, 22 proqram, 27 metodik vəsaiti çap olunmuşdur.

Hazırda kafedrada 14 nəfər – 3 nəfər elmlər doktoru, professor (Əli Allahverdiyev (kafedra müdiri), Eldar Həsənov, Qəzənfər Süleymanov), 1 nəfər hüquq elmləri üzrə fəlsəfə doktoru, professor (Ənvər Seyidov), 3 nəfər fəlsəfə doktoru, dosent (Mirzəli Cəfərov, Dilarə Babayeva, Cema Şahmirzəyeva), 3 nəfər fəlsəfə doktoru, baş müəllim (Asif Axundov, Cəfər Cəfərli, Faiq Ələkbərov), 2 nəfər baş müəllim (Vaqif Əliyev, İradə Əliyeva), 2 nəfər müəllim (Şövkət Gülməmmədova, Leyla Allahverdiyeva) çalışır.

### 3.1.5. ÜMUMİ PEDAQOGİKA KAFEDRASI

İnstitut fəaliyyətə başladığı ilk gündən burada pedaqogika və pedaqogika tarixi fənləri tədris olunmuşdur. Pedaqogika kafedrası müstəqil kafedra kimi 1930-cu ildə – Azərbaycan Pedaqoji İnstitutu yenidən təşkil edilərkən yaradılmışdı. Müstəqil fəaliyyətə başladığı ilk gündən geniş və hərtərəfli işi ilə fərqlənən kafedraya ilk vaxtlar dos. M.Rəhimli (1931–1937), sonralar dos. N.Asatur (1937–1942), prof. Ə.Seyidov (1943–1950 və 1956–1974), prof. M.Muradxanov (1951–1956), prof. M.Mehdizadə (1950–1951) rəhbərlik etmişdir. 1974–1977-ci illərdə isə professorlar B.Əhmədov, N.Kazımov, S.Şəfiyev kafedra müdiri vəzifəsində çalışmışlar.

Kafedraya 1978-ci ildən SSRİ PEA-nın müxbir üzvü, Beynəlxalq Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü, Rusiya Təhsil Akademiyasının akademiki, əməkdar ali məktəb işçisi, pedaqoji elmlər doktoru, professor H.M.Əhmədov rəhbərlik edir.



*Ümumi pedaqogika kafedrasının əməkdaşları*

XX əsrin 30-cu illərinin əvvəllərində 1 professor (B.B.Komarovski), 3 dosent (Ə.Hacıyev, M.Rəhimli, Ə.K.Zəkuzadə), 7 assistent (M.Mehdizadə, Ə.Əfəndiyev, İ.Əfəndiyev, Q.Əsgərov, Ə.Seyidov, R.Əfəndiyev, Ə.Qədimbəyova), 1 laborantla (M.Tahirli) fəaliyyətə başlayan pedaqogika kafedrası ildən-ilə inkişaf etmiş, respublikada pedaqoji biliyin mərkəzinə çevrilmişdir. İldən-ilə kafedra əməkdaşlarının və elmi dərəcəlilərin sayı artmış, tərkibi kəmiyyətcə və keyfiyyətcə yüksəlmişdir. Həmin illərdə Pedaqogika kafedrasının elmi fəaliyyətinin əsas istiqamətlərindən biri namizədlik və doktorluq dissertasiyaları hazırlamaqdan ibarət olmuşdur. Bu istiqamətdə aparılan işlər ali məktəblər üçün yüksəkixtisaslı müəllimlərin və tədqiqatçı alimlərin hazırlanması baxımından mühüm əhəmiyyət kəsb edirdi. İlk milli pedaqoji elmlər doktorlarının (Ə.Seyidov, M.Mehdizadə) meydana gəlməsi respublikada pedaqoji elmlərin inkişafında mühüm bir hadisə oldu.

Ə.Seyidov «XIX əsr Azərbaycan pedaqoji fikrinin əsas nümayəndələri» (1947), M.Mehdizadə isə «Azərbaycan sovet məktəbinin tarixinə dair xülasələr» (1957) mövzusunda doktorluq dissertasiyaları müdafiə etdilər.

Pedaqogika kafedrası 50-ci illərdə elmi-pedaqoji kadr hazırlığı sahəsində əməli fəaliyyətini həm kəmiyyət, həm də keyfiyyətcə genişləndirərək möhkəmləndirmişdir. Bu dövrdə kafedrada 3 elmlər doktoru, professor (Ə.Y.Seyidov, M.M.Mehdizadə, Ə.K.Zəkuzadə), 6 elmlər namizədi, dosent (M.Ə.Muradxanov, T.Y.Əfəndiyev, D.M.Mustafayeva, Ş.S.Ağayev, İ.İ.Vəlixanlı, A.K.Abdullayeva), 3 elmlər namizədi, baş müəllim (Ə.S.Tağıyev, Q.K.Qasımzadə, S.M.Babayeva) çalışırdılar. Bu dövrdə kafedrada yetişən gənc kadrlar: Ə.S.Tağıyev, D.M.Mustafayeva, A.N.Kərimov, T.Y.Əfəndiyev, İ.İ.Vəlixanlı, B.Ə.Axundov, N.M.Kazımov, H.M.Əhmədov, M.Ə.Məmmədov, Q.M.Məmmədov pedaqogikanın aktual nəzəri məsələləri ilə əlaqədar namizədlik dissertasiyası müdafiə etdilər.

Ümumi pedaqogika kafedrasının elmi həyatında 70-ci illər doktorluq dissertasiyalarının müdafiəsi ilə səciyyəvidir. H.M.Əhmədovun «XIX əsrdə Azərbaycanda məktəb təhsilinin inkişaf tarixi» (1972), A.N.Kərimovun «Azərbaycanda əməyin və politexnizmin tarixinə dair oçerklər» (1973), Y.R.Talıbovun «Şagirdlərin sosialist beynəlmiləlçiliyi tərbiyəsinin nəzəriyyəsi və təcrübəsi» (1975) adlı doktorluq dissertasiyaları həmin dövrün başlıca elmi uğurları idi.

Pedaqoji elmlər üzrə ixtisaslaşdırılmış Müdafiə Şurasında 1988–1990-cı illərdə müdafiə olunan 92 dissertasiyadan 55-i pedaqogikanın nəzəriyyəsi və tarixinə aid idi. Bunlardan ümumi pedaqogika kafedrasında aspirantura və dissertantura hazırlığı keçən V.A.Zərbəliyev, B.Nəsirov, Z.C.Vəlibəyova, S.M.Qurbanova, M.İ.İlyasov, X.Ə.Mehdizadə, H.B.Bayramov, S.A.Orucova, F.A.Rüstəmov, Ş.V.Zülfüqarova, N.P.Ağabəyova 70–80-ci illərdə namizədlik dissertasiyası müdafiə etmişlər. Sonrakı illərdə Ş.Azadəliyeva, Ə.Məhərrəmov, K.Quliyeva, M.Nəzərov, Ə.İsmayılxanova namizədlik, o dövrdə kafedranın əməkdaşları olmuş dos. S.M.Quliyev (1988) və F.A.Rüstəmov (2003) doktorluq dissertasiyaları müdafiə etdilər. 2011-ci ildə dos. M.İlyasov doktorluq, G.Qocayeva isə namizədlik dissertasiyası müdafiə etmiş, dos. H.Bayramov doktorluq dissertsiyasını müzakirəyə təqdim etmişdir.

Kafedra əməkdaşları pedaqogika üzrə dərslik və dərs vəsaitlərinin hazırlanmasında yaxından iştirak etməklə respublikada ali pedaqoji məktəb tələbələrinin bu sahədəki tələbatını ödəməyə çalışırlar. Prof. H.M.Əhmədovun «XIX əsr Azərbaycan məktəbi» (1978, 2000), «Pedaqogika tarixi kursundan mühazirələr» (1987) və «Azərbaycanda məktəb və pedaqoji fikir tarixi» (rus

və Azərbaycan dillərində, 1991, 1993, 1995), «İdarəetmənin pedaqogikası və psixologiyası» (şərikli), İ.İsayevin «Pedaqogika» (1993, şərikli), «Abbas Səhhət və xalq maarifi» (2002), prof. Ə.Paşayevin «XIX əsr–XX əsrin əvvəllərində Qafqazda ibtidai təhsilin inkişafının tarixi oçerkləri» (1991), «Gürcüstanda Azərbaycan məktəblərinin tarixi oçerkləri» (1997), «Pedaqogika. Yeni kurs» (prof. F.Rüstəmovla birgə, 2002), prof. A.Həsənovun «Pedaqogika» (2007), «Milli mənəvi dəyərimiz» (2010), «Seçilmiş pedaqoji əsərləri» (II cilddə, 2011), dos. M.Həsənovun «Dərsdə texniki vasitə tətbiqi» (1992), «İbtidai məktəbdə təlimin texniki vasitələrinin tətbiqinin didaktik əsasları» (1993), dos. Ş.Azadəliyevanın «Təlimdə geridə qalan ibtidai sinif şagirdləri ilə işin sistemi» (1996), «Təhsil-tərbiyənin müasir problemləri» (2011), M.İlyasovun «Məktəbdə peşəyönümü işinin sistemi» (1999), «Şagirdlərin peşəseçməyə hazırlanmasının pedaqoji əsasları» (2005), «Şagirdlərin peşə seçməyə hazırlanması» (2009), H.Bayramovun «İdarəetmənin pedaqogikası və psixologiyası» (Azərbaycan və rus dillərində 2002, şərikli), «Nitq mədəniyyəti» (2005, şərikli), «Təhsili idarəetmənin əsasları» (2009, şərikli), «Çarizmin Azərbaycandakı təhsil siyasətinin əsas istiqamətləri: unifikasiya prosesi və tarixi-pedaqoji paradiqmanın formalaşması» (2011), dos. K.Quliyevanın «Yuxarı sinif şagirdlərinin müəllimlik peşəsinə istiqamətləndirilməsi» (2003) adlı monoqrafiya, dərslik və dərs vəsaitləri məhz bu illərin məhsuludur. Prof. F.Rüstəmov kafedrada işləyərkən xeyli dərslik və dərs vəsaitləri nəşr etdirmişdir: «Azərbaycanda pedaqoji elmin inkişaf tarixindən» (1992), «Günüuzadılmış qruplarda tərbiyə məsələləri» (prof. A.İsmayılovla birgə, 1993), «M.V.Vidadinin, M.P.Vaqifin, Q.B.Zakirin təlim-tərbiyə haqqında fikirləri» (dos. İ.İsayevlə birgə, 1994), «Azərbaycan pedaqoji biblioqrafiyası: məktəb və pedaqogika tarixinə dair ədəbiyyat» (1995), «Azərbaycanda pedaqoji terminalogiyanın inkişaf tarixindən» (1997), «Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri» (1998), «Pedaqogika kafedrasının tarixi: xələflər və sələflər» (1999), «Şərqdə pedaqogika tarixi» (2002), «Pedaqogika». Yeni kurs. (prof. Ə.Paşayevlə birgə, 2002), «Qərb pedaqogika tarixi» (2003), «Yeni dövrün pedaqogika tarixi» (2004), «Ən yeni dövrün pedaqogika tarixi» (2005), «Pedaqogika tarixi» (2006), «Akademik H.Əhmədov və yetirmələri» (2005) və s.

Kafedra əməkdaşları Pedaqogika, Pedaqogika tarixi və ayrı-ayrı seçmə fənlərlə bağlı yeni proqramların hazırlanmasına və nəşrinə nail olmuşlar.

«Azərbaycan Respublikasının təhsil sistemi», «Təhsil sisteminin idarəedilməsi», «Təhsilin tarixi və fəlsəfəsi», «Təhsilin əsasları», «Milli əxlaq və ailə dəyərləri» fənlərinin proqramları dos. H.Bayramovun iştirakı ilə hazırlanmışdır.

Ümumi pedaqogika kafedrası xətti ilə elmə gələn tədqiqatçılara professorlar Ə.Y.Seyidov və H.M.Əhmədov rəhbərlik etmişlər. Kafedra əməkdaşları universitetin ictimai həyatında yaxından iştirak etmiş, müxtəlif vəzifə daşımışlar. Pedaqogika kafedrasının yetirməsi akademik M.M.Mehdizadə 23 il Azərbaycan maarifinə rəhbərlik etmişdir. T.Əfəndiyev, Ə.Tağıyev, S.Axundov institutda partiya komitəsinin katibi, H.Əhmədov komsomol komitəsinin katibi, (o, həm də İxtisasartırma fakültəsinin dekanı olmuşdur), Ə.Əhmədov, H.Abdullayev həmkarlar komitəsinin sədri, A.İsmayılov İctimai peşələr fakültəsinin dekanı, N.Kazımov elmi işlər üzrə prorektor, B.Bəşirov tərbiyə işləri üzrə prorektor, İ.İsayev, T.Məmmədov dekan, M.Həsənov, M.İlyasov, V.Zərbəliyev dekan müavinləri, H.Bayramov ABU-nun prorektoru vəzifəsində işləmişlər. Kafedranın professoru F.Rüstəmov hazırda Pedaqoji fakültənin dekanı vəzifəsində çalışır.

Elmi-pedaqoji sahədəki nailiyyətlərinə görə kafedranın professorları Ə.Seyidov, M.Mehdizadə, M.Muradxanov Əməkdar elm xadimi, prof. H.Əhmədov Əməkdar ali məktəb işçisi fəxri adlarına layiq görülmüşlər. Prof. H.Əhmədov 1993-cü il mayın 19-da Azərbaycan Milli Yaradıcılıq Akademiyasının həqiqi üzvü (akademiki), 1993-cü il iyunun 18-də isə Beynəlxalq Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü (akademiki) seçilmişdir. 1998-ci ildə elmi-pedaqoji sahədəki yaradıcılıq uğurlarına, elmi-pedaqoji kadr hazırlığındakı xidmətlərinə görə Beynəlxalq Pedaqoji Akademiyasının «Y.A.Komenski adına Böyük Qızıl Medalı» ilə təltif olunmuşdur. 1999-cu ildə isə Rusiya Dövlət Təhsil Akademiyasının əcnəbi üzvü seçilmişdir. 2005-ci ildə Türk Dünyası Araşdırmaları Uluslararası Elmlər Akademiyası tərəfindən «Türk Dünyasına Hizmet» qızıl medalı ilə təltif olunmuşdur. 2007-ci il akademik H.Əhmədov üçün daha uğurlu olmuşdur. O, Azərbaycan Respublikası Prezidenti İ.Əliyevin sərəncamı ilə Azərbaycan təhsilinin inkişafındakı böyük xidmətlərinə görə Prezidentin fərdi təqaüdünə layiq görülmüş, Rusiya Federasiyasının Təhsil və Elm Nazirliyinin «K.D.Uşinski» medalı ilə təltif olunmuşdur.

Prof. H.Əhmədov, prof. F.Rüstəmov, dos. H.Bayramov, Rusiya Pedaqoji və Sosial Elmlər Akademiyasının, prof. Ə.Paşayev Gürcüstan Təhsil

Akademiyasının akademiki seçilmişdir. Prof. H.Əhmədov və prof. F.Rüstəmov həm də Beynəlxalq Pedaqoji Akademiyanın həqiqi üzvüdürlər.

Ümumi pedaqogika kafedrası respublikada yüksək səviyyəli elmi-praktik konfransların hazırlanması və keçirilməsində də böyük təcrübəyə malikdir. Prof. H.M.Əhmədovun təşəbbüsü ilə keçirilən «Qori seminariyasının Azərbaycan şöbəsinin 100 illiyi» (1979), «Pedaqogika tarixi kursunun tədrisinin təkmilləşdirilməsi və respublikada tarixi-pedaqoji tədqiqatların təşkili» (1984), «Nəriman Nərimanovun anadan olmasının 120 illiyi» (1990), «Y.A.Komenskinin anadan olmasının 400 illiyi» (1992), «Ə.Seyidovun anadan olmasının 100 illiyi» (1992), «Etnopsixologiya və etnopedaqogika: mənbələr və müasir problemlər» (1992), «Pedaqoji peşəyönümünün aktual problemləri» (1993), «Rəcəb Əfəndiyevin anadan olmasının 100 illiyi» (1994) mövzularında keçirilən konfranslar tarixi-pedaqoji irsin təbliğində mühüm rol oynamaqla yanaşı, həm də pedaqogika elminin inkişafını təmin edən vasitələrdən birinə çevrilmişdir.

Ayrı-ayrı vaxtlarda prof. H.Əhmədov, prof. Ə.Paşayev, prof. F.Rüstəmov, prof. A.Həsənov, dos. H.Cəfərov, dos. İ.İlyasov, dos. H.Bayramov, dos. S.Qurbanova pedaqogikanın nəzəriyyəsi və tarixi ixtisası üzrə İxtisaslaşdırılmış Müdafiə Şuralarının üzvü olmuşlar. Hazırda akademik H.Əhmədov, prof. Ə.Paşayev və prof. İ.İsayev Universitetimizdə fəaliyyət göstərən ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi ixtisası üzrə Dissertasiya Şurasının üzvləridirlər. Pedaqogika kafedrası respublikamızda pedaqoji elmlərin mərkəzi statusunu özündə saxlayır və onu yeni nailiyyətlərlə daha da zənginləşdirir. Bu gün ali pedaqoji məktəblərdə uğurla tədris olunan «Azərbaycan məktəb və pedaqoji fikir tarixi» adlı kursun yaradılması ideyası məhz burada meydana gəlmiş, bu fənnin proqramı hələ sovetlər birliyi dövründə SSRİ Maarif Nazirliyinin elmi-metodik şurasında müzakirə edilərək bəyənilmiş və bu təcrübənin digər müttəfiq respublikalarda da tətbiqi tövsiyə edilmişdir. Bütün ali pedaqoji məktəblərdə tədris olunan bu fənnin akademik Hüseyn Əhmədov tərəfindən Azərbaycan və rus dillərində dərs vəsaitləri hazırlanaraq nəşr edilmişdir. Kafedra əməkdaşlarının elmi əsərlərinin İran, Türkiyə, Rusiya, Çexiya və digər xarici ölkələrdə nəşri fərəh doğurur. Akademik Hüseyn Əhmədovun Azərbaycan təhsil və pedaqoji fikir tarixi ilə bağlı kitablarının nüsxələri ABŞ Beynəlxalq Ekspert və Bioqrafiya Araşdırmalar İnstitutunun kitabxanasında

saxlanılır. Həmin İnstitut tərəfindən akademik Hüseyn Əhmədov pedaqogika elminin məharətli bilicisi elan edilmiş və ona ixtisaslaşdırılmış bilik sertifikatı təqdim olunmuşdur.

Kafedra əməkdaşları Pedaqoji Universitetdə pedaqogika fənninin tədrisinin keyfiyyətinin yüksəldilməsinə, onun elmi-nəzəri səviyyəsinin və praktik istiqamətinin güclənməsinə, təlimin yeni metodlarının tətbiqinə çalışırlar. Açıq dərslərin təşkili, mühazirə mətnlərinin, dərslik və dərs vəsaitlərinin müzakirəsi, qarşılıqlı dərs dinləmə, elmi-tədqiqat işlərinin nəticələrinin tətbiqi və digər təşkilati işlərin yüksək səviyyədə aparılmasında kafedra müdiri akademik H.M.Əhmədovun xidmətləri böyükdür.

Hazırda kafedrada 22 nəfər – 1 nəfər akademik (Hüseyn Əhmədov), 2 nəfər elmlər doktoru, professor (Əmrulla Paşayev, Ağahüseyn Həsənov), 1 nəfər fəlsəfə doktoru, professor (İramin İsayev), 9 nəfər fəlsəfə doktoru, dosent (Miri Həsənov, Həsən Bayramov, Müseyib İlyasov, Heydər Cəfərov, Zoya Vəlibəyova, Südabə Qurbanova, Şiruyə Azadəliyeva, Kəmalə Quliyeva, Sahilə Orucova), 2 nəfər fəlsəfə doktoru, baş müəllim (Müslüm Nəzərov, Əsmət İsmayılxanova), 1 nəfər fəlsəfə doktoru, müəllim (Şəfiqə Zülfüqarova), 3 nəfər baş müəllim (Ofeliya Mürsəlova, Püstəxanım Balayeva, Zemfira Qədirova), 3 nəfər müəllim (Gülarə Qocayeva, Kəmalə Quliyeva, Nigar İsmayılova) çalışır.

### 3.1.6. FƏLSƏFƏ KAFEDRASI

Kafedra 1930–1931-ci tədris ilində yaradılmışdır. O zaman Dialektik materializm kafedrası adlanırdı. Kafedra müdiri əvvəl professor A.B.Çikalov, sonra Ə.K.Zəkuzadə seçilmişdir.

İlk illərdə kafedrada prof. A.O.Makovelski, Ə.K.Zəkuzadə, H.N.Hüseynov, H.Ə.Əfəndiyev və b. işləmişlər. Marksizm-leninizm kafedrası ilə birləşdikdən sonra 1937–1938-ci illərdə kafedraya dos. M.Ə.Mahmudov 1939–1940-cı illərdə akademik H.N.Hüseynov rəhbərlik etmişdir. Kafedra 1950–1951-ci tədris ilindən etibarən yenə müstəqil fəaliyyət göstərməyə başlamışdır.

Sonrakı illərdə kafedraya dos. H.Ə.Əfəndiyev (1957–1964), dos. M.H.Əliyev (1964–1972), prof. C.S.Quliyev (1972–1978), dos. Ş.C.Salmanov (1978–1980), dos. A.H.Mikayılov (1980–1982), dos. Ş.Ə.Ələkbərov



*Fəlsəfə kafedrasının əməkdaşları*

(1983–1985), dos. Y.A.Qaraməmmədli (1985–1990), prof. S.Ş.Xəlilov (1991–1993), prof. M.A.Balayev (1993–1999), dos. B.Ə.Fərəcov (1999–2005), dos. K.Q.Hüseynov (2006–2007) rəhbərlik etmişdir. 2007-ci ildə prof. M.A.Balayev yenidən Fəlsəfə kafedrasına müdir vəzifəsinə seçilmişdir.

Kafedranın əməkdaşları əsasən dialektik və tarixi materializm, təbiətşünaslığın fəlsəfi əsasları, Azərbaycanda fəlsəfi fikir tarixi problemlərinin tədqiqi ilə məşğul olmuşlar. Sosial və mənəvi proseslərin metodoloji problemləri, ictimai fikir tarixi, milli-mənəvi dəyərlərin formalaşma amilləri və qanunauyğunluqları – tədqiqatçıların diqqət mərkəzində olmuşdur.

Son illərdə prof. M.A.Balayevin «İslam və onun ictimai-siyasi həyatda rolu» (1991), «İslam, əxlaq və siyasət» (1994), «Azərbaycanda milli hərəkat ideyalarının yaranması və tarixi təkamülü» (şərikli, 1994), «İncəsənətin növləri» (şərikli, 1997), «Azərbaycanda islam dininin öyrənilməsi» (2005), «Heydər Əliyev və Azərbaycanda elmin, təhsilin inkişafı» (şərikli,

2007), «Görkəmli alim və ictimai xadim» (2009), B.Fərəcovun «Elmi-texniki inqilab və biosfera problemi» (1999), «Biosfer və noosferanın təbii-elmi və fəlsəfi əsasları» (2000), «Müasir ekoloji şəraitin sosial-iqtisadi aspektləri» (2001), dos. Y.A.Qaraməmmədlinin «Diplomatiya: ensiklopedik lüğət» (şərikli, 2005), «Fəlsəfə ensklopedik lüğəti» (şərikli, 1997), «Riskin idarə olunmasında insan amili-psixoloji faktorlar» (şərikli, 2004), «Qəza təbabəti-fövqəladə hallarda əhaliyə psixoloji xidmətin təşkili» (şərikli, 2009, Azərbaycan və ingilis dillərində), dos.L.D.Quliyevanın «Estetik mədəniyyət» (1993), «Ümumi qanunauyğunluq və mədəniyyətin inkişafı», (1994), «Gender və sənətşünaslıq» (2006), «Gender və sənətşünaslıq» (2007), baş müəllim T.Ş.Şərifovun «İncəsənətin növləri» (şərikli, 1994), «Ailə-məişət mədəniyyəti» (2010), «Mənim elmi yaradıcılığım» (2010) adlı monoqrafiya, dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

1990-cı ilin sonunda fəlsəfə kafedrasının bazasında Mədəniyyətşünaslıq kafedrası təşkil edilmiş, dos. Y.A.Qaraməmmədli müdir təyin olunmuşdur, 1996-cı ildə yenidən fəlsəfə kafedrası ilə birləşdirilmişdir.

Son beş ildə kafedra əməkdaşları tərəfindən 5 monoqrafiya, 7 proqram və 20-dən çox elmi məqalə çap olunmuşdur. Müasir dövrdə kafedranın əməkdaşları fəlsəfənin aktual problemləri ilə bağlı araşdırmalar aparır, Azərbaycan ictimai, fəlsəfi fikrinin ən mühüm məqamlarını, orta əsr mütəfəkkirlərinin fəlsəfi baxışlarını, müasir dövrün ekoloji, gender və mədəniyyət problemlərini tədqiq edirlər.

Hazırda kafedrada 10 nəfər – 1 nəfər elmlər doktoru, professor (Məmməd Balayev), 6 nəfər fəlsəfə doktoru, dosent (Məmməd İsmayılov, Yasin Qaraməmmədli, Kamal Hüseynov, Zemfira Zülalova, Svetlana Adıgözəlova, Leyla Quliyeva), 1 nəfər fəlsəfə doktoru, baş müəllim (Taliyə Məmmədova), 1 nəfər baş müəllim (Tosim Şərifov), 1 nəfər baş laborant (Rəhilə Cəfərova) fəaliyyət göstərir.

## 3.2. FİLOLOGİYA FAKÜLTƏSİ



*Dekan*
*prof. Buludxan Xəlilov*

Ali Pedaqoji İnstitut yarandığı vaxtdan burada fəaliyyət göstərən şöbələrdən biri də tarix-ədəbiyyat olmuşdur. Bu şöbə 1925–1926-cı tədris ilindən tarix və ədəbiyyat şöbələrinə ayrılmışdır. 1933-cü ildən Dil-ədəbiyyat fakültəsi müstəqil fəaliyyətə başlamışdır.

Fakültənin əsas kafedrası da dil və ədəbiyyat adlandırılmışdır. Kafedra müdiri vəzifəsini uzun müddət dos. Əli Nazim yerinə yetirmişdir.

1933–1934-cü tədris ilindən tələbə kontingentinin və müəllim heyətinin artması fakültənin genişlənməsinə səbəb olmuşdur. Dil və ədəbiyyat kafedrasının bazası əsasında üç müstəqil kafedra – «Azərbaycan ədəbiyyatı tarixi», «Dilçilik» və «Ümumi ədəbiyyat tarixi» – təşkil edilmişdir.

Fakültə yaranandan ona nüfuzlu alimlər rəhbərlik etmişlər. İlk dekanı prof. B.V.Çobanzadə olmuş, sonrakı illərdə kollektivə prof. A.S.Abdullayev (1939–1941), prof. M.H.Rəfili (1943–1945), müəllim C.F.Bağırov (1945–1947), dos. İ.R.Əfəndiyev (1947–1952), dos. S.M.Əfəndiyev (1952–1957) rəhbərlik etmişlər. APİ-nin 5 illik təhsilə keçməsi ilə əlaqədar (1956) müstəqil Tarix və Dil-ədəbiyyat fakültələri təşkil edilmişdir. Lakin bir neçə il keçməmiş yenidən bu fakültələr birləşdirilmişdir. Dil-ədəbiyyat fakültəsinə dekan vəzifəsinə dos. A.Ə.Hüseynov (1957–1961), birləşəndən sonra isə dos. Ş.Ə.Sadıqov (1961–1964) seçilmişdir.

Tarix-filologiya fakültəsi 1964–1965-ci tədris ilindən yenidən ayrılmış və bundan sonra Filologiya fakültəsinə prof. A.M.Qurbanov (1968–1981), prof. F.Q.Fərhadov (1981–1984), prof. P.Ş.Əfəndiyev (1984–1986), dos. B.H.Muradov (1986–1989), prof. Q.Ş.Kazımov (1989–1997), prof. H.B.Balıyev (1997–2006) rəhbərlik etmişlər. 2006-cı ildən Filologiya fakültəsinin dekanı filologiya elmləri doktoru, prof. Buludxan Xəlilovdur.

Fakültənin nəzdində 9 kafedra fəaliyyət göstərir: Müasir Azərbaycan dili (müdir prof. H.İ.Mirzəyev), Azərbaycan dilçiliyi (müdir prof. N.M.Xudiyev),



*Filologiya fakültəsinin elmi şurası*

Azərbaycan və dünya ədəbiyyatı tarixi (müdir prof. H.Ə.Qasımov), Folklor və qədim ədəbiyyat (müdir prof. T.C.Novruzov), Ədəbiyyat və onun tədrisi metodikası (müdir prof. Z.A.Xəlil), Azərbaycan dili və onun tədrisi metodikası (müdir prof. Ə.V.Tanrıverdiyev), İngilis dili və onun tədrisi metodikası (müdir prof. B.Q.Hüseynov), Xarici dillər (müdir dos. Ə.B.Alıyeva), Rus dili (müdir dos. L.O.Vəzirova).

Fakültənin professor-müəllim heyətinin tərkibində 20 nəfər elmlər doktoru, professor, 40 nəfər fəlsəfə doktoru, dosent, 2 nəfər fəlsəfə doktoru, əvəzçiliklə dosent, 14 nəfər fəlsəfə doktoru, baş müəllim, 49 nəfər müəllim, 9 nəfər aspirant, 10 nəfər dissertant çalışır. Fakültədə 1999–2000-ci tədris ilindən dil və ədəbiyyat ixtisasından əlavə fransız dili, 2001–2002-ci tədris ilindən ingilis dili ixtisası üzrə müəllim hazırlığına başlanmışdır. Bu ixtisaslarda Fransadan, Amerikadan gələn elmi-pedaqoji kadrlar da dərs deyir və tədqiqatla məşğul olurlar.

Filologiya fakültəsi Pedaqoji Universitetin kadr potensialına görə ən böyük fakültələrindəndir. Burada 1224 tələbənin təhsil-tərbiyəsi ilə 200 nəfərdən çox professor-müəllim, tədris-köməkçi işçi məşğul olur. Fakültədə bu



«Cəfər Xəndan auditoriyası»nın açılışı. Akademik A.Hacıyev və prof. Y.Məmmədov

gün təhsil alan 1224 tələbənin 813 nəfəri əyani, 411 nəfəri isə qiyabi şöbədə oxuyur. Bakalavr pilləsində tələbələr üç ixtisasa: Azərbaycan dili və ədəbiyyatı müəllimliyi (əyani və qiyabi şöbə), ingilis dili müəllimliyi (əyani şöbə) və fransız dili müəllimliyi (əyani şöbə), magistraturada isə 8 ixtisasa: Azərbaycan dili, ümumi dilçilik, ədəbiyyat nəzəriyyəsi, Azərbaycan ədəbiyyatı, folklorşünaslıq və mifologiya, Azərbaycan dili və ədəbiyyatın tədrisi metodikası, ingilis dili və fransız dili ixtisaslarına yiyələnirlər. Bakalavr və magistrlərin ixtisaslarına yüksək səviyyədə yiyələnmələri üçün fakültədə hər cür şərait yaradılmışdır. Aparılan işlər, keçirilən çoxsaylı tədbirlər tələbələrin elmlərə yiyələnməsinə, gənc bir müəllim kimi formalaşmasına xidmət edir.

Universitetimizdə ilk dəfə kredit sistemi Filologiya fakültəsində tətbiq olunmuşdur.

Fakültədə Cəfər Xəndan auditoriyası, «Gənc dilçilər» və «Gənc ədəbiyyatçılar» adlı iki dərnək fəaliyyət göstərir. «Gənc filoloq» adlı divar qəzeti müntəzəm olaraq çap olunur.

Fakültədə Tələbə Elmi Cəmiyyəti (sədri, dos. F.Yusifov) müntəzəm olaraq tələbələrin elmə olan marağını artırmaq istiqamətində işlər görür. Hər il tələbələrin elmi fəaliyyəti yekunlaşır və seçilən tələbələr müvafiq yerlər üzrə mükafatlandırılır. Fakültənin tələbələri XIII Respublika fənn olimpiadasında I, II, III yerləri, XIV Respublika fənn olimpiadasında II, III yerləri tutmuş, müxtəlif universitetlərdə keçirilmiş konfranslarda da müvafiq yerlərin qalibləri olmuşlar.

Filologiya fakültəsi xalqımızın milli sərvətidir. Odur ki, fakültədə xalqımızın mənəviyyatına, mədəniyyətinə, dilinə, ədəbiyyatına xidmət edən alimlərin, şair və yazıçıların yubileyləri (M.F.Axundovun, M.Hüseynin, M.İbrahimovun, R.Rzanın, Ə.Hacızadənin, F.Qocanın, N.Həsənzadənin, Anarın və s.) keçirilir, onlar gənc nəslə tanıtdırılır.

Filologiya fakültəsi şərəfli bir yol keçmiş, həmişə öz məzunları ilə fəxr etmişdir. Vaxtilə bu fakültədə təhsil almış yüzlərcə tələbə öz əməli fəaliyyətləri ilə universitetimizə şərəf gətirmişdir. Xalq şairləri M.Rahim, M.Dilbazi, professorlar C.Xəndan, O.Sarıvəlli, Ə.Ələkbərzadə, M.Cəfər, M.H.Təhmasib, M.C.Paşayev, Şıxəli Qurbanov, xalq yazıçıları Süleyman Rəhimov, İsmayıl Şıxlı, akademik Məmməd Arif Dadaşzadə, şairlər İlyas Tapdıq, Tofiq Bayram, Məmməd Aslan, Məstan Əliyev, Kələntər Kələntərov, yazıçı Sabir Əhmədov və digərləri fakültəmizin şöhrət simvoludurlar.

### 3.2.1. MÜASİR AZƏRBAYCAN DİLİ KAFEDRASI

Kafedra 1989-cu ilin iyun ayında Azərbaycan dilçiliyi kafedrasının bazasında yaradılmışdır. Fəaliyyət göstərdiyi illər ərzində kafedranın tərkibi dəyişmiş, keyfiyyət baxımından yaxşılaşmış, əməkdaşlar qısa bir müddətdə xeyli proqram və dərslik hazırlamış, elmi məqalələr çap etdirmişlər.

Kafedranın müdiri Əməkdar elm xadimi filologiya elmləri doktoru, prof. Həsən Mirzəyevdir. O, 750-dən artıq əsərin, o cümlədən 200-dən çox elmi əsərin müəllifidir. İndiyədək 25 kitabı, 8 tədris proqramı çap olunmuşdur. 25 kitabdan on ikisi 15 cildlik külliyatına daxildir ki, onların da ümumi həcmi 750 çap vərəqindən artıqdır. O, müxtəlif səpkidə yazılmış 60 əsərin elmi redaktoru, 15-nin rəyçisi, 5-nin məsləhətçisi olmuşdur. 14 fəlsəfə doktoru və elmlər doktorunun opponenti olmuş, xeyli elmlər doktoru və fəlsəfə doktoru yetişdirmişdir. Rəhbərlik etdiyi Müasir Azərbaycan dili kafedrasında 21 il müddətində 8 nəfər filologiya elmləri doktoru yetişmişdir. 3 nəfər doktorantı müdafiə etmək ərəfəsindədir.

Prof. Həsən Mirzəyev Azərbaycan dilçiliyində «Fel» bəhsi üzrə məktəb yaratmış, türkologiyada mübahisə doğuran bir çox mövzulara (feli sifət, felin təsir kateqoriyası) aydınlıq gətirmişdir. «Dərələyəzin toponim və şivə sözləri», «Dərələyəz folkloru», «Qərbi Azərbaycanın Dərələyəz



*Müasir Azərbaycan dili kafedrasının əməkdaşları*

mahalı» (ensiklopedik məlumat) kimi sanballı monoqrafiyaları dilçiliyimiz, folklorumuz, tariximiz və coğrafiyamız üçün mötəbər mənbədir.

Kitablarının dördünü ulu öndər Heydər Əliyevin əziz xatirəsinə ithaf etmiş prof. H.Mirzəyev Respublika ali məktəb əlaçısı, Əmək veteranı, YAP siyasi şurasının, Yazıçılar və Jurnalistlər Birliyinin üzvüdür. «91»lərin ağsaqqallarından biri, «Şöhrət orden»lidir. Respublika Ağsaqqallar Şurasında sədr müavini kimi fəaliyyət göstərmişdir. 1998-ci ildə Birinci çağırış, 2000-ci ildə İkinci çağırış Azərbaycan Respublikası Milli Məclisinə deputat seçilmiş, Milli Məclisdə təhsil, elm və toponimika komissiyalarının üzvü olmuşdur. 2007-ci ildə «Əməkdar elm xadimi» fəxri adına, 2009-cu ildə prezidentin fərdi təqaüdünə layiq görülmüşdür. 2009-cu ildə «Borçalı cəmiyyəti» tərəfindən Borçalı elinin fəxri vətəndaşı seçilmişdir. 16 aprel 2010-cu il tarixdə Almaniyanın Hanover şəhərindəki Avropa Akademiyasının həqiqi üzvü seçilmişdir.

Kafedranın professoru V.Əliyev 1960-cı ildən dilçilik sahəsində fəaliyyət göstərir. Elmi tədqiqatları Azərbaycan dilçiliyi və türkologiya ilə bağlıdır. 200-ə qədər elmi məqalənin və «Azərbaycan dilində felin təsriflənməyən formaları», «Məsdər», «Azərbaycan dilində feli sifət», «Azərbaycan dilində feli bağlama», «Azərbaycan dilində felin perifrastik formaları», «Toponimika», «Azərbaycan toponimiyası», «H.Əliyevin dil siyasəti», «Zəngəzurda qalan izimiz» adlı kitabların müəllifidir. Azərbaycan EA-nın nəşr etdirdiyi

3 cildlik «Müasir Azərbaycan dili» əsərinin müəlliflərindən biridir. 1997-ci ildən ADPU-nun elmi işlər üzrə prorektorudur. YAP-ın əsasını qoyan «91» vətənpərvər ziyalıdan biridir. YAP Siyasi Şurasının və Azərbaycan Dövlət Dil Komissiyasının üzvüdür.

Kafedra üzvü prof. B.Ə.Xəlilov dekan vəzifəsinə seçildiyi müddətdə fakültədə xeyli işlər görmüşdür. O, 12 magistr yetişdirmiş və hal-hazırda 3 aspiranta, 5 dissertanta rəhbərlik edir. Rəhbərlik etdiyi dissertantların 3-nün işi müdafiəyə təqdim edilmişdir. 2001-ci ildə «İlin alimi» nominasiyasının, 2003-cü ildə «Vektor» Beynəlxalq Elm Mərkəzi Mükafat Komissiyasının qərarı ilə «Azərbaycanın gənc alimləri» Beynəlxalq layihəsinin qalibi olmuşdur. O, 2004-cü ildə Azad Qələmlər Cəmiyyəti tərəfindən Azərbaycan dili, ədəbiyyatı və türkologiya elmlərinin tədqiqi-təbliği sahəsindəki xidmətlərinə görə «Qızıl qələm» fəxri mükafatı laureatı seçilmişdir. 2006-cı ildə «Tərəqqi medalı» ilə təltif edilmişdir. 2009-cu ildə türk ədəbiyyatına xidmətləri ilə bağlı olaraq Türkiyə Cümhuriyyətinin KIBATEK Akademik ÜYESİ diplomunu almış və KIBATEK Akademik Üyesi seçilmişdir.

2011-ci ildə Azərbaycan Kütləvi İnformasiya Vasitələri İşçilərinin Həmkarlar İttifaqı tərəfindən «Xalqın nüfuzlu ziyalısı» mükafatına layiq görülmüşdür. 2007–2008-ci və 2008–2009-cu tədris illərində ADPU-da «İlin müəllimi» müsabiqəsinin, 2007, 2008, 2010-cu illərdə «İlin alimi» müsabiqəsinin qalibi olmuşdur. Prof. B.Ə.Xəlilov bir neçə dərslik, dərs vəsaiti və monoqrafiyaların, 7 tədris proqramının, 300-dən çox elmi və elmi-publisistik məqalənin müəllifidir.

O, Türkiyənin Ankara şəhərində Orxon-Yenisey yazılı abidələrinə həsr olunmuş konfransda (2007), Uluslararası VI türk dili qurultayında (2008), Türkmənistanın Aşqabad şəhərində XI əsrin hikmət sahibi Əhməd Yəsəviyə həsr olunmuş beynəlxalq tədbirdə (2010) iştirak etmiş və məruzələrlə çıxış etmişdir. Azərbaycan Yazıçılar Birliyinin, Azərbaycan Jurnalistlər Birliyinin üzvüdür.

Kafedranın əməkdaşları dilçiliyin müxtəlif problemləri ilə bağlı dəyərli əsərlər yazmışlar: prof. C.Cəfərov «Nitq hissələrində keçid prosesləri» (1983), «İnkarlığın ifadə vasitələri» (2000), «Müasir Azərbaycan dilinin morfologiyası» (2004), «Linqvistik təhlil nümunələri», «Nitq hissələrində keçid prosesləri və konversiya» (2009), prof. B.Xəlilov «Azərbaycan dilində təkhecalı fellərin əsasında duran ilkin köklərin fonosemantik inkişafı» (1995),

«Azərbaycan dilində ikihecalı fellərin fonosemantik inkişafı» (1996), «Fellərin ilkin kökləri» (1998), «Birinci Beynəlxalq Türkoloji Qurultay» (1999), «Azəri» (2000, həmmüəlliflə), «Müasir Azərbaycan dilinin morfologiyası, I hissə» (2000), «Türkologiyanın intibah dövrü» (2000), «Azərbaycan dili (6–7-ci siniflər)» (həmmüəlliflə), «Müasir Azərbaycan dilinin morfologiyası, II hissə dərsliyi» (2003), «Azərbaycan dili: dünən, bu gün» (2004), «Türkologiyaya giriş» (2006), «Müasir Azərbaycan dili: fonetika, yazı, əlifba, qrafika, orfoqrafiya, orfoepiya» (2007), «Müasir Azərbaycan dilinin leksikologiyası» (2008), «Mahmud Kaşğarinin «Divani lüğət-it-türk» əsərində etnonimlər» (2009), «Türkün hikmət xəzinəsi: Xoca Əhməd Yəsəvi» (2010), «224 qədim türk sözü» (2010), prof. M.İsmayılova «Azərbaycan dili terminologiyasının linqvistik təhlili» (1997), «Terminşünaslığın əsas məsələləri» (1999), «Terminologiyanın leksik-qrammatik məsələləri» (2006), «Azərbaycan dilinin tətbiqi işinin təkmilləşməsi», prof. İ.Bayramov «Ermənistan azərbaycanlılarının tarixi coğrafiyası» (şərikli, 1995), «Qərbi Azərbaycanın türk mənşəli toponimləri» (2002), «Qərbi azərbaycanlıların toponimlər sistemi» (2005), «Qərbi Azərbaycan şivələrinin leksikası» (2010), «Azərbaycan dilinin dialekt leksikası» (2011), dosent F.Məmmədova «Azərbaycan ədəbi dili» (2011), «Azərbaycan dilində linqvistik ekvivalentlər» (2011), K.Səmədova «Qərbi Azərbaycan (indiki Ermənistan) etnotoponimlərinin arealları» (2008) və s.

Hazırda kafedrada 14 nəfər – 6 nəfər elmlər doktoru, professor (Həsən Mirzəyev (kafedra müdiri), Vilayət Əliyev (elmi işlər üzrə prorektor), Buludxan Xəlilov (Filologiya fakültəsinin dekanı), Cəfər Cəfərov, Mirvari İsmayılova, İbrahim Bayramov (magistratura və doktorantura şöbəsinin müdiri), 1 nəfər fəlsəfə doktoru, dosent (Firuzə Məmmədova), 3 nəfər fəlsəfə doktoru, müəllim (Minaxanım Nəzərova, Yeganə Qəhrəmanova, Könül Səmədova), 2 nəfər müəllim (Sevinc Sadıqova, Mahirə Hüseynova), 2 nəfər baş laborant (Elnarə Niftəliyeva, Leyla Həsənova) çalışır.

### 3.2.2. AZƏRBAYCAN DİLÇİLİYİ KAFEDRASI

Azərbaycan dilçiliyi kafedrası 1943-cü ildə təşkil olunub. Kafedraya həmin ildən 1979-cu ilə qədər Azərbaycan EA-nın müxbir üzvü, Əməkdar elm xadimi, Dövlət mükafatı laureatı prof. Əbdüləzəl Dəmirçizadə rəh-



*Azərbaycan dilçiliyi kafedrasının əməkdaşları*

bərlik etmişdir. Prof. Əbdüləzəl Dəmirçizadə Azərbaycan dilçilik elminin təməlini qoyanlardan biri, onlarca monoqrafiya, dərslik, proqram, elmi-metodik göstəriş, 40-a qədər bədii əsər, iki yüzdən çox elmi-piblisistik məqalənin müəllifi və böyük dilçi alimlər ordusunun müəllimidir. Onun «Azərbaycan ədəbi dili tarixi xülasələri» (1938), «Axundovun dili və Axundov dil haqqında» (1942), «Müasir Azərbaycan dilinin fonetikası» (1960), «Azərbaycan dilinin üslubiyyatı» (1962), «Azərbaycan ədəbi dili tarixi» (1979) və s. kitabları çap olunmuşdur.

Kafedraya 1979-cu ildən 2009-cu ilə kimi AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, Dövlət mükafatı laureatı prof. Afad Qurbanov rəhbərlik etmişdir. Prof. A.Qurbanov dilçiliyin bir sıra sahələri üzrə elmi-tədqiqat işləri aparmışdır. Onun «Azərbaycan onomalogiyasının əsasları» (2 cilddə, 2004) monoqrafiyası Dövlət mükafatına layiq görülmüşdür. Prof. A.Qurbanov «Müasir Azərbaycan ədəbi dili» (2 cilddə, 2003), «Ümumi dilçilik» (2 cilddə, 2004), «Bədii mətnin linqvistik təhlili» (2005), «Müasir Azərbaycan ədəbi dilinə dair praktikum» (2 cilddə, 2005), «Türkoloji dilçilik» (2007), «Azərbaycan dilçiliyinin müasir problemləri» (2 cilddə, 2009) və s. adlı fundamental əsərlərin müəllifidir.

Kafedraya 2010-cu ildən filologiya elmləri doktoru, Əməkdar elm xadimi, prof. Nizami Xudiyev rəhbərlik edir. Prof. N.Xudiyev 60-dan artıq

monoqrafiya, dərslik və dərs vəsaitinin, 40-dan artıq sənədli televiziya filmlərinin ssenarisinin, 350-dən artıq elmi məqalənin, bir neçə proqramın müəllifidir. «Azərbaycan ədəbi dilinin lüğət tərkibinin inkişafı» (1986), «Azərbaycan ədəbi dilinin zənginləşmə yolları» (1987), «Azərbaycan ədəbi dilinin sovet dövrü» (1989), «Tərcümə ədəbiyyatı və ədəbi dilimiz» (1991), «XV–XVI əsrlər Azərbaycan ədəbi dili» (1994), «Azərbaycan milli ədəbi dilinin yaranması və inkişafı» (1994), «XX əsr Azərbaycan ədəbi dili» (1995), «Azərbaycan ədəbi dili tarixi» (Bakı,1995; Tehran,1999), «Heydər Əliyev və Azərbaycan dili» (Bakı; 1997, Tehran, 2004), «Radio, televiziya və ədəbi dil» (Bakı, 2001, Tehran, 2001), «Sabaha inamla» (2002), «Xalqın tarixi haqqı: dilimiz, varlığımız» (Bakı, 2004; Tehran, 2004), «Xalq və dövlət naminə» (2004), «Zamanın axarı ilə» (2 clddə, Bakı, 2004, 2008), «Azərbaycan antroponimlərinin təşəkkülü və inkişafı» (2005), «Cavad Heyət möcüzəsi» (2005), «Şəxsiyyət və zaman» (2006), «Uğurlu yolun layiqli davamçısı» (2007) kitablarını və s. qeyd etmək olar.

Prof. N.Ə.Əsgərovun son beş ildə «Azərbaycan makrotoponimləri» (2009), «Adın tarixi – tarixin adı – paleotoponimlər» (2010) dərs vəsaitləri, «Azərbaycan hidronimlərinin semantik xüsusiyyətləri» (2011) metodik vəsaiti, magistr və bakalavr hazırlığı üçün proqramları, 24 elmi məqaləsi çap olunmuşdur.

Dos. V.İsrafilovun «Şəxsiyyətin möcüzəsi» (2006) adlı kitabı, 120-ə qədər elmi məqaləsi, bir neçə tədris proqramı çap olunmuşdur. O, 2008-ci ildə Türkiyədə Uluslararası dil qurumu konfransında iştirak etmişdir.

Azərbaycan dilçiliyi kafedrasının dosenti M.Hüseynov 2006–2011-ci illərdə 30-dan çox elmi əsər çap etdirmişdir. Respublika daxilində 4, xarici ölkələrdə 2 beynəlxalq elmi konfransda iştirak etmişdir. Rusiyada, Türkiyədə, Ukrayna və Qazaxıstanda məqalə çap etdirmişdir. Əsas monoqrafiyaları bunlardır: «Yazıçının dili və üslubu» (1981), «Romanın üslub zənginliyi» (1990), «Şeirşünaslıqda dil sənətkarlığı» (2007); «Dil və poeziya» (2008), «Sözün poetikası» (2010), «Səsin poeziyası» (2010), «Poeziya dilinin milli qaynaqları» (2009) və s.

Dos. H.Hüseynovanın «Toponimlərin bəzi nəzəri problemləri» (2006), «Mir Cəlalın obrazlı dili» (2007), «Mir Cəlalın bədii əsərlərinin dili və üslubu» (2008), «Mir Cəlal: Aforizmlər. Antroponimlər» (2009) adlı kitabları və 50-dən artıq elmi məqaləsi nəşr olunmuşdur. Məqalələrdən 8-i xa-

ricdə çap olunmuşdur. H.Hüseynova hazırda ADPU-nun «Dilçilik» ixtisası üzrə magistrlərin müdafiə şurasının katibi, filologiya fakültəsi üzrə «Qızıl Aypara Cəmiyyəti»nin sədri vəzifəsini icra edir.

Dos. Y.Q.Yusifovun dilçiliyin müxtəlif sahələrinə dair 100-ə qədər məqaləsi çap olunmuşdur. Qazaxlı aşıq, şair və yazıçıların həyat və yaradıcılıqlarını əks etdirən kitabın tərtibçilərindən biridir.

Dos.A.Hüseynovun «Azərbaycan dialektologiyası» adlı vəsaiti 1958 və 1979-cu illərdə çap edilmişdir. Azərbaycanın Qax, Oğuz, Zaqatala, Balakən rayonlarının bütün kəndlərində fərdi dialektoloji müşahidələr aparmış və APİ-nin (indiki ADPU) elmi əsərlərində silsilə məqalələr və şimal-qərb şivələrinin lüğətini çap etdirmişdir. O, Azərbaycan SSR Ali Sovetinin «Fəxri fərmanı»na, Azərbaycan Respublikası Təhsil Nazirliyi tərəfindən «Azərbaycan Respublikası qabaqcıl təhsil işçisi» döş nişanına layiq görülmüşdür.

B.Sadıqov 1978-ci ildən Azərbaycan dilçiliyi kafedrasının dosentidir. 200-dən artıq məqalənin, bir neçə monoqrafiyanın müəllifidir. O, Azərbaycan Aşıqlar Birliyi və Azərbaycan Yazıçılar Birliyinin üzvüdür.

Dosent R.Həsənovun üslubiyyata, nitq mədəniyyətinə və dilçiliyin müxtəlif sahələrinə aid 100-dən artıq məqaləsi çap olunmuş, tədris etdiyi bir neçə fənnin proqramını hazırlamışdır.

Dos. Q.Mustafayeva 2006–2011-ci illərdə 10-dan çox məqalə, bir dərs vəsaiti («Azərbaycan dilinin üslubiyyatı») və beş proqram çap etdirmiş, Respublika daxilində 3 konfransda iştirak etmişdir.

İ.M.Kərimova 2004-cü ildə Azərbaycan dilçiliyi kafedrasında müəllim, 2009-cu ildən isə baş müəllim vəzifəsində çalışır. O, 2007-ci ildən AMEA-nın Nəsimi adına Dilçilik İnstitutunun dissertantıdır. Son illərdə 12 məqaləsi nəşr olunmuşdur.

Hazırda kafedrada 12 nəfər – 2 nəfər elmlər doktoru, professor (Nizami Xudiyev (kafedra müdiri), Nəbi Əsgərov), 7 nəfər fəlsəfə doktoru, dosent (Azər Hüseynov, Rasim Həsənov, Qızqayıt Mustafayeva, Vaqif İsrafilov, Məhərrəm Hüseynov (dekan müavini), Yusif Yusifov, Həcər Hüseynova), 1 nəfər baş müəllim (İradə Kərimova), 2 nəfər baş laborant (Umxanım Həsənova, Adilə İsayeva) çalışır.

## 3.2.3. AZƏRBAYCAN VƏ DÜNYA ƏDƏBİYYATI TARİXİ KAFEDRASI

Kafedranın yaranması universitetimizin bir təhsil ocağı kimi fəaliyyətə başladığı dövrə təsadüf edir. Universitetin «İctimai-lisaniyyət» şöbəsinin tərkibində «Dil-ədəbiyyat» bölməsi, sonralar «Dil-ədəbiyyat», «Ədəbiyyat», «Ədəbiyyat-incəsənət», «Azərbaycan ədəbiyyatı», «Azərbaycan ədəbiyyatı tarixi» adı ilə fəaliyyət göstərib. Hazırda «Azərbaycan və dünya ədəbiyyatı tarixi» adı ilə fəaliyyət göstərən kafedraya ilk illər görkəmli ədib, pedaqoq Abdulla Şaiq Talıbzadə rəhbərlik etmişdir.

1924-cü ildə B.Çobanzadə, İ.Hikmət, C.Əfəndizadə, Y.V.Çəmənzəminli kafedrada işə dəvət olunmuş, 30-cu illərdə kafedraya yeni qüvvələrin gəlişi başlanmışdır. Ə.Nazim, M.Rəfili, H.Nəzərli və M.S.Əfəndiyevin Azərbaycan və dünya ədəbiyyatı tarixi kafedrasında çalışmaları təlim-tərbiyənin keyfiyyətinin yüksəlməsinə təkan vermişdir. Sonralar Ə.Sultanlı, M.Quluzadə, H.Əfəndiyev, M.Əlizadə, Ə.Qarabağlı da kafedraya cəlb olundular. H.Araslı, M.Cəlal, C.Xəndan APİ-nin ilk aspirantları olaraq kafedraya yeni nəfəs gətirmişlər.

Ə.Nazim 30-cu illərin əvvəllərindən «Ədəbiyyat tarixi» kafedrasının müdiri olmuş və «Ədəbiyyat tarixi», «Ədəbiyyat nəzəriyyəsi» fənlərindən mühazirələr oxumuşdur. M.Rəfilinin də elmi-pedaqoji fəaliyyətinin mühüm bir hissəsi ADPU ilə bağlı olmuşdur. Prof. M.Rəfili kafedra müdiri kimi ixtisaslı kadrların hazırlanmasında xüsusi xidmətlər göstərmişdir. İ.Şıxlı və M.Həyatzadə Ə.Sultanlının rəhbərliyi altında «Xarici ölkələr ədəbiyyatı» ixtisası üzrə mütəxəssis kimi yetişmişlər.

Dos. Ə.Hüseynov 23 il Filologiya fakültəsində rus ədəbiyyatından mühazirələr oxumuş, fitri istedadı və qabiliyyəti ilə seçilmişdir. Onun «Sənət yanğısı» əsəri bu gün də elmi dəyərini qoruyub saxlayır. Akademik H.Araslının elmi-pedaqoji fəaliyyətinin böyük bir hissəsi – 1933–1941-ci illər dövrü bu kafedra ilə bağlı olub.

Azərbaycan ədəbiyyatı kafedrasına müxtəlif illərdə B.Çobanzadə, Ə.Nazim, M.Əfəndiyev, C.Xəndan, M.Rəfili, F.Qasımzadə, M.Məmmədov, P.Əfəndiyev, A.Hacıyev rəhbərlik etmişlər.

Prof. Himalay Qasımov 2003-cü ildən Azərbaycan və dünya ədəbiyyatı tarixi kafedrasına müdir vəzifəsinə seçilmişdir. O, «Ədəbiyyat nəzəriyyəsindən mühazirələr» (1981), «Bədiiliyin meyarı» (1990), «Müasir Azərbaycan romanı: janrın poetika və tipologiyası» (1994), «Müasir Azərbaycan romanının



*Azərbaycan və Dünya ədəbiyyatı tarixi kafedrasının əməkdaşları*

qaynaqları» (B., 1994), «Azərbaycan şeirinin poetikası» (1996), «Müasir Azərbaycan ədəbiyyatında yaradıcılıq meyilləri» (1998), «Şəhriyarın lirikası və etiqadı» (1999), «Azərbaycan ədəbiyyatının yaradıcılıq problemləri» (2004), «Şəhriyar poetikası» (2006, həmmüəlliflə), «Səməd Vurğunun poetik dünyası» (2006), «XX əsr Azərbaycan ədəbiyyatşünaslığı məsələləri» (2007, həmmüəlliflə), «H.Cavidin lirikası və dramaturgiyası» (2007), «Azərbaycan romanının inkişaf problemləri» (2008), «Azərbaycan şeirinin poetikası» (2008) kimi dərs vəsaiti və monoqrafiyaların, o cümlədən Azərbaycan ədəbiyyatının yaradıcılıq problemləri ilə bağlı 100-dən artıq elmi məqalənin müəllifidir.

Prof. H.Qasımovun elmi kadrların hazırlanmasında böyük xidmətləri olmuşdur. O, onlarla fəlsəfə doktoru və elmlər doktoru dissertasiyalarının elmi rəhbəri və məsləhətçisi, 40-dan çox namizədlik və doktorluq işinin rəsmi opponenti olmuşdur. AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunda və ölkənin müxtəlif universitetlərində İxtisaslaşdırılmış Dissertasiya Şuralarının üzvü olmuşdur. Hazırda Bakı Dövlət Universitetinin nəzdində fəaliyyət göstərən Dissertasiya Şurasının üzvüdür.

«Türk araşdırmaları» elmi-tədqiqat laboratoriyasının müdiri, filologiya elmləri doktoru, professor Elman Quliyevin elmi yaradıcılığı son illərdə daha məhsuldar olmuşdur. Onun «M.Şəhriyar: Gəldim sizi görməyə» (1992),

«S.Tahir. Lirika» (1992), «M.Şəhriyar. Heydərbabaya salam» (2004), «Mirzə İbrahimov: Ədəbi-estetik görüşlər və sənətkarlıq məsələləri» (1997), «Seyid Məhəmmədhüseyn Şəhriyar» (1999), «Müasir özbək ədəbiyyatı tarixi» (1999), «Heydərbabaya salam» necə varsa» (2001), «Türkiyə türk ədəbiyyatı» (2003), «Şəhriyar poeziyası və milli təkamül» (2004), «Şəhriyar poetikası» (2006, həmmüəlliflə), «Özbək ədəbiyyatı» (2009), «Türk xalqları ədəbiyyatının yaradıcılıq problemləri» (2010, həmmüəlliflərlə), «Orta əsrlər türk xalqları ədəbiyyatı» (2010), «Türk xalqları ədəbiyyatı» (2009; 2011), «Şərq xalqları ədəbiyyatı», (2 claddə, 2011) adlı kitabları işıq üzü görmüşdür. 1999-cu ildə «Mirzə Uluqbəy» (Özbəkistan) mükafatı almış, 2007-ci ildə C.Rumi – 800 (UNESCO) müsabiqəsinin laureatı və «İlin alimi» (2007, 2010) müsabiqəsinin qaliblərindən biri olmuşdur. Türk ədəbiyyatı problemlərinin öyrənilməsindəki xidmətlərinə görə 2011-ci ildə «Avropa Nəşr Mətbu Evi»nin qızıl medalı ilə təltif edilmiş, Şimali Kipr Cümhuriyyətinin Bakı təmsilçiliyinin ödülünü almışdır. Prof. E.Quliyev bir çox beynəlxalq konfranslarda məruzə ilə çıxış etmiş və həmin konfranslarda iclaslara sədrlik etmişdir. Onun M.Şəhriyarın 90 illiyi (İran, Tehran-Təbriz, 1998), M.Şəhriyarın 100 illiyi (İran-Tehran 2006, Türkiyə-Ankara 2007), Mehmed Akif Ərsoy (Türkiyə-Burdur, 2008), Uluslararası öğretmen yetişdirme politikaları və sorunları (Türkiyə-Ankara-Hacəttəpə Universıteti, 2010), Xoca Əhməd Yəsəvi və Şərq sufi ədəbiyyatı (Türkmənistan, Aşqabad, 2010), «Dədə Qorqud» və keçmişdən gələcəyə türk dastanları» (Şimali Kipr, Lefkoşa, 2010), Uluslararası Namiq Kamal simpoziumu (Türkiyə-Tekirdağ, 2010) və s. digər beynəlxalq elmi tədbirlərdə etdiyi çıxışlar və elmi nəticələri yüksək qarşılanmış, təqdir olunmuşdur.

Prof. T.S.Cavadov «Pedaqoji mühit və uşaq ədəbiyyatı» (1992, şərikli), «Faciəli talelər» (1998), «Müasir Azərbaycan romanının poetikası (XX əsrin 80-ci illəri)» (2005), «Müasir Azərbaycan romanı: janr təkamülü (XX əsrin 80-ci illəri)» (2007), «Ən yeni Azərbaycan ədəbiyyatı məsələləri» (2008), «Tarixi və çağdaş ədəbi prosesə dair araşdırmalar» (2009) monoqrafiyalarının, «Ədəbi tənqid tarixinə dair portret – oçerklər» adlı dərs vəsaitinin, 150-dən artıq elmi məqalənin, «Azərbaycan klassik uşaq ədəbiyyatı antologiyası»nın müəlliflərindən biridir. «İlin alimi» müsabiqəsinin qaliblərindən (III yer) biri olmuşdur.

Dos. R.M.Əhmədovun «İsmayıl Şıxlı» (Biblioqrafiya) (1983), «Məmməd Arif (tənqid və dramaturgiya)» (1986), «Azərbaycan dramaturgiyası yeni mərhələdə» (1992), «Cəfər Cabbarlının dramaturgiyası» (1994), «Səməd Vurğunun dramaturgiyası: tarixilik və müasirlik» (1996), «Sənət və həyat» (2005), «Azərbaycan dramaturgiyası: ideallıqla reallığın vəhdəti (H.Cavid, C.Cabbarlı və S.Vurğunun pyesləri əsasında)» (2009) adlı kitabları, 4 tədris proqramı və 60-dan yuxarı elmi-nəzəri və metodiki məqaləsi çap olunmuşdur.

Dos. Y.H.Rzayev «Bədii söz və milli azadlıq şüuru», «Azərbaycan romanı: siyasət və milli düşüncə (1930–1955-ci illər)» adlı monoqrafiyaların və 50-dən çox məqalənin müəllifidir.

Dos.T.Y.Rəhimli 10-dan artıq elmi, bədii və publisistik kitabın redaktoru, ön söz müəllifi və rəyçisi olmuşdur. «Ədəbiyyat və tənqidin yaradıcılıq problemləri» adlı dərs vəsaitinin və 15 elmi məqalənin müəllifidir.

Hazırda kafedrada 12 nəfər – 3 nəfər elmlər doktoru, professor (Himalay Qasımov, Elman Quliyev, Təyyar Cavadov), 5 nəfər fəlsəfə doktoru, dosent (Ramin Əhmədov, Nəcəf Nəcəfov, Yaşar Rzayev, Nazilə Məmmədova, Təranə Rəhimli), 1 nəfər fəlsəfə doktoru, baş müəllim (Təranə Əzimova), 1 nəfər müəllim (Yeganə Qasımova), 2 nəfər böyük laborant (Zərnurə Hüseynova, Ətrabə Səfərova) çalışır.

### 3.2.4. FOLKLOR VƏ QƏDİM ƏDƏBİYYAT KAFEDRASI

2002-ci ilin fevralında yaradılan Folklor və qədim ədəbiyyat kafedrasına prof. T.C.Novruzov rəhbərlik edir.

Kafedrada – folklor və qədim ədəbiyyatın aktual problemləri araşdırılır, «Azərbaycan şifahi xalq ədəbiyyatı», «Qədim dünya ədəbiyyatı», «Orta əsrlər Azərbaycan və qərb ədəbiyyatı», «Azərbaycan ədəbiyyatı tarixi» (ümumi kurs), «Azərbaycan satirasının inkişaf istiqamətləri» (seçmə fənn) və s. fənlər tədris olunur.

«Sabir irsinin tədqiqi və təbliği», «M.Ə.Sabir» (tədqiqat tarixindən), «Sabir və davamçıları», «Sabir ədəbi məktəbi», «M.Ə.Sabir», «Müasir şeirimizdə Sabir ənənələri», «Şərq və qərb ədəbi əlaqələrimiz», «Ədəbiyyat və ədəbiyyatşünaslıq məsələləri», «M.Ə.Sabir: axtarışlar, tapıntılar», «Cəfər Xəndan Hacıyev: həyatı və yaradıcılıq yolu» kimi fundamental monoqrafiyaları, «Azərbaycan dilindən təcrübi məşğələlər» (həmmüəllifl ə), «Xarici



*Folklor və qədim ədəbiyyat kafedrasının əməkdaşları*

ədəbiyyat» (orta əsrlər və intibah dövrü), «XII əsr Qərb ədəbiyyatı», «Antik ədəbiyyatı tarixi» (II dəfə nəşr olunub), «Qədim Şərq ədəbiyyatı tarixi», «Qədim dünya ədəbiyyatı tarixi», «Orta əsrlər Qərb ədəbiyyatı», «Antik ədəbiyyat müntəxəbatı» adlı dərslik və dərs vəsaitləri prof. T.Novruzovun qələminin məhsuludur. Dövri mətbuatda 250-yə qədər məqaləsi çap olunub. 9 dərslik, 7 dərs vəsaiti, 11 monoqrafiya və 6 proqramın müəllifidir. «Tərəqqi» medalı ilə təltif olunmuşdur. «İlin alimi» müsabiqəsinin qaliblərindən biri olmuşdur. 2008-ci ildə «Qızıl Qələm» Media Mükafatı laureatı diplomunu almışdır.

Prof. Paşa Əfəndiyev Azərbaycanın görkəmli folklorşünas alimlərindən biri, Əməkdar elm xadimidir. Respublikamızda ilk dəfə «Azərbaycan folklorşünaslığının tarixi» mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. Repressiyaya uğramış Hənəfi Zeynallı, Salman Mümtaz, Vəli Xuluflu, Əmin Abid, Yusif Vəzir Çəmənzəminli kimi alimlərin folklorşünaslıq fəaliyyəti onun tədqiqat obyektinə çevrilmişdir. O, ali məktəb tələbələri üçün Azərbaycan şifahi xalq ədəbiyyatından ilk dərsliyin müəllifidir. 30-a qədər dərslik, dərs vəsaiti və monoqrafiya çap etdirmişdir. 200-ə qədər elmi-metodiki məqalənin müəllifidir. «C.Cabbarlı və xalq ədəbiyyatı» (1985), «Səməd

Vurğun və xalq yaradıcılığı» (1992), «Xalqın söz xəzinəsi» (1985), «Dastan yaradıcılığı» (1999), «Azərbaycan folklorşünaslığı» (müntəxəbat) (2000), «Azərbaycan folklorşünaslığının problemləri» (5 cilddə) kitabları vardır. 35 il xalq aşığı Molla Cümənin şeirlərini toplamaqla məşğul olmuş və onun 4 kitabını çap etdirmişdir.

Prof. Rəfael Hüseynov bir sıra irihəcmli monoqrafiyaların, çoxsaylı elmi və publisistik məqalələrin müəllifidir: «Məhsəti necə varsa», «Vaxtdan uca», «Rəfibəylilər», «Millətin zərrəsi», «Məhsəti Gəncəvi – özü, sözü, izi» və s. Son illərdə «Risalə», «Şərq tərcümə toplusu» adlı kitablar onun redaktəsi ilə çap olunmuşdur. Yazıçılar Birliyinin üzvüdür. Son iki çağırış Milli Məclisin üzvü seçilmişdir.

Prof. Rafiq Əliyev (Yusifoğlu) 60-a yaxın monoqrafiya, dərslik, dərs vəsaiti, tərcümə və bədii kitabların müəllifidir. Bunlardan «Azərbaycan poeması, axtarışlar və perspektivlər», «Kitabi-Dədə Qorqud», «Uşaq ədəbiyyatı», «Müasir ədəbi proses və ədəbi tənqid», «Ədəbiyyatşünaslığın əsasları», «Uşaq ədəbiyyatı», «Azərbaycan dili-2» (şərikli), «Azərbaycan poemasının sənətkarlıq xüsusiyyətləri» kimi kitabları misal göstərmək olar.

Prof. Mahmud Allahmanlı Azərbaycan şifahi xalq ədəbiyyatının, eləcə də türk xalqlarının şifahi yaradıcılığının bir sıra aktual problemləri ilə bağlı araşdırmalar aparmışdır. «Aşıq Valehin sənət dünyası» (1991), «Şamanla ozan arasında» (1996), «Ozan, aşiq və aşıq» (1997), «Türk dastan yaradıcılığı» (1998), «Din, təriqət və aşıq» (1999), «Ağlın və yaddaşın dedikləri» (2000), «Şaman, ozan və aşıq» (2002), «Haqdan yanan ocaq» (2005), «Ədəbi düşüncələr» (2006), «Krım tatar ədəbiyyatı (problemlər, mülahizələr)» (2007), «Aşıq Ömərin yaradıcılığı» (2008), «Ədəbiyyat məsələləri (məqalələr)» (2009) adlı kitabları var. Krım tatarlarının ədəbiyyatı ilə bağlı araşdırmalarına görə Ukrayna Respublikasının Bəkir Çobanzadə adına mükafatına (2009) layiq görülüb.

Dos.Akif Əliyev əsasən müasir Azərbaycan ədəbiyyatının problemlərinin tədqiqi ilə məşğul olur. «Azərbaycan ədəbiyyatının sovet dövrü» (1984), «Qələbə və ədəbiyyatımız» (1985), «Ədəbiyyat və həqiqət» (1990), «Cəsarət və mərdlik rəmzi» (1997), «Ədəbiyyatımıza müasir baxış» (1999), «Heydər Əliyev və ədəbiyyatımız» (2007), «Ədəbiyyat nəzəriyyəsindən mühazirələr» (2010) adlı kitabların, 500-dən artıq publisistik, 100-dək

filoloji aspektli məqalənin müəllifidir. Azərbaycan Yazıçılar Birliyinin üzvüdür. Dos. Nigar Qasımzadənin «Azərbaycan uşaq ədəbiyyatının XX əsrin əvvəllərində inkişafı» adlı dərsliyi (rus dilində) və onlarla elmi məqaləsi çap olunmuşdur. Filologiya elmləri doktoru Ramazan Qafarlı 6 monoqrafiyanın, iki dərs vəsaitinin, bir neçə folklor toplusunun, o cümlədən «Mif və nağıl» (1999), «Azərbaycan atalar sözləri, xalq mahnıları və dramlarının poetikası» ( 2001), «Mifologiya və folklorşünaslıq məsələləri» (2002), «Mif, əfsanə, nağıl» ( 2002), «Azərbaycan türklərinin mifologiyası» (bərpa, genezis) (2004), «Azərbaycan türklərinin mifologiyası» (Mifik dünya modeli, təsnifat) (2004), «Azərbaycan folkloru antologiyası»nın «Şəki folkloru» (2002), «Lütfəli kişidən folklor nümunələri» toplusunun (2003), eləcə də 200-dən çox elmi-publisistik məqalənin müəllifidir. O, AMEA-nın Ədəbiyyat İnstitutunun hazırladığı 6 cildlik «Azərbaycan ədəbiyyatı tarixi»nin 1-ci cildinin (2004) üç oçerkinin: «Uşaq folkloru», «Xalq dramları», «Xalq mahnıları» müəllifidir. Bir sıra əsərləri xarici ölkələrdə – Türkiyədə, Rusiyada çap olunmuşdur. Dos. Yaqub Babayev «Pedaqoji mühit və uşaq ədəbiyyatı» (həmmüəlliflərlə, 1991), «Təriqət ədəbiyyatı: Sufizm, hürufizm» (2007), «Ana dilli Azərbaycan ədəbiyyatının təşəkkülü və epik şeirin inkişafı (XIII–XIV əsrlər)» (2008), «XIII–XIV əsrlər ana dilli lirik şeirlərimizin inkişaf yolu» (2009) və s. kitabların, folklor və klassik ədəbiyyatla bağlı xeyli sayda elmi məqalələrin müəllifidir. Dos.Qüdrət Umudov «Folklorşünaslığımızın tarixindən» (1995), «Azərbaycan folklorşünaslığı: tarixi və problemləri» (2011) adlı kitabların, 50-dək elmi məqalənin müəllifidir. Filologiya üzrə fəlsəfə doktoru, baş müəllim Sakibə Ələsgərovanın xeyli elmi və publisistik yazıları, müxtəlif elmi əsərlərə yazdığı resenziyaları çap olunmuşdur.

Hazırda kafedrada 14 nəfər – 5 nəfər elmlər doktoru, professor (Tərlan Novruzov, Paşa Əfəndiyev, Rəfael Hüseynov, Rafiq Əliyev (Yusifoğlu), Mahmud Allahmanlı), 1 nəfər elmlər doktoru (Ramazan Qafarlı), 4 nəfər fəlsəfə doktoru, dosent (Nigar Qasımzadə, Akif Əliyev, Qüdrət Umudov, Yaqub Babayev), 1 nəfər fəlsəfə doktoru, baş müəllim (Sakibə Ələsgərova), 3 nəfər baş laborant (Arifə Abdullayeva, Şəhanə Məhərrəmova, Ulduz Qəhrəmanova) çalışır.

## 3.2.5. ƏDƏBİYYAT VƏ ONUN TƏDRİSİ METODİKASI KAFEDRASI

«Ədəbiyyatın tədrisi metodikası» fənni institutun təşkilinin ilk illərindən tədris olunur. Bir müddət bu fənni prof. Mikayıl Rəfili, akademik Feyzulla Qasımzadə tədris etmiş, həmin sahənin mütəxəssisləri yetişdikdən sonra 1973-cü ildə müstəqil kafedra təşkil olunmuşdur. Kafedranın yaradıcısı və ilk müdiri görkəmli folklorşünas alim prof. Fərhad Fərhadov olmuşdur.

Kafedra müstəqil şəkildə fəaliyyətə başlayan gündən həm ədəbiyyat metodikası, həm də uşaq ədəbiyyatı fənlərini əhatə etmişdir. O, 1994–1998-ci illərdə «Ədəbiyyatın tədrisi metodikası» və «Uşaq ədəbiyyatı» adları ilə iki müstəqil kafedra kimi fəaliyyət göstərmişdir. Ədəbiyyatın tədrisi metodikası kafedrasına prof. Aydın Hacıyev, uşaq ədəbiyyatı kafedrasına isə prof. Zahid Xəlil rəhbərlik etmişdir. 1998-ci ildən hər iki kafedra Ədəbiyyatın tədrisi metodikası kafedrası adı altında birləşdirilmişdir. Hazırda kafedra müdiri filologiya elmləri doktoru, prof. Z.Xəlildir.

Prof. Zahid Xəlil elmi-pedaqoji və ictimai-ədəbi fəaliyyəti ilə seçilən tanınmış alimlərimizdən və tanınmış uşaq yazıçılarımızdan biridir. O, UNESCO-nun uşaq ədəbiyyatının tədqiqi ilə məşğul olan Beyəlxalq təşkilatının (MOİDL) tədbirlərində dəfələrlə iştirak edib, bu ədəbiyyatın problemləri ilə bağlı məruzə və çıxışlara qatılıb. Moskvada rus dilində çap olunmuş «Detskaya literatura Azerbaydjana» adlı monoqrafiyası təkcə bizim respublikada deyil, Rusiyanın ali məktəblərində də dərs vəsaiti kimi istifadə olunur. Professor Z.Xəlil, həmçinin Respublikanın ali məktəbləri üçün uşaq ədəbiyyatı proqramlarının, dərsliklərinin yazılmasında, kurikulumların, yeni tədris standartlarının hazırlanmasında fəal iştirak etmiş, Təhsil Nazirliyinin yaratdığı xüsusi komissiyaya rəhbərlik etmişdir. Hazırda «Azərbaycan dili və ədəbiyyatı» ixtisası üzrə respublika olimpiadasının sədridir. O, Ankarada və Bakıda keçirilən Beynəlxalq Elmi Konfranslarda müəllim hazırlığının problemləri ilə bağlı məruzələr etmişdir. Moskvada MŞPU-da (Moskva Şəhər Pedaqoji Universitetində) UNESCO-nun keçirdiyi Beynəlxalq Elmi Konfransda «Azərbaycanda məktəbəqədər təhsilin vəziyyəti və qarşıda duran vəzifələr» mövzusunda məruzə etmişdir. İbtidai məktəbin II, III sinifləri üçün «Azərbaycan dili» (2009–2010), ali məktəblər üçün «Uşaq ədəbiyyatı» dərsliklərinin (2009, 2010) müəllifidir.



*Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının əməkdaşları*

Fakültənin ən nüfuzlu müəllimlərindən biri olan Dos. Bilal Muradov ömrünün 50 ildən çoxunu ADPU-da fəaliyyət göstərmişdir. Onun «Ədəbiyyat tədrisi metodikasının nəzəri əsasları», «Məktəbdə ədəbiyyat kursunun məzmunu və tədrisinin təşkili məsələləri», «Ədəbiyyat dərslərində şifahi və yazılı nitqin inkişaf etdirilməsi», «Orta məktəbdə ədəbi əsərlərin öyrədilməsi», «Məhəmməd Füzulinin məktəbdə tədrisi», «M.Füzuli və İ.Nəsiminin tədrisi», «Nitq mədəniyyəti üzrə mühazirə mətnləri» kimi kitabları ali və orta məktəb tələbələri üçün çox faydalıdır.

Dos. Füzuli Əsgərli uşaq ədəbiyyatı üzrə mütəxəssisdir. «Sənətkarın uşaq dünyası», «Ədəbi düşüncələr», «Azərbaycan uşaq ədəbiyyatının mərhələli inkişafı», «Bədii tərcümə prinsipləri, «Ömrün sözü, sözün ömrü», «Uşaq ədəbiyyatı: qarşılıqlı yaradıcılıq qaynaqları», «Bədii təhlil və ədəbi tənqid», «Zahid Xəlilin sənət dünyası» adlı monoqrafiyaların və «Uşaq ədəbiyyatı» dərsliklərinin müəlliflərindən biridir.

Dos. Soltan Hüseynov, dos. Fəxrəddin Yusifov «Orta məktəbdə S.Ə.Şirvani əsərlərinin dilinin öyrədilməsi», «Orta məktəbdə «Dastani-Əhməd Hərami»nin məzmununun öyrədilməsi», «Məktəbdə ədəbiyyat dərslərinin təşkili», «Məktəbdə Nəsimi əsərlərinin məzmununun öyrədilməsi», «İfadəli oxu» (pedaqoji fakültə tələbələri üçün), «Ədəbiyyatın tədrisi metodikası» dərs vəsaitlərinin müəllifidir.

Dos. Zemfira Tahirli Respublikanın Əməkdar müəllimidir. Onun «Böyük Vətən müharibəsi dövründə Azərbaycan uşaq şeiri» kitabı tələbələrə daim gərəkli olan elmi-pedaqoji əsərlərdəndir.

Hazırda kafedrada 16 nəfər – 1 nəfər elmlər doktoru, professor (Zahid Xəlil (kafedra müdiri)), 10 nəfər fəlsəfə doktoru, dosent (Bilal Muradov, Şəkərxanım Ömərova, Zemfira Tahirli, Soltan Əliyev, Fəxrəddin Yusifov, Füzuli Əsgərli, Cəmilə Məhərrəmova, Sədaqət Hüseynova, Vaqif Əliyev, Aygün Əhmədova), 1 nəfər fəlsəfə doktoru, baş müəllim (Şöhrət Nəsirova), 1 nəfər baş müəllim (Roza Ağayeva), 1 nəfər fəlsəfə doktoru, müəllim (Tənzilə Əliyeva), 1 nəfər baş laborant (Gülnarə Nurəliyeva), 1 nəfər laborant (Gülnar İbrahimova) çalışır.

### 3.2.6. AZƏRBAYCAN DİLİ VƏ ONUN TƏDRİSİ METODİKASI KAFEDRASI

Təməli 1947-ci ildə qoyulan kafedra 1957-ci ilədək «Azərbaycan dili və onun tədrisi metodikası» adı altında fəaliyyət göstərmiş, 1957-ci ildə isə «Azərbaycan dilinin tədrisi» fənni prof. Ə.Dəmirçizadənin rəhbərlik etdiyi «Azərbaycan dili» kafedrasına birləşdirilmişdir. 1959-cu ildə bu kafedranın bazası əsasında «Azərbaycan dili və onun tədrisi metodikası» kafedrası yaradılmışdır.

Kafedraya təsis olunduğu gündən 1979-cu ilədək görkəmli metodist-alim prof. Ağamməd Abdullayev rəhbərlik etmişdir. Prof. A.Ş.Abdullayev 100-dən çox elmi əsər və məqalənin müəllifi olmuşdur. Onun «Orta məktəbdə Azərbaycan dili tədrisi metodikası» (1978), «Azərbaycan dilinin tədrisi tarixindən» (1966) monoqrafiyaları sanballı tədqiqat əsərləridir.

1979-cu ildən 2009-cu ilədək kafedraya prof. Həsən Balıyev rəhbərlik etmişdir. O, 40-dan çox elmi əsərin, 200-dək elmi-publisistik məqalənin

müəllifidir. «Orta məktəbdə Azərbaycan dilinin tədrisi metodikası» (1996, 2003), «Azərbaycan dilinin tədrisi metodikasından mühazirələr» (1978), «Azərbaycan dili» (Dillər İnstitutu tələbələri üçün dərslik – 1972), «Azərbaycan dili II təlimdə» (2003), «Azərbaycan dili» (təbiət elmləri fakültəsi tələbələri üçün, 2001), «Azərbaycan dili» (rus qrupları üçün dərslik, 2006), «Azərbaycan dili» (türk dinləyiciləri üçün dərslik, 2009) kitabları nəşr olunmuşdur. Prof. H.Balıyev 1997–2006-cı illərdə Filologiya fakültəsinin dekanı olmuş, respublikanın ictimai həyatında fəal iştirak etmişdir.

2009-cu ildən 2011-ci ilin sentyabrınadək kafedraya ictimai əsaslarla prof. Buludxan Xəlilov rəhbərlik etmişdir.

Hazırda kafedraya filologiya elmləri doktoru, professor Əzizxan Tanrıverdiyev rəhbərlik edir. O, 15 kitabın və 150-dən artıq elmi məqalənin müəllifidir. «Kitabi-Dədə Qorqud»un obrazlı dili» (2006), «Kitabi-Dədə Qorqud»un söz dünyası» (2007), «Dədə Qorqud kitabı»nın dil möcüzəsi» (2008), «Dilimiz və mənəviyyatımız» (2008), «Poeziyanın dili, dilin poeziyası» (2008), «Qədim türk mənbələrində yaşayan şəxs adları» (2009), «Azərbaycan dilinin tarixi qrammatikası» (2010) əsərləri Ə.Tanrıverdiyevin sanballı tədqiqat əsərləridir. O, 2009-cu ildə ADPU üzrə keçirilən «İlin alimi» müsabiqəsinin qaliblərindən biri olmuşdur.

Kafedranın sabiq üzvləri prof. N.Abbasova, prof. N.Abdullayeva, İ.Bayramov, N.Əhmədov, dos. B.Rəhimova, Ə.Əhmədov, Ə.Kəlbəliyev, S.Quliyeva, S.Qasımova, Ə.Şirinov, N.Hacıyev, M.Həsənov, F.Əbdürrəhimov, H.Hüseynov, İ.İsmayılov, Z.Məmmədovun elmi-metodik tədqiqatları bu sahədə müstəsna xidmət kimi qiymətləndirilməlidir.

Kafedranın ilk aspirantı p.e.d., prof. Ə.Fərəcovun xidmətləri də unudulmazdır. Uzun müddət Filologiya fakültəsi qiyabi şöbəsinin dekanı kimi çalışmış alim orta məktəblər üçün Azərbaycan dili dərsliklərinin, 10-a qədər kitabın və 100-dən artıq elmi məqalənin müəllifidir.

Prof. N.Abdullayevın «Ədəbi tələffüz təliminin metodikası» (1986), «Nitq mədəniyyətinin əsasları» (2005), filologiya elmləri doktoru M.Nuriyevanın «Nitq mədəniyyəti və üslubiyyat məsələlərinə dair» (1994), «Rus dilində türk sözləri» (2001), «İslahatlar, müharibələr. Türk şəhərlərinin taleyi» (2005) əsərləri diqqəti cəlb edir.

Filologiya elmləri doktoru, prof. M.Nuriyevanın elmi tədqiqatları çoxşaxəlidir. O, bir sıra beynəlxalq konfranslarda (8 dəfə) ölkəmizi



*Azərbaycan dili və onun tədrisi metodikası kafedrasının əməkdaşları*

layiqincə təmsil etmiş, sanballı əsərlər nəşr etdirmişdir. «Türk əsilli ruslar» (2010), «Türk sözləri rus dilində» (2010), «Türk kitabı» (2009), «Qafqaz islam ordusunun fəaliyyət xronologiyası (Türkiyə–2011) əsərləri son illərdə işıq üzü görmüşdür. Müxtəlif səpkili 440-dan artıq elmi-publisistik məqalənin müəllifidir.

2007–2011-ci illərdə fakültədə dekan müavini vəzifəsində çalışmış, dosent K.Bəşirovun 60-a yaxın elmi məqaləsi, 5 kitabı: «Sözün tərkibi üzrə təhlilə dair» (1996), «III sinifdə Azərbaycan dili dərsləri» (2000), «Azərbaycanın mürəkkəb quruluşlu toponimləri» (2007), «Orta məktəbdə morfologiyanın tədrisi məsələləri» (2009), «Oğuz qrupu türk dillərində qrammatik morfemlər» (2009) və 3 proqramı nəşr olunmuşdur.

Respublikanın Əməkdar müəllimi dos. Ə.Abbasov 160 elmi-metodik məqalənin, «V sinifdə Azərbaycan dili» (şərikli müəlliflərlə) (2009), «VI sinifdə Azərbaycan dili (təlimi rus dilində olan məktəblər üçün)» (2006), «İmla mətnləri» (Ə.Əfəndizadə ilə birlikdə) (2009), «X sinifdə Azərbaycan dili» (təlimi rus dilində olan məktəblər üçün) (2006) və s. dərslik və dərs vəsaitlərinin müəllifidir.

Kafedra üzvlərindən dos. R.Məhərrəmovanın 23 elmi məqaləsi, «Tovuz rayonu onomastik vahidlərinin tarixi-linqvistik təhlili» (2006), «Azərbaycan dili dərslərində fəndaxili və fənlərarası əlaqə» (2008), «Azərbay-

can dili dərslərində təlimin keyfiyyətinin yüksəldilməsi» (2010) adlı kitabları, dos. H.Əliyevin ana dilinin tədrisi metodikasına dair 26 məqaləsi, «Azərbaycan dilinin izahlı lüğəti» (A-Y) (2001), «Nitq hissələrinin müqayisəli tədrisi» (2006), «Durğu işarələrinin işlədilməsi qaydaları» (həmmüəlliflə, 2011) adlı kitablar, dos. P.Paşayevanın «İbtidai siniflərdə fonetikanın tədrisinin elmi-metodik əsasları» (2007), «Azərbaycan dilinin tədris metodikasından kurs işlərinin hazırlanması metodları» (2011) adlı kitablar, 17 elmi-metodik məqaləsi, dos. Şəlalə Nəbiyevanın 31 elmi məqaləsi, «İbtidai siniflərdə bədii mətnin tədrisi problemləri» (2008), «Ana dili dərslərində şagirdləri fəallaşdıran tapşırıqlar» (2010), «Ana dili tədrisi metodikasının aktual problemləri» (2010) adlı dərs vəsaitləri, dos.Məmmədxan Soltanovun «Azərbaycan dili», «İfadəli mətnləri» (2006), «İmla mətnləri» (2007), «Məktəblinin izahlı lüğəti» (2008) adlı metodik vəsaitləri və 30 elmi məqaləsi, dos. A.Hacıyevin «Azərbaycan dilinin onomastik sistemi» (2006), dos. Misir Səfərovun «Əbülhəsən Ələkbərzadənin nəsr dili» (1992) vəsaitləri, b/müəl. A.Balıyevin «Ana dilinin tədrisi metodikasından praktikum və laborator məşğələlər» (2009), «Türk bölməsində Azərbaycan dili» metodik vəsaiti və 30-dan çox elmi məqaləsi, b/müəl. İ.Abbasovun dilçilik və ədəbiyyatşünaslığın bir sıra aktual problemlərinə həsr olunmuş çoxsaylı məqalələri, müəllim A.Kazımovun 71 elmi məqaləsi, ana dilinin tədrisi metodikasına dair bir neçə kitabı; «Ana dilinin izahlı lüğəti», «Ana dili dərslərində interaktiv təlim metodları», «Durğu işarələrinin işlədilməsi qaydaları», «Linqvistik təhlilin aparılması metodikası» və s. nəşr edilmişdir.

Hazırda kafedrada 29 nəfər – 2 nəfər elmlər doktoru, professor (Əzizxan Tanrıverdiyev (kafedra müdiri), Minaxanım Nuriyeva), 1 nəfər fəlsəfə doktoru, professor (Nadir Abdullayev), 12 nəfər fəlsəfə doktoru, dosent (Qabil Tahirov, Tamara Babayeva, Misir Səfərov, Kamil Bəşirov, Həmzə Əliyev, Məmmədxan Soltanov, Şəlalə Nəbiyeva, Pəri Paşayeva, Rəhilə Hümmətova, Ənvər Abbasov, Allahverdi Hacıyev, Faiq Şahbazlı), 2 nəfər fəlsəfə doktoru, müəllim (Mələk Məmmədova, Nazilə Yusifova), 4 nəfər baş müəllim (İlham Abbasov, Nahidə Əfəndiyeva, Adil Balıyev, Fəridə Əliyeva), 4 nəfər müəllim (Arif Kazımov, Gültəkin Abdullayeva, Tahirə Səfərova, İnci Əliyeva), 4 nəfər laborant (Sənubər Bağırova, Nüşabə Mukimova, Maya Kərimova, Fatma Allahverdiyeva) çalışır.

## 3.2.7. İNGİLİS DİLİ VƏ ONUN TƏDRİSİ METODİKASI KAFEDRASI

2008-ci ilin noyabrında Universitetimizdə ingilis dili ixtisasına tələbə qəbulunun artması (ilk illər 25, sonra 50–75 nəfər) ilə əlaqədar olaraq «Xarici dillər» kafedrası bazasında yeni «İngilis dili və onun tədrisi metodikası» kafedrası yaradıldı. Kafedraya filologiya elmlər doktoru, prof. Balaxan Hüseynov seçildi. Kafedra «Xarici dillər» kafedrası bazasında yarandığı üçün «Xarici dillər» kafedrasından 14 nəfər müəllim – filologiya üzrə fəlsəfə doktoru Faida İsayeva, filologiya üzrə fəlsəfə doktoru Jalə Bəşirova, b/m Dilarə Sadıqova, b/m Zemfira Əliyeva, b/m Ülviyyə Hacıyeva, b/m Mirvari Qasımova, b/m Təranə Rzayeva, müəllimlər: Maral Ağayeva, Yasəmən Babayeva, Aytən İsmayılova, Günel Şamxalova, Sevda Xəlilova bu kafedraya köçürüldü.

Kafedra yarandığı ilk gündən ingilis dilini mükəmməl bilən və tədris edən kadrların seçilməsinə üstünlük verir. Kafedra müəllimlərinin bilik səviyyəsini artırmaq üçün onları yeni metodika ilə işləyən intensiv dil kurslarına göndərir, yeni dərslik və dərs vəsaitlərindən, audio-video materiallarından istifadə edir. Kafedra müdiri prof. B. Hüseynov Türkiyənin İzmir şəhərində Egey Universitetində (2008) keçirilən ETEN-in (Beynəlxalq İngilis dili müəllimlərinin Assosiasiyası) konfransında ADPU-da tədris prosesinin təşkili ilə bağlı geniş mühazirə ilə çıxış etmişdir. ADPU ilə bağlı təqdimat rəğbətlə qarşılanmış və Universitetimiz Respublikada ETEN-ə seçilmiş ilk Universitet olmuşdur.

Kafedra əməkdaşları Respublikamızın bir çox ali məktəbləri – BDU, ADU, Qafqaz və Sumqayıt Dövlət Universitetinin müvafiq kafedraları ilə sıx əlaqə saxlayır.

Kafedra müdiri B.Q.Hüseynovun rəhbərliyi ilə son 5 ildə 6 nəfər namizədlik dissertasiyası müdafiə edərək filologiya üzrə fəlsəfə doktoru elmi dərəcəsi almışdır. Prof. B.Hüseynov Təhsil Nazirliyinin Xarici dillər üzrə metodik şurasının və Bakı Slavyan Universitetindəki müdafiə şurasının üzvüdür. O, təhsildəki xidmətlərinə görə «Tərəqqi medalı» ilə təltif edilmişdir.

Son illərdə kafedra əməkdaşları 20 məqalə, 10 dərslik və dərs vəsaiti, 5 proqram nəşr etdirmiş, prof. B.Q.Hüseynovun, dos. F.D.İsayevanın, b/m D.T.Sadıqovanın, baş müəllim Ü.Hacıyevanın, müəllimlər M.Ağayeva və G.Abdullayevanın dərslik və dərs vəsaitləri işıq üzü görmüşdür.



*İngilis dili və onun tədrisi metodikası kafedrasının əməkdaşları*

Hazırda kafedrada 19 nəfər – 1 nəfər elmlər doktoru, professor (Balaxan Hüseynov (kafedra müdiri), 2 nəfər fəlsəfə doktoru, dosent (Nailə Əlizadə, Faidə İsayeva), 5 nəfər baş müəllim (Zemfira Əliyeva, Dilarə Sadıqova, Jalə Bəşirova, Ülviyyə Hacıyeva, Mirvari Qasımova), 8 nəfər müəllim (Maral Ağayeva, Sevda Xəlilova, Jalə Səmədova, Aytən İsmayılova, Günel Şamxalova, Samirə Babayeva, Gülhəyat Abdullayeva, Nüşabə İsmayılova), 1 nəfər baş laborant (Günel Ağayeva), 2 nəfər laborant (Aytən Cəfərova, Hicran Ələkbərova) çalışır.

### 3.2.8. XARİCİ DİLLƏR KAFEDRASI

1937–38-ci tədris ilində APİ-də Xarici dillər fakültəsi – ingilis, fransız və alman dilləri üzrə üç şöbədən ibarət təşkil edilmiş və həmin fakültədə 154 nəfər tələbə oxumağa başlamışdır. Alman dili şöbəsinin rus və Azərbaycan bölmələri, ingilis və fransız şöbələrinin isə ancaq rus bölməsi olmuşdur.

Fakültədə xarici dillər üzrə fənlərin tədrisinə bir ümumi Xarici dil kafedrası rəhbərlik edirdi. Dos. Neff Otoo həmin kafedranın rəhbəri idi.



*Xarici dillər kafedrasının əməkdaşları*

1939-cu ildə Xarici dillər kafedrası ingilis dili, fransız dili, alman dili kafedralarına ayrıldı. Həmin ildə fakültəyə P.İ.Krom dekan, İ.L.Rax isə alman dili kafedrasına müdir vəzifəsinə seçildi.

1941-ci ildən APİ-nin Xarici dillər fakültəsi S.M.Kirov adına ADU-nun tərkibinə daxil edildi, iki il sonra yenidən APİ-nin nəzdində bərpa olundu.

Böyük Vətən müharibəsindən sonra xarici dil tədrisi sahəsində kadr hazırlığı ilə əlaqədar olaraq SSRİ Nazirlər Sovetinin 1947-ci il 10 dekabr tarixli qərarına əsasən APİ-nin Xarici dillər fakültəsinin bazası əsasında Xarici Dillər İnstitutu yaradıldı. Həmin vaxtlar APİ-də ikinci dil kimi tədris olunan «Qərbi Avropa dilləri» kafedrası olmuş və ona Xudaverdiyev rəhbərlik etmişdir. Kafedranın cəmi 9 üzvü olmuşdur. 1951–1953-cü illərdə Xarici dillər kafedrası E.M.Təkinskayanın rəhbərliyi altında fəaliyyət göstərmişdir. 1953-cü ildə kafedra bağlanmışdır. 1961-ci ilə qədər ingilis, fransız və alman dilləri üzrə xarici dil müəllimləri 8 nəfərdən ibarət olaraq «Erməni dili və ədəbiyyatı» kafedrasının tərkibində fəaliyyət göstərmişdir.

Xarici dillərin tədrisini yaxşılaşdırmaq haqqında SSRİ Nazirlər Sovetinin 1961-ci il 27 may tarixli qərarı ilə əlaqədar olaraq 1962-ci ildə APİ-də «Xarici dillər» kafedrası təşkil olundu. Rəhbərlik dos. Yəqubi Əsəd Rza

oğluna tapşırıldı. Kafedra əməkdaşları ingilis, fransız, alman və fars dillərini tədris edirdilər.

1967-ci ildə kafedrada 1 dosent, 7 baş müəllim, 13 müəllim və iki böyük laborant olmuşdur.

Xarici dil kafedrasına uzun müddət rəhbərlik etmiş Ə.R.Yəqubi Azərbaycan Respublikasının ali məktəblərinin humanitar fakültələri üçün fars, fransız dilləri və əski Azərbaycan yazısı üzrə ilk tədris proqramları, dərsliklər və dərs vəsaitlərinin müəllifidir. O, xarici dillərin tədrisinin asanlaşdırılması və müddətcə qısaldılması problemi ilə bağlı kafedrada icra etdiyi elmi işlərini mətbuatda silsilə məqalələr şəklində nəşr etdirmişdir. Onun «Azərbaycanda təlim-tərbiyə mədəniyyəti, təhsil və pedaqoji fikir tarixi» (2005) adlı əsəri Azərbaycan təhsil tarixinə dəyərli töhfədir. Sonrakı illərdə kafedraya M.C.Əsgərzadə, L.A.Skobelova, prof. Arif Tahirov və filologiya elmləri doktoru, prof. Balaxan Hüseynov (1987–2008) rəhbərlik etmişlər.

2008-ci ildən «Xarici dillər» kafedrasının bazasında «İngilis dili və onun tədrisi metodikası» kafedrası yaradılmış, kafedra iki hissəyə bölünmüşdür. 2008-ci ilin noyabr ayından «Xarici dillər» kafedrasına filologiya elmləri üzrə fəlsəfə doktoru, dos. Gülçöhrə Alıyeva rəhbərlik edir. O, 50-yə yaxın elmi məqalə və tezisin, 5 bakalavr təhsil pilləsi, 2 magistr təhsil pilləsi üzrə proqramların və «English for Shipbuilders» (2006), «English for Marine Electrical-Engineers» (2007), «Grammar Exercises for Mariners» (2008) adlı kitabların müəllifi və həmmüəllifidir. 20-dən çox filologiya üzrə fəlsəfə doktoru dissertasiya işinin opponenti və ya rəyçisi olmuşdur.

Xarici dillər kafedrasının əməkdaşları ixtisaslarına dair xarici ölkə və respublika daxilində keçirilən təhsil treninqlərində, simpoziumlarda, konfranslarda, ali məktəblərarası fənn olimpiadalarında fəal iştirak edirlər.

Hazırda kafedrada 52 nəfər – 4 nəfər fəlsəfə doktoru, dosent (Gülçöhrə Alıyeva (kafedra müdiri), Yaşar Qaraxanov, Aygün İsmayılova, Səkinəxanım Vəliyeva), 1 nəfər fəlsəfə doktoru, baş müəllim (Zakir Rəsulov), 17 nəfər baş müəllim (Tubu Sultanova, Şəlalə Vəliyeva, Lyudmila Mehdiyeva, Fəridə Əmirbəyova, Taisa Quliyeva, Şəfiqə Nağıyeva, Elmira Əhmədova, Fatma Əliyeva, Sürəyyə Həsənova, Fəridə Mehdiyeva, Sevda Ağayeva, Nazilə Ə.Rəhimova, Nazilə R.Rəhimova, Məsmə İsmayılova, Səidə Dadaşova, Gülbəniz Məmmədova, Nazilə Əliyarbəyova), 23 nəfər müəllim (Tamilla Turabova, Mehriban Mahmudova, Səlminaz Orucova,

Nigar Mirzəyeva, Pərvanə Qasımova, Aygün Məmmədova, Sədaqət İsgəndərova, Aygün Qocayeva, Aytən Cəfərova, Cəmalə Həsənova, Şəhla Namazova, Aynurə Quliyeva, Aynur Məmmədova, Könül Nəcəfova, Esmira Ağamirzəyeva, Leyla Kərimova, Tovuz Hacıbədəlli, Günel Əliyeva, Aysel Quliyeva, Simuzər Muxtarova, Sevinc Əhmədova, Günel Məmmədova, Sevinc Namazova), 1 nəfər fəlsəfə doktoru, baş laborant (Simuzər Əliyeva), 5 nəfər baş laborant (Günay Məmmədova, Günay Məmmədzadə, Minayə Cəfərova, Rəna Babayeva, Ramilə Məmmədova), 1 nəfər laborant (Günel Hüseynova) çalışır.

### 3.2.9. RUS DİLİ KAFEDRASI

1936–1937 – tədris ilində müstəqil Rus dili kafedrası təşkil edilmiş və dos.V.L.Arxarova müdir seçilmişdir. Sonrakı illərdə kafedraya N.Q.Yukovskaya, N.İ.Terentyeva, dos. A.A.Roşal, Y.A.Əliyev və dos. İ.Y.Yudkin rəhbərlik etmişdir. 1967-ci ildən 2006-cı ilin sentyabrına qədər kafedraya prof. T.N.Əliyeva rəhbərlik etmişdir. 2006-cı ilin noyabrından kafedraya dos. L.O.Vəzirova rəhbərlik edir.

Kafedrada elmi-tədqiqat işləri üç istiqamətdə aparılır: müxtəlif sistemli dillərin müqayisəli – tipoloji təhlili, rus dili təliminin metod və formalarının təkmilləşdirilməsi, dərs vəsaitlərinin hazırlanması.

Kafedranın əməkdaşları rus dili və ədəbiyyatının, Azərbaycan məktəblərində rus dilinin tədrisi metodikasının mühüm problemləri üzərində elmi-tədqiqat və tədris-metodiki işlər aparırlar. Kafedranın başlıca vəzifələrindən biri – elmi-pedaqoji və metodiki biliklərin, təcrübələrin nəticələrinin, açıq dərslərin müzakirələrinin nəticələrinin və metodika sahəsində yeniliklərin kafedra əməkdaşlarına çatdırılması və qabaqcıl təcrübənin öyrənilməsidir.

Kafedranın pedaqoji kadrlarının hər beş ildən bir ixtisasartırma kurslarını keçmələri onların peşə ustalıqlarının, elmi biliklərinin və informasiyalarının zənginləşməsində zəruri amildir.

Son illərdə kafedra əməkdaşları tərəfindən «Сопоставительный анализ синонимических парадигм русского и азербайджанского языков» (dos. L.O.Vəzirova, 2010), «Практический курс русского языка» (dos. L.O.Vəzirova, dos. N.N.Kazımova, dos. S.Ə.Sadıxova, S.K.Məmmədova, 2007), «Развитие речи при изучении имени существительного»




*Rus dili kafedrasının əməkdaşları*

(dos. S.Ə.Sadıxova, 2010), «Композиционно-смысловая структура сложного синтаксического целого» (dos. S.Ə.Sadıxova, 2010) monoqrafiya, dərslik və dərs vəsaitləri, «Программа по практическому курсу русского языка для бакалавров АГПУ» (dos.L.O.Vəzirova, dos.N.N.Kazımova, S.K.Məmmədova, 2009) hazırlanaraq çap edilmişdir ki, həmin proqram üzrə yeni dərslik hazırlanır.

Hazırda kafedrada 22 nəfər – 4 nəfər fəlsəfə doktoru, dosent (Leyla Vəzirova (kafedra müdiri), Sevinc Sadıxova, Nurlana Kazımova, Larisa Kolesnikova), 8 nəfər baş müəllim (Çingiz Ağayev, İradə Vəliyeva, Zərifə Tapdıqova, Şəmsiyyə Köçərli, Ofeliya Məmmədova, Nailə Sadıxova, İrina Məlikova, Hicran Vəliyeva), 7 nəfər müəllim (Samirə Məmmədova, Gülzar Primova, Svetlana Mirzəyeva, Ofeliya Mustafayeva, Xədicə Çələbiyeva, Şeyda Fərəcova, Mətanət Musayeva), 3 nəfər baş laborant (Arzu Əbilova, Nigar Ələkbərova, Sevda Məmmədova) çalışır.

## 3.3. PEDAQOJİ FAKÜLTƏ



*Dekan*
*prof. Fərrux Rüstəmov*

Fakültə 1958-ci ildə İbtidai təhsilin pedaqogika və metodikası adı ilə fəaliyyətə başlamışdır. Fakültənin təşkilində əsas məqsəd həm Azərbaycanın, həm də Ermənistan və Gürcüstandakı Azərbaycan məktəblərinin ibtidai siniflərini ali təhsilli müəllimlərlə təmin etməkdən ibarət idi. Fakültəyə ayrı-ayrı vaxtlarda prof. Şövqi Ağayev (1958), dos. İsfəndiyar Vəlixanlı (1959–1969), prof. Nəmidə Abbasova (1969–1976), dos. Musa Həsənov (1976–1989), prof. Xəlil Fətəliyev (1990–1997), prof. Zahid Xəlilov (1998–2005), dos. Zabit Məmmədov (dekan əvəzi) (2005–2006) rəhbərlik etmişdir. Fakültəyə 2006-cı ildən pedaqoji elmlər doktoru, prof. Fərrux Rüstəmov rəhbərlik edir.

Fakültənin inkişafında və tez bir zamanda şöhrət qazanmasında akademik Mehdi Mehdizadə, prof. Mərdan Muradxanov, prof. Şövqi Ağayev, prof. Ağamməd Abdullayev, prof. Nəmidə Abbasova, dos. İsfəndiyar Vəlixanlı, dos. Əfşan Qədimbəyova və dos. Tələt Əfəndiyevin böyük xidmətləri olmuşdur.

1958–70-ci illərdə fakültəyə daha böyük maraq göstərilmiş, tələbə kontingenti ildən-ilə artmışdır. 1977–78-ci tədris ilindən başlayaraq 5 il müddətində fakültə fakültələrarası sosializm yarışının qalibi olmuş, keçici Qırmızı Bayraqla və müxtəlif mükafatlarla rəğbətləndirilmişdir. 1990-cı ildə Pedaqoji fakültə əyani və qiyabi şöbələrə bölündü.

1991-ci ildə qiyabi şöbə süni olaraq iki yerə bölündü. 4 illik tədris planı ilə təhsil alanlar şöbəsinə dos. İramin İsayev, 5 illik tədris planı ilə təhsil alanlar şöbəsinə isə Qulam Əzimov dekan vəzifəsinə seçildilər.

1981-ci ildə Pedaqoji fakültənin nəzdində musiqi şöbəsi təşkil edildi. 1998-ci ildə əyani və qiyabi şöbələr birləşdirildi.

Pedaqoji fakültədə təhsilin yeni texnologiyalar əsasında təşkilində diqqətəlayiq uğurlar qazanılmışdır. 2009-cu ildən ibtidai sinif müəllimi ixtisasında «Təhsilin əsasları» fənni tədris olunur. Bu məqsədlə fakültənin nəz-



*Pedaqoji fakültənin elmi şurasının iclasında*

dində «Təhsilin əsasları» adlı ixtisaslaşdırılmış auditoriya yaradılmış, pedaqoji təhsilin problemlərini araşdıran «Pedaqoji təhsilin problemləri» elmi-tədqiqat laboratoriyası təşkil edilmişdir.

Fakültə tələbələrinin son dövrlərdə tanınmış pedaqoq-alim, Rusiya Təhsil Akademiyasının akademiki, pedaqoji elmlər doktoru, professor Hüseyn Əhmədovla, Təhsil Problemləri İnstitutunun şöbə müdiri, psixologiya elmləri doktoru, professor Ramiz Əliyevlə, Respublika Təhsil Şurasının sədri, professor Əjdər Ağayevlə, Təhsil Problemləri İnstitutunun şöbə müdiri, professor Vidadi Xəlilovla, Xarici Dillər Universitetinin pedaqogika kafedrasının müdiri, professor Nurəddin Kazımovla, «Etiraf» verilişinin aparıcısı, psixologiya üzrə fəlsəfə doktoru İlham Mirzəyevlə keçirilən görüşləri yaddaqalan tədbirlərdən sayılır.

Əməkdar elm xadimi, professor Mərdan Muradxanovun, dosent İsfəndiyar Vəlixanlının anadan olmasının 100 illiyinə həsr olunmuş yubiley tədbiri həm fakültə, həm də universitet əməkdaşlarının yaddaşında dərin iz buraxmışdır.

Fakültənin tələbələri Bakı şəhərinin qabaqcıl lisey və məktəblərində (Heydər Əliyev adına Müasir Təhsil Kompleksi, Avropa liseyi və 15, 36, 45, 46, 189, 200, 211 nömrəli məktəblər) pedaqoji təcrübə keçirlər.




*Pedaqoji fakültənin 50 illik yubiley tədbirində*

Fakültədə 1025 nəfər (onlardan 495-i qiyabi, 530-u əyani) tələbənin təhsil-tərbiyəsi ilə 10 nəfər elmlər doktoru, professor, 40 nəfər fəlsəfə doktoru, dosent və 50 nəfər müəllim məşğul olur. Fakültədə 91 nəfər magistrant təhsil alır.

Fakültədə təhsil alan əlaçı və zərbəçi tələbələri birləşdirən Əlaçılar Şurası fəaliyyət göstərir.

Yarandığı vaxtdan indiyədək fakültənin 15 minə yaxın məzunu olmuşdur. Fakültənin əməkdaşları müxtəlif illərdə 300-dən artıq dərslik və dərs vəsaiti hazırlayıb çap etdirmişlər. Pedaqoji fakültə Gəncə Dövlət Universitetinin, Azərbaycan Müəllimlər İnstitutunun müvafiq fakültələri ilə sıx əməkdaşlıq edir.

2008–2009-cu tədris ilindən fakültədə təhsil kredit sistemi əsasında aparılır. Bu məqsədlə yeni tədris planı hazırlanmış və təsdiq olunmuşdur.

2010-cu ilin aprel ayında Pedaqoji fakültənin 50 illiyi Respublika səviyyəsində təntənəli surətdə qeyd olunmuşdur. Yubiley tədbirində təhsil naziri, prof. Misir Mərdanov, nazirliyin idarə rəisləri, Bakı şəhər təhsil idarəsinin rəhbərliyi, Milli Məclisin deputatları, Universitet və İnstitut rektorları, tanınmış ziyalılar iştirak etmişlər. Yubiley tədbirində Türkiyənin Hacəttəpə Uni-




*Professor Mərdan Muradxanovun 100 illiyinə həsr olunmuş tədbir*

versitetinin 22 nəfər əməkdaşı da iştirak etmişdir. Yubiley tədbiri münasibəti ilə fakültənin dekanı prof. Fərrux Rüstəmov, dekan müavinləri dos. Afət Həsənova və dos. Zabit Məmmədov, prof. Sərdar Quliyev, dos. Yaqut Rzayeva, dos. Laçın Həsənova, dos. Elmira Əfəndiyeva «Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi» döş nişanı ilə, prof. Seyidağa Həmidov və dos. Qulaməli Balaşov, prof. Minarə Dadaşova və Zemfira Abdullayeva, prof. Jalə Qədimova və dos. Ramidə Məmmədova isə Azərbaycan Respublikası Təhsil Nazirliyinin «Fəxri Fərmanı» ilə təltif olunmuşlar.

Fakültənin tərkibində 5 kafedra fəaliyyət göstərir: İbtidai təhsilin pedaqogikası və metodikası (kafedra müdiri dos. Y.Rzayeva), Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası (kafedra müdiri prof. S.Həmidov), İbtidai siniflərdə rus dili (kafedra müdiri dos. R.Məmmədova), Musiqi fənləri və onun tədrisi metodikası (kafedra müdiri prof. J.Qədimova), Musiqi alətləri fənlərinin tədrisi metodikası (kafedra müdiri prof. M.Dadaşova).

## 3.3.1. İBTİDAİ TƏHSİLİN PEDAQOGİKASI VƏ METODİKASI KAFEDRASI

İbtidai təhsilin pedaqogikası və metodikası kafedrası 1959-cu ildə yaradılmışdır. Kafedranın ilk müdiri görkəmli pedaqoq-alim, SSRİ Pedaqoji Elmlər Akademiyasının həqiqi üzvü, pedaqoji elmlər doktoru, prof. Mehdi Mehdizadə (1903–1984) olmuşdur. 1960–1979-cu illərdə kafedraya prof. Mərdan Muradxanov rəhbərlik etmişdir. Onun bu kafedranın təşəkkülü və inkişafında, elmi potensialının formalaşmasında xidmətləri əvəzsizdir. Kafedraya 1979–1992-ci illərdə dos. Əyyub Tağıyev, 1993–1997-ci illərdə prof. Sərdar Quliyev, 1996–2006-cı illərdə dos. Həmzə Əliyev, 2006–2011-ci illərdə prof. Fərrux Rüstəmov rəhbərlik etmişdir. Bu illərdə kafedrada elmi dərəcəlilərin sayı artmış, tədris və tədqiqat işlərinin səviyyəsi xeyli yüksəlmişdir.

Hazırda kafedraya dos. Yaqut Rzayeva rəhbərlik edir.

İbtidai təhsilin pedaqogikası və metodikası kafedrası fəaliyyətini iki istiqamətdə – elmi-tədqiqat və tədris işləri üzrə aparır, ənənəsinə sadiq qalaraq pedaqoji və elmi pedaqoji kadr hazırlığında fəal iştirak edir.

Kafedrada 4 problem üzrə elmi tədqiqat işi aparılır: tərbiyə nəzəriyyəsi, təlim nəzəriyyəsi, xarici ölkələrin pedaqoji fikir tarixi, Azərbaycan məktəb və pedaqoji fikir tarixi.

Kafedra yarandığı gündən pedaqoji bilikləri təbliğ edən mərkəzə çevrilmişdir. Bu təbliğat, əsasən, mühazirələr, televiziya və radio verilişlərində çıxışlar, kitablar və məqalələr, elmi seminarlar, pedaqoq alimlərlə görüşlər vasitəsilə həyata keçirilmişdir. Ayrı-ayrı vaxtlarda kafedranın əməkdaşları pedaqogikanın tarixi və nəzəriyyəsi ilə bağlı dərslik və dərs vəsaitləri hazırlayaraq tələbələrin istifadəsinə vermişdir. Prof. Mərdan Muradxanovun redaktəsi ilə hazırlanan «Pedaqogika» (1964) kitabı uzun illər Azərbaycanın ali pedaqoji və orta ixtisas məktəblərində tələbələrin istifadə etdiyi yeganə dərs vəsaiti olmuşdur.

Son illərdə prof. Fərrux Rüstəmovun «Pedaqogika tarixi» (2006), «Pedaqogikadan kurs və buraxılış işlərinə dair metodik göstəriş» (2007), «Pedaqogika» (2007), «Ali məktəb pedaqogikası» (2007), «Pedaqoji fakültə–50» (2009), «Pedaqoji (təlim və tərbiyə) tarixi Şərqdə», Tehran, «Xorşidafərin» (2010), «Pedaqoji oçerklər: sələflərim və müasirlərim» (2010), «Pedaqoji qeydlər, resenziyalar, müsahibələr» (2010), «Azərbaycanda ümumi



*İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının əməkdaşları*

pedaqogika, pedaqogikanın və təhsilin tarixi ixtisası üzrə elmi-pedaqoji kadr hazırlığı (1927–2010-cu illər)» (2010), «Azərbaycanda təhsil və tərbiyə nəzəriyyəsinin inkişafı (1961–1981-ci illər)» (2010), prof. Sərdar Quliyevin «Şərq mütəfəkkirlərinin əsərlərində ailədə övlad tərbiyəsi» (2008), «Gəncliyin tərbiyəsində aqillərin nəsihət və vəsiyyətləri» (2011), dos. Yaqut Rzayevanın «Sosial pedaqogika» (2008), «Texnologiya (əmək hazırlığı)» (2006), dos. Bəhruz Nəsirovun «Mahmud bəy Mahmudbəyov və ibtidai təhsilin inkişafı» (2007), dos. Tamilla Vahabovanın «Gəncliyin mərdlik və qəhrəmanlıq tərbiyəsi» (2006), dos. İ.Məmmədovanın «Kiçikyaşlı məktəblilərin tərbiyəsində valideynlərin rolu» (2010), dos. Təranə Əliyevanın «Müəllimin peşə mədəniyyəti» (2010), «Müəllimlik peşəsi və müəllim-şagird münasibətləri» (2010), dos.Ə.Novruzovanın «Məktəbli şəxsiyyətinin formalaşmasında fəal təlimin tətbiqinin rolu» (2011), Ofira Qafarovanın «Педагогические основы экологического образования и воспитания старшеклассников во внеурочное время» (2010), «Методические указания по курсовым и выпускным работам по педагогике» (2008), «Организация экологического просвещения и экологической общественно-полезной деятельности старшеклассников» (2009), b/m. Ayişə Məmmədovanın «Uşaq bağçasında beşyaşlıların məktəbə hazırlanması» (2007), R.Əliyevin

«Akademik Mehdi Mehdizadənin pedaqoji irsi» (2011) adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

R.Əliyev və M.Zamanova fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün dissertasiya müdafiə etmiş, kafedranın doktorantları G.Balayeva və Ş.Adgözəlovanın dissertasiyaları müdafiə şurasına təqdim olunmuşdur.

Kafedranın ilk müdiri olmuş akademik Mehdi Mehdizadə 23 il Azərbaycan Respublikası maarifinə rəhbərlik etmişdir. Dos. Əyyub Tağıyev, prof. Soltansəlim Axundov, dos. Yaqut Rzayeva institut partiya və komsomol komitəsinin katibi, dos. Allahyar İmanov institut komsomol komitəsinin katibi vəzifəsində çalışmışlar. Prof. F.Rüstəmov Pedaqoji fakültənin dekanı, Azərbaycan Respublikası Prezidenti yanında AAK-ın ADPU-da fəaliyyət göstərən ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi ixtisası üzrə Dissertasiya Şurasının sədr müavini, dos.Yaqut Rzayeva isə elmi katibdir. Prof. F.Rüstəmov ADPU da keçirilən «İlin müəllimi», «İlin alimi» nominasiyasının qaliblərindən biri olmuşdur. O, «Akademik Mehdi Mehdizadə», «Gənc alimlər», «Qızıl qələm» mükafatları laureatıdır. 2006-cı ildə «Tərəqqi medalı» və 2010-cu ildə «Azərbaycan Respublikasının qabaqcıl təhsil işçisi» döş nişanı ilə təltif edilmişdir. 1998-ci ildə Beynəlxalq Pedaqoji Akademiyanın, 2011-ci ildə isə Pedaqoji və Sosial Elmlər Akademiyasının (Moskva) həqiqi üzvü seçilmişdir. 2011-ci ildə «Avropa Nəşr Mətbu Evi»nin «Ən Yaxşı Vətənpərvər Tədqiqatçı Alim» qızıl medalına layiq görülmüşdür. Təhsil nazirinin əmri ilə yaradılan bir neçə komissiyanın sədri və ya üzvüdür. O, 30-dan artıq dərslik, dərs vəsaitinin, kitab və kitabçanın, 500 elmi-pedaqoji və publisistik yazının müəllifidir.

Kafedrada bakalavr səviyyəsində pedaqogika, pedaqogika tarixi, təhsilin əsasları, təlim nəticələrinin qiymətləndirilməsi, texnologiya və onun tədrisi metodikası, həyat bilgisi və onun tədrisi metodikası, sosial pedaqogika, təhsilin idarə olunması, Azərbaycan məktəb və pedaqoji fikir tarixi, fəal (interaktiv) təlim; magistr səviyyəsində pedaqogika elminin müasir problemləri, ali məktəb pedaqogikası və onun müasir problemləri, ibtidai məktəb pedaqogikası, tərbiyə işinin metodikası, pedaqogika elminin tarixi və metodologiyası fənləri tədris olunur.

Kafedrada elmi-metodik seminar fəaliyyət göstərir.

Hazırda kafedrada 24 nəfər – 2 nəfər elmlər doktoru, professor (Fərrux Rüstəmov (fakültə dekanı), Sərdar Quliyev), 10 nəfər fəlsəfə doktoru,

dosent (Yaqut Rzayeva (kafedra müdiri), Səfurə İbrahimova, Teyyubə Hüseynova, Allahyar İmanov, Bəhruz Nəsirov, İsmət Məmmədova, Ofira Qafarova, Tamilla Vahabova, Təranə Əliyeva, Gülşən Novruzova), 2 nəfər pedaqogika üzrə fəlsəfə doktoru, müəllim (Ramiz Əliyev, İradə Quliyeva), 3 nəfər baş müəllim (Pakizə Əliyeva, Çiçək Hümmətova, Ayşə Məmmədova), 3 nəfər müəllim (Hüseyn Hacıyev, Flora Bayramova, Mələk Zamanova), 4 nəfər tədris-köməkçi heyət (Səmayə Nəsirova, Lyudmila Abdullayeva, Tamilla İbrahimova, Rəna Qurbanova) çalışır.

### 3.3.2. RİYAZİYYAT VƏ ONUN İBTİDAİ KURSUNUN TƏDRİSİ METODİKASI KAFEDRASI

1966-cı ildə Elementar riyaziyyat və riyaziyyatın tədrisi metodikası kafedrasının bazası əsasında Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrası təşkil olundu. Həmin dövrə qədər riyaziyyat və ibtidai siniflərdə riyaziyyatın tədrisi metodikası fənləri Elementar riyaziyyat və riyaziyyatın tədrisi metodikası kafedrası əməkdaşları (prof. Sadıq Sadıqov, dos. Sədi Nəsibov, b/m. Məmməd Əzizov, b/m. Süleyman Məmmədov, b/m. Nəriman Kazımov və 1962-ci ildən Seyidağa Həmidov, Vladislav Popov və b.) tərəfindən tədris olunurdu.

Kafedra təşkil olunarkən onun 6 nəfər üzvü (b/m. A.Təmrazlı, b/m. S.Məmmədov, b/m. N.Kazımov, b/m. V.V.Popov, b/m. S.Həmidov) var idi.

Kafedraya pedaqoji elmlər namizədi Nüsrət Sadıxov (1975–1993) rəhbərlik edirdi. O, 1978-ci ildə professor elmi adını aldı və kafedraya 1993-cü ilə qədər rəhbərlik etdi.

Kafedraya 1994-cü ildən pedaqoji elmlər doktoru, professor Seyidağa Həmidov rəhbərlik edir. O, 1992-ci ildə «Ali pedaqoji məktəblərdə gələcək ibtidai sinif müəllimlərinin riyaziyyatdan elmi-metodiki hazırlığı məsələləri» mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. O, 10-dan çox dərslik və dərs vəsaitinin, 300-dən artıq elmi-metodik və publisistik məqalənin müəllifidir.

Kafedrada aşağıdakı istiqamətlərdə elmi tədqiqat işləri aparılır: 1) ibtidai siniflərdə riyaziyyat təliminin təkmilləşdirilməsi; 2) orta məktəbdə riyaziyyat tədrisinin təkmilləşdirilməsi; 3) ali pedaqoji məktəblərin ibtidai sinif müəllimi hazırlanan fakültələrində riyaziyyat tədrisinin təkmilləşdirilməsi; 4) mək-



*Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının əməkdaşları*

təbəqədər müəssisələr üçün pedaqoji kadrların riyaziyyatdan elmi-metodiki hazırlığının aktual problemləri.

Kafedranın əməkdaşları ibtidai siniflərdə riyaziyyatın tədrisi metodikası ilə bağlı onlarla dərslik və dərs vəsaitlərinin müəllifləridir. Son illərdə prof. S.S.Həmidovun «I–IV siniflərdə riyaziyyatın tədrisi metodikası» (2008), prof. S.S.Həmidov, dos. A.Ə.Əliyev, b/m. N.R.Abbasov və dos. N.M.Hacıyevin «Riyaziyyatın nəzəri əsasları fənninə aid testlər» (2010), dos. Q.Q.Balaşov və dos. N.M.Hacıyevin «Riyaziyyatdan məsələ və misallar» (2009), dos. Z.F.Kazımovun «Hesab məsələləri və həlli metodları» (2008), dos. B.S.Cəbrayılovun «Riyaziyyatın ibtidai kursunun nəzəri əsasları» (2011), dos. M.X.Əsədovun «Riyaziyyat» (2011), b/m. N.R.Abbasovun «Riyaziyyat-1» (2008) adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

Kafedra əməkdaşları respublika və beynəlxalq konfranslarda riyaziyyat və onun ibtidai siniflərdə tədrisi problemləri ilə bağlı məruzələrlə çıxış edir, xarici ölkələrin nüfuzlu elmi nəşrlərində məqalələr nəşr etdirirlər.

Kafedrada elmi-pedaqoji kadr hazırlığına xüsusi diqqət yetirilir. Kafedra təşkil ediləndə yalnız bir nəfərin elmi dərəcəsi olduğu halda, indi 16 nəfər

kafedra üzvündən 14-nün elmi dərəcəsi vardır. Prof. S.S.Həmidovun elmi rəhbərliyi altında 12 nəfər namizədlik dissertasiyası müdafiə etmişdir. Hazırda kafedranın 3 doktorantı vardır.

Kafedra əməkdaşları respublikada pedaqoji kadr hazırlığını həyata keçirən digər ali təhsil müəssisələrinin müvafiq kafedraları ilə sıx əlaqə saxlayır.

Kafedra əməkdaşları aşağıdakı fənləri tədris edirlər: riyaziyyatın ibtidai kursunun nəzəri əsasları, ibtidai siniflərdə riyaziyyatın tədrisi metodikası, sadə riyazi təsəvvürlərin formalaşdırılmasının nəzəri əsasları və metodikası.

Hazırda kafedrada 16 nəfər – 1 nəfər elmlər doktoru, professor (Seyidağa Həmidov (kafedra müdiri)), 9 nəfər fəlsəfə doktoru, dosent (Abbas Əliyev, Qulaməli Balaşov, Sabir Süleymanov, Bəyməmməd Cəbrayılov, Samirə Tağıyeva, Zahir Kazımov, Fəxrəddin Alıyev, Namiq Hacıyev, Mübariz Əsədov), 4 nəfər fəlsəfə doktoru, baş müəllim (Nazim Abbasov, Mehdixan Aşurov, Rafiq Alıyev, Aygün Məcidova), 1 nəfər baş müəllim (Gülnarə Xaspoladova) və 1 nəfər müəllim (Gülnar Abıyeva) çalışır.

### 3.3.3. MUSİQİ ALƏTLƏRİ FƏNLƏRİNİN TƏDRİSİ METODİKASI KAFEDRASI

Kafedra «Musiqi və onun tədrisi metodikası» adı ilə 1973-cü ildə professor Sabir Quliyevin təşəbbüsü ilə təşkil olunmuşdur. 1980-ci ildə Pedaqoji fakültənin nəzdində musiqi şöbəsinin açılması kafedranın elmi potensialının və maddi-texniki bazasının güclənməsinə, digər musiqi təhsili verən ali və orta ixtisas müəssisələri ilə əlaqələrin genişlənməsinə şərait yaratmışdır.

Fakültənin musiqi şöbəsinə tələbə qəbulunun ildən-ilə artırılması təbii ki, tədris yükünün çoxalmasına və beləliklə də, yeni kafedranın təşkilinə zərurət yaratdı. Musiqi və onun tədrisi metodikası kafedrasının bazasında 1982-ci ildə iki müstəqil kafedra yarandı: 1) Musiqi alətləri kafedrası; 2) Musiqi fənləri və onun tədrisi metodikası kafedrası.

Musiqi alətləri kafedrasının təşkil olunduğu il (1980) burada yalnız bir nəfər fəlsəfə doktoru (S.Quliyev) fəaliyyət göstərirdisə, 1988–90-cı illərdə kafedrada 1 elmlər doktoru (S.Quliyev) və 7 fəlsəfə doktoru (Z.Abdullayeva, M.Dadaşova, N.Abutidze, G.Əsgəriyə, F.Rzayeva, Z.Seyidova, V.Əliyeva) çalışırdı.



*Musiqi alətləri fənlərinin tədrisi metodikası kafedrasının əməkdaşları*

2001-ci ildən Musiqi alətləri kafedrasına pedaqoji elmlər doktoru, prof. Minarə Dadaşova rəhbərlik edir. O, 1989-cu ildə «Pedaqoji fakültə tələbələrində yaradıcı təxəyyülün tərbiyəsi» mövzusunda namizədlik, 2006-cı ildə «Fortepiano sinfində tələbələrin musiqi bilik, bacarıq və vərdişlərinin formalaşması üzrə işin sistemi» mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir.

Kafedrada həm praktik, həm də nəzəri fənlər tədris olunur. Kafedra əməkdaşları musiqi üzrə dərslik və dərs vəsaitlərinin hazırlanmasında iştirak etməklə respublikada ali pedaqoji məktəb tələbələrinin bu sahədəki tələbatını ödəməyə çalışırlar. Son illərdə prof. M.Dadaşovanın «Tələbələrdə musiqi təfəkkürünün inkişafına kömək göstərən biliklər» (2002), «Ümumtəhsil məktəblərinin gələcək musiqi müəlliminin bacarıq və vərdişləri» (2002), «Musiqi fənlərinin tədrisində fortepiano alətinin rolu» (2004), «Fortepiano tədrisinin metodikası» (2007), «Fortepianoda çalmaq üçün dərs vəsaiti» ( 2007), «Musiqi müəlliminin hazırlığında bilik, bacarıq və vərdişlər kompleksi» (2008), «Musiqi müəlliminin hazırlığının metodikası» (2010), prof.Z.Abdullayevanın «Fikrət Əmirov» (2003), «Ecazkar sənətkar» (2007), «Musiqi alətləri» (2008), «Azərbaycan musiqi ədəbiyyatı» (2009), «Azərbaycan xalq musiqi yaradıcılığı» (2011), prof. T.Ə.Bağı-

rovanın «Aşıq sənətinin yaranma tarixi və inkişafı» (F.Hidayətova ilə birlikdə – 2009), «Etnomusiqişünaslıq» (prof. J.Qədimova ilə birlikdə, 2009) adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

Kafedranın dosenti N.Abutidze və konsertmeysteri İradə Əliyeva İspaniyada keçirilən orqan ifaçılarının Beynəlxalq müsabiqəsində laureat adına layiq görülmüşlər. Kafedra əməkdaşları (prof. M.R.Dadaşova, b/m. A.Hüseynova və b.) musiqi pedaqogikasının aktual problemləri ilə bağlı respublika və beynəlxalq konfranslarda iştirak edir, xarici ölkələrin nüfuzlu jurnallarında elmi məqalələr dərc etdirirlər.

Prof. Z.Abdullayeva 2009-cu ildə «Humay» mükafatı laureatı («Ecazkar sənətkar» kitabına görə), 2010-cu ildə Təhsil Nazirliyi kollegiyasının qərarı ilə «Fəxri Fərman»la mükafatlandırılmış, həmin ildə ADPU-da keçirilən «İlin müəllimi» müsabiqəsinin mükafatçısı (II yer) olmuşdur. Dos. N.Abutidze Ukraynada keçirilən «Киевская весна» festivalında Azərbaycan musiqi mədəniyyətini ləyaqətlə təmsil edərək Ukrayna Mədəniyyət Nazirliyi tərəfindən Fərqlənmə diplomu ilə mükafatlandırılmış, 2010-cu ildə Təhsil Nazirliyi Kollegiyasının qərarı ilə Azərbaycanda orqan alətində ifaçılıq sənətinin əsasının qoyulmasının 50 illiyi münasibətilə «Fəxri Fərmanla» təltif edilmişdir. Kafedrada elmi-metodik seminar fəaliyyət göstərir. Seminarda musiqi təhsili və tədrisi ilə bağlı vacib problemlər müzakirə olunur.

Kafedra əməkdaşları digər ali və orta ixtisas məktəbləri – Bakı Musiqi Akademiyası, Milli Konservatoriya, Mədəniyyət və İncəsənət Universiteti, Bülbül adına orta ixtisas musiqi məktəbi ilə sıx əlaqə saxlayır, onlarla birlikdə müxtəlif elmi konfranslar və tədbirlər keçirirlər. «Musiqi fənlərinin tədrisində fortepiano alətinin rolu» (2004) mövzusunda keçirilən Respublika elmi-praktik konfransı məhz kafedranın təşəbbüsü ilə keçirilmişdir.

Hər il kafedranın əməkdaşlarının hazırladığı tələbələr ali məktəb tələbələrinin bədii yaradıcılıq festivalında uğurla çıxış edirlər. 2007, 2008, 2009, 2010-cu illərdə festivalda iştirak edən kafedranın «Xalq çalğı alətləri ansamblı» (bədii rəhbər baş müəllim Camal Osmanov) və solo ifa ilə çıxış edən tələbələr (Zabitə Əhmədli, Sevinc Quliyeva, Musa Zeynalov, Aygün Şükürlü, Əfruz Əlizadə, Sahil Şirinov və b.) müxtəlif dərəcəli diploma layiq görülüblər.

Kafedranın baş müəllimi Gülarə Aslanova mütəmadi olaraq tələbələrin tədbirlərdə çıxışlarını hazırlayır və onları müşayiət edir.

2005-ci ildə kafedrada Musiqi şöbəsinin 25 illik yubileyi keçirilmişdir. Tədbirdə prof. Vidadi Xəlilov, prof. Oqtay Rəcəbov, şöbənin məzunları Nailə Mirməmmədli, Natiq Nuriyev, Zahid Məmmədov, o dövrdə fakültə dekanı işləmiş dos. Musa Həsənov, şöbənin ilk müəllimləri və başqa qonaqlar iştirak etmişlər.

Kafedrada yaradıcı insanların yubiley tədbirlərinin keçirilməsi ənənə xarakteri alıb. Dahi Azərbaycan bəstəkarı Üzeyir Hacıbəylinin 110 və 125 illik yubileyləri, Bülbülün 110, Qara Qarayevin 85, Fikrət Əmirovun 80, Tofiq Quliyevin 90, Soltan Hacıbəyovun 85, Süleyman Ələsgərovun 85, Arif Məlikovun 70, Vaqif Mustafazadənin 70, Səməd Vurğunun 100 illiyinə həsr olunmuş yaradıcılıq gecəsinin keçirilməsində kafedra əməkdaşlarının böyük zəhməti olmuşdur.

Kafedrada görkəmli sənətkarlar və musiqişünaslarla (Vasif Adıgözəlov, Sevda İbrahimova, İsmayıl Hacıbəyov, Elnarə Dadaşova, Ramiz Zöhrabov, Cəmilə Həsənova), tanınmış ifaçılarla (Ülviyyə Hacıbəyova, Fəridə Məmmədova, Gülnaz İsmayılova və b.) görüşlər ənənə halını almışdır.

Kafedranın müəllimləri tələbələrin musiqi savadı ilə yanaşı, onların elmi-tədqiqat işinə cəlb olunmalarına da xüsusi diqqət yetirirlər. I–IV kurs tələbələrinin elmi-tədqiqat işlərinə, məruzə və konfranslarda çıxışlarına rəhbərlik edirlər. Tələbə elmi işlərinin əsas mövzularını musiqi tədrisi, musiqi tərbiyəsi, ifaçılıq, milli musiqi vasitəsilə musiqi mədəniyyətinin inkişafı təşkil edirdi.

2006-cı ildə 8 nəfər tələbə elmi konfransında çıxış etmiş, 2 tələbə – Əhmədova Güləndam (IV kurs, elmi rəhbəri prof.M.R.Dadaşova) və Sadıqova Aynur (III kurs, rəhbəri b/m. L.M.İsgəndərova) diplom almışdır.

Kafedrada mütəmadi olaraq sinif konsertləri keçirilir. Müəllimlərdən prof. Z.Abdullayeva, b/m. L.İsgəndərova, b/m. A.Hüseynova, b/m. İ.Əhmədova bu işdə xüsusilə fəallıq göstərirlər.

Kafedrada 28 nəfər – 2 nəfər pedaqoji elmlər doktoru, professor (Minarə Dadaşova (kafedra müdiri), Tamilla Bağırova), 1 nəfər sənətşünaslıq üzrə fəlsəfə doktoru, professor (Zemfira Abdullayeva), 2 nəfər fəlsəfə doktoru, dosent (Firəngiz Rzayeva, Nelli Abutidze), 2 nəfər fəlsəfə doktoru, b/m. (Aidə Hüseynova, Zemfira Seyidova), 1 nəfər fəlsəfə doktoru, konsertmeyster (Vəfa Əliyeva), 11 nəfər baş müəllim (Gülgün Novruzova,

Kamilla Qarabağlı, Lalə İsgəndərova, Camal Osmanov, Adil Vəliyev, Lalə Abbasova, Zemfira Sultanova, Lalə Məlikova, Aygün Əhədova, Gülarə Aslanova, İradə Əhmədova), 6 nəfər konsertmeyster (Mehri Əliyeva, Səadət Kərimova, Cəmilə Cəfərova, Elmira Həsənova, Rəna İsmayılova, Mədinə Məmmədova), 1 nəfər baş laborant (Gülnarə Bakıxanova), 2 nəfər laborant (Törə Məcidova və Günel İsrafilova) çalışır.

### 3.3.4. MUSİQİ FƏNLƏRİ VƏ ONUN TƏDRİSİ METODİKASI KAFEDRASI

Kafedra 1982-ci ildə təşkil olunmuşdur. Əvvəllər İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının nəzdində fəaliyyət göstərən Musiqi və rəsm şöbəsi 1964-cü ildə müstəqil kafedraya çevrildi. Həmin kafedraya pedaqoji elmlər namizədi, dosent Bəhlul Axundov, 1966-cı ildən etibarən sənətşünaslıq elmləri namizədi dosent Paşa Hacıyev rəhbərlik etmişdir. Bu dövrdə əyani, axşam və qiyabi şöbələrdə ibtidai təhsilin metodikası və pedaqogikası və məktəbəqədər tərbiyə ixtisasları üzrə təhsil alan tələbələrə Musiqi və onun tədrisi metodikası fənni tədris edilirdi. O illərdə Şəfiqə Axundova, Hacıbaba Həsənov, Priva Pinson, Adilə Qafarova, Sabir Quliyev, Nəcməddin Məlikməmmədov, Akif Eyvazov, Pərvaz Babayeva və Elmira Əfəndiyeva kafedrada çalışırdılar.

1974-cü ildə musiqi və rəsm ixtisasları ayrıldı. Beləliklə, pedaqoji elmləri namizədi, dosent Sabir Quliyevin rəhbərliyi altında «Musiqi və onun tədrisi metodikası» kafedrası fəaliyyət göstərməyə başladı. 1980-ci ildə Pedaqoji fakültə nəzdində «Musiqi» şöbəsi açıldı. Musiqi tarixi, musiqi əsərlərinin təhlili, harmoniya, solfecio, polifoniya, dirijorluq, xorşünaslıq, vokal, musiqi aləti, xor və digər musiqi fənlərinin tədrisinə ehtiyac yarandı. Kafedra əməkdaşlarının sayı artdı. G.Axundova, S.Hacıyeva, A.Qəribova, T.Sadıxova, İ.Əhmədova, J.Qədimova, Z.Abdullayeva, M.Ələskərov, Y.Həbibov həmin fənlərin tədrisinə cəlb olundular. Bununla əlaqədar olaraq kafedranın iki istiqamətdə fəaliyyətinə ehtiyac yarandı. Beləliklə, Musiqi alətləri və Musiqi fənləri və onun tədrisi metodikası kafedraları yarandı.

Musiqi fənləri və onun tədrisi metodikası kafedrasına müdir vəzifəsinə pedaqoji elmlər namizədi, dosent N.Məlikməmmədov seçildi. O, 1982–1998-ci illərdə həmin kafedraya rəhbərlik etdi.



*Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının əməkdaşları*

1998-ci ildən həmin vəzifəyə pedaqoji elmlər doktoru, professor J.H.Qədimova seçildi. O, 2 monoqrafiya, 4 dərslik və 2 dərs vəsaitinin, 40-dan çox elmi məqalə və tezisin müəllifidir. Ali Attestasiya Komissiyasında ekspert şurasının üzvüdür. Onlarla dissertasiya işinin ya rəsmi rəyçisi olmuş, ya da rəy vermişdir. Geniş ictimai və pedaqoji fəaliyyətlə məşğuldur. O, Universitet «Qadınlar şurası»nın və «Qızıl Aypara Cəmiyyəti»nin sədridir. Onun təşəbbüsü ilə ADPU-da «Qızıl Aypara Cəmiyyəti»nin 5 illik fəaliyyəti təntənə ilə qeyd edilmişdir. Rəhbərlik etdiyi cəmiyyətin üzvləri uşaq və əlillər evlərində «Yeni il», «Novruz bayramı» şənliklərinin keçirilməsini təşkil etmiş, onlara hədiyyələr təqdim etmişlər.

Kafedranın əməkdaşları Q.Qəhrəmanova, A.Qəribova, N.Kamilova, A.Hüseynova, M.Əliyeva fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün dissertasiya üzərində çalışırlar. Prof. J.H.Qədimovanın elmi rəhbərliyi ilə F.Hidayətova pedaqogika üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün dissertasiya müdafiə etmişdir.

Kafedranın dosenti L.X.Həsənova ADPU-nun elmi katibi, dosent A.İ.Həsənova Pedaqoji fakültənin dekan müavini vəzifəsində çalışır.

Kafedrada bakalavr səviyyəsində musiqinin tədrisi metodikası, musiqi tarixi, musiqi ədəbiyyatı, musiqi əsərlərinin təhlili, Azərbaycan xalq musiqisinin əsasları, polifoniya, musiqi nəzəriyyəsi və harmoniya, solfecio, xorşünaslıq, xor aranjirovkası, xor sinfi və onun tədrisi metodikası, diri-

jorluq və onun tədrisi metodikası, vokal və onun tədrisi metodikası, məktəb mahnı repertuarı, xor partituralarının oxunuşu, Azərbaycan xalq yaradıcılığı, aşıq sənəti, məktəbəqədər musiqinin tədrisi metodikası, ibtidai siniflərdə musiqinin tədrisi metodikası, magistratura səviyyəsində musiqinin müasir problemləri, musiqişünaslıq, XX əsrin musiqi tarixi, Şərq xalqlarının ənənəvi musiqisi, müasir harmoniya, mənbəşünaslıq, etnomusiqişünaslıq fənləri tədris edilir.

Kafedra üzvləri tərəfindən 5 monoqrafiya, 28 dərslik və dərs vəsaiti, 7 metodik tövsiyə, 29 fənn proqramı, 120-dən çox məqalə, 40-dan artıq tezis çap edilmişdir.

Son illərdə kafedranın əməkdaşları tərəfindən «Musiqinin tədrisi metodikası» (J.Qədimova, 2007), «Etnomusiqişünaslıq» (J.Qədimova, 2009), «Musiqi» (J.Qədimova, E.Əfəndiyeva, 2007), «Metodika prepodavanii muzıki» (J.Qədimova, L.Həsənova, 2011), «Musiqi əsərlərinin təhlili» (E.Əfəndiyeva, 2009), «Musiqi tarixi üzrə 1500 test» (E.Əfəndiyeva, 2011), «Rus musiqi mədəniyyəti» (E.Əfəndiyeva, 2011), «Azərbaycan musiqi ədəbiyyatı» (E.Əfəndiyeva, 2011), «Məktəb mahnı repertuarı» (A.Həsənova, 2009), «Azərbaycanda xanəndəlik ənənəsinin və vokal mədəniyyətinin yaranması və inkişafı» (G.Axundova, 2010), «Rus bəstəkarlarının seçilmiş opera xorları» (P.Babayeva, 2009), «Musiqi və vətəndaşlıq sənəti» (F.Hidayətova, 2009), «Aşıq sənətinin yaranma tarixi və inkişafı» (F.Hidayətova, T.Bağırova, 2009), «Pedaqoji təmayüllü ali məktəblərdə musiqi müəllimlərinin hazırlığında musiqi kurikulumundan istifadənin imkan və yolları» (O.Rəcəbov, F.Hidayətova, 2011), «Musiqi» (I, II, III siniflər üçün, N.Kamilova, 2010), «Vokal və onun tədrisi metodikası» (N.Kamilova, 2010), «Solfecio» fənninin tədrisi (K.İsmayılova, 2009) adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

Kafedrada musiqi fənlərinin tədrisi metodikasının müasir problemləri ilə bağlı elmi seminar fəaliyyət göstərir. Seminar materialları toplu şəklində nəşr olunur. Toplunun redaktoru prof. J.Qədimova, üzvləri isə dos. E.M.Əfəndiyeva, dos. L.X.Həsənova, dos. A.İ.Həsənova və b/m. Q.Qəhrəmanovadır.

2008-ci ildən «Musiqişünaslıq» ixtisası üzrə magistr qəbulu həyata keçirilir.

Kafedranın əməkdaşları müxtəlif elmi-praktik konfranslarda musiqinin nəzəri və praktik problemləri ilə bağlı məruzələrlə çıxış etmişdir. Ha-

zırladıqları tələbə və magistrlər müxtəlif müsabiqələrdə iştirak etmiş və müsabiqənin qalibləri olmuşlar. Kafedranın baş müəllimi N.Kamilovanın rəhbərliyi ilə yaradılmış birləşmiş xor 2004–2011-ci illərdə ali məktəb tələbələri arasında keçirilən müsabiqə və yaradıcılıq festivallarında uğurla çıxış etmiş, qalib kimi müxtəlif mükafata və diplomlara layiq görülmüşlər.

Kafedrada görkəmli sənətkarlar və musiqişünaslarla (Xalq artisti, prof. R.Zöhrabov, Əməkdar incəsənət xadimi R.Mustafayev, Xalq artisti E.Quliyev, Əməkdar incəsənət xadimi Hikmət Mirməmmədli, prof. O.Rəcəbov, Əməkdar incəsənət xadimi, prof. A.Dadaşov və b.) görüşlər keçirilmişdir.

Kafedranın respublikanın müvafiq təhsil ocaqlarının uyğun kafedraları ilə sıx əlaqəsi var. Musiqi fənlərinin tədrisi metodikası ilə bağlı dövlət standartlarının hazırlanmasında kafedra əməkdaşları yaxından iştirak edirlər.

Hazırda kafedrada 29 nəfər – 1 nəfər pedaqoji elmləri doktoru, professor (Jalə Qədimova (kafedra müdiri) ), 5 nəfər fəlsəfə doktoru, dosent (Elmira Əfəndiyeva, Gülarəxanım Axundova, Laçın Həsənova, Afət Həsənova, Firəngiz Hidayətova), 9 nəfər baş müəllim (Pərvaz Babayeva, Elmira Dadaşova, Arifə Qəribova, Svetlana Hacıyeva, Rəfiqə Kərimova, Nərmin Kamilova, Kəmalə İsmayılova, Qızxanım Qəhrəmanova, Nigar Məlikova), 5 nəfər müəllim (Xanım Yarıyeva, Xatirə Qocayeva, Maralxanım Əliyeva, Aynur Hüseynova, Nailə Mirməmmədli), 7 nəfər konsertmeyster (Rəna Zaidova, Şəhla Ələkbərova, Şəhla Mirzəbəyova, Anaxanım Nəcəfova, A.Enaliyeva, Sevda Hacıyeva, Təranə Əlizadə) və 2 nəfər böyük laborant (Şəfiqə Əsgərova, Xəyalə Səfərova) çalışır. Kafedranın əməkdaşlarından 1 nəfər (Nailə Mirməmmədli) Azərbaycanın Əməkdar incəsənət xadimidir.

### 3.3.5. İBTİDAİ SİNİFLƏRDƏ RUS DİLİ KAFEDRASI

Kafedra 1983-cü ildə yaradılmışdır. Kafedraya müxtəlif vaxtlarda dos. R.Məmmədova, sonralar isə dos. H.Məmmədov, prof. E.Abbaszadə rəhbərlik etmişlər. Hal-hazırda kafedraya dos. R.Məmmədova rəhbərlik edir.

Kafedra əməkdaşları rus dilinin nəzəriyyəsi, müasir rus dili, rus dilinin tədrisi metodikası, nitq mədəniyyəti, bədii mətnlərin linqvistik təhlili, Azərbaycan qruplarında praktik rus dili fənlərini tədris edirlər.



*İbtidai siniflərdə rus dili kafedrasının əməkdaşları*

Kafedrada rus dilçiliyi və rus dilinin tədrisi metodikası sahəsində bir sıra elmi əsərlər yazılmışdır: «Rus dilinin frazeologiyası, leksikologiyası və terminologiyası» (dos. R.Məmmədova), «İbtidai siniflərdə rus dilinin tədrisi metodikası» (prof. E.Abbaszadə, dos. H.Məmmədov, b/m H.Seyidov) və s. Kafedrada tədris olunan bütün fənlər üzrə proqramlar tərtib olunmuş, dərs vəsaitləri yazılmışdır. Kafedranın əməkdaşları bir çox konfranslarda iştirak ediblər.

Dos. R.Məmmədova rus dilçiliyi ilə bağlı sanballı bir kitabın «Rus dilinin frazeologiyası, leksikologiyası və terminologiyası» və bir sıra elmi əsərlərin müəllifidir.

Kafedrada magistrantların hazırlanmasına xüsusi diqqət yetirilir. Hər il onlarla tələbə rus dilinin nəzəri və praktik problemləri ilə bağlı TEC-in təşkil etdiyi konfranslarda müxtəlif məruzələrlə çıxış edir, mükafata layiq yerlər tuturlar.

Hazırda kafedrada 12 nəfər – 1 professor (Eldar Abbaszadə), 3 nəfər fəlsəfə doktoru, dosent (Ramidə Məmmədova (kafedra müdiri), Hamlet Məmmədov, Rəfiqə Rüstəmova), 1 nəfər fəlsəfə doktoru, baş müəllim (Asya Orucəliyeva), 3 nəfər baş müəllim (Hidayət Seyidov, Zenfira Qəhrəmanova, Ninel Əliyeva), 2 nəfər müəllim (Zivər Talıbova, Sevinc Sadıqova), 2 nəfər baş laborant (Ceyran Əsgərova, Kəmalə İbrahimova) çalışır.

## 3.4. KİMYA FAKÜLTƏSİ



*Dekan*
*dos. Vaqif Həsənov*

Ali Pedaqoji İnstitut yaradılarkən burada təşkil edilən üç şöbədən biri «Təbiyyat-coğrafiya» idi. İnstitut 1926–1927-ci tədris ilində Bakı Dövlət Universitetinin tərkibinə verildiyindən «Təbiyyat-coğrafiya» şöbəsi öz fəaliyyətinə müvəqqəti ara verdi. 1930–1934-cü illərdə Bakı Dövlət Universiteti bir müddət öz fəaliyyətini dayandırdı. Onun fakültələrinin bazası əsasında yeni ali məktəblər təşkil edildi. Müstəqil ali təhsil ocağı kimi Azərbaycan Pedaqoji İnstitutu yenidən qurulanda (1930) onun əsas fakültələrindən biri Təbiyyat-kimya olmuşdur. 1945-ci ilin ikinci yarısında fakültənin adında və strukturunda əsaslı dəyişikliklər edildi.

Təbiyyat-kimya fakültəsi 1968-ci ilin ikinci yarısında iki müstəqil fakültəyə bölündü: Kimya və Biologiya. Kimya fakültəsinə prof. R.Əliyev (1968–1971), prof. R.Əbdürrəhimova (1971–1976), prof. T.Ağdamski (1976–1981), Biologiya fakültəsinə isə prof. R.Qafarova rəhbərlik etmişlər. 1981–1982-ci tədris ilində bu iki fakültə əsasında yenidən Kimya-biologiya fakültəsi yaradıldı. 2002-ci ildən isə onun bazasında yenidən iki müstəqil fakültə: Kimya və Biologiya fakültələri təşkil edildi. 2002–2005-ci illərdə Kimya fakültəsinə prof. Ə.Qurbanov rəhbərlik etmişdir.

2006-cı ildən hal-hazıra kimi kimya fakültəsinə dosent Vaqif Həsənov başçılıq edir.

Fakültədə kimya, biologiya-əlavə kimya, kimya və biologiya, kimya və pedaqogika ixtisasları üzrə kadr hazırlanmışdır.

Hazırda fakültədə 2 ixtisas üzrə (kimya, kimya və biologiya müəllimliyi ixtisasları) yüksəkixtisaslı müəllim kadrları hazırlanır. Fakültənin indiyədək 4000-dən artıq məzunu olmuşdur.

Fakültədə hazırda bakalavr pilləsində 465 tələbə (onlardan 12 nəfəri əcnəbi vətəndaşdır), magistr pilləsində 43 magistrant təhsil alır. Magistraturada təhsil alanlardan 13 nəfəri qeyri-üzvi kimya, 15 nəfəri analitik kimya və 15 nəfəri isə üzvi kimya ixtisası üzrədir. Fakültədə 40 nəfər professor-müəllim



*Kimya fakültəsinin elmi şurası*

(4 elmlər doktoru, professor, 22 fəlsəfə doktoru, dosent; 4 fəlsəfə doktoru, baş müəllim; 3 fəlsəfə doktoru, müəllim; 1 baş müəllim və 6 müəllim) çalışır.

Fakültədə kadr hazırlığına həmişə xüsusi diqqət yetirilmiş və bu gün də bu işlər müvəffəqiyyətlə davam etdirilir. Fakültədə tədrisin təşkili günün tələbləri səviyyəsində qurulur, mühazirə, seminar və laborator məşğələlərində də bu tələblər gözlənilir.

AMEA-nın akademikləri Yusif Məmmədəliyev, Bahadur Zeynalov, müxbir üzvləri Heydər Əfəndiyev, Şamxal Məmmədov, Məmməd Mövsümzadə, Cümşüd Zülfüqarlı, kimya elmləri doktoru, professorlar Yusif Musabəyov, İsgəndər Bağbanlı, Şıxbala Əliyev, Püstəxanım Rzazadə, Ağarəfi Ağayev, Zəlimxan Qarayev, Allahverdi Verdizadə kimi tanınmış elm adamları məhz fakültənin məzunlarıdır.

Fakültənin məzunları professorlar: Ş.Məmmədov, A.Qarayev, Z.Şahtaxtinskaya, M.Mövsümzadə, Ə.Əbdürrəhimov, A.Verdizadə, R.Qafarova, R.Əbdürrəhimova, İ.Nəsibov, R.Əliyev və onlarla başqaları uzun müddət bu ali məktəbdə səmərəli fəaliyyət göstərmişlər.

Respublikamızda və onun hüdudlarından kənarda Universitetimizin şərəfini uca tutan, öz əmək fəaliyyəti ilə seçilən ləyaqətli məzunlarımız çoxdur. Onlardan AMEA-nın müxbir üzvü, professor V.M.Abbasov, professor




*Görkəmli kimyaçı alim professor A.Verdizadənin 95 illiyinə həsr olunmuş tədbir*

Ə.N.Qurbanov, professor N.A.Verdizadə, professor Ö.M.Əliyev, professor Ə.M.Məmmədov, professor Y.K.Əhmədov, professor Ə.N.Fərəcov, pedaqoji elmlər doktoru M.M.Abbasov və başqalarının adını çəkmək olar.

Fakültənin kafedralarında aparılan elmi-tədqiqat işlərinin nəticələri Bakıda, Moskvada, Sankt-Peterburqda, Novosibirskdə, Ufada, Kiyevdə, Tbilisidə və digər şəhərlərdə nəşr olunan elmi və metodik jurnallarda (1000-dən artıq məqalə), 100-ə qədər müəlliflik şəhadətnaməsində öz əksini tapmışdır. Kafedraların professor-müəllimləri ali və orta məktəblər üçün 150-ə yaxın dərslik, dərs vəsaiti, metodik göstəriş nəşr etdirmiş, tədris olunan fənlərin proqramlarının tərtibinə nail olmuşlar. Hər üç kafedranın əməkdaşları Bakı, Moskva, Sankt-Peterburq, Novosibirsk, Sverdlovsk, Ufa, Kişinev, Sumi, Daşkənd, Fərqanə, Saratov, Voronej, Tallin, Surix, Afina, Porto, Gera, Vyana, İstanbul, Ankara və onlarla digər şəhərlərdə keçirilən beynəlxalq elmi konfranslarda məruzələrlə çıxış etmişlər.

Fakültənin təşəbbüsü ilə 2009-cu ildə iki Respublika elmi konfransı təşkil edilimişdir. Ulu öndər Heydər Əliyevin anadan olmasının 86-cı ildönümünə həsr olunan «Kimya və ekologiyanın aktual problemləri» mövzusunda konfransda respublikanın müxtəlif elmi-tədqiqat müəssisələrindən, universitetlərdən və xarici ölkələrdən göndərilmiş 130 adda elmi məruzə, professor Allahverdi Verdizadənin 95 illik yubileyinə həsr olunmuş konfransda isə 186 adda elmi məruzə dinlənilmişdir.

2011-ci il UNESCO tərəfindən Beynəlxalq Kimya ili elan olunduğundan fakültədə silsilə tədbirlər keçirilir. Azərbaycan MEA-nın akademikləri Məhərrəm Məmmədyarov, Nadir Seyidov və müxbir üzvü professor Vaqif Abbasovla fakültənin professor-müəllim və tələbə heyətinin görüşü və prof. İsmayıl Hüseynovun 100 illik yubileyinin keçirilməsi bu qəbildən olan tədbirlərdəndir.

Hazırda Kimya fakültəsinin nəzdində 3 kafedra – Ümumi kimya və kimyanın tədrisi metodikası (kafedra müdiri prof. Ə.Qurbanov), Üzvi kimya və kimya texnologiyası (kafedra müdiri dos. R.Məmmədova), Analitik və fiziki kimya (kafedra müdiri prof. N.Verdizadə) kafedraları fəaliyyət göstərir.

### 3.4.1. ÜMUMİ KİMYA VƏ KİMYANIN TƏDRİSİ KAFEDRASI

Kafedra 1930-cu ildə təşkil edilmişdir. Həmin kafedranın bazası əsasında 1966-cı ildə «Üzvi kimya və kimya texnologiyası», 1969-cu ildə isə «Analitik və fiziki kimya» kafedraları yaradılmışdır.

«Ümumi kimya və kimyanın tədrisi» kafedrasında 3 problem – yarımkeçirici materiallar, kompleks birləşmələr və tədris-tərbiyə işlərinin təkmilləşdirilməsi üzrə elmi-tədqiqat işləri aparılır. Kafedra əməkdaşları son illərdə 100-dən çox tədris vəsaiti, metodik göstəriş və elmi məqalə nəşr etdirmişlər. Məqalələrin çoxu yaxın və uzaq xarici ölkələrin nüfuzlu nəşrlərində işıq üzü görmüşdür. Professor İ.Q.Nəsibov, T.İ.Sultanovla birlikdə «S-elementlərinin kimyasına giriş» (1988), «P-elementlərinin kimyasına giriş» (1988), B.H.Həsənov və T.İ.Sultanovla şərikli «Qeyri-üzvi kimyadan laboratoriya məşğələləri» (1989), T.İ.Sultanov, B.N.Mardaxayev və A.Z.Məmmədova ilə birlikdə «Keçid elementlərinin kimyasına giriş» (1990) və «Qeyri-üzvi kimyadan yoxlama yazı işlərinin variantları» (1990), S.Ə.Quliyeva ilə şərikli «VI qrupun əsas yarımqrup elementləri» (1997), «Kimya terminlərinin izahlı lüğəti» (1997), İ.Nəsibov və T.İ.Sultanovun «Ümumi kimya» (2001), İ.O.Nəsibov, T.İ.Sultanovun «Qeyri-üzvi kimya» dərsliyi ali məktəblərin Kimya fakültələrinin tələbələri, məktəblərin müəllimləri və aspirantlar üçün çox dəyərli ədəbiyyatlardır. Professor R.Y.Əliyev «Kimya tədrisi üsulunun ümumi məsələləri» (1987), «Kimya tədrisinin ümumi metodikası» (1991), dosent Ə.N.Xəlilov «Biz kimya əsrində yaşayırıq» (1981), «Əsrin böyük kəşfləri» (1982), «Kimya tarixindən səhifələr» (1984), «Qeyri-üzvi kimyadan mühazirə mətnləri» (1989), «Azərbaycan kimya aləminə səyahət» (1990), «Nizami yaradıcılığında elmi anlayışlardan istifadə» (1991), «Kimyanın tədrisində yerli ma-

teriallardan və Azərbaycan alimlərinin elmi nailiyyətlərindən istifadə» (1993), habelə R.Əliyev, B.Mardaxayev, M.Şahbazov, C.Zülfüqarlı, P.Rüstəmov, H.Məmmədov, Y.Abışova ilə şərikli «Elementlər kimyasına dair metodik işləmə» (1984), «Qeyri-üzvi kimyadan yoxlama işlərinə aid metodik göstəriş» (1986), «Kimya terminləri lüğəti» (1987), «Böyük alim Dmitri İvanoviç Mendeleyev» (1994), «Kimyadan əyləncəli təcrübələr və söhbətlər» (1997), Ə.N.Qurbanov, H.İ.İbrahimov və V.Ə.Qurbanovanın «Maddənin quruluşu və kimyəvi rabitə» (2008), Ə.N.Qurbanov, V.Ə.Qurbanova «Ümumi kimyaya giriş» (2007), Ə.N.Qurbanov, M.H.Şahbazov, A.Z.Məmmədova, G.G.Şəfəqqətova «Ümumi və qeyri-üzvi kimyadan praktikum» (2010), A.C.Quliyev «Kompleks birləşmələr kimyası» (2010), Ö.M.Əliyev «Qeyri-üzvi kimya kursu» (I və II hissə, 2009), C.B.Musayev «Qeyri-üzvi sintez» (2009), G.G.Şəfəqqətova «Kompleks birləşmələr kimyası» (2010) və digər tədris vəsaitləri, metodik göstərişlər, elmi-kütləvi kitab və kitabçalar hazırlayıb nəşr etdirmişlər. Kafedra əməkdaşları tərəfindən «Maddələrin quruluşu və kimyəvi rabitə», «Kompleks birləşmələr kimyası», «Radiokimya və geokimyanın əsasları», «Qeyri-üzvi kimyanın nəzəri əsasları», «Qeyri-üzvi kimyanın aktual problemləri», «Keçid elementlərinin kirtallokimyası» fənlərinə aid proqramlar yenidən işlənmiş, Təhsil Nazirliyinin tövsiyəsi ilə nəşr olunmuşdur. Son illərdə kafedrada «Kompleks birləşmələr kimyası», «Qeyri-üzvi kimyanın nəzəri əsasları», «Nadir torpaq elementlər kimyası», «Maddənin quruluşu və kimyəvi rabitə», «Radiokimya və geokimyanın əsasları», «Fiziki kimyəvi analizin əsasları» ilə bağlı yeni proqramlar hazırlanmışdır.

Kafedra əməkdaşları respublikada və xarici ölkələrdə keçirilən beynəlxalq konfranslarda fəal iştirak edirlər. Kafedranın həm respublikanın (BDU, Neft Akademiyası, Tibb Universiteti), həm də digər MDB ölkələrinin (Dnepropetrovsk Dövlət Universiteti, İvanov Texnologiya İnstitutu, Moskva Pedaqoji İnstitutu, Düşənbə Dövlət Universiteti, Mahaçqala, Nalçik Universiteti) universitetləri ilə sıx əlaqəsi vardır.

Kafedra Bakının ümumtəhsil məktəbləri ilə sıx əlaqə saxlayır. 129, 145, 115, 82 saylı orta məktəblərdə «Kimya və ətraf mühit», «Əyləncəli kimya gecələri» təşkil olunmuş, məktəblərə əyani vəsaitlər hazırlanıb verilmişdir.

Kafedranın əməkdaşları apardıqları elmi-tədqiqat işləri ilə əlaqədar AMEA-nın Kimya Problemləri İnstitutunda keçirilən seminarlarda və müxtəlif elmi-praktik konfranslarda çıxış edirlər.



*Ümumi kimya və kimyanın tədrisi metodikası kafedrasının əməkdaşları*

Kafedra müdiri prof. Ələkbər Qurbanov BDU-nun nəzdində fəaliyyət göstərən Dissertasiya Şurasının üzvüdür. O, həm də ADPU-nun Elmi Xəbərlərinin (təbiət elmləri üzrə) redaksiya heyətinin üzvüdür. 2006-cı ildə ona «Əməkdar müəllim» fəxri adı verilmişdir.

Hazırda kafedrada 14 nəfər – 1 elmlər doktoru, professor (Ələkbər Qurbanov (kafedra müdiri)), 8 nəfər fəlsəfə doktoru, dosent (Nigar Seyidova, Aysəba Məmmədova, Cavadxan Musayev, Mədət Şahbazov, Mütəllim Hüseynov, Sona Quliyeva, Asəf Quliyev, Gülbuta Şəfəqqətova), 2 nəfər fəlsəfə doktoru, baş müəllim (Gülzar Şadlinskaya, Gülnarə İsmayılova) 2 nəfər fəlsəfə doktoru, müəllim (Vəsilə Qurbanova, Reyhan Ağayeva), 1 nəfər müəllim (Simuzər Qəhrəmanova) çalışır.

### 3.4.2. ÜZVİ KİMYA VƏ KİMYA TEXNOLOGİYASI KAFEDRASI

Kafedra 1966-cı ildə «Ümumi kimya» kafedrasının bazası əsasında təşkil edilmişdir. Kafedraya ayrı-ayrı vaxtlarda dos. Ə.S.Rzayev (1966–1972), prof. İ.İ.Hüseynov (1972–1979), prof. R.Q.Ələkbərov (1979–2004), dos. V.S.Həsənov (2004–2011) rəhbərlik etmişlər. Hazırda kafedra müdiri vəzifəsində dosent Rəfiqə Məmmədova çalışır.

Son illərdə kafedrada «Təbabətdə, kənd təsərrüfatında və texnikada tətbiq edilə biləcək yeni bioloji aktiv birləşmələrin sintezi və tədqiqi» problemi üzrə elmi-tədqiqat işləri aparılır.

Kafedrada elmi-pedaqoji kadr hazırlığına xüsusi diqqət yetirilir. Kafedranın əməkdaşı R.Ələkbərovaya səmərəli elmi-pedaqoji fəaliyyətinə, kadr hazırlığı sahəsindəki xidmətlərinə görə 1990-cı ildə «professor» elmi adı verilmişdir. O, 1992-ci ildə «Funksional əvəzli aminlər və alkanollar əsasında virus inaktivatorlarının, kimyəvi mutagenlərin və bioksidlərin məqsədli sintezi» mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. Kafedranın aspirant və dissertantları İsmayıl Səfərov, Sabir Quliyev, Sevil Əliyeva, Eyyub Abbasov, Ənvər Əfəndiyev, Vaqif Həsənov, Yavər Qasımova, Şükür Mustafayev, Nəcibə Şirinova və Məhsəti Mirzəyeva bir-birinin ardınca dissertasiya müdafiə edərək kimya elmləri üzrə fəlsəfə doktoru alimlik dərəcəsi almışdır. Kafedrada indiyədək 60-dan çox magistr hazırlanmışdır.

Kafedranın nəzdində 1989-cu ildən «Yeni bioloji aktiv birləşmələr» problem laboratoriyası fəaliyyət göstərir.

Əməkdaşlar tərəfindən kafedrada tədris olunan fənlər üzrə 70-dən artıq dərslik, dərs vəsaiti və metodik vəsait nəşr edilmişdir. «Üzvi sintez praktikumu» (1989), «Bioloji kimyadan təcrübə məşğələləri» (1990), «Dərsdənkənar kimya vəsaiti» (1992), «Kimya həvəskarları üçün yaddaş» (1998), «Üzvi kimya» (I hissə, 2007; II hissə, 2008), «Həyat fəaliyyətinin kimyəvi əsasları» (2008), «Üzvi kimyadan yoxlama işləri» (2008), «Yüksək molekullu birləşmələrdən yoxlama testlər» (2009), «Həyat fəaliyyətinin kimyəvi əsasları və bioloji kimyadan yoxlama testlər» (2010), «Dərman maddələrinin sintezindən yoxlama testlər» (2010), «Üzvi kimyanın nəzəri əsasları və üzvi sintezdən yoxlama testlər» (2010), «Üzvi kimyadan testlər» (2010), «Bioloji kimyadan yoxlama işləri» (2010), «Üzvi kimya praktikumu» (2010), «Üzvi sintez testlərdə» (2011), «Element üzvi birləşmələr testlərdə» (2011), «Üzvi sintez praktikumu» (2011) adlı elmi nəşrlər bu qəbildəndir.

Kafedrada bakalavr və magistr pilləsində tədris olunan bütün fənlər üzrə proqramlar (kimya texnologiyası, biokimya və molekulyar biologiya, həyat fəaliyyətinin kimyəvi əsasları, YMB kimyası, neft kimyası, üzvi kimya, üzvi sintez, stereokimya, konformasiya analizi, üzvi kimyanın aktual problemləri, bioüzvi kimya, təbii birləşmələr kimyası, dərman maddələrinin sintezi və s.) hazırlanıb çap edilmişdir.



*Üzvi kimya və kimya texnologiyası kafedrasının əməkdaşları*

Kafedranın dosentləri V.Həsənov, M.Mirzəyeva, M.Allahverdiyev ixtiralar üçün müəlliflik şəhadətnamələri və Milli Patentlər almışlar. Kafedranın dosentləri V.Həsənov və Ə. Rzayev BDU-da fəaliyyət göstərən Dissertasiya Şurasının nəzdində fəaliyyət göstərən seminarın üzvüdür. Dosent V.Həsənov ADPU-nun Elmi Xəbərlərinin təbiət elmləri üzrə redaksiya heyətinin məsul katibi, həm də Kimya fakültəsinin dekanıdır. Kafedranın əməkdaşları dos. V.Həsənov, dos. Ə.Mahmudova və baş müəllim R.Məmmədova Türkiyə Respublikasında keçirilən Beynəlxalq konfransda iştirak etmişlər.

Hazırda kafedrada 16 nəfər – 9 nəfər fəlsəfə doktoru, dosent (Rəfiqə Məmmədova (kafedra müdiri), Əbdül Rzayev, Vaqif Həsənov, Nəzirə Mehmandarova, Mədinə Nəsirova, Yavər Qasımova, Ədilə Mahmudova, Elmira Məmmədova, Nizami Əkbərov), 2 nəfər fəlsəfə doktoru, baş müəllim (Rəhimə Məmmədova və Məhsəti Mirzəyeva), 1 nəfər baş müəllim (Gülnarə Babayeva) və 4 nəfər müəllim (İsa Cəfərov, Səadət Abdullayeva, Səliqə Qəhrəmanova, Kəmalə İsgəndərova), 2 nəfər baş laborant (Sevinc Rəhimova, Fərqanə Əzizova), 2 nəfər laborant (Sevinc Məmmədova, Azadə Nuruzadə) çalışır.

### 3.4.3. ANALİTİK VƏ FİZİKİ KİMYA KAFEDRASI

Kafedra 1969-cu ildə professor Allahverdi Verdizadənin rəhbərliyi altında yaradılmışdır (Allahverdi Verdizadə 1959–1964-cü illərdə ADPU-nun «Ümumi kimya» kafedrasına rəhbərlik etmişdir). 1976-cı ildən hal-hazıra kimi kafedraya professor Nailə Verdizadə rəhbərlik edir.

Kafedra təşkil olunandan burada 3 elmlər doktoru (Nailə Verdizadə, Telman Ağdamski, Ələkbər Qurbanov) və 8 fəlsəfə doktoru (Sevil Şirəliyeva, Hüsü İbrahimov, Məhyəddin İsgəndərov, Telman Əmrahov, Zərifə Rəhimova, Kərim Quliyev, Əli Zalov, Ülviyyə Rüstəmova) və 26 nəfər magistr yetişmişdir.

Kafedrada iki istiqamət üzrə elmi-tədqiqat işi aparılır: analitik kimya və kataliz. Analitik kimyadan elmi işlər prof. Allahverdi Verdizadə tərəfindən və onun rəhbərliyi altında aparılmışdır.

Allahverdi Verdizadə (1914–1973) elmi fəaliyyətinin ilk dövründə yodun üzvi həlledicilərinin tətbiqi ilə dəmirin mikroyodometrik təyini sahəsində tədqiqatlar aparmışdır. Onun əsas elmi istiqaməti peryodatometrik və yodometrik üsulların tətbiq sahəsinin inkişafı olmuşdur. O, mis, dəmir, molibden, nikel, kobalt, qalay, sink, kadmium, sirkonium, civə, torium, serium, indium, qurğuşun və s. elementlərin qravimetrik, titrimetrik və fotometrik təyini üsullarını işləyib hazırlamış və bu üsulları müxtəlif obyektlərə tətbiq etmişdir. Elmi fəaliyyətinin sonrakı illərində isə o, bəzi d-keçid elementlər üçün həssas və seçici yeni ekstraksiyalı-fotometrik üsulların işlənilməsi ilə məşğul olmuşdur. O bir nəfər elmlər doktoru və üç nəfər fəlsəfə doktoru yetişdirmişdir (Ələkbər Qurbanov, Nailə Verdizadə, Sevil Şirəliyeva).

Prof. Nailə Verdizadə ilk elmi tədqiqatlarını qələvi torpaq metallarının peryodatları ilə talliumun qravimetrik, titrimetrik, ekstraksiyalı-fotometrik və differensial-fotometrik təyini üsullarının işlənilməsinə həsr etmişdir.

Əsas elmi istiqaməti isə (1972-ci ildən hal-hazıra kimi) d-keçid elementlərin tərkibində azot və kükürd olan liqandlarla əmələ gətirdikləri komplekslərin spektrofotometrik tədqiqi və analitik tətbiqi olmuşdur. Onun bilavasitə işlədiyi və rəhbərlik etdiyi işlər nəticəsində müəyyən edilmişdir ki, bir sıra d-keçid elementləri rodanid, 2, 7-di (rodanometil)-benzol-1, 4-dioksan, 2-oksi-5-halogentiofenol, ditiol və hidrofob üzvi aminlərlə yaxşı ekstraksiya olunan həssaslığına və seçiciliyinə görə eyni liqand komplekslərdən üstün olan müxtəlif liqandlı komplekslər əmələ gətirirlər. Aparılan tədqiqatlar nəticəsində niobium, tantal, molibden, volfram, uran, vanadium, titan, dəmir, kobalt, mis, bismutun və s. ekstraksiyalı-fotometrik təyini üçün yeni üsullar işlənib hazırlanmışdır. İşlənilmiş metodikalar alunit, torpaq, ərinti, polad, yeyinti məhsulları, neft və onun məhsullarının həmin elementlərin təyinində istifadə edilmişdir. Bu üsullar yüksək seçiciliyə və həssaslığa malik olduğundan Sumqayıt boru prokat və superfosfat zavodlarının, Tbilisi aviasiya zavodunun, Keşlə maşınqayırma və Azneftyağ zavodlarının və s. laboratoriyalarında tətbiq olunmuşdur.



*Analitik və fiziki kimya kafedrasının əməkdaşları*

Prof. Nailə Verdizadənin rəhbərliyi altında 6 nəfər fəlsəfə doktoru yetişmiş və hal-hazırda 1 nəfər (Ülviyyə Abbasquliyeva) aspirant öz elmi tədqiqatlarını davam etdirir. O, 300-dən artıq elmi əsərin, o cümlədən 40 dərslik, dərs vəsaiti və metodik göstərişin, 13 proqramın müəllifidir.

Kataliz sahəsində kafedrada işlər prof. Telman Ağdamski (o, 1976–1981-ci illərdə kimya fakültəsinin dekanı vəzifəsində işləmişdir) tərəfindən aparılmışdır.

Prof. Telman Ağdamskinin əsas elmi tədqiqatları katalizatorların sintezi, tədqiqi və seçilməsinin nəzəri əsaslarının işlənilməsinə və koordinasiya kimyasına aiddir. O, xrom-alüminium katalizatorlarının sintez şəraitini müəyyənləşdirərək, onları dehidrogenləşmə və polimerləşmə reaksiyalarında tədqiq etmişdir. Onun tərəfindən dehidrogenləşmə reaksiyasında nadir və nadir-torpaq elementlərinin katalitik və promotorluq xassələri öyrənilmiş və respublikanın xammalı əsasında yüksək fəallığa malik katalizatorlar sintez edilmişdir. O, tərkibində d- və f-elementləri olan iki və üç valentli itterbium, samarium və yevropiumun tsiklopentadienil, arenil törəmələrinin sintezi, xassələri, quruluşu və katalitik xassələrinin öyrənilməsi sahəsində elmi-tədqiqat işlərini davam etdirərək lantanoidlərin üzvi birləşmələrinin sintezi və onların koordinasiya kimyasının öyrənilməsi sahəsində uğurlu elmi nəticələr əldə etmişdir. O,150-yə qədər elmi əsərin, 15 dərslik və dərs vəsaitinin, 3 ədəd müəlliflik şəhadətnaməsinin müəllifidir.

Prof. Telman Ağdamski koordinasiya kimyası üzrə 1985–2001-ci illərdə İsveçrə, Yunanıstan, Avstraliya, Portuqaliya, Almaniya, Yaponiya, Kanada, Amerikada keçirilmiş XXIII–XXXI Beynəlxalq konqres və simpoziumlara və Karbon 4-oksidin işlənilməsinə həsr olunmuş I, II, III, V və VI beynəlxalq konfranslara (1990, Almaniya; 1993, İtaliya; 1994, 1997, Yaponiya; 2001, Amerika) dəvət edilmişdir.

Kafedrada Nailə Verdizadənin rəhbərliyi ilə aparılan işlərin nəticələri mərkəzi və respublika elmi jurnallarında nəşr edilmiş, Bakı, Moskva, Kiyev, Tallin, Saratov, Voronej, Qroznı, Mahaçqala, Nalçik, Sürix, Yunanıstan, Portuqaliya, ADR, Avstraliya, İngiltərə, Avstriyada keçirilən respublika və beynəlxalq elmi konfranslarda və XII Mendeleyev və Polşada keçirilən kimyaçıların qurultaylarında dinlənilmişdir. Kafedra əməkdaşlarının ekologiya sahəsində gördükləri işləri «Ecological conqress» adlı Rusiya-ABŞ beynəlxalq jurnalında ingilis dilində mütəmadi şəkildə çap olunur.

İlk dəfə olaraq pedaqoji institutlar və universitetlər üçün analitik və fiziki kimya ixtisasları üzrə dərslik və dərs vəsaitləri, ali məktəblərə daxil olanlar üçün kimyadan vəsait məhz kafedra əməkdaşları tərəfindən yazılmışdır.

Son illərdə kafedra əməkdaşlarının (N.Verdizadə, T.Ağdamski, N.Xəlilova, S.Şirəliyeva, T.Əmrahov, M.İsgəndərov, H.İbrahimov, K.Quliyev, Ə.Zalov, S.Quliyev, A.Sərdarlı) 130-dan artıq elmi və metodiki əsəri, o cümlədən 10-dan çox dərslik və dərs vəsaiti «Azərbaycanca-ingiliscə-rusca kimya, kimya texnologiyası, neft və qazın emalına dair lüğət» (2004), «Kompleks birləşmələr və onların analizdə tətbiqi» (2005), «Fiziki kimyadan məsələ və çalışmalar» (2005), «Üzvi reaksiyaların kinetikası» (2005), «Домашние задания школьников по химии» (2006), «Oksidləşmə-reduksiya reaksiyaları» (2007), «Ekologiyanın əsasları və təbiətin mühafizəsi» (2008), «Elektrokimya» (2009), «Fiziki və kolloid kimyadan praktikum» (2009), «Xromatoqrafik analiz metodları» (2009), «Analitik kimya fənni üzrə test sualları» (2009), «Oksidimetriya» (2009), «Kolloid kimya» (2010), «Üzvi reagentlərin analitik kimyada tətbiqi» (2010) və 10-dan artıq yeni proqramı nəşr olunmuşdur.

2009-cu ildə isə noyabrın 24–25-də prof. Allahverdi Verdizadənin 95 illik yubileyinə həsr olunmuş «Üzvi reagentlər analitik kimyada» adlı respublika konfransı keçirilmişdir. Konfransın təşkilat komitəsinə 14 nəfər AMEA-nın akademiki və müxbir üzvləri daxil edilmişdir. İki gün keçirilən konfransda respublikanın müxtəlif elmi-tədqiqat və universitetlərindən və xarici ölkələrdən göndərilmiş 186 adda elmi məruzə dinlənilmişdir.

Analitik və fiziki kimya kafedrasının elmi əlaqələri həm xarici ölkə, həm MDB ölkələri, həm də respublika daxili elm müəssisələrini əhatə edir. Bu əlaqələr öz xarakterinə görə müxtəlifdir: elmi tədqiqat işləri mövzularının bir-biri ilə əlaqələndirilməsi, məruzə və məsləhət üçün görkəmli mütəxəssislərin dəvət edilməsi, kafedra aspirantlarının başqa müəssisələrdə və başqa aspirantların bizim kafedrada elmi iş yerinə yetirməsi, elmi konfranslarda iştirak edilməsi, elmi seminarlarda məruzə ilə çıxış edilməsi, təsərrüfat müqaviləli işlərin yerinə yetirilməsi, elmi-tədqiqat işləri nəticələrinin xalq təsərrüfatında tətbiq edilməsi və s.

1982–1992-ci illərdə prof. Nailə Verdizadənin rəhbərliyi altında kafedra Moskva Əlvan Metalların Emalı İnstitutu nəzdində olan və Mtsensk şəhərində yerləşən keyfiyyətli ərintilər eksperimental zavodu ilə təsərrüfat müqaviləli iş aparmışdır. Kafedra nəzdində Nailə Verdizadənin rəhbərliyi altında «Koordinasion birləşmələr» elmi-tədqiqat laboratoriyası fəaliyyət göstərir. Bu laboratoriya tərkibində kükürd olan liqandlarla üçkomponentli metal komplekslərinin tədqiqi və onların müxtəlif materialların analizinə tətbiqi ilə məşğul olur.

Uzun illərdir ki, prof. N.Verdizadə və prof. T.Ağdamski respublikada namizədlik və doktorluq dissertasiyalarının müdafiəsi üzrə Müdafiə şuralarının üzvüdürlər. Prof. T.Ağdamski 2004–2011-ci illərdə Azərbaycan Respublikasının Pezidenti yanında Ali Attestasiya Komissiyasının kimya elmləri üzrə ekspert şurasının üzvü olmuşdur. Kafedra üzvləri hər il TEC xətti ilə 15-ə yaxın tələbənin elmi işlərinə rəhbərlik edir. Həmin tələbələr fakültə, universitet və respublika miqyaslı, elmi konfranslarda məruzə ilə çıxışlar edir, diplomlarla təltif olunurlar. Bu işə əvvəllər dos. Əli Zalov (o, iki ildir ki, ADPU üzrə TEC-in sədridir ), indi isə dos. Kərim Quliyev rəhbərlik edir.

Respublika və Universitet üzrə tələbələr arasında keçirilən kimya olimpiadalarında kafedranın müəllimləri fəal iştirak edir. Prof. N.Verdizadə uzun illərdir ki, Təhsil Nazirliyi tərəfindən təşkil edilən tələbə olimpiadasının üzvü, gənc tədqiqatçıların elmi konfranslarında kimya bölməsinin sədridir. AMEA-nın qərarı ilə NailəVerdizadə «Humay 2005» Milli mükafat diplomuna layiq görülmüşdür. O, 2006-cı ildə «Əməkdar müəllim» fəxri adına layiq görülmüş, ADPU-da keçirilən «İlin alimi», «İlin müəllimi» müsabiqəsinin qaliblərindən biri olmuşdur.

Hazırda kafedrada 10 nəfər – 2 nəfər elmlər doktoru, professor (Nailə Verdizadə (kafedra müdiri), Telman Ağdamski) 6 nəfər fəlsəfə doktoru, dosent (Naimə Xəlilova, Sevil Şirəliyeva, Hüsü İbrahimov, Məhyəddin İsgəndərov, Kərim Quliyev, Əli Zalov), 2 nəfər müəllim (Şəfa Məmmədova, Naibə Əfəndiyeva) çalışır.

## 3.5. BİOLOGİYA FAKÜLTƏSİ



*Dekan*
*prof. Yusif Əhmədov*

İnstitut yaradılarkən təşkil edilən 3 şöbədən biri Təbiyyat-coğrafiya idi. İnstitut 1926–1927-ci tədris ilində Bakı Dövlət Universitetinin tərkibinə verildiyindən Təbiyyat-coğrafiya şöbəsi öz fəaliyyətini müvəqqəti dayandırdı. Müstəqil ali təhsil müəssisəsi kimi Pedaqoji İnstitut yenidən təşkil olunanda onun əsas fakültələrindən biri Təbiyyat-kimya idi. 1945-ci ilin ikinci yarısında fakültənin adında və strukturunda əsaslı dəyişikliklər edildi. Ona rəhbərlik dos. Z.Şahtaxtinskaya-ya, az sonra isə Ə.Əbdürrəhimova tapşırıldı.

Təbiyyat-kimya fakültəsi 1968-ci ilin sonunda iki müstəqil fakültəyə bölündü: Biologiya və Kimya. Biologiya fakültəsinə R.Z.Qafarova (1968–1981), Kimya fakültəsinə isə prof. R.Y.Əliyev (1968–1971), prof. R.Ə.Əbdürrəhimova (1971–1976), dos. T.Ə.Ağdamski (1976–1978) rəhbərlik etdilər.

1972-ci ildə fakültə Coğrafiya fakültəsi ilə birləşərək Biologiya-coğrafiya adı altında fəaliyyət göstərdi.

1981–1982-ci tədris ilində yenidən Kimya-biologiya fakültəsi yaradıldı. Əməkdar elm xadimi, prof. R.Z.Qafarova ömrünün sonuna (1997) kimi fakültənin dekanı vəzifəsində çalışdı. Sonrakı illərdə fakültəyə kimya elmləri doktoru, prof. Ə.N.Qurbanov (1997–2002), dos. Ə.M.Məhərrəmov (2002–2011) rəhbərlik etmişdir. Hazırda fakültəyə prof. Yusif Əhmədov rəhbərlik edir.

Kimya-biologiya fakültəsinin onlarla məzunu fəlsəfə və elmlər doktoru alimlik dərəcəsi almış, professor, SSRİ EA-nın müxbir üzvü, respublika EA-nın həqiqi və müxbir üzvləri seçilmişlər.

Öz elmi fəaliyyətləri ilə Azərbaycan kimya və biologiya elminə ümumdünya şöhrəti qazandıran fakültə məzunlarından SSRİ EA-nın müxbir üzvü, respublika EA-nın akademiki, SSRİ Dövlət mükafatı laureatı, Azərbaycan EA-nın sabiq prezidenti (2 dəfə seçilmişdir) Y.Məmmədəliyevin, AMEA-nın akademikləri A.Qarayevin, B.Zeynalovun, müxbir üzvləri



*Biologiya fakültəsinin elmi şurası*

H.Əfəndiyevin, Ş.Məmmədovun, M.Mövsümzadənin, C.Zülfüqarlının, Ə.Qasımovun, Fransa Təbiətşünaslıq və Texnika Tarixi Akademiyasının müxbir üzvü, professor Y.Musabəyovun, biologiya elmləri doktoru, professorlardan Ş.Barxalovun, C.Hidayətovun, H.Talışınskinin, Z.Şahtaxtinskayanın, H.Qədirovun, R.Qafarovanın, B.Ağayevin, Ə.Fərəcovun, M.Qarayevin, kimya elmləri doktoru və professorlardan İ.Bağbanlının, Ş.Əliyevin, İ.Şıxıyevin, P.Rzazadənin, A.Verdizadənin, Ə.Əlbəndovun, N.Rüstəmovun, Ö.Əliyevin, Ə.Qurbanovun, N.Verdizadənin, texnika elmləri doktoru, professor A.Misgərlinin, geologiya-mineralogiya elmləri doktoru, professor F.Vəkilovanın, tarix elmləri doktoru H.Əmirquliyevin və başqalarının adlarını iftixarla çəkmək olar.

2002-ci il may ayının 20-də Kimya-biologiya fakültəsi ayrılaraq iki fakültəyə – Biologiya və Kimya fakültələrinə çevrilmişdir.

Fakültənin indiyə qədər 16200 məzunu olmuşdur ki, onların bir çoxu bu gün həm ölkə daxilində, həm də xaricdə ixtisaslarına uyğun işlərdə çalışırlar.

Kafedralarda elmi-tədqiqat işlərini yüksək səviyyədə aparmaq məqsədi ilə AMEA-nın elmi-tədqiqat institutları, xarici ölkələrin universitetləri ilə sıx əməkdaşlıq edilir. Fakültə əməkdaşları həm respublikada, həm də xarici ölkələrdə konfrans və konqreslərdə məruzələrlə çıxış edir, məqalələr nəşr etdirir, monoqrafiya, dərslik və dərs vəsaitləri yazırlar.

Respublika və Beynəlxalq Biologiya Olimpiadalarının təşkilində fakültə əməkdaşları fəal iştirak edir. Hər il TEC xətti ilə onlarla tələbə elmi-tədqiqat işlərinə cəlb olunurlar. Fakültəmizin kafedralarında 6 nəfər professor, 28 nəfər dosent, 33 nəfər baş müəllim, 14 müəllim, 22 nəfər tədris-köməkçi heyət çalışır. Son illərdə kafedra əməkdaşları tərəfindən 29 adda dərslik, 80 adda dərs vəsaiti, 90 metodik göstəriş, 18 monoqrafiya hazırlanaraq nəşr edilmişdir.

Hazırda fakültədə 5 ixtisas kafedrası: Botanika (kafedra müdiri prof. Y.Əhmədov), Zoologiya (kafedra müdiri prof. B.Ağayev), İnsan və heyvan fiziologiyası (kafedra müdiri prof. Ə.Fərəcov), Biologiyanın tədrisi metodikası (kafedra müdiri prof. Ə.Hüseynov) və Tibbi biliklərin əsasları (kafedra müdiri prof. T.Feyzullayeva) fəaliyyət göstərir.

### 3.5.1. BOTANİKA KAFEDRASI

Botanika kafedrası 1930–1931-ci tədris ilində yaradılmışdır. Kafedra yaradıldığı ilk dövrdən prof. A.A.Qrossheym, prof B.Şutov, dos. S.X.Osmanzadə, dos. M.Ağamirov, V.M.Hacıyev, Y.M.İsayev kimi yüksək ixtisaslı kadrlarla komplektləşdirilmişdir. İnstitut fəaliyyətə başlayan vaxtdan Peterburq ali qadınlar kursunu bitirmiş Səlimə xanım Osmanzadə kafedra ilə əməkdaşlıq etmişdir. İnstitutun təşkilində xüsusi xidmətləri olan prof. F.A.Rzabəyli burada işləyərkən biologiyanın aktual məsələlərinə həsr edilmiş 30-dan artıq elmi əsər yazmışdır. O, «Biologiya terminləri lüğəti», «Ümumi biologiya» əsərlərinin müəllifidir. Kafedra əməkdaşları prof.A.A.Qrossheymin ümumi redaktəsi ilə «Abşeron bitkilərinin təyinedicisi» əsərini yazmış, 4 cildlik «Qafqaz florası», 3 cildlik «Azərbaycan florası» əsərlərini nəşr etdirmişlər.

Əməkdar elm xadimi, prof. H.M.Qədirov 1946-cı ildən Botanika kafedrasının dosenti, sonralar professoru, 1950-ci ildən 1984-cü ilə qədər fasiləsiz olaraq həmin kafedranın müdiri işləmişdir. O, 1951-ci ildən APİ-nin tədris işləri üzrə direktor müavini, 1951–54-cü illərdə direktoru, 1954–1962-ci illərdə isə tədris işləri üzrə prorektor vəzifəsində çalışmışdır. H.M.Qədirov akademik A.A.Qrossheym kimi dünya şöhrətli alimlərlə birlikdə dəfələrlə Botanika üzrə ekpedisiyalarda iştirak etməklə, respublikamızın Böyük Qafqaz, Kiçik Qafqaz, Talış, Kür-Araz ovalığı və s. ərazilərinin zəngin florasını öyrənmiş, xalq təsərrüfatının müxtəlif sahələri üçün də-

yərli fondların yaradılmasında gərgin əmək sərf etmişdir. Onun tədqiqatlarının nəticələri 100-ə qədər elmi əsərində, o cümlədən 16 adda kitabda öz əksini tapmışdır. O, həm də «Azərbaycan florası» (1, 5, 6, 7-ci cildlər) və «Abşeronun yaşıllaşdırılması» kimi qiymətli monoqrafik əsərlərin müəlliflərindən biridir. Prof. H.M.Qədirov tərəfindən ali məktəb tələbələri üçün «Bitki coğrafiyası», «Bitki coğrafiyasından laborator məşğələləri», «Ali bitkilər sistematikasından laborator məşğələləri», «Sərbəstləçəkli ikiləpəlilər», «Bitişikləçəkli ikiləpəli və birləpəlilər», «Ali bitkilərin sistematikası» adlı tədris kitabları nəşr olunmuşdur.

Kafedrada 7 namizədlik dissertasiyası müdafiə edilmişdir. Kafedra əməkdaşları tərəfindən 40-dan artıq dərslik və dərs vəsaiti – H.Qədirov və Q.Əliyevin «Bitki coğrafiyası», Ə.İsayev və T.Əliyevin «Bitki coğrafiyasından laborator məşğələləri», Ə.Salamzadə, Q.Əliyev və Y.Ağayevanin «İbtidai bitkilər sistematikasından laborator məşğələləri», Y.Əhmədovun «Bitki fiziologiyasından praktikum», «Mikrobiologiyanın əsasları ilə bitki fiziologiyasından laborator məşğələləri», M.Atakişiyev və T.Əliyevin «Kənd təsərrüfatının əsaslarından laborator məşğələləri», T.Əliyev və F.Əliyevanın «Sitologiyadan praktikum», M.Atakişiyev, T.Əliyev və Y.Əhmədovun «Bitki ekologiyasının əsasları ilə botanikadan laborator məşğələləri», dos. A.Ə.Yusifovanın «Bitki fiziologiyasından praktiki məşğələlər», F.Ə.Kərimov və prof. Y.K.Əhmədovun «Bitkilərin davamlılığının fiziologiyası», S.Cəbrayılzadənin «Mikologiya» və s. yazılmşdır.

Kafedra əməkdaşı O.Cərrahova tərəfindən «Şuşa xaşası» adlı yeni bitki növü tapılmışdır.

Hazırda kafedra Rusiya EA Botanika və Bitki Fiziologiyası institutları, AMEA Botanika, Mikrobiologiya, Genetika və Seleksiya institutları, həmçinin Humboltd adına Berlin Universiteti ilə (prof Y.K.Əhmədov həmin Universitetdə kadrların ixtisasartırma kursundan keçmişdir) elmi əməkdaşlıq edir. Kafedra əməkdaşları beynəlxalq, Respublika və ümumuniversitet konfranslarında elmi məruzələrlə çıxışlar edirlər.

Kafedraya 1984-cü ildən prof. Y.K.Əhmədov rəhbərlik edir.

Prof. Y.K.Əhmədov Sankt-Peterburq şəhərində bitki fiziologiyası fənninin tədrisi problemlərinə həsr edilmiş elmi konfransda, Moskva şəhərində keçirilmiş «Yeni qeyri-ənənəvi bitkilər və onlardan istifadə perspektivləri» adlı IV beynəlxalq simpoziumda, «Bitkilərin böyümə və inkişafı-



*Botanika kafedrasının əməkdaşları*

nın tənzimləyiciləri» adlı beşinci və altıncı konfranslarda, Ukraynanın Kiyev şəhərində «Fotosintez və onun məhsulları» adlı beynəlxalq konfransda, Türkiyənin Malatya şəhərində keçirilən XVI beynəlxalq bioloji konqresdə məruzələrlə çıxış etmişdir. Prof. Y.K.Əhmədov və dos. Q.H.Əliyev Alma-Ata şəhərində keçirilən Ümumittifaq Botanika qurultayına nümayəndə seçilmiş, orada məruzələrlə çıxış etmişlər.

Kafedrada bitki aləminin mühafizəsi, dəyişdirilməsi və ondan səmərəli istifadə olunması istiqamətində elmi tədqiqat işləri aparılır.

Aparılan tədqiqat işlərində əsas məqsəd yeni bitki növlərinin aşkara çıxarılması, fizioloji aktiv maddələrin və mikroelementlərin bitki orqanizmində böyümə, inkişaf və məhsuldarlığa təsirinin öyrənilməsi, həmçinin həmin maddələrin optimal dozalarının təyin edilməsindən ibarətdir.

Kafedra əməkdaşları prof. Y.K.Əhmədov, dos. M.Ə.Atakişiyev, dos. T.Ə.Əliyev, dos. Q.H.Əliyev rəsmi opponent və rəyçi kimi Müdafiə şuralarının işində fəal iştirak edir. Prof. Y.K.Əhmədov və S.Cəbrayılzadə Dissertasiya şurasının üzvüdürlər.

Aparılmış elmi-tədqiqat işlərinin nəticəsi öz əksini elmi əsərlərdə tapmışdır ki, bu da 420-yə yaxın məqalə və tezisdən ibarətdir. Eyni zamanda yeni tədris planlarının tələblərinə uyğun olaraq həm bakalavr, həm də magistr pilləsində tədris olunan Botanika fənləri üzrə metodiki göstəriş və proqramlar hazırlanmışdır. Son illərdə kafedra əməkdaşları tərəfindən

400-dən artıq məqalə və məruzə tezisi çap edilmiş, yeni tədris planlarına uyğun olaraq bakalavr, magistr pillələri üçün yeni proqram hazırlanmışdır.

Kafedrada 17 nəfər – 2 nəfər professor (Yusif Əhmədov, Məmməd Salmanov), 7 nəfər fəlsəfə doktoru, dosent (Mustafa Atakişiyev, Tofiq Əliyev, Flora Əliyeva, Ofelya Cərrahova, Fatma Feyzullayeva, Anaxanım Yusifova, Zöhrə Sultanova ), 4 nəfər fəlsəfə doktoru, baş müəllim (Ofelya Tağıyeva, Kəmalə Əfənfiyeva, Kəmalə Məmmədova, Sabiyə Cəbrayılzadə), 2 nəfər baş müəllim (Gültəkin İsmayılova, Xuraman Vəliyeva), 2 nəfər müəllim (Dilşad Sadıqova, Sənubər Aslanova) çalışır.

### 3.5.2. ZOOLOGİYA KAFEDRASI

Zoologiya kafedrası 1930-cu ildə yaradılmış və onun müdiri vəzifəsinə professor T.Ə.Rzabəyli təyin olunmuşdur. Kafedraya 1932–1936-cı illərdə professor V.S.Yelpatevski, 1936–1937-ci illərdə S.Y.Veysiq rəhbərlik etmişlər.

1937–1977-ci illərdə kafedraya görkəmli alim, ictimai xadim və pedaqoq kimi şöhrət qazanmış Əməkdar elm xadimi, biologiya elmləri doktoru, professor Z.M.Şaxtaxtinskaya rəhbərlik etmişdir. Onun kafedraya rəhbərlik etdiyi 40 il müddətində onlarla namizədlik və doktorluq dissertasiyaları müdafiə edilmişdir. B.Ağayev, M.Əliyeva, F.Əliyev, T.Tahirova, Ə.Salahov, Q.Quliyev, S.Hüseynova, C.Sailov, Y.Mustafayev, Z.Dadaşova, R.Sadıxov, Z.Vəliyeva və b. məhz həmin dövrdə elmi-tədqiqat işlərini başa çatdırmış, namizədlik dissertasiyaları müdafiə etmişlər.

Z.M.Şaxtaxtinskayanın rəhbərliyilə kafedrada tədrislə yanaşı, elmi tədqiqat işləri də aparılmış, məqalələr, dərslik və dərs vəsaitləri yazılmışdır. Prof. Z.M.Şaxtaxtinskayanın «Onurğasızlar zoologiyası» (I hissə), «Zoologiya» (I hissə 2-ci kitab), «Təbiətşünaslığın əsasları», «Çiyinayaqlılar», «Molyuskalar», «Dərisitikanlılar», dos. C.İ.Sailovun «Onurğasızlar zoologiyasından laboratoriya məşğələləri», «Parazitologiyadan ixtisas kursu» (I–II hissələr), M.Əliyevanın «Quşlar», «Sürünənlər» adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

1977–1990-cı illərdə kafedraya biologiya elmləri doktoru, professor S.Y.Əliyev rəhbərlik etmişdir. Bu dövrdə də kafedranın əməkdaşları tədris ilə bərabər elmi tədqiqatla da məşğul olmuşlar. Bu tədqiqatların nəticələri elmi məqalələr, dərs vəsaitləri kimi çap olunmuş, namizədlik və

doktorluq dissertasiyaları kimi müdafiə olunmuşdur. Həmin illərdə kafedranın dosenti B.İ.Ağayev 1990-cı ildə Ukrayna EA-nın Zoologiya institutunda doktorluq dissertasiyasını müdafiə edərək biologiya elmləri doktoru, Z.P.Dadaşova və L.M.Məhərrəmova isə namizədlik dissertasiyaları müdafiə edərək biologiya elmləri namizədi alimlik dərəcəsi almışlar.

Professor B.İ.Ağayevin elmi tədqiqat işi bir çox xarici ölkə alimlərinin marağına səbəb olmuşdur. O, ABŞ, Kanada, İtaliya, Çexoslovakiya, Polşa, Macarıstan, Bolqarıstan və s. ölkələrin alimləri ilə sıx əməkdaşlıq etmişdir. B.İ.Ağayev 15 yeni bioloji növ aşkar etmiş və onların təsvirini vermişdir.

Kafedraya 1993-cü ildən professor B.İ.Ağayev rəhbərlik edir.

Həmin illərdə də kafedra əməkdaşları səmərəli işləmiş, E.Mehdiyeva, Ş.Hüseynova, A.Həsənova, Z.Zeynalova namizədlik dissertasiyaları müdafiə etmişlər.

Kafedra əməkdaşları bakalavr pilləsində onurğasızlar və onurğalılar zoologiyası, təkamül təlimi, genetika və seleksiyanın əsasları, heyvanların morfologiya və sistematikası, müqayisəli anatomiya, magistratura pilləsində isə teriologiya, herpetologiya, yerli fauna, entomologiya, torpaq faunası, zoologiyanın müasir problemləri, helmintologiya və s. fənlərini tədris edirlər.

Kafedranın nəzdində respublikada və müxtəlif ölkələrdə nadir və geniş halda yayılan onurğasız və onurğalı heyvanlara aid müqəvvalar, mulyajlar, həşərat və qurdlara aid xeyli daimi preparatlarla zəngin muzey vardır. Həmin muzey materiallarının keyfiyyətli saxlanması üçün lazımi şərait yaradılmış və onun yeni materiallarla zənginləşdirilməsi davam etdirilir. Tədris prosesində muzey materiallarından geniş şəkildə istifadə olunur.

Kafedranın əməkdaşları tədris ilə yanaşı, «Parazit xəstəliklərin törədicisinin faunası, növdaxili dəyişkənliyi, ekologiyası və parazit-sahib sisteminin qarşılıqlı əlaqələri» və «Torpaq və su biotoplarında heyvanların növ tərkibi, ekoloji xüsusiyyətləri, təsərrüfat əhəmiyyətli növlərin çoxaldılma texnologiyasının elmi əsaslarının hazırlanması» problemləri üzrə elmi tədqiqat işi aparırlar. Aparılan tədqiqatların nəticələri respublika və xarici ölkələrin nüfuzlu elmi nəşrlərində dərc olunmuşdur.

2006–2011-ci illərdə kafedrada «Onurğasızlar zoologiyası» və «Onurğalılar zoologiyası» ixtisasları üzrə 41 magistr dissertasiya işi müdafiə olunmuşdur. TEC xətti ilə 50-dən çox tələbə konfranslarda çıxış etmişdir.



*Zoologiya kafedrasının əməkdaşları*

Kafedra müdiri prof. B.İ.Ağayev 1994–1996-cı illərdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin tədris işləri üzrə prorektoru, 1996–2006-cı illərdə həmin universitetin rektoru vəzifəsində çalışmış, 2000–2006-cı illərdə Ali Attestasiya Komissiyasının «Ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi», «Təlim və tərbiyənin nəzəriyyəsi və metodikası» ixtisasları üzrə Müdafiə Şurasının sədri olmuşdur.

B.İ.Ağayevin «Ümumi entomologiya» I-II hissə (1979–1981), «Onurğasızlar zoologiyasından praktikum» I-II hissə (1993, 1995), «Onurğasızlar zoologiyasından laboratoriya məşğələləri» (1977), «Zoocoğrafiya zoologiyanın əsasları ilə» (1999), «Onurğalılar zoologiyası» (dos. Z.P.Dadaşova ilə birlikdə, 2000), «Zoologiya, heyvanların ekologiyasının əsasları ilə» (2002), «Ümumi entomologiya» (2004), «Onurğasızlar zoologiyasından laboratoriya məşğələləri» (2004), «Onurğasızlar zoologiyası (2008), «Onurğasızlar zoologiyası» (Z.A.Zeynalova ilə birlikdə, 2005), «Ümumi entomologiya» (Z.A.Zeynalova ilə birlikdə, 2005), «Heyvanların coğrafiyası, zoologiyanın əsasları ilə» (İ.C.Namazovla birlikdə, 2006) dərslik və dərs vəsaitləri nəşr olunmuşdur. Ümumiyyətlə, prof. B.İ.Ağayevin 70 elmi əsəri, 4 monoqrafiyası nəşr olunmuşdur.

Dos. S.M.Hüseynovanın 17 elmi məqaləsi, «Zoologiya, heyvanların ekologiyası əsasları ilə» əsəri (həm tərcümə, həm də tərtib) çap olunmuşdur. Dos. R.C.Sadıxovun 28 elmi-metodiki məqaləsi, «Onurğasızlar zoologiyasından metodiki işləmələri» (I-II-III hissələrin tərcüməsi) (1987, 1989, 1991) əsəri çap olunmuşdur. Bunlardan II hissə («Buğumayaqlılar») latın qrafikası ilə çapdan çıxmışdır (2006). Onun «Bir ağacdan dərilmiş yarpaqlar üzrə dəyişkənliyin statistik hesablanması» adlı metodik vəsaiti (L.Məhərrəmova ilə birlikdə) (2000), «Onurğasızlar zoologiyası» fənni üçün hazırladığı proqram (2003) çap olunmuşdur.

Dos. Z.A.Zeynalovanın 18 elmi məqaləsi, «Onurğasızlar zoologiyası (Briozoylar, Çiyinayaqlılar, Foronidlər, Poqonoforlar)» (2002), «Onurğasızlar zoologiyası (Yumşaqbədənlilər, Dərisitikanlılar)» (2006) adlı dərs vəsaitləri, «Onurğasızlar zoologiyası» (B.İ.Ağayevlə birlikdə, 2005) və «Ümumi entomologiya»ya (B.İ.Ağayevlə birlikdə, 2005) aid proqramları, «Onurğasızlar zoologiyası» dərsliyi (B.İ.Ağayevlə birlikdə, 2008) nəşr olunmuşdur.

Dos. L.M.Məhərrəmova 18 elmi və metodik məqalənin, «Praktiki məşğələlərdə irsiyyət qanunlarına aid məsələ həlli» (1997), «Bir ağacdan dərilmiş yarpaqlar üzrə dəyişkənliyin statistik hesablanması» (R.Sadıxovla birlikdə, 2000), «Ekoloji genetika» (2004) adlı dərslik və dərs vəsaitlərinin müəllifidir. Dos. İ.C.Namazovun 34 elmi məqaləsi və zoocoğrafiya fənni üçün proqramı, dos. E.C.Mehdiyevanın 12 elmi məqaləsi və «Onurğalılar zoologiyasından məşğələlər (Balıqlar) adlı metodik vəsaiti (2000), dos. A.Z.Namazovun 20 elmi məqaləsi və «Onurğasızlar zoologiyasından çöl tədris təcrübəsi»nə aid metodik vəsaiti, dos. Y.M.Məmmədovun 26 elmi və metodiki məqaləsi, «Sürünənlər» (2011) və «Quşların biologiyası və təsnifatı» (I cild) adlı əsərləri, dos. A.M.Həsənovanın 27 elmi məqaləsi, 2 metodiki vəsaiti, 1 proqramı, baş müəllim Q.K.İsmayılovun 47 elmi və metodiki məqaləsi, «Biologiyanın inkişaf tarixi və metodologiyası» dərs vəsaiti (2009), «Hidrobiologiya» ixtisası üzrə proqramı, P.M.Qafarovanın 11 elmi məqaləsi çap olunmuşdur.

Hazırda kafedrada 11 nəfər – 1 nəfər elmlər doktoru, professor (Bəhlul Ağayev (kafedra müdiri)), 7 nəfər biologiya üzrə fəlsəfə doktoru, dosent (Ramiz Sadıxov, Alı Namazov, Zülfiyyə Zeynalova, Eleonora Mehdiyeva, İsmayıl Namazov, Lalə Məhərrəmova, Yavər Məmmədov), 2 nəfər biologiya üzrə fəlsəfə doktoru, baş müəllim (Amalya Həsənova, Qaçay İsmayılov), 1 nəfər müəllim (Pərvin Qafarova) çalışır.

### 3.5.3. İNSAN VƏ HEYVAN FİZİOLOGİYASI KAFEDRASI

Kafedra 1930-cu ildə yaradılmışdır. Kafedranın ilk müdiri prof. A.A.Əmirov olmuşdur. Onun vəfatından sonra kafedraya biologiya elmləri doktoru, prof. S.R.Ocaqverdizadə başçılıq etmişdir.

1941-ci ildə Azərbaycan Pedaqoji İnstitutunun Fiziologiya kafedrası Azərbaycan Dövlət Universitetinin eyniadlı kafedrası ilə birləşdirilmişdir. O, zaman kafedraya akademik A.İ.Qarayev rəhbərlik etmişdir.

1951-ci ildə Fiziologiya kafedrası yenidən bərpa olunmuş və kafedraya biologiya elmləri namizədi, dos. Tələt Qayıbov müdir seçilmişdir. O, 1961-ci ildə Moskvada Piroqov adına Tibb İnstitutunda «Qan köçürmənin retsipientin orqanizminə təsiri və funksional irəliləyiş» mövzusunda doktorluq dissertasiyası müdafiə etmiş, 1962-ci ildə professor elmi adına layiq görülmüşdü. T.Qayıbovun rəhbərliyi ilə o vaxt Fiziologiya kafedrasının nəzdində ilk dəfə olaraq «İonlaşdırıcı şüalanmanın postnatal entogenezdə orqanizmin rezistentliyinə təsiri» adlı elmi-tədqiqat problem laboratoriyası yaradılmışdı. Laboratoriyada orta-letal rentgen şüalanmasının müxtəlif növ heyvanlarda toxuma səviyyəsində gedən metobolizm proseslərinə təsiri tədqiq olunmuşdur. 1970-ci illərin əvvəllərində kafedra əməkdaşlarından 8 nəfəri onun rəhbərliyi ilə namizədlik dissertasiyası müdafiə etmişdir.

Ekoloji fiziologiya sahəsində tanınmış alim olan Roza Qafarova 1967-ci ildə AMEA-nın «Biologiya bölməsinin» İxtisaslaşdırılmış Elmi Şurasında «Bakı şəhərinin isti mühiti şəraitində və mövsümlə əlaqədar dəridə gedən dəyişikliklər» mövzusunda doktorluq dissertasiyası müdafiə etmişdir. O, dəfələrlə ölkə fizioloqlarının qurultay, simpozium və müşavirələrində, beynalxalq elmi forumlarda Azərbaycan fiziologiya elmini ləyaqətlə təmsil etmişdir. Onun elmi məqalələri keçmiş SSRİ-nin bir sıra nüfuzlu elmi jurnallarında nəşr olunmuşdur. O, Moskvada nəşr olunan «SSRİ-nin təbii şəraitinin fiziologiyası» (1969) kitabının həmmüəlliflərindən biridir. Prof. R.Qafarova 30 ildən artıq ADPU-nun Biologiya, Kimya-biologiya fakültəsinin (1967–1997-ci illərdə) dekanı vəzifəsində çalışmışdır. Elmi və pedaqoji sahədə qazandığı uğurlara görə Əməkdar elm xadimi fəxri adına layiq görülmüşdür. Onun elmi rəhbərliyi və rəsmi opponentliyi ilə onlarla gənc tədqiqatçı namizədlik və doktorluq dissertasiyası müdafiə etmişdir.



*İnsan və heyvan fiziologiyası kafedrasının əməkdaşları*

1967–1993-cü illərdə fiziologiya kafedrasına prof. Rza Səfərov rəhbərlik etmişdir. R.Səfərov ali təhsilini Moskvada almış, orada namizədlik dissertasiyası, 1962-ci ildə Tbilisi şəhərində doktorluq dissertasiyası müdafiə etmişdir. Onun rəhbərliyi ilə 17 nəfər fəlsəfə doktoru, 5 nəfər elmlər doktoru elmi dərəcəsi almışdır. O, həzm fiziologiyası sahəsində keçmiş İttifaqda tanınmış tədqiqatçılardan biri olmuşdur. Elmi və pedaqoji sahədə qazandığı uğurlara görə Əməkdar elm xadimi fəxri adına layiq görülmüşdür. Prof. R.Səfərov «Analizatorların fiziologiyası» və «Oyanmış toxumanın fiziologiyası» adlı dərs vəsaitlərinin müəllifidir.

1994-cü ildən Fiziologiya kafedrasına biologiya elmləri doktoru, prof. Ədalət Fərəcov rəhbərlik edir. O, baş beynin limbik sistemi strukturlarında neyromediator təbiətli birləşmələrin metobolizmini postnatal ontogenezdə və orqanizmin müxtəlif funksional vəziyyətlərində tədqiq edir. Bu sahədə onun 200-ə yaxın elmi əsəri dünyanın müxtəlif ölkələrinin (Almaniya, İspaniya, Türkiyə, İran, Rusiya, İngiltərə, Fransa və b.) nüfuzlu elmi nəşrlərində çap olunmuşdur. Rəhbərliyi ilə 8 nəfər biologiya üzrə fəlsəfə doktoru dissertasiyası müdafiə etmişdir ki, onların da bəziləri xarici ölkə (Türkiyə, Misir-Ərəb, Yəmən, Koreya) vətəndaşlarıdır. Son 5 ildə onun rəhbərliyi ilə 3 nəfər (İ.Qafarova, N.Həkimova, E.Mehbalıyeva)

biologiya, 1 nəfər (A.Balayeva) tibb elmləri üzrə fəlsəfə doktoru dissertasiyası müdafiə etmişlər. Prof. Ə.Fərəcov hazırda 3 nəfərin doktorluq, dissertasiyasına rəhbərlik edir. Prof. Ə.Fərəcov 2000-ci ildə «XX əsrin görkəmli adamı» adına layiq bilinmiş və Beynəlxalq Biologiya Cəmiyyətinin (mərkəzi Kembric Universitetindədir) qızıl medalını almışdır. O, 30 ilə yaxındır ki, Azərbaycan Milli Elmlər Akademiyasının Fiziologiya İnstitutunda Dissertasiya Şurasının həmsədri kimi fəaliyyət göstərir.

Prof. Ə.Fərəcov 15 ildir ki, biologiya fənni üzrə Respublika Olimpiadası münsiflər heyətinin sədridir. Məktəblilərin beynəlxalq Biologiya olimpiadalarında koordinator kimi respublikamızı ləyaqətlə təmsil edir.

Prof. Ə.Fərəcov ali və orta ixtisas məktəbləri üçün 8 dərslik və dərs vəsaitinin, 4 monoqrafiyanın müəllifidir. O, orta məktəblər üçün «Biologiya İnsan» fənnindən elektron dərs vəsaitinin multimedia resurslarının Azərbaycan və rus dillərində müəllifidir. Son iki ildə prof. Ə.Fərəcovun Rusiyada, Ukraynada, Amerikada, Fransada 10 elmi məqaləsi çap olunmuşdur.

Biologiya elmləri doktoru, prof. M.A.Qarayev kafedrada tədris olunan fənlərə aid bir neçə proqram tərtib etmiş, 10 dərs vəsaitinin, 2 dərsliyin, 1 monoqrafiyanın və 100-dən artıq elmi məqalənin nəşrinə nail olmuşdur.

Kafedrada təhsilin bakalavr və magistratura pillələrində histologiya, insan və heyvan fiziologiyası, insan anatomiyası, idman fiziologiyası, yaş fiziologiyası, uşağın anatomiyası və fiziologiyası, biofizika, mərkəzi sinir sistemi və sensor sistemin fiziologiyası, endokrinologiya və s. fənlər tədris olunur. Kafedranın əsas elmi istiqaməti orqanizmin fərdi inkşafında neyrohumoral tənzim mexanizmlərini müxtəlif faktorların təsiri şəraitində öyrənməkdir. Tədris və elmi «tədqiqat işləri aparmaq üçün kafedra cərrahiyyə otağı, biokimya, anatomiya, histologiya və fiziologiya laborotoriyaları, ixtisaslaşmış mühazirə otağı ilə təchiz olunmuşdur.

Hazırda kafedrada 20 nəfər – 2 nəfər elmlər doktoru, professor (Ədalət Fərəcov, Məmməd Qarayev), 10 nəfər biologiya üzrə fəlsəfə doktoru, dosent (Həqiqət Hacıyeva, Humay Xanlarova, Telman Həsənov, Laura Həsənova, Minəxanım Orucova, Laləndə Ağayeva, Nizam Mehdizadə, Vəsilə Bayramova, İradə Qafarova, Elnarə Mehbalıyeva), 3 nəfər baş müəllim (Lətifə Məmmədova, Nəzakət Qasımova, Azadə İmamverdiyeva) və 5 nəfər müəllim (Solmaz Cəfərova, Yeganə Heydərova, Vüsalə Həsənova, Ülviyyə Aslanova, Leyla Hüseynova) çalışır.

### 3.5.4. BİOLOGİYANIN TƏDRİSİ METODİKASI KAFEDRASI

Universitetimizdə ilk dəfə 1941-ci ildə fənlərin tədrisi metodikası kafedrası yaradılmışdır. Onun ilk müdiri dosent (sonra akademik) M.Mehdizadə olmuşdur. Əvvəlcə hər fənnin metodikasına dair ayrıca kurslar təşkil olunmuş, sonra müxtəlif ixtisas fakültələrinin tərkibinə verilmişdir. 1945–1946-cı illərdə Biologiyanın tədrisi metodikası fənninin tədrisi Zoologiya kafedrasının əməkdaşlarına həvalə edilmişdir.

1969-cu ildə yaradılan Biologiyanın tədrisi metodikası kafedrasına dos. F.C.Əliyev (1969–1982) müdir seçilmişdir. Sonralar ardıcıllıqla prof. Ə.Ə.Salahov (1982–1988) və dos. T.M.Rüstəmov (1988–1998) kafedra müdiri vəzifəsində çalışmışlar.

1998-ci ildən kafedraya prof. Əli Hüseynov rəhbərlik edir. Kafedra əməkdaşları BTM-in, təbiətşünaslığın, ətraf aləmlə tanışlığın tədrisi metodikası, təbiətşünaslığın əsasları, entomologiya və bitkilərin mühafizəsi, təbiətin mühafizəsi fənlərindən mühazirələr oxuyur. Kafedrada ixtisaslaşmış laboratoriya fəaliyyət göstərir. Orada ayrı-ayrı fənlərin tədrisinə aid praktik işlər aparılır.

Kafedrada təcrübəli müəllim və laborantlar fəaliyyət göstərirlər. Ə.M.Hüseynov 2003-cü ildə «Orta məktəbdə biologiya tədrisinin nəzəri və metodik əsasları» mövzusunda dissertasiya müdafiə edərək pedaqoji elmlər doktoru alimlik dərəcəsi almışdır.

Ə.M.Hüseynovun 1998-ci ildə Kembric Universitetinin buraxdığı «Kim kimdir» ensiklopediyasında tərcümeyi-halı nəşr olunmuşdur. O, «Beynəlxalq Biologiya Cəmiyyəti»nin diplomunu almış, «Qızıl ulduz» medalına layiq görülmüş, Amerika Bioqrafiya İnstitutunun «Qızıl heykəl» mükafatı ilə təltif olunmuşdur (1999). O, 1993-cü ildə akademik X.Məmmədov adına, 1996-cı ildə isə Təhsil Nazirliyinin təsis etdiyi mükafata layiq bilinmişdir. 2006-cı ildə Əməkdar müəllim fəxri adına layiq görülmüşdür.

Son illərdə prof. Ə.M.Hüseynovun ümumtəhsil («Ümumi biologiya» (X sinif), «Ümumi biologiya» (XI sinif), «Həyat bilgisi» (III sinif), «Həyat bilgisi» (IV sinif, 2007) və ali məktəblər (Biologiya tədrisi metodikasından kurs və yoxlama işi (2008), Orta məktəbdə biologiyadan sinifdənkənar məşğələlərin təşkili və aparılması (2008), Biologiya tədrisi metodikasının elmi əsasları (2009) üçün dərslik və dərs vəsaitləri nəşr olunmuşdur. Dos. S.A.Ələkbərovanın «Методика изучения лекарственных свойств растений на уро-



*Biologiyanın tədrisi metodikası kafedrasının əməkdaşları*

как биологии в средней школе» (2009), dos. T.Q.Abdullayevanın «Biologiyanı sxem və cədvəllərlə öyrənək» (2011), dos. H.M.Hacıyevanın «Dərman bitkiləri» (2007), «Orta məktəbdə biologiyanın tədrisində tibbi biliklərin verilməsinin imkan və yolları» (2007), H.M.Hacıyeva, Ə.M.Məhərrəmov, Q.C.İsmayılov və İ.V.Qafarovanın «Biologiyanın inkişaf tarixi və metodologiyası» (2009), H.M.Hacıyeva, T.Q.Abdullayeva və E.Ə.Hacıbəyovanın «Biologiyanın tədrisi metodikasının inkişaf tarixi və elmi əsasları» (2010), H.M.Hacıyeva, E.Həmidova və Ş.Əliyevanın «Zoologiya kursunun tədrisində sxemlərdən istifadənin mənimsəməyə təsiri» (2011), İ.Ə.Məmmədova və N.N.Əliyevanın «Bitkilər kursunun tədrisində ümumiləşdirici sxemlərdən istifadə (2011), Ə.N.Hacıyevanın «Biologiyadan didaktik materiallar» (2009) adlı dərslik və dərs vəsaitləri də son illərdə nəşr olunmuşdur.

Kafedra əməkdaşları Azərbaycan Müəllimlər İnstitutu, Təhsil Problemləri İnstitutu, Amerika Bioqrafiya İnstitutu, İngiltərənin Kembric Universiteti, Türkiyə və Rusiya Universitetləri ilə əlaqə saxlayırlar.

Hazırda kafedrada 15 nəfər – 1 nəfər elmlər doktoru, professor (Əli Hüseynov), 6 nəfər fəlsəfə doktoru, dosent (Ələyyənağı Məhərrəmov, Həqiqət Hacıyeva, Jalə İbrahimova, Təranə Abdullayeva, Gülşən Hacıyeva, Sevinc Ələkbərova), 3 nəfər fəlsəfə doktoru, baş müəllim (İmran Kazımov, Elmira Hacıbəyova, Rafiq Əmrahov), 1 nəfər baş müəllim (Nazimə Əliyeva), 4 nəfər müəllim (Asya Mirzəzadə, Şəfəq Əliyeva, Elnurə Həmidova, İradə Məmmədova) çalışır.

## 3.5.5. MÜLKİ MÜDAFİƏ VƏ TİBBİ BİLİKLƏRİN ƏSASLARI KAFEDRASI

Kafedra 1971-ci ildə «Məktəb gigiyenası» adı ilə yaradılmışdır. Onun ilk müdiri, dos. İ.M.Süleymanov olmuşdur.

İnstitutda 1967-ci ildə tibb bacıları hazırlıq kursu təşkil olunmuşdur. Onun rəhbəri N.Rəhimxanov idi. Əməkdar həkim, polkovnik İ.M.Sadıxovun rəhbərliyi altında 1975-ci ildə Mülki müdafiə və tibbi hazırlıq kafedrası yaradılmış, bu adla 1991-ci ilə kimi fəaliyyət göstərmişdir. Yeni tədris proqramlarına keçilməsi ilə əlaqədar Məktəb gigiyenası ilə Mülki müdafiə və tibbi hazırlıq kafedraları birləşdirilərək Tibbi biliklərin əsasları adı altında formalaşdırıldı. 2009-cu ildə kafedranın adında dəyişiklik edilmiş, «Mülki müdafiə və tibbi biliklərin əsasları» adlandırılmışdır.

Həmin vaxtdan kafedraya prof. T.Ə.Feyzullayeva rəhbərlik edir.

Kafedranın əməkdaşları universitetin bütün fakültələrində mülki müdafiə və tibbi biliklərin əsasları, idman – təbabəti və müalicəvi idman, pediatriyanın və məktəbəqədər yaşlı uşaqların gigiyenasının əsasları, defektologiyanın əsasları, ümumi patologiya, qulaq, burun-boğaz orqanlarının anatomik-fizioloji xüsusiyyətləri və xəstəlikləri, ümumi gigiyenanın əsasları, məktəb gigiyenası fənlərini tədris edirlər. Həmin fənlər üzrə yeni tədris proqramları tərtib edilərək nəşr olunmuşdur.

Kafedrada məktəblilərin sağlamlığı və təlim-tərbiyəsinin aktual problemləri ilə bağlı aparılmış elmi-tədqiqat işləri üzrə 2 monoqrafiya, 7 dərs vəsaiti, 26 metodik göstəriş, 300-dən çox elmi məqalə işıq üzü görmüşdür.

Son illərdə kafedrada aparılan elmi-tədqiqat işlərinin nəticələri əsasında «Ümumtəhsil məktəblərində mülki müdafiənin və tibbi xidmətin tədrisinə dair praktikum» (T.Ə.Feyzullayeva, S.Ə.Ələkbərova, R.Ə.Atakişiyeva), «Məktəb gigiyenası üzrə mühazirə mətnləri» (İ.M.Süleymanov, Ş.B.Əliyeva və T.Ə.Feyzullayeva), «Pediatriyanın və məktəbəqədər yaşlı uşaqların gigiyenasının əsasları» (T.Ə.Feyzullayeva), «Mülki müdafiə və tibbi biliklərin əsasları» (T.Ə.Feyzullayeva, S.Ələkbərova, F.Məmmədova), «Sanitar təmizləmə, dezaktivasiya, deqazasiya», «Fövqəladə hallarda əhalinin xəbərdarlığı və davranışı» və s. adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

2008–2011-ci illərdə «Həyat fəaliyyətinin təhlükəsizliyi və sağlam həyat tərzi» elmi problemi üzrə kafedrada aparılan tədqiqatların nəticələri tematik toplu şəklində nəşr olunmuşdur.



*Mülki müdafiə və tibbi biliklərin əsasları kafedrasının əməkdaşları*

Kafedranın əməkdaşları Azərbaycan Respublikası Fövqəladə Hallar Nazirliyi xətti ilə Mülki Müdafiə Qərargahında ixtisasartırma kurslarında iştirak etmiş, xüsusi vəsiqə almışlar.

Kafedranın nəzdində lazımi əyani vasitələrlə təchiz edilmiş 2 ixtisaslaşdırılmış auditoriya mövcuddur. Kafedranın əməkdaşları keçmiş Ümumittifaq (Moskva, Sank-Peterburq, Xarkov, Odessa, Stavropol və başqa şəhərlərdə) və respublika elmi konfranslarında və simpoziumlarda məruzələr oxumuşlar.

Hazırda kafedrada 22 nəfər – 1 nəfər fəlsəfə doktoru, professor (Tamella Feyzullayeva), 2 nəfər fəlsəfə doktoru, dosent (Şərqiyyə Əliyeva, Səfurə Ələkbərova), 1 nəfər psixologiya üzrə fəlsəfə doktoru (Lalə Mürsəlbəyova), 15 nəfər baş müəllim (Firəngiz Rəhimova, Raya Məmmədova, Nazir Mirzəyev, Afiyət Abdinova, Rəna Xəlilova, Firuzə Hüseynova, Tamella Abbasova, Südabə Hüseynova, Xatirə Quliyeva, Fazilə Məmmədova, Rasimə Atakişiyeva, Gülnarə Əzimova, Sürəyya Bəbirova, Nahidə Nağıyeva, Rəfiqə Əkbərova), 3 nəfər müəllim (Könül Quliyeva, Jalə Qafarova, Xuraman Səfərova) çalışır.

## 3.6. FİZİKA FAKÜLTƏSİ



*Dekan*
*prof. Mirzəli Murquzov*

Ali pedaqoji İnstitut yaradılarkən burada fəaliyyət göstərən üç şöbədən biri fizika – riyaziyyat idi. İlk illərdə şöbənin fizika bölməsində dos. R.M.Məlikov, N.Q.Berq və başqaları çalışırdılar. Respublikamızda fizika ixtisası üzrə ilk ali təhsilli mütəxəssislər burada hazırlanmışdır.

Keçən əsrin 30-cu illərində şöbələr eyniadlı fakültəyə çevriləndə professor A.Q.Abbaszadə Fizika-riyaziyyat fakültəsinin dekanı təyin olunmuşdu. Fizika-riyaziyyat fakültəsi 1968–1969-cu tədris ilində iki müstəqil fakültəyə Fizika və Riyaziyyat fakültələrinə ayrıldı. Fizika fakültəsinə müxtəlif illərdə dos.T.K.Xasməmmədov (1968–1971), dos. Ə.H.Əhmədov (1971–1975), prof Ə.M.Kərimov (1975–1981), prof. K.D.Hüseynov (1981–1984), dos. M.M.Əliyev (1984–1987), prof. E.Ə.Eyvazov (1988–1989), prof. İ.H.Cəfərov (1989–1995) rəhbərlik etmişlər.

Fakültəyə 1996-cı ildən prof. Mirzəli Murquzov rəhbərlik edir.

Fizika fakültəsində 8 elmlər doktoru, 46 fəlsəfə doktoru, onlarla aspirant, dissertant və magistr bərk cismlər fizikası, yarımkeçiricilər və dielektriklər fizikası, mayelər və istilik fizikası, elementar zərrəciklər və nüvə fizikası, kristalloqrafiya, astrofizika və fizikanın tədrisi metodikasının müasir problemləri sahəsində elmi-tədqiqat işləri aparır.

Fakültə müstəqil fəaliyyətə başlayandan 3000-dən çox yüksəkixtisaslı kadr hazırlamışdır. Məzunlardan 100 nəfərə yaxını Respublikanın müxtəlif ali məktəblərində və AMEA-nın Elmi «Tədqiqat İnstitutlarında fəaliyyət göstərir.

Fakültə bir sıra elm və təhsil ocaqları – MDU, MDPU, Ukrayna EA-nın Materialşünaslıq Problemləri İnstitutu, İstanbul Universiteti, Azərbaycan Respublikası MEA-nın Fizika, Kimya problemləri və Radiasiya problemləri İnstitutları və BDU ilə sıx əməkdaşlıq edir.

Hazırda fakültədə 450 nəfər bakalavr və 18 nəfər magistr təhsil alır.



*Fizika fakültəsinin elmi şurası*

Fakültədə 4 kafedra – Mexanika və molekulyar fizika (kafedra müdiri prof. E.Eyvazov), Elektrik və optika (kafedra müdiri prof. M.Murquzov), Nəzəri fizika və astronomiya (kafedra müdiri prof. İ.Cəfərov), Fizikanın tədrisi metodikası (kafedra müdiri dos. R.Abdurazaqov) və bir problem laboratoriya (Nadir torpaq metal materialları fizikası) fəaliyyət göstərir.

### 3.6.1. MEXANİKA VƏ MOLEKULYAR FİZİKA KAFEDRASI

Kafedra Ümumi fizika adı ilə institut yarandığı ilk gündən fəaliyyətə başlamışdır. Onun ilk müdiri dos. R.Məlikov olmuşdur. O, 1921-ci ildən etibarən 15 il fizika kafedrasına rəhbərlik etmişdir. Bu müddətdə R.Məlikov fizika sahəsində ali məktəb tələbələri üçün Azərbaycan dilində dərslik və dərs vəsaitlərinin hazırlanmasında böyük xidmətlər göstərmişdir.

Fizika kafedrasında rus alimlərindən prof. Y.B.Lopuxin, prof. V.İ.Tixomirov və dos. A.Q.Alfimov fəaliyyət göstərmişlər. Bu alimlərin köməyi ilə kafedranın tədris və elmi-tədqiqat işləri tədricən istənilən səviyyəyə çatdırılmışdır.

Dos. R.Məlikovun vəfatından sonra Fizika kafedrasına prof. A.Abbaszadə rəhbərlik etmişdir. 30 ildən artıq müddət ərzində prof. A.Abbaszadənin rəhbərliyi ilə Fizika kafedrasında 2 istiqamətdə (fizikanın tədrisi metodikası; maddələrin istilik – fiziki xassələrinin tədqiqi) xeyli iş görülmüşdür. Bu işlərin nəticəsində 40 nəfərə yaxın tədqiqatçı fizika-riyaziyyat

üzrə fəlsəfə doktoru alimlik dərəcəsi almışdır. Prof. A.Abbaszadə uzun müddət (20 ildən çox) Fizika fakültəsinin dekanı işləmişdir. İşlədiyi dövrdə o, Azərbaycan məktəbləri üçün yüksəkixtisaslı müəllim kadrlarının hazırlanmasına çox böyük zəhmət sərf etmişdir. O, bu gün də elmi əhəmiyyətini itirməyən «İstilikkeçirmə», «Termodinamika» və «Molekulyar fizika» kitablarının müəllifidir.

Hazırda Fizika fakültəsində fəaliyyət göstərən 4 kafedra R.Məlikov və A.Abbaszadənin yaratdıqları Fizika kafedrasının bazası əsasında formalaşmışdır.

A.Abbaszadə dekan işlədiyi dövrdə Respublikanın görkəmli alimlərinin – prof. Y.Əmənzadə, prof. Z.Kazımzadə, AMEA-nın müxbir üzvü, prof. A.Muxtarov və başqalarının Fizika fakültəsində işləmələrini təşkil etmişdir.

A.Abbaszadənin vəfatından sonra kafedraya dos. A.Ə.Qılmanov, prof. Ə.M.Kərimov, prof. Ə.İ.Rüstəmov, prof. A.B.Bəşirov, dos. Ə.H.Əhmədov rəhbərlik etmişlər.

Hazırda kafedraya f.r.e.d. prof. E.Ə.Eyvazov rəhbərlik edir.

Hal-hazırda kafedranın nəzdində 3 tədris (mexanika, molekulyar fizika və xüsusi praktikum) və 2 elmi-tədqiqat laboratoriyaları (mayelərin istilik-fiziki xassəsinin tədqiqi; bərk cisimlər fizikası) fəaliyyət göstərir. Kafedra əməkdaşlarının elmi və elmi-metodik məqalələri respublika və xarici ölkələrin nüfuzlu elmi nəşrlərində çap olunmuşdur. Son illərdə kafedra əməkdaşlarının «Bərk cisimlər fizikasının məsələlərlə şərhi» (prof. E.Ə.Eyvazov, prof. V.İ.Nəsirov, Y.M.Abbasov, 2006), «Ümumi fizika praktikumu» (Y.M.Abbasov, 2006); «Molekulyar fizikadan məsələlər» (dos. Ə.H.Əhmədov, dos. N.N.Niftiyev, dos. A.M.Allahverdiyev, 2007), «Mexanikadan məsələlər» (dos. Ə.H.Əhmədov, dos. N.N.Niftiyev, dos. A.M.Allahverdiyev, 2009), «Yarımkeçiricilər fizikasına giriş» (prof. E.Ə.Eyvazov, dos. V.C.Fərəcov, dos. S.Ş.Qurbanov, 2009), «Molekulyar fizika və termodinamikaya giriş» (prof. E.Ə.Eyvazov, dos. S.Ş.Qurbanov, Ş.X.Xəlilov, 2010); «Bərk cisimlər fizikasından səciyyəvi testlər» (prof. E.Ə.Eyvazov, dos. S.A.Zeynalov, f.r.e.n V.İ.Hüseynov, 2010), «Elementar fizika» (prof. E.Ə.Eyvazov, f.r.e.n V.İ.Hüseynov, 2010) adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

Hazırda kafedrada 11 nəfər – 2 nəfər elmlər doktoru, professor (Edil Eyvazov, Kamal Hüseynov), 7 nəfər fəlsəfə doktoru, dosent (Yavər Abbasov, Albert Qılmanov, Şakir Xəlilov, Sultanəli Qurbanov, Elman Məm-



*Mexanika və molekulyar fizika kafedrasının əməkdaşları*

mədov, Azər Allahverdiyev, Namiq Niftiyev), 1 nəfər fəlsəfə doktoru, müəllim (Vaqif Hüseynov) çalışır.

### 3.6.2. ELEKTRİK VƏ OPTİKA KAFEDRASI

Kafedra 1976-cı ildən müstəqil fəaliyyət göstərir. Kafedraya 1982-ci ilə qədər dos. A.A.Məmmədov və prof. K.P.Məmmədov rəhbərlik etmişdir.

1982-ci ildən kafedraya prof. M.İ.Murquzov rəhbərlik edir. O, 1981-ci ildə V.Kansukas adına Vilnüs Dövlət Universitetində «Lantanoidlərin iştirakı ilə mürəkkəb yarımkeçiricilərdə valent elektronların vəziyyəti» mövzusunda doktorluq dissertasiyası müdafiə etmiş, ilk dəfə atomların fərdi xüsusiyyətlərini nəzərə almaqla lantanoidlərin iştirakı ilə alınmış mürəkkəb yarımkeçiricilərə ən müasir nəzəri konfiqurasiya modelini tətbiq edərək maddənin elektron quruluşu ilə xassəsi arasında bir sıra yeni qanunauyğunluqlar aşkar etmişdir. Onun 250-dən çox elmi tədqiqat işi, dərslik, dərs vəsaiti, monoqrafiya və metodik vəsaitləri çap olunmuşdur. Professor M.İ.Murquzov dəfələrlə beynəlxalq elmi konfranslarda məruzələr oxumuşdur.

Prof. M.İ.Murquzov kadr hazırlığına da xüsusi diqqət yetirmişdir. Belə ki, onun rəhbərliyi ilə 8 nəfər (M.Quliyev, O.Həsənov, H.Həsənov, A.Ələkbərov, C.Hüseynov, S.Musayeva, Ə.Novruzova, X.Adıgözəlova) namizədlik dissertasiyası müdafiə etmişdir. T.A.Cəfərov və İ.M.Məmmədov isə namizədlik dissertasiyası üzərində işləyir.

Prof. M.İ.Murquzov təhsil sahəsində aparılan islahatların həyata keçirilməsində yaxından iştirak edir. Belə ki, onun rəhbərliyi və müəllifliyi ilə ümumtəhsil məktəblərinin VII–XI sinifləri üçün «Fizika», XI siniflər üçün «Astronomiya» dərslikləri, həmin dərsliklərə uyğun «İş dəftəri», «Fizikadan məsələlər. VII–XI siniflər», «Fizikadan laboratoriya praktikumu» yazılmış, ümumtəhsil məktəbləri üçün «Fizika-astronomiya» fənlərinin dövlət standartı, fənn proqramı və fənnin müasir konsepsiyası hazırlanmışdır. O, ali məktəb tələbələri üçün yazılmış «Atom fizikası» (2000), «Atom fizikasından laboratoriya praktikumu» (2002, A.S.Ələkbərovla), «Ümumi fizika kursundan məsələlər: Atom və nüvə fizikası» (2005, C.İ.Hüseynov və T.A.Cəfərovla), «Fiziki elektronikadan laboratoriya praktikumu» (2004, A.S.Ələkbərov və C.M.Səfərovla), «Atom və nüvə fizikası: qısa nəzəri məlumat, suallar, məsələlər, testlər» (2010, C.İ.Hüseynov və T.A.Cəfərovla), «Fizika kursundan laboratoriya praktikumu (elektrik, maqnitizm, optika)» (2010, V.Nəsirov, C.Hüseynovla), «Ümumi fizika kursu» (2011, A.S.Ələkbərov və O.M.Həsənovla) kitablarının, magistr hazırlığı üçün «Yarımkeçiricilər fizikası», «Optik hadisələr fizikası» (2005) proqramlarının müəllifidir.

Prof. M.İ.Murquzov elmi-pedaqoji fəaliyyəti ilə yanaşı, ictimai əsaslarla Respublika Təhsil Şurasının sədr müavini, Respublika Təhsil Nazirliyinin Elmi-Metodik Şurasının «Fizika» bölməsinin sədri, Məktəblilərin fizika fənni üzrə Respublika Olimpiadasının münsiflər heyətinin sədri, Tələbə Qəbulu üzrə Dövlət Komissiyasında fizika fənni üzrə ekspert komissiyasının sədri, Təhsil sektorunun inkişafı layihəsi çərçivəsində ümumtəhsil məktəbləri üçün fizika fənninin kurikulumunu hazırlayan işçi qrupun sədri kimi geniş fəaliyyət göstərir.

Prof. M.İ.Murquzov 2005-ci ildə «Əməkdar müəllim» fəxri adına layiq görülmüş, 2006-cı ildə «Şöhrət ordeni» ilə təltif edilmişdir.

Kafedranın inkişafında prof. K.P.Məmmədov, prof. Ə.Rüstəmov, prof. M.M.Əliyev, prof. B.A.Haqverdiyev, prof. Q.İ.Səfərəliyev, dos. X.Y.Xəlilov, dos. V.M.Nağıyev, dos. M.M.Xəlilov, dos. V.V.Yusifov və baş müəllim Y.Q.Yusifovun səmərəli xidmətləri olmuşdur.



*Elektrik və optika kafedrasının əməkdaşları*

Kafedranın əməkdaşları prof. V.İ.Nəsirov, dosentlər İ.Ş.Dadaşov, R.F.Məmmədova, C.İ.Hüseynov, Ə.A.Ələkbərov, Ə.N.Quliyev, Ş.S. İsmayılov, baş müəllimlər C.M.Səfərov, A.Ə.Əliyev, X.A.Adıgözəlova, müəllimlər O.M.Həsənov, T.A.Cəfərov, İ.M.Məmmədov «Lantanoidlərin iştirakı ilə yarımkeçirici materialların alınması və elektrofiziki xassələrinin tədqiqi» sahəsində elmi tədqiqat işi aparırlar.

Prof. V.İ.Nəsirov 1993-cü ildə Azərbaycan Milli Elmlər Akademiyasının Fizika İnstitutunda doktorluq dissertasiyası müdafiə etmişdir. Prof. V.İ.Nəsirov 100-dən çox elmi məqalənin və «Kristalloqrafiyanın elementləri» (E.Ə.Eyvazovla birlikdə), «Bərk cisimlər fizikasının məsələlərlə şərhi» (E.Ə.Eyvazov və Y.Abbasovla birlikdə, 1999), «Elektrik» (G.Aslanlı, 2002), «Elektrik və maqnetizm» (G.Aslanlı, 2008), «Fizika kursundan laboratoriya praktikumu (elektrik, maqnitizm, optika)» (2010, M.Murquzov, C.Hüseynovla), «Optika» (2010) və «Elektrik və maqnetizmdən məsələlər» (2011, X.Adıgözəlova və O.Həsənov) kitablarının müəllifidir. Hal-hazırda prof. V.Nəsirov «Kristallarda polimorf çevrilmə zamanı yeni yaranan fazaların böyümə morfologiyası» sahəsində tədqiqat aparır.

Kafedranın nəzdində 5 tədris (Elektrik, Optika, Atom və nüvə fizikası, Yarımkeçiricilər, Rentgenquruluş təhlil) və 1 problem laboratoriyası (Nadir torpaq metallar materiallar fizikası) fəaliyyət göstərir.

Kafedra əməkdaşlarının bir sıra elmi və metodik əsərləri nəşr olunmuşdur. M.İ.Murquzovun «Kvant fizikasından mühazirələr» (1988), M.İ.Murquzov və V.V.Yusifovun «Elektrik bəhsi» (1989), M.İ.Murquzov, Ə.N.Quliyev, İ.Ş.Dadaşov və Q.İ.Səfərəliyevin «Yarımkeçiricilərin elektrik xassələrinin təyininə aid laboratoriya praktikumu» (1996), K.P.Məmmədov və X.Xəlilovun «Optika» (3 hissəli,1981), B.A.Haqverdiyev və M.M.Əliyevin «Fiziki prinsiplər» (1987), B.A.Haqverdiyev və B.B.Quliyevin «Fiziki effektlər» (1988), B.A.Haqverdiyev, A.S.Ələkbərov və F.A.Axundovun «Elektromaqnetizimdən mühazirələr» (1996), M.M.Əliyevin «Fizika» (1986) dərslik və dərs vəsaitləri bu qəbildəndir.

Hazırda kafedrada 14 nəfər – 2 nəfər elmlər doktoru, professor (Mirzəli Murquzov (kafedra müdiri, dekan), Vaqif Nəsirov), 6 nəfər fəlsəfə doktoru, dosent (İltifat Dadaşov, Rəna Məmmədova, Cahangir Hüseynov, Aydın Ələkbərov, Əliqulu Quliyev, Şərif İsmayılov), 3 nəfər fəlsəfə doktoru, baş müəllim (Ağaxəlil Əliyev, Cəlal Səfərov, Xatirə Adıgözəlova), 3 nəfər fəlsəfə doktoru, müəllim (Oktay Həsənov, İ.Musayev, Tapdıq Cəfərov) çalışır.

### 3.6.3. NƏZƏRİ FİZİKA KAFEDRASI

Nəzəri fizika kafedrası 1977-ci ildə yaradılmışdır. Kafedraya müxtəlif vaxtlarda dos. R.Ş.Yəhyayev, prof. Q.İ.Səfərəliyev və dos. Y.M.Qasımzadə rəhbərlik etmişdir. 1996-cı ildən kafedraya elementar zərrəciklər və onların qarşılıqlı təsirləri sahəsində tanınmış alim prof. İ.H.Cəfərov başçılıq edir.

Kafedra əməkdaşları bakalavr təhsil pilləsində ümumi nəzəri fizika (klassik mexanika, elektrodinamika, kvant mexanikası, statistik fizika və termodinamika, elementar zərrəciklər fizikası), riyazi fizika, astronomiya və astrofizika, magistr təhsil pilləsində Nəzəri və riyazi fizika ixtisasına müvafiq xüsusi fənləri tədris edirlər.

Kafedrada nüvə və elementar zərrəciklər fizikası, bərk cisimlər fizikası, ulduzlar fizikası, riyazi fizika və s. üzrə elmi-tədqiqat işləri aparılır.

Kafedranın müdiri prof. İ.H.Cəfərov tədqiqatlarında elementar zərrəciklərin elektromaqnit və zəif qarşılıqlı təsirlərinin bir sıra vahid modellərini irəli sürmüş, bu qarşılıqlı təsirlərlə şərtlənən çoxlu sayda prosesin effektiv kəsiklərini hesablamış, neytral zəif cərəyan effektivlərinin eksperimentdə ayrılması üçün müxtəlif reseptlər irəli sürmüşdür.



*Nəzəri fizika kafedrasının əməkdaşları*

İ.Cəfərov xaricdə və respublikada nəşr olunan 160-dan çox elmi əsərin müəllifidir. Onun rəhbərliyi ilə 2 doktorluq, 8 namizədlik dissertasiyası müdafiə olunmuşdur. Müxtəlif illərdə onun elmi nəticələri keçmiş SSRİ EA və Azərbaycan EA-nın ən mühüm nailiyyətləri sırasına daxil edilmişdir. Onun dördkomponentli neytrino sxemi üzrə irəli sürdüyü leptonların vahid elektrozəif qarşılıqlı təsir modeli E.Ferminin tələbəsi Bruno Pontekorvo tərəfindən yüksək qiymətləndirilmiş və bu sahədə «pioner nəzəriyyə» adlandırılmışdır.

Prof. H.B.İbrahimov nano ölçülü strukturların kinetik və optik xassələrinin öyrənilməsi sahəsində tədqiqat apararaq maraqlı nəticələr əldə etmişdir. Dos. Ü.S.Paşabəyova M.Bornun bərk cisimlərin izotrop halları üçün nəzəriyyəsini anizotrop kristallar üçün ümumiləşdirmiş, ikioxlu kristallar üçün əks olma və udulma spektrlərini müəyyənləşdirmiş və alınan nəticələri çoxoxlu kristallar halına tətbiq etmişdir. Ə.H.Babayev Günəş alışmalarının optik qalınlığını, elektron temperaturunu və emissiyasının ölçüsünü müəyyənləşdirməyə imkan verən kompleks üsul təklif etmişdir. F.Q.Zeynalov təbiət-riyaziyyat silsiləli fənlərin əlaqəli tədrisi prosesində şagirdlərin elmi dünyagörüşünün formalaşmasına yardımçı olan metodika irəli sürmüşdür.

Kafedra əməkdaşları bir sıra dərslik, dərs vəsaitləri və elmi-kütləvi kitablar nəşr etdirmişlər. Prof. İ.H.Cəfərovun «Elementar zərrəciklər fizikasının əsasları», «Kvant fizikasına giriş», «Elementar zərrəciklər fizikasından 500

test», «Kvant mexanikası» və «Kvant mexanikasından metodik göstəriş» (R.Yəhyayevlə birlikdə), «Neytrino» (akademik N.Quliyevlə birlikdə), «Dünya nədən və necə qurulmuşdur?», «Doğrudanmı kütlə sürətdən asılıdır və doğrudanmı enerji olan yerdə həmişə kütlə də vardır?»; prof. H.B.İbrahimovun «Nano ölçülü sistemlər fizikası» (O.Ələkbərovla birlikdə); dos. Ü.S.Paşabəyovanın «Statistik fizikadan məsələ və suallar» (R.Yəhyayev və Z.Vəliyevlə birlikdə), «Statistik paylanmalar və onların bəzi tətbiqləri» (E.Eyvazov və İ.Əliyevlə birlikdə); baş müəllim Ə.H.Babayevin «Praktiki astrofizikanın əsasları (S.Əzimovla birlikdə); F.Q.Zeynalovun «Kurs və diplom işlərinin icra metodikası» adlı kitabları bu qəbildəndir.

Kafedrada 8 nəfər – 2 nəfər elmlər doktoru, professor (İsgəndər Cəfərov, Hüseyn İbrahimov), 3 nəfər fəlsəfə doktoru, dosent (Ürfan Paşabəyova, Firudin Zeynalov, Yaşar Hüseynəliyev), 2 nəfər fəlsəfə doktoru, baş müəllim (Asəf Nəbiyev, Nərminə Əliyeva) və 1 nəfər baş müəllim (Əziz Babayev) çalışır.

### 3.6.4. FİZİKANIN TƏDRİSİ METODİKASI KAFEDRASI

Fizikanın tədrisi metodikası bir elm kimi Azərbaycanda XX əsrin iyirminci illərində təşəkkül tapmağa başlamışdır. Bu elmin yaranması və inkişafında Azərbaycan Dövlət Pedaqoji Universiteti, Bakı Dövlət Universiteti və Təhsil Problemləri İnstitutu (Elmi Tədqiqat Pedaqoji Elmlər İnstitutu) böyük rol oynamışdır. Həmin illərdən görkəmli alimlər R.Məlikov, B.Mirzəyev, A.Abbaszadə, M.Abdullayev, M.Əliyev, E.Lopuxin, V.Tixomirov, Y.Dorfman, A.Amosov və başqaları fizikanın ali və orta məktəblərdə tədrisi metodikasına dair əvvəlcə rus dilində, otuzuncu illərdən isə Azərbaycan dilində dərslik, dərs vəsaiti, metodik tövsiyələr, elmi-metodik məqalələr yazıb nəşr etdirdilər. B.Mirzəyevin «Molekulyar fizikadan konspekt» (1933), «Rəqslər və dalğalar» (1934), «Fizika praktikumu» (1935,1938), A.Abbaszadə, R.Həsənov və M.Ramazanzadənin tərcümə etdikləri «Molekulyar fizika və istilik», «Optika və akustika» (1935), «Məktəb fizika eksperimentinin metodikası və texnikası» (1936), A.Abbaszadə və Z.Əlizadənin tərcüməsində «Fizika terminləri lüğəti» (1939), A.Abbaszadənin «Fizikanın tədrisində hərbi texnika elementləri» (1942 və 1944) və s. əsərlər həmin dövrün məhsuludur.

Azərbaycanda ilk fizika kabineti 1923-cü ildə Rəhim bəy Məlikovun (Həsən bəy Zərdabinin qardaşı oğlu) təşəbbüsü və rəhbərliyi ilə yaradılmış-



*Fizikanın tədrisi metodikası kafedrasının əməkdaşları*

dır. Həmin kabinet fizikadan məktəb eksperimentinin nümayişinə və A.Şaiq adına nümunəvi orta məktəbdə tələbələrin pedaqoji praktikasına xidmət edirdi.

Fizikanın tədrisi metodikası kafedrası ilk dəfə 1946-cı ildə Fizika-riyaziyyat fakültəsinin nəzdində «Fizika və riyaziyyatın tədrisi metodikası» adı ilə fəaliyyətə başlamışdır. Kafedraya 1946–1951-ci illərdə prof. B.Ağayev, 1951–1955-ci illərdə dos. B.Şəfizadə rəhbərlik etmişdir. 1955-ci ildən fizikanın tədrisi metodikası müstəqil fəaliyyətə başlayır (B.Şəfizadə 1970-ci ilə qədər həmin kafedraya rəhbərlik etmişdir). Həmin dövrlərdə kafedrada iki tədris, iki məktəb eksperimenti və iki təlimin texniki vasitələri laboratoriyaları yaradılır. Kafedrada müəllim kadrlarının hazırlanması ilə yanaşı, yüksəkixtisaslı metodist alimlərin hazırlanmasına diqqət artırılır. B.Sultanov, T.Xasməmmədov, S.İmanov, Ə.Əhmədov, Ə.Axundov, Z.Osmanov, İ.Bənənyarlı, T.Vahidov namizədlik dissertasiyaları müdafiə edirlər.

1971–1973-cü illərdə kafedraya rəhbərlik edən T.Xasməmmədovun dövründə S.İmanov doktorluq, F.Rəştiyev, Ş.Əlizadə namizədlik dissertasiyaları müdafiə edirlər. 1973–1975-ci illərdə kafedraya F.Rəştiyev, az sonra isə B.Sultanov rəhbərlik etmişdir.

1975–2003-cü illərdə kafedraya prof. S.İmanov rəhbərlik etmişdir. Bu dövrdə İ.İsmayılov, K.Həsənov, X.Padarov, R.Abdurazaqov, N.Məsimov,

D.Əliyeva, Ə.Kərimov, Ş.Əhmədov, S.Cəlilova namizədlik, Ş.Əlizadə isə doktorluq dissertasiyası müdafiə etmişdir. Həmin illərdə ali və orta məktəblərdə fizikanın tədrisi metodikasının aktual problemləri istiqamətində araşdırmalar genişləndirilmiş, məktəb eksperimentinin aparılma metodikası və texnikası, tələbələrin pedaqoji eksperimentinin keçirilməsinə dair metodik göstərişlər, fizikanın tədrisi metodikasının ümumi məsələlərinə dair elmi-metodik məqalə, dərs vəsaitləri nəşr olunmuşdur.

2003-cü ildə kafedraya qısa bir müddətdə Z.Hacıyeva rəhbərlik etmişdir. Həmin dövrdə kafedrada tədris olunan bütün fənlərin proqramları yenidən hazırlanmışdır.

2004-cü ildən kafedraya dos. R.Abdurazaqov rəhbərlik edir. Bu dövrdə kafedranın nəzdində «Yeni informasiya texnologiyaları» laboratoriyası yaradılmış, məktəb eksperimenti laboratoriyaları təmir olunaraq yenidən qurulmuş və yeni avadanlıqlarla təchiz edilmişdir. Kafedrada elmi araşdırmalar gücləndirilmiş, dos. İ.İsmayılov doktorluq dissertasiyası müdafiə etmiş, R.Abdurazaqov, Ş.Əlizadə, F.Rəştiyev, T.Vahidov, X.Padarov, B.Mirzəyev, N.Məsimov, D.Əliyeva, Ə.Kərimov, S.Cəlilova, Z.Hacıyeva, M.Muradova, T.Hacıyev və Ə.Musayevanın yeni dərslik, dərs vəsaiti və metodik tövsiyələri nəşr olunmuşdur.

Kafedra əməkdaşları ümumtəhsil məktəbləri üçün dərslik və dərs vəsaitlərinin hazırlanmasında yaxından iştirak edir. Kafedra müdiri, dos. R.Abdurazaqov ümumtəhsil məktəblərinin VII–XI sinifləri üçün yazılan Fizika və astronomiya proqramlarının, dərslik və dərs vəsaitlərinin, habelə respublikada fizika fənni üzrə ilk elektron dərsliklərin müəlliflərindən biridir.

Kafedrada doktorantura və magistratura pilləsi üzrə yüksəkixtisaslı kadrların hazırlıq işi gücləndirilmişdir. Kafedrada 3 nəfər fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün dissertasiya üzərində çalışır. İndiyə kimi «Fizikanın tədrisi metodikası və metodologiyası» ixtisası üzrə 42 nəfər magistr hazırlanmışdır.

Hazırda kafedrada 23 nəfər – 2 nəfər pedaqoji elmlər doktoru (Şükür Əlizadə, İsa İsmayılov), 10 nəfər fəlsəfə doktoru, dosent (Rasim Abdurazaqov (kafedra müdiri), Tacəddin Vahidov, Fikrət Rəştiyev, Məbud İsmayılov, Xəlil Padarov, Bakıxan Mirzəyev, Nazim Məsimov, Əfqan Kərimov, Dilbər Əliyeva, Sevinc Cəlilova), 2 nəfər baş müəllim (Zemfira Hacıyeva, Mahirə Muradova), 2 nəfər müəllim (Tofiq Hacıyev, Gülşən Musayeva), 7 nəfər tədris-köməkçi heyət (Gülbəniz Vəlibəyova, Rəna Həsənova, Navad Əlmərdanova, Zəminə Kərimli, Lalə Məmmədova, Səbinə Əliyeva, Sevinc Mirzəyeva) çalışır.

## 3.7. RİYAZİYYAT FAKÜLTƏSİ



*Dekan*
*dos. Maqsud Nəcəfov*

Ali Pedaqoji İnstitut yaradılarkən, burada təşkil edilən üç şöbədən biri Fizika-riyaziyyat şöbəsi idi. 1930-cu ildə Pedaqoji İnstitut ali təhsil ocağı kimi yenidən təşkil ediləndə Fizika-riyaziyyat şöbəsi müstəqil fakültəyə çevrildi. Şöbə kimi fəaliyyətə başlayan fakültənin ilk dekanı M.R.Əfəndiyev olmuşdur. Fizika-riyaziyyat fakültəsi 1969-cu ildə iki müstəqil fakültəyə bölündü: Riyaziyyat və Fizika fakültəsi. Riyaziyyat fakültəsinə dosent Ə.Cəfərov (1969–1971), prof. Q.Orucov (1971–1976), prof. Ə.Məmmədov (1978–1981), dos. F.Abdullayev (1981–1987), dos. C.Süleymanov (1987–1994), dos. Ş.Məmmədov (1994– 2001) rəhbərlik etmişlər.

Riyaziyyat fakültəsinə 2001-ci ildən dosent Maqsud Nəcəfov rəhbərlik edir. Ötən illər ərzində fakültədə riyaziyyat, riyaziyyat-informatika ixtisasları üzrə kadr hazırlanmışdır. Hazırda fakültədə 3 ixtisas üzrə (riyaziyyat müəllimliyi, riyaziyyat və informatika müəllimliyi, informatika müəllimliyi ixtisasları) yüksək-ixtisaslı müəllim kadrları hazırlanır. Fakültəni indiyə qədər 14 mindən çox mütəxəssis bitirmişdir.

Hazırda fakültənin bakalavr pilləsində 1071 tələbə (703 nəfər əyani şöbədə, 34 nəfəri əcnəbi vətəndaşdır, 368 nəfəri isə qiyabi şöbədə), magistr pilləsində 98 nəfər magistr (45 nəfəri əyani, 53 nəfəri qiyabi) təhsil alır ki, onların da təhsil-tərbiyəsi ilə 70 nəfər professor-müəllim (8 elmlər doktoru, professor, 38 fəlsəfə doktoru, dosent, 3 fəlsəfə doktoru, baş müəllim, 9 baş müəllim, 12 müəllim) məşğul olur.

Son illərdə fakültə əməkdaşlarının elmi yaradıcılığı çox zəngin olmuşdur. Fakültədə fəaliyyət göstərən elmi-metodik seminarda təkcə fakültənin deyil, respublikanın digər ali məktəblərinin əməkdaşları da öz elmi araşdırmalarının nəticələri barədə məruzələr etmişlər.

AMEA-nın akademikləri İbiş İbrahimov, Zahid Xəlilov, Məcid Rəsulov, Maqsud Cavadov, fizika-riyaziyyat elmləri doktoru, professorlar Məlikbaxış



*Riyaziyyat fakültəsinin elmi şurası*

Babayev, Məmməd Bayramoğlu, Qulam Sadıqov və başqaları fakültənin formalaşmasında, onun elmi potensialının artmasında və yüksəkixtisaslı elmi kadrların hazırlanmasında mühüm rol oynamışlar.

Fakültə əməkdaşlarının elmi-tədqiqat işlərinin nəticələri Bakı, Moskva, Sankt-Peterburq, Ufa, Kiyev,Tula şəhərlərinin və Türkiyə Respublikasının nüfuzlu elmi və metodiki jurnallarında çap edilmişdir.

Fakültədə, əsasən, funksiyalar nəzəriyyəsi, funksional analiz, diferensial və inteqral tənliklər nəzəriyyəsi, diferensial və inteqral tənliklərin ədədi həlləri, riyaziyyatın tədrisi metodikası, cəbr və həndəsənin bəzi aktual məsələləri ilə bağlı elmi araşdırmalar aparılır, dərslik, dərs vəsaiti və metodik göstərişlər hazırlanır, yeni tədris planlarının tələblərinə uyğun proqramlar nəşr edilir.

Hal-hazırda riyaziyyat fakültəsinin nəzdində 5 kafedra – Riyazi analiz (kafedra müdiri prof. V.Qurbanov), Cəbr və həndəsə (kafedra müdiri p.e.d. Y.Baxşəliyev), Hesablama riyaziyyatı və informatika (kafedra müdiri dos. Z.Tağıyeva), Riyaziyyat və onun tədrisi metodikası (kafedra müdiri prof. A.Adıgözəlov) və Funksiyalar nəzəriyyəsi (kafedra müdiri prof. Q.Orucov) fəaliyyət göstərir.

### 3.7.1. RİYAZİ ANALİZ KAFEDRASI

Müasir riyaziyyatın aktual problemlərinə həsr olunmuş tədqiqat işi aparılan mərkəzlərdən biri kimi tanınan Riyazi analiz kafedrası 1921-ci ildə təşkil olunmuşdur. Burada çoxhədlilərə yaxınlaşma, daxilolma teoremləri, sıralar və diferensial tənliklər nəzəriyyəsinə aid alınmış nəticələr dünya riyaziyyatçıları tərəfindən yüksək qiymətləndirilmişdir.

Kafedranın elmi istiqamətinin müəyyənləşməsində uzun illər kafedranın müdiri olmuş, Əməkdar elm xadimi, AMEA-nın akademiki, fizika-riyaziyyat elmləri doktoru, prof. İ.İ.İbrahimovun, onun tələbəsi prof. Ə.S.Cəfərovun xüsusi rolu olmuşdur. Kafedraya akademik İ.İ.İbrahimov (1948–1960), prof. Ə.S.Cəfərov (1962–1978; 1988–1998), prof. S.Y.Yaqubov (1978–1981), prof. Q.A.Orucov (1981–1988), prof. M.S.Cəbrayılov (1998–2011) rəhbərlik etmişlər.

Hal-hazırda kafedranın müdiri prof. V.M.Qurbanovdur.



*Riyazi analiz kafedrasının əməkdaşları*

Kafedranın professoru M.S.Cəbrayılov ADPU-nun tədris işləri üzrə prorektoru vəzifəsində çalışır.

Kafedrada «Operatorların spektral nəzəriyyəsi» adlı elmi seminar fəaliyyət göstərir.

Kafedra əməkdaşları riyazi analizin aktual problemlərinə həsr olunmuş beynəlxalq konfranslarda maraqlı çıxışları ilə fərqlənmişlər. Kafedra əməkdaşları tanınmış elmi mərkəzlər ilə əlaqə saxlayır, birgə elmi tədqiqat işləri aparırlar. Prof. M.Cəbrayılovun, prof. V.M.Qurbanovun, dos. B.Ə.Əliyevin əsərləri Rusiya, Ukrayna və Türkiyənin nüfuzlu elmi jurnallarında çap olunmuşdur.

Kafedranın əməkdaşlarının elmi-tədqiqat və metodik işlərinin nəticələri kitablarda və çoxsaylı məqalələrdə əksini tapmışdır. Son illərdə prof. M.Cəbrayılovun «Ədədi üsullar», «Metrik və normal fəzalar. Xətti operatorlar», «Riyazi analiz», prof. V.Qurbanovun «Ədədi və funksional sıralar» və digər dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

2006-cı ildə kafedranın professorları M.S.Cəbrayılov və V.M.Musayev Əməkdar müəllim fəxri adına layiq görülmüşlər.

Prof. V.M.Qurbanov 2011-ci ildə Azərbaycan Prezidenti yanında «Elmin İnkişaf Fondu»nun qrantını almışdır.

Hazırda kafedrada 21 nəfər – 2 nəfər elmlər doktoru, professor (Malik Cəbrayılov, Vəli Qurbanov (kafedra müdiri)), 7 nəfər riyaziyyat üzrə fəlsəfə doktoru, dosent (Cəfər Süleymanov, Elmira Cəbrayılova, Bəhram Əliyev, Almaz İmanova, Şəhrizad Məmmədova, Müdafiə Mahmudov, Səbinə Qasımova), 1 nəfər baş müəllim (Vaqif Məstəliyev), 5 nəfər müəllim (Əhməd Məmmədov, Fəridə Şabanova, Səbinə Kərimova, Səbinə Ələsgərova, Sevinc Xalıqova), 6 nəfər tədris-köməkçi heyət (Leyla Aslanova, Sevinc Əliyeva, Zöhrə Mirəliyeva, Gülər Məmmədova, Qumru Rəhimova, Günel Hacıyeva) çalışır.

### 3.7.2. CƏBR VƏ HƏNDƏSƏ KAFEDRASI

Kafedra 1936-cı ildə «Ali cəbr, analitik həndəsə və astronomiya» adı ilə fəaliyyətə başlamışdır. Onun ilk müdiri Bəhram Yusifzadə olmuşdur. O, 1974-cü ilədək həmin vəzifədə çalışmışdır.

Kafedrada müxtəlif dövrlərdə Aqil Salayev (o həm də 1935–1936-cı illərdə İnstitutun direktoru olmuşdur), Saleh Axundov, Qulam Şahrza oğlu, Müzəffər Hacıyev, prof. Karlen Xudaverdiyev, Firudin Abdullayev kimi



*Cəbr və həndəsə kafedrasının əməkdaşları*

tanınmış riyaziyyatçılar fəaliyyət göstərmişlər. M.Hacıyev görkəmli riyaziyyatçı Y.B.Lopatinskinin tələbəsi olmuşdur. Moskva riyaziyyat məktəbinin yetirməsi olan M.Hacıyev 1945-ci ildə dissertasiya müdafiə edərək fizika-riyaziyyat elmləri namizədi alimlik dərəcəsi almışdır. Bir müddət İranda elmi-pedaqoji fəaliyyət göstərmişdir. 1949-cu ildə dosent elmi adı alan M.Hacıyev L.Y.Okunevin «Ali cəbr» kitabını Azərbaycan dilinə tərcümə etmişdir. İlk cəbrşünas alim kimi tanınan M.Hacıyevin 1959-cu ildə «Ali cəbrdə məsələlər» kitabı nəşr edilmişdir.

1969-cu ildə Ali cəbr və analitik həndəsə kafedrasının bazası əsasında iki müstəqil kafedra yaradılmışdır: «Cəbr və ədədlər nəzəriyyəsi» və «Həndəsə». «Cəbr və ədədlər nəzəriyyəsi» kafedrasına AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, prof. Mais Cavadov, «Həndəsə» kafedrasına isə B.Yusifzadə müdir seçilmişdir. 1974–1985-ci illərdə «Həndəsə» kafedrasına Q.Qasımov başçılıq etmişdir.

1998-ci ildə «Cəbr və ədədlər nəzəriyyəsi» və «Həndəsə» kafedraları yenidən birləşərək «Cəbr və həndəsə» kafedrası adlandırılmışdır. Həmin ildən kafedraya pedaqoji elmlər doktoru Y.R.Baxşəliyev rəhbərlik edir.

Kafedranın fəaliyyəti dövründə 10-dan çox namizədlik, 1 doktorluq dissertasiyası müdafiə olunmuş, həm ölkə daxilində, həm də xaricdə nüfuzlu jurnallarda onlarla elmi məqalə çap olunmuşdur. Son illərdə Y.Baxşəliyev və L.Əbdülkərimlinin «Cəbr kursu» (2011), Z.Sadıxov və Ə.A.Xudaverdiyevanın «Həndəsi qurmalardan və proyektiv həndəsədən mühazirələr» (2010), X.Paşayev və M.Nəcəfovun «Analitik həndəsədən mühazirələr» (2002) adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

Kafedranın əməkdaşları respublikada və xarici ölkələrdə keçirilən konfranslarda fəal iştirak edirlər. Kafedrada «Müasir cəbrin və həndəsənin müasir problemləri» adlı elmi seminar fəaliyyət göstərir.

Kafedra əməkdaşları bakalavr pilləsində 8, magistr pilləsində 10-dan çox fəndən mühazirə və seminar məşğələləri aparır. Tədris olunan bütün fənlərin proqramları yenidən hazırlanaraq nəşr edilmişdir.

Hazırda kafedrada 20 nəfər – 1 nəfər pedaqoji elmlər doktoru (Yafəz Baxşəliyev (kafedra müdiri), 11 nəfər riyaziyyat üzrə fəlsəfə doktoru, dosent (Loğman Əbdülkərimli, Maqsud Nəcəfov, Naidə Acalova, Güləndam Xudaverdiyeva, Zahirəli Sadıxov, Hökumə Əkbərova, Üfiq İsmayılova, Piri Göyüşov, Feliks Əfəndiyev, Şəmsəddin Abdullayev, Sədəddin Hacıyev), 1 nəfər baş müəllim (Astan Şeləmənov), 7 nəfər tədris-köməkçi heyət (Dilarə Mehdiyeva, Nailə İmranova, Zümrüd Pənahova, Şəbnəm Süleymanova, Könül Soltanova, Hamlet Abbasov, Leyla Süleymanova) çalışır.

### 3.7.3. HESABLAMA RİYAZİYYATI VƏ İNFORMATİKA KAFEDRASI

Kafedra 1971-ci ildə «Hesablama riyaziyyatı və ehtimal nəzəriyyəsi» adı ilə fəaliyyətə başlamışdır. 1971–1981-ci illərdə kafedranın müdiri dos. H.Əliyev olmuşdur. Sonra kafedraya prof. Ə.M.Məmmədov (1981–1996) rəhbərlik etmişdir. Onun böyük əməyi hesabına universitetdə hesablama riyaziyyatı bir elm sahəsi kimi inkişaf etmişdir. 1998-ci ildən hal-hazıra kimi kafedra müdiri vəzifəsində dos. Z.Ə.Tağıyeva çalışır.

Son illərdə kafedranın potensialı artmış, elmi dərəcəlilərin sayı çoxalmışdır. M.Ö.Yusifov 2008-ci ildə doktorluq dissertasiyası müdafiə etmiş, 2010-cu ildə professor elmi adı almışdır. 2010-cu ildə isə dos. Ə.Q.Pələngov pedaqoji elmlər doktoru alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə etmişdir.



*Hesablama riyaziyyatı və informatika kafedrasının əməkdaşları*

Kafedra əməkdaşları bakalavr pilləsində informatika və təhsildə İKT, hesablama üsulları, əməliyyat sistemi, alqoritmlər nəzəriyyəsi, kompyuter arxitekturası, kompyuter şəbəkəsi, ehtimal nəzəriyyəsi fənlərini, magistratura pilləsində isə elm və təhsildə kompyuter texnologiyaları, informatikanın müasir problemləri, informasiyaların təşkili və iqtisadi problemləri, instrumental proqram vasitələri fənlərini tədris edirlər.

Kafedranın əməkdaşları tərəfindən 300-dən çox elmi məqalə, 2 monoqrafiya, 15 dərs vəsaiti çap olunmuşdur. Son illərdə Ə.Pələngovun «Proqramlaşdırma dilləri» (2011), Z.Tağıyeva, Ə.Həsənova və S.Cəbrayılzadənin «İnformatika və İKT» (2011), M.Yusifov və K.Cəfərovun «Ehtimal nəzəriyyəsi və riyazi statistikadan praktikum» (2011), M.Yusifovun «Rəqslər nəzəriyyəsinin riyazi həll üsulları» (2011) dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

Kafedranın əməkdaşlarından M.Ö.Yusifov və Ə.Q.Pələngovun əsərləri Rusiya, Belorusiya və Türkiyənin nüfuzlu elmi jurnallarında çap olunmuşdur. Ə.Q.Pələngov Moskva şəhərində keçirilən XVIII Beynəlxalq konfransda iştirak edib və sertifikat alıb.

Kafedrada «İnformatika və İKT tətbiqi» və «Tətbiqi riyaziyyatın nəzəri və metodiki məsələləri» adlı elmi seminar fəaliyyət göstərir.

Kafedra əməkdaşları informatika və hesablama riyaziyyatının əsaslarının öyrədilməsi istiqamətində elmi-tədqiqat işi aparırlar.

Hazırda kafedrada 19 nəfər – 1 nəfər elmlər doktoru, professor (Mehralı Yusifov), 1 nəfər fəlsəfə doktoru, professor (Əlif Məmmədov), 1 nəfər pedaqoji elmlər doktoru, dosent (Əbülfət Pələngov), 9 nəfər riyaziyyat üzrə fəlsəfə doktoru, dosent (Zenfira Tağıyeva (kafedra müdiri), Ofelya Əfəndiyeva, Şavər Talıbova, Kamandar Cəfərov, Vaqif Cabbarzadə, Qurban Əliyev, Səid Həmidov, Səadət Mazanova, Arzu Quliyev), 2 nəfər müəllim (Qönçə Bəşirova, Aynur Qasımova), 5 nəfər tədris-köməkçi heyət (Gülnarə Cəfərova, Elnarə Hüseynova, Sevil Şirinova, Məhluqə Hüseynova, Jalə Abdurəhimova) çalışır.

### 3.7.4. RİYAZİYYAT VƏ ONUN TƏDRİSİ METODİKASI KAFEDRASI

Kafedra 1930-cu ildə yaranmışdır. İlk illərdə kafedraya prof. B.Ə.Ağayev rəhbərlik etmişdir. Kafedra riyaziyyat tədrisinin aktual problemlərinə həsr olunmuş tədqiqat işləri aparılan mərkəz kimi tanınmışdır. Burada riyaziyyat tədrisinin istehsalatla əlaqələndirilməsi, fəndaxili və fənlərarası əlaqə, müxtəlif tip məktəblərdə riyaziyyat təliminin xüsusiyyətləri, riyaziyyatın tətbiqlərinin öyrədilməsi və başqa istiqamətlərdə araşdırmalar aparılmış, yüksəkixtisaslı mütəxəssislər hazırlanmışdır.

Sonralar kafedraya prof. B.Ə.Ağayevin tələbəsi və tanınmış metodist alim dos. Ə.Y.İbrahimov (1959–1975), prof. S.N.Sadıqov (1975–1987), dos. T.M.Əliyeva (1987–2003 ) rəhbərlik etmişlər.

2003-cü ildən kafedranın müdiri pedaqoji elmlər doktoru, prof. Azadxan Adıgözəlovdur.

Kafedrada «Riyaziyyatın tədrisi metodikasının müasir problemləri» adlı elmi seminar fəaliyyət göstərir.

Kafedranın əməkdaşları riyaziyyat təliminin müasir problemlərinə həsr olunmuş beynəlxalq elmi-metodiki konfranslarda məruzələrlə çıxışlar edirlər.

Son illərdə A.Adıgözəlovun «Riyaziyyatın tədrisi metodikası» (2009), «Həndəsi qurmalar» (2011), Ə.Quliyevin «Planimetriyanın məsələ vasitəsilə təkrarı» (2008), «Riyaziyyatın tədrisində ümumiləşdirmə» (2009), «Həndəsə məsələləri» (2010) adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.



*Riyaziyyat və onun tədrisi metodikası kafedrasının əməkdaşları*

Kafedrada riyaziyyatın tədrisi metodikası ixtisası üzrə xeyli fəlsəfə və elmlər doktoru dissertasiyaları müzakirə olunmuşdur. Bu sahədə prof. A.Adıgözəlovun xidmətləri xüsusilə qeyd olunmalıdır. Uzun müddətdir ki, o, Ali Attestasiya Komissiyasında ekspert kimi fəaliyyət göstərir. 2006-cı ildə kafedranın əməkdaşları dos. T.M.Əliyeva və dos. Ə.A.Quliyev Əməkdar müəllim fəxri adına layiq görülmüşlər.

Hazırda kafedrada 20 nəfər – 1 nəfər elmlər doktoru, professor (Azadxan Adıgözəlov (kafedra müdiri)), 7 nəfər riyaziyyat üzrə fəlsəfə doktoru, dosent (İdris Əliyev, Əsab Quliyev,Tinatin Əliyeva, Novruz Nəsirov, Allahverdi Cəfərov, Akif Sadıqov, Səxavət Abbasov), 3 nəfər baş müəllim (Solmaz Həsənova, Akif Quliyev, Müşgünaz Vəliyeva), 1 nəfər fəlsəfə doktoru, müəllim (Tellibəyim Həsənova), 3 nəfər müəllim (Cəmilə Abdullayeva, İradə Zeynalova, Ləman Zeynalova), 5 nəfər tədris-köməkçi heyət (Ülviyyə Məmmədova, Arzu Əliyeva, Zalxa Qardaşova, Ülviyyə Bayramlı, Sevda Bayramova) çalışır.

### 3.7.5. FUNKSİYALAR NƏZƏRİYYƏSİ KAFEDRASI

Kafedra 1996-cı ildə «Ümumi riyaziyyat» və «Riyazi analiz kafedralarının bazası əsasında təşkil edilmişdir. Həmin ildən kafedraya professor Q.Ə.Orucov rəhbərlik edir.

Kafedra əməkdaşları bakalavr pilləsində həqiqi və kompleks dəyişənli funksiyalar nəzəriyyəsi və bu fənlərlə əlaqəli ixtisas kursları tədris edirlər. Magistratura pilləsində xətti operatorların spektral nəzəriyyəsi, Banax fəzasında xətti tənliklər, funksional analizin əlavə fəsilləri – Banax cəbri, C*-cəbri, erqodik nəzəriyyə və funksiyaların yaxınlaşma nəzəriyyəsinin bəzi məsələləri kimi fənlər tədris olunur.

Kafedranın əməkdaşları funksiyaların yaxınlaşma nəzəriyyəsi üzrə mühüm nəticələr almışlar. Tədqiqatların nəticələri yaxın və uzaq xarici ölkələrin, həmçinin respublikanın nüfuzlu elmi jurnallarında dərc olun-



*Funksiyalar nəzəriyyəsi kafedrasının əməkdaşları*

muşdur. Kafedranın üzvləri bir sıra respublika və beynəlxalq elmi konfranslarda, simpoziumlarda məruzələrlə çıxış etmişlər.

Prof. Qardaşxan Orucovun «Riyazi analiz (monoton və məhdud variasiyalı funksiyalar)» (1993), «Riyazi analiz və funksiyalar nəzəriyyəsi, Riman Stiltes inteqralı» (1998), F.Səlimov, H.İbrahimov və F.Abdullayevlə birlikdə «Analitik funksiyalar nəzəriyyəsindən mühazirələr» (1985), F.Səlimov və R.Qəmərli ilə birlikdə «Riyazi analizdə qeyri-müəyyən inteqral hesabına aid» (1988), F.Səlimovla birlikdə «Dirixle sırası» (rus dilində) (I–II hissə, 1989; 1992), M.Ə.Əzimovla birlikdə «İnteqral hesabı» (1986), M.Ə.Əzimov və Ş.F.Məmmədovla birlikdə «Diferensial tənliklər» (1991), R.Qəmərli ilə birlikdə «Riyaziyyatdan abituryentlərə kömək» (I hissə, 1991) əsərləri nəşr olunmuşdur.

Son illərdə kafedra əməkdaşları – O.Həmzəyev və Q.Ə.Orucovun «Həqiqi dəyişənli funksiyalar nəzəriyyəsi» (2007), F.Hüseynov və S.Y.Əliyevin «Çoxdəyişənli funksiyaların diferensial hesabı» (2009) adlı dərslik və dərs vəsaitləri çap olunmuşdur.

Kafedrada «Bəzi fəzalarda yaxınlaşmalar nəzəriyyəsi» adlı elmi seminar fəaliyyət göstərir.

Hazırda kafedrada 11 nəfər – 1 nəfər riyaziyyat elmləri doktoru, professor (Qardaşxan Orucov (kafedra müdiri)), 4 nəfər riyaziyyat üzrə fəlsəfə doktoru, dosent (Ağakərim Adıgözəlov, Oqtay Həmzəyev, İbrahimxəlil Xəlilov, Seymur Rzayev), 4 nəfər baş müəllim (Faiq Hüseynov, Sürəyya Nəcəfova, Arif Məmmədov, Rafiq Qəmərli), 2 nəfər tədris-köməkçi heyət (Nərmin Quliyeva, Zibeydə Həşimova) çalışır.

## 3.8. COĞRAFİYA VƏ ÇAĞIRIŞAQƏDƏR HAZIRLIQ FAKÜLTƏSİ



*Dekan*
*dos. Mətanət Əsgərova*

Ali Pedoqoji İnstitut yaradılarkən burada təşkil edilən 3 şöbədən biri Təbiyyat-coğrafiya idi. İnstitut 1926–27-ci dərs ilində Bakı Dövlət Universitetinin tərkibinə verildiyindən Təbiyyat-coğrafiya şöbəsi öz fəaliyyətini müvəqqəti dayandırdı.

Təbiyyat-kimya fakültəsində fəaliyyət göstərən Coğrafiya şöbəsinin bazası əsasında 1934-cü ildə müstəqil coğrafiya fakültəsi təşkil edildi, Coğrafiya ixtisasına uyğun yeni kafedralar yaradıldı.

Fakültənin dekanı M.Zülfüqarovun səyi nəticəsində 50-ci illərdə tədris və elmi işlər sahəsində mühüm nailiyyətlər əldə edildi, kadr hazırlığı xeyli genişləndirildi. Subyektiv amillər üzündən 1959-cu ildə BDU-nun Coğrafiya fakültəsinə birləşdirilən fakültə bir müddət fəaliyyətini dayandırdı. Lakin bu vəziyyət çox davam etmədi. Respublikanın coğrafiya müəllimlərinə olan ehtiyacını nəzərə alaraq APİ-nin Kimya-biologiya (1966), sonralar isə Biologiya-kimya fakültəsinin (1970–1981) tərkibində coğrafiya şöbəsi fəaliyyət göstərdi.

1981-ci ildən Coğrafiya fakültəsi müstəqil fəaliyyət göstərir. Fakültəyə son 30 ildə dos. S.B.Məmmədov, prof.N.N.Allahverdiyev, dos. Ə.N.Əsədov, prof. Ş.G.Həsənov, prof. X.Ə.Vəliyev, dos. Y.Q.Əliyev, dos. M.C.Əliyev rəhbərlik etmişdir. Hazırda fakültəyə dosent Mətanət Əsgərova rəhbərlik edir.

Fakültədə əvvəllər yalnız coğrafiya ixtisası üzrə mütəxəssis hazırlandığı halda, indi həm də menecment, ekologiya, fiziki tərbiyə və gənclərin çağırışaqədərki hazırlığı müəllimliyi ixtisasları üzrə də mütəxəssis hazırlanır. Fakültənin məzunları arasında onlarla elmlər namizədi, dosent, professor, əməkdar müəllim, qabaqcıl maarif işçisi vardır. Fakültənin professor və müəllim heyəti ali və orta məktəblər üçün dərsliklər, dərs vəsaitləri və metodik vəsaitlər çap etdirmişlər. İftixarla demək lazımdır ki, elmimizin kori-



*Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsinin elmi şurası*

feylərindən biri olan akademik Həsən Əliyev bir müddət Coğrafiya fakültəsində işləmiş, xalq şairi M.Araz, xalq yazıçısı İ.Əfəndiyev, akademiklər B.Budaqov, Q.Məmmədov fakültəmizin tələbəsi olmuşlar.

Gənclərin cağırışaqədər hazırlıq fakültəsi keçmiş SSRİ hökumətinin 25 avqust 1978-ci il tarixli qərarına əsasən orta təhsil müəssisələrində ibtidai hərbi hazırlığın inkişafı məqsədilə Azərbaycan Təhsil Nazirliyinin 21 dekabr 1979-cu il tarixli, 63 saylı əmri ilə «İbtidai hərbi və fiziki təlim» adı ilə yaradılmışdır.

Respublikamızda belə bir fakültənin təşkilinin təşəbbüskarı Azərbaycan xalqının ümummilli lideri H.Ə.Əliyev olmuşdur. Fakültədə 1985-ci ildən indiyə kimi 2500-dən çox məzun zabit rütbəsinə layiq görülmüşdür. Onlar orta məktəblərdə bədən tərbiyəsi və hərbi rəhbər işləməklə yanaşı, Müdafiə, Daxili İşlər, Milli Təhlükəsizlik nazirliklərində də çalışırlar.

Fakültənin məzunları Qarabağ uğrunda gedən döyüşlərdə fədakarlıq göstərmiş, Milli Qəhrəman adınadək yüksəlmişlər. Mirələkbər İbrahimov 1986-cı ildə fakültəni bitirmiş, bir müddət Yasamal rayonu 53 saylı mək-

təbdə hərbi rəhbər işləmiş, sonra könüllü olaraq cəbhəyə yollanmış, döyüşdə igidliklə həlak olmuş və şücaətinə görə Azərbaycanın Milli Qəhrəmanı adına layiq görülmüşdür. İşlədiyi məktəb onun adını daşıyır. Fakültənin digər məzunu Mətləb Quliyev də könüllü olaraq Vətən uğrunda döyüşlərə getmiş, torpaqlarımızın azadlığı uğrunda şəhid olmuşdur. Milli Qəhrəman M.Quliyevin adını daşıyan Sumqayıt şəhər 3 saylı orta məktəbdə onun abidəsi qoyulmuşdur. Fakültənin məzunu Mürşüd Məmmədov isə polis mayoru idi. 1994-cü ilin yanvarın 24-də Murovdağ uğrunda döyüşlərdə qəhrəmanlıq göstərmiş, ölümündən sonra o, «Azərbaycan Bayrağı» ordeni ilə təltif edilmişdir. Fakültənin məzunu Malik Bayramov da ölümündən sonra «Azərbaycan Bayrağı» ordeninə layiq görülmüşdür.

Fakültənin yetirmələri idman sahəsindəki fəaliyyətlərini bu gün də davam etdirirlər. Tələbələrimizdən Elman Əsgərov sərbəst güləş üzrə dünya çempionatında 3-cü yeri tutmuşdur. Rüstəm Siyavuşov ümumdünya oyunlarının mükafatçısı, sanbo üzrə idman ustasıdır. Fakültəmizdə təhsil alan tələbələrdən bir çoxu beynəlxalq yarışların mükafatçılarıdır.

Hazırda fakültədə 7 kafedra fəaliyyət göstərir: Ümumi coğrafiya (kafedra müdiri dos. M.Əsgərova), İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası (kafedra müdiri dos. K.Bayramov), Fiziki coğrafiya (kafedra müdiri dos. N.Süleymanova), Ekologiya (kafedra müdiri dos. Y.Əliyev), Fiziki tərbiyə və gənclərin çağırışaqədər hazırlığı fənləri və onların tədrisi metodikası (kafedra müdiri dos. A.Əmiraslanov), İdman fənləri (kafedra müdiri dos. G.Quliyev), Bədən tərbiyəsi (kafedra müdiri prof. Ə.Mehdiyev).

### 3.8.1. ÜMUMİ COĞRAFİYA KAFEDRASI

Kafedra 1974-cü ildə Fiziki coğrafiya kafedrasının iki hissəyə bölünməsi nəticəsində yaranmışdır. Kafedraya 1974–1977-ci illərdə dos. P.S.Mirzəyev, 1978–1991-ci illərdə prof. Ş.Ə.Həsənov, 1992–1997-ci illərdə yenə dos. P.S.Mirzəyev, 1997–2007-ci illərdə M.C.Əliyev rəhbərlik etmişdir.

Hazırda kafedra müdiri dos. Mətanət Əsgərovadır.

Kafedrada Ümumi yerşünaslığa giriş, Meteorologiya və iqlimşünaslıq, Hidrologiya, Geomorfologiya, Torpaq coğrafiyası, Təbiətin mühafizəsi, Geologiya, Geodeziya, Topoqrafiyanın əsasları və Kartoqrafik rəsmxət fənləri tədris olunur.



*Ümumi coğrafiya kafedrasının əməkdaşları*

Kafedranın əməkdaşları tədris işi ilə yanaşı, müasir tələblərə cavab verən, istehsalatla, həyat və məişətlə bağlı elmi problemlərlə də məşğuldurlar. Burada Lənkəran–Talış, Quba–Xaçmaz, Abşeron–Qobustan fiziki-coğrafi rayonlarının, Böyük Qafqazın cənub yamacının fiziki-coğrafi xüsusiyyətləri, təbii ehtiyatlarının tətbiqi və təsərrüfat məqsədi ilə istifadə yolları kimi kompleks problemlərlə bağlı elmi-tədqiqat işi aparılmışdır.

Son dövrlərdə kafedranın maddi-texniki bazası daha da zənginləşdirilmiş, laboratoriyaların sayı artırılmış, yeni kabinetlər yaradılmış, cihazlar, xəritələr, tablolar, diapozitivlər, kinoqurğular, tədris filmləri və s. alınmış, tədrisin keyfiyyəti xeyli yüksəldilmiş, gənc kadrlar işə cəlb edilmişdir.

Prof. Ş.Ə.Həsənovun çoxillik elmi yaradıcılığında təbiətin mühafizəsi, ekoloji problemlər və onun tarazlığının pozulmasında antropogen amillərin rolu, təbii ehtiyatlardan səmərəli istifadə olunması yolları kompleks şəkildə tədqiq edilmişdir. Prof. Ş.Ə.Həsənov təkcə respublikamızda deyil, onun hüdudlarından kənarda da yüksəkixtisaslı xarici ölkə mütəxəssislərinin yetişdirilməsinə xeyli əmək sərf etmişdir. Birmada işlədiyi dövrdə onun təşəbbüsü ilə Patris Lumumba adına Xalqlar Dostluğu Universitetinə 10 nəfər birmalı gənc oxumağa göndərilmiş, onlardan iki nəfəri aspiranturada təhsilini davam

etdirmiş, namizədlik dissertasiyası (Ş.Ə.Həsənovun rəhbərliyi altında) müdafiə edərək vətənə qayıtmışdır.

Kafedranın aparıcı tədqiqat sahələrindən biri də geomorfologiyadır. Respublikamızda geomorfoloqların əldə etdiyi mühüm nailiyyətlərdən biri Xəzər dənizinin dibinin və sahillərinin dinamikasının inkişaf qanunauyğunluqlarının tədqiqidir. Bu işdə kafedranın əməkdaşı prof. X.Ə.Vəliyevin böyük xidmətləri vardır.

Kafedranın dosenti O.M.Rzayev (Oqtay Rza) neft və qaz geologiyasına dair onlarla elmi və elmi-kütləvi məqalələrin, iki hissədən ibarət «Geologiyanın əsasları» dərsliyinin müəllifidir. Dövri mətbuat səhifələrində və teleradio verilişlərində geoloji-mineroloji səpkidə çıxışları ilə tanınan Oqtay Rza ədəbi yaradıcılıqla da məşğuldur. O, Azərbaycan Yazıçılar Birliyinin üzvü, «Qızıl qələm» mükafatı laureatıdır.

Dos. A.Əzizbəyova 30 ilə yaxın kafedrada çalışmışdır. Onun dos. O.Rza ilə birlikdə çap etdirdiyi «Geologiyadan çöl təcrübələrinin aparılmasına dair» metodik göstərişi bu gün də istifadədədir.

Məktəb coğrafiyası bir çox konkret elmlərin (geomorfologiya, iqlimşünaslıq, meteorologiya, hidrologiya, okeanologiya, torpaqşünaslıq, əhali coğrafiyası, kartoqrafiya, topoqrafiya və s.) pedaqoji proyeksiyasıdır. Bu cəhətdən kafedranın dosentləri Z.Əfəndiyev, Ə.Hüseynov və A.Hüseynovun kartoqrafiya və topoqrafiya ilə bağlı dərslik və dərs vəsaitlərinin hazırlanmasında təqdirəlayiq xidmətləri olmuşdur.

Ümumi coğrafiya kafedrasında tədris olunan fənlərdən biri də toponomikadır. Kafedranın əməkdaşı S.Mirmahmudovanın «Ermənistanın oykonimləri» adlı əsəri mühüm elmi tədqiqat işidir. A.Z.İsmayılova akademik B.Ə.Budaqovun rəhbərliyi ilə «Dağlıq Qarabağın toponimləri» mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir. Türkdilli xalqların yaşadıqları ərazilərin toponimlərini öyrənmək sahəsində coğrafiya üzrə fəlsəfə doktoru A.İsmayılovanın maraqlı tədqiqatları var.

Dos. Y.Q.Əliyevin Kiçik Qafqazda apardığı morfostrukturların inkişaf tarixi, mənşəyi, məkanca yerləşmə xüsusiyyətləri elmi-tədqiqat işlərinin nəticələri irimiqyaslı xəritələrdə və nəşr olunmuş elmi əsərlərdə öz əksini tapmışdır. O, hazırda «Kiçik Qafqazın konstruktiv geomorfologiyası» (Azərbaycan ərazisində) mövzusunda doktorluq dissertasiyasını tamamlamaq üzrədir. İki dərs vəsaitinin və 40-dan çox elmi məqalənin müəllifidir.

Dos. M.C.Əliyev coğrafiyanın fəlsəfi məsələləri ilə məşğul olmuşdur. O, «Coğrafiyanın inkişaf tarixi və səyyahlar» (2009), «Meliorativ coğrafiya»

(2010) dərs vəsaitlərinin müəlliflərindən biri olmuşdur. Ekoloji situasiya və ekoloji şüura dair onlarla məqaləsi dövri mətbuat səhifələrində dərc edilmişdir. Onun dos. A.H.Əliyev və başqaları ilə birlikdə yazdığı «Materiklərin torpaq örtüyü, torpaq ehtiyatları, mühafizəsi və onların eroziyadan qorunmasının bəzi problemləri» (2006) adlı dərs vəsaiti maraq doğurur.

Son illərdə prof. X.Vəliyev və dos. Y.Əliyevin «Ali məktəblərə daxil olan abituriyentlər üçün coğrafiyadan vəsait», «Xəzərin sahillərinin təbiəti və ekologiyası», prof. Ş.Ə.Həsənov və dos. M.Əsgərovanın «Torpaq coğrafiyası, torpaqşünaslığın əsasları» (iki cilddə), prof. X.Vəliyevin «Xəzər sahillərinə səyahət», «Xəzərin Azərbaycan sahillərinin geomorfologiyası və dinamikası», prof. Ş.Həsənovun «Azərbaycanın torpaq ehtiyatları, onların səmərəli istifadə olunması və qorunması», «Torpaq nədir?», «731 gün Birmada», dos. N.Uluxanlının «Azərbaycanda üzümün becərilməsinin aqroiqlim şəraiti və ehtiyatları», F.Həsənlinin «Meliorativ coğrafiya», A.Məmmədovun «Tərtərçay hövzəsi landşaftlarında ağır metalların (Hg, Pb, Cu) yayılma qanunauyğunluqları», Ə.İmaməliyevin «Torpaqşünaslıq və torpaq coğrafiyasının əsasları fənnində çöl-təcrübə işlərinin aparılmasına dair», «Torpaq xəritələrinin oxunması və torpaq tiplərinin coğrafiyası» mövzusuna aid laboratoriya – praktiki işlər üzrə» adlı monoqrafiya və dərs vəsaitləri çap edilmiş, torpaq coğrafiyası, meterologiya və iqlimşünaslıq, geomorfologiya, topoqrafiya, geologiya fənlərindən çöl təcrübələrinin aparılmasına dair metodiki göstərişlər işlənib hazırlanmışdır.

Hazırda kafedrada 12 nəfər – 1 nəfər elmlər doktoru, professor (Şahalı Həsənov), 9 nəfər fəlsəfə doktoru, dosent (Mətanət Əsgərova (kafedra müdiri), Yavər Əliyev, Nurəddin Uluxanlı, Fərrux Həsənli, Arifə İsmayılova, Hafizə Əsgərova, Adışirin Məmmədov, Oqtay Rzalı, Əkbər İmaməliyev), 2 nəfər müəllim (Telman Həbibov, İlhamə Qəribova) çalışır.

### 3.8.2. İQTİSADİ COĞRAFİYA VƏ COĞRAFİYANIN TƏDRİSİ METODİKASI KAFEDRASI

Kafedra 1970-ci ildən fəaliyyət göstərir. Müxtəlif vaxtlarda prof. N.N.Allahverdiyev, prof. H.Ə.Sadıxlı, dos. T.P.Gərayzadə, dos. D.M.Ələsgərov ona rəhbərlik etmişlər. Hal-hazırda dos. Kərəm Bayramov kafedraya rəhbərlik edir.

2011–2012-ci tədris ilindən AMEA-nın müxbir üzvü, prof. R.M.Məmmədov kafedrada əvəzediciliklə müəllim kimi fəaliyyətə başlamışdır. Kafedra respublikanın əksər ali məktəblərinin analoji kafedraları, Kiyev



*İqtisadi coğrafiya və coğrafiyanın tədrisi metodikası kafedrasının əməkdaşları*

Dövlət Universitetinin «İqtisadi və siyasi coğrafiya» kafedrası və AMEA ilə sıx əməkdaşlıq edir. Eyni zamanda AMEA-nın H.Əliyev adına Coğrafiya İnstitutunun müvafiq şöbələri ilə elmi-pedaqoji əməkdaşlığı artıraraq, institutun bütün tədbirlərində fəal iştirak edir. Kafedra regionlarımızın təhsil şöbələri ilə müntəzəm yaradıcı əməkdaşlıq əlaqələri saxlayır. Kafedranın nəzdində 16 magistr əyani və qiyabi şöbədə hazırlığını davam etdirir.

Kafedra əməkdaşları tədris prosesi ilə paralel genişmiqyaslı elmi-tədqiqat, elmi-pedaqoji və ictimai-sosial tədbirlərdə iştirak edir. Kafedranın professor-müəllim heyəti iki istiqamətdə; sosial-iqtisadi və coğrafiyanın orta və ali məktəblərdə tədrisi metodikası istiqamətində elmi-tədqiqat işi aparır.

Ali pedaqoji məktəb tələbələri və ümumtəhsil məktəb şagirdləri üçün dərslik, dərs vəsaiti, proqram, metodik tövsiyə və praktikumların hazırlanması kafedra əməkdaşlarının əsas vəzifələrindən birinə çevrilmişdir. Son illərdə dos. K.B.Bayramovun «Şəhərətrafı ASK-nin tədqiqinə dair», «Dünyanın fiziki və iqtisadi coğrafiyası xəritəsinin öyrənilməsinə dair»,

«Dünyanın iqtisadi və sosial coğrafiyasının tədrisinə dair», «Latın Amerikası ölkələri», «Meksikanın iqtisadi coğrafiyası», «And ölkələri», «La-Plata ovalığı və Amazon hövzəsi ölkələri», «Təbiətdən istifadənin iqtisadi-coğrafi və ekoloji problemləri», dos. M.X.Məmmədovun «Dünya təsərrüfatının coğrafiyası», dos. D.M.Ələsgərovun «Materiklər və okeanların fiziki coğrafiyası», «Dünya təsərrüfatı», prof. N.N.Allahverdiyevin «Azərbaycan Respublikasının iqtisadi və sosial coğrafiyası», dos. T.P.Gərayzadənin «Xarici ölkələrin iqtisadi və sosial coğrafiyası», «Regional coğrafiya», «Coğrafiya» (IX sinif üçün), dos. O.K.Alxasovun «Dünyanın iqtisadi və sosial coğrafiyası (IX sinif)», «Materiklər və okeanların fiziki coğrafiyası» (VII sinif), «Coğrafiyanın tədrisi metodikası», dos. Y.Q.İsmayılovun «İqtisadi və fiziki coğrafiyanın tədqiqat üsulları» adlı dərslik, dərs vəsaiti və metodik tövsiyələri nəşr olunmuşdur.

Kafedranın əməkdaşlarından dos. O.K.Alxasov, dos. D.M.Ələsgərov, b/m. K.M.Əkbərov TQDK ilə yaxından əməkdaşlıq edir, proqram və testlərin hazırlanmasında fəal istirak edirlər.

Kafedrada 14 nəfər – 5 nəfər fəlsəfə doktoru, dosent (Kərəm Bayramov, Məlikməmməd Məmmədov, Yunis İsmayılov, Oqtay Alxasov, Dadaş Ələsgərov), 1 nəfər fəlsəfə doktoru (Mirvari Verdiyeva), 2 nəfər baş müəllim (Sona İmanova, Kamal Əkbərov), 6 nəfər müəllim (Səmayə Həsənova, Fəxriyyə Məmmədova, Nəcibə Axundova, Nəzakət Zamanova, Vəfa Tağıyeva, Dünyabəyim Əfəndiyeva) çalışır.

### 3.8.3. FİZİKİ COĞRAFİYA KAFEDRASI

Kafedra 1966-cı ildə təşkil olunmuşdur. Kafedraya 1966–1973-cü illərdə Əməkdar elm xadimi, prof. N.K.Kərəmov, 1973–1983-cü illərdə prof. R.B.Tarverdiyev, 1984–1989-cu illərdə B.N.Nəbiyev, 1989–1998-ci illərdə dos. B.S.Cəfərov, 1999–2008-ci illərdə dos. A.H.Əliyev rəhbərlik etmişdir.

2008-ci ildən kafedranın müdiri dos. Nərminə Süleymanovadır.

Prof. N.K.Kərəmovun Azərbaycanda fiziki coğrafiyanın, xüsusilə landşaftşünaslıq elminin inkişafında böyük xidmətləri vardır. Əsərləri, əsasən, Böyük Qafqazın landşaftlarına, təbii komplekslərin yüksəklik zonallığına həsr edilmişdir. O, A.A.Bakıxanov və H.Z.Şirvanidən bəhs edən qiymətli monoqrafiyaların müəllifidir. Prof. N.K.Kərəmovun «H.Z.Şir-



*Fiziki coğrafiya kafedrasının əməkdaşları*

vaninin həyat yolu» və «A.A.Bakıxanov – Qüdsinin səyahətləri» adlı elmi-kütləvi kitabçaları Moskvada (1980) rus dilində işıq üzü görmüşdür.

Prof. R.B.Tarverdiyevin əsas tədqiqatları Azərbaycanın gölləri və su anbarlarının hidroloji xüsusiyyətlərinə aiddir. O, «Mingəçevir su anbarının lillənməsi», «Azərbaycan daxilində Böyük Qafqazın gölləri» monoqrafiyalarının və çox sayda elmi məqalələrin müəllifidir.

Kafedra müdiri, dos. N.S.Süleymanova «Materiklərin və okeanların fiziki coğrafiyası», «Azərbaycan Respublikasının fiziki coğrafiyası», «Coğrafi tədqiqatların aparılması üsulları» (dosent Y.Q.İsmayılovla) adlı dərslik və dərs vəsaitləri və magistr və bakalavr pilləsi üçün proqramlar tərtib etmişdir. Dos. A.H.Əliyev 5 monoqrafiya, 1 dərslik, 4 dərs vəsaitinin, 1 proqram, 2 metodik vəsaitin,100-ə qədər elmi, elmi-metodik məqalənin müəllifidir. Dos. B.S.Cəfərov «Kiçik Qafqaz çay hövzələrinin su balansı», «Azərbaycanın çayları, gölləri və su anbarları», «Avrasiya materikinin təbii şəraiti», «Azərbaycanın fiziki coğrafiyası» adlı monoqrafiya, dərslik, dərs vəsaitinin və bir neçə tədris proqramının müəllifidir.

Dosentlər T.X.Zülfüqarov, F.H.Baxmalov və A.S.İbrahimov Xəzər dənizinin fiziki coğrafiyası ilə əlaqədar ciddi elmi tədqiqat aparmışlar. Azərbaycanın dağlıq ərazi landşaftlarının diferensiasiyasının tədqiqində dos. B.N.Nəbiyev, F.A.Hüseynova və N.S.Süleymanovanın böyük əməyi olmuşdur. Dosent B.S.Cəfərovun «Avrasiya materikinin təbii şəraiti» (1991), dos. B.N.Nəbiyev və dos. F.H.Baxmalovun «Cənubi Amerikanın fiziki coğrafiyası» (1991), dos. B.S.Cəfərov, dos. A.H.Əliyev və dos. N.S.Süleymanovanın «Azərbaycan Respublikasının fiziki coğrafiyası» (1993), dos. A.H.Əliyev və N.S.Süleymanovanın «Materiklərin fiziki coğrafiyası» (1997), dos. A.H.Əliyevin «Avstraliya və okeaniyanın fiziki coğrafiyası» (1992), «Afrikanın fiziki coğrafiyası» (1992), «Antarktidanın fiziki coğrafiyası» (1993), «Torpaq coğrafiyası torpaqşünaslığın əsasları ilə» (1995), dos.A.H.Əliyev, R.F.Zeynalovun «Naxçıvan MR ərazisinin fiziki-coğrafi şəraiti və onun eroziya prosesinə təsiri» (2008), dos. A.S.İbrahimovun «Xəzər dənizi və Azərbaycan Respublikasının fiziki coğrafiyasından testlər» (2008), dosentlər A.H.Əliyev, N.S.Süleymanova, B.S.Cəfərov, F.A.Hüseynovanın «Materiklər və okeanların fiziki coğrafiyası» (2010), dosentlər B.S.Cəfərov, N.S.Süleymanova, T.X.Zülfüqarovun «Azərbaycanın iqlimi və iqlim ehtiyatları» (2009), dosentlər B.S.Cəfərov, N.S.Süleymanova, F.A.Hüseynovanın «Azərbaycanın su ehtiyatları» (2008), dos. A.H.Əliyev, dos. F.A.Hüseynova, G.N.Şirinovanın «Dünyanın torpaq ehtiyatları və onun mühafizəsi» (2008), dos. B.S.Cəfərov, dos. N.S.Süleymanova, N.S.Seyidovun «Materiklər və okeanların fiziki coğrafiyası» (2009), dosentlər N.S.Süleymanova və Y.Q.İsmayılovun «Coğrafi tədqiqatların aparılması üsulları» (2011) adlı dərslik, dərs vəsaiti və metodik tövsiyələrindən tədrisdə geniş istifadə edilir. Kafedrada «Azərbaycanın fiziki coğrafiyası», «Qafqazın fiziki coğrafiyası», «Materiklər və okeanların fiziki coğrafiyası» fənləri üzrə yeni tədris proqramları tərtib edilmişdir.

Hazırda kafedrada 8 nəfər – 1 nəfər coğrafiya elmləri doktoru (Hüseyn Xəlilov), 4 nəfər fəlsəfə doktoru, dosent (Nərminə Süleymanova (kafedra müdiri), Alı Əliyev, Bəhlul Cəfərov, Fatma Hüseynova), 3 nəfər tədris-köməkçi heyət (Rəna İsgəndərova (kabinə müdiri), Gülnarə Şirinova, Nizami Seyidov) çalışır.

### 3.8.4. EKOLOGİYA KAFEDRASI

Fakültədə ekologiya ixtisasında təhsil alan tələbələrin bu sahədə yüksəkixtisaslı mütəxəssis kimi yetişməsi və respublikamızda ekoloji kadrlara olan tələbatı ödəmək məqsədilə 2008-ci ildə Ekologiya kafedrası yaradılmışdır. Kafedranın ilk müdiri dos. M.C.Əliyev olmuşdur.

Kafedraya 2011-ci il tarixdən coğrafiya üzrə fəlsəfə doktoru, dos. Yavər Əliyev rəhbərlik edir. Kafedranın əməkdaşları universitetimizin ayrı-ayrı kafedralarında uzun müddət fəaliyyət göstərmiş peşəkar müəllimlərdir. Ekologiya ilə bağlı zəruri tədris və metodiki ədəbiyyatın, testlərin hazırlanmasında onların mühüm rolu vardır.

Y.Q.Əliyev Kiçik Qafqazın cənub-şərq hissəsinin morfostrukturları və onların inkişaf xüsusiyyətləri ilə bağlı tədqiqatların müəllifidir. Hazırda o, Kiçik Qafqazın konstruktiv geomorfologiyası problemi üzərində araşdırma-



*Ekologiya kafedrasının əməkdaşları*

lar aparır. Prof. Rauf Sultanov 2 ildir ki, universitetimizdə çalışır. 1995-ci ildə doktorluq dissertasiyası müdafiə edərək biologiya elmləri doktoru elmi dərəcəsi adı almışdır. 2008-ci ildən professordur. O, 230-a qədər elmi əsərin, o cümlədən 8 monoqrafiyanın, 12 dərsliyin, 3 dərs vəsaitinin, 36 fənn proqramının, metodiki göstərişin, tövsiyənin və 170 elmi məqalənin müəllifidir. Onun rəhbərliyi altında 7 nəfər namizədlik dissertasiyası müdafiə etmişdir. R.L.Sultanov 2 ixtiranın müəllifidir.

Kafedranın əməkdaşı Ş.Hüseynova genetika, S.Həsənova, R.Hüseynova, Ş.Hüseynova, Q.Bayramova, G.Məmmədova isə ekologiyanın müxtəlif problemləri ilə bağlı araşdırmalar aparır, müxtəlif konfranslarda məruzələrlə çıxış edir, elmi məqalələr nəşr etdirirlər.

Kafedrada 11 nəfər – 1 nəfər elmlər doktoru, professor (Rauf Sultanov), 1 nəfər fəlsəfə doktoru, dosent (Yavər Əliyev), 2 nəfər baş müəllim (Şəmsiyyə Hüseynova, Subeyrat Həsənova), 1 nəfər biologiya üzrə fəlsəfə doktoru (Rəna Hüseynova), 3 nəfər müəllim (Şəhla Hüseynova, Qənirə Bayramova, Günel Məmmədova) və 3 nəfər tədris-köməkçi heyət (Aygün Qocayeva, Emilya Həsənova, Mehmanə Cavadova) çalışır.

### 3.8.5. FİZİKİ TƏRBİYƏ VƏ GƏNCLƏRİN ÇAĞIRIŞAQƏDƏR HAZIRLIĞI FƏNLƏRİ VƏ ONLARIN TƏDRİSİ METODİKASI KAFEDRASI

İbtidai hərbi hazırlıq və fiziki tərbiyə fakültəsi yaradılarkən burada fəaliyyət göstərən əsas kafedralardan biri «Fiziki tərbiyənin nəzəri əsasları və onun tədrisi metodikası» adlanırdı. Hazırda kafedra «Fiziki tərbiyə və gənclərin çağırışaqədər hazırlığı fənləri və onların tədrisi metodikası» kafedrası adlanır.

Kafedrada fiziki tərbiyənin nəzəriyyəsi və onun tədrisinin metodikası, fiziki tərbiyənin təşkili və idarə olunması, fiziki tərbiyənin tarixi, gənclərin çağırışaqədər hazırlığı və onun tədrisi metodikası, hərbi-vətənpərvərlik tərbiyəsi, güllə atıcılığı, rabitə sistemindən istifadə və s. fənlər tədris olunur. Xüsusi proqram əsasında taktiki atəş və texniki hazırlıq keçirilir.

Kafedrada tədris olunan bütün fənlər üzrə tədris proqramları tərtib edilmişdir. Kafedranın ixtisaslaşdırılmış auditoriyaları, 25 metrlik güllə-atıcılıq tiri vardır.



*Fiziki tərbiyə və gənclərin çağırışaqədər hazırlığı fənləri və onların tədrisi metodikası kafedrasının əməkdaşları*

Kafedraya uzun müddət əməkdar məşqçi, beynəlxalq dərəcəli hakim, prof. Rafiq Baxşəliyev rəhbərlik etmişdir.

Hazırda kafedraya dosent Akif Əmiraslanov rəhbərlik edir.

Kafedrada 8 nəfər – 1 nəfər professor (Rafiq Baxşəliyev), 1 nəfər fəlsəfə doktoru, dosent (Akif Əmiraslanov), 5 nəfər baş müəllim (Sabir Yolçuyev, Əvəz Sadıqov, Natiq Əliyev, Faiq Fərəcov, Şikar Şikarov), 1 nəfər müəllim (Gülnar Məmmədova) çalışır.

### 3.8.6. İDMAN FƏNLƏRİ KAFEDRASI

Fakültə fəaliyyətə başlayarkən onun yalnız bədən tərbiyəsi üzrə bir kafedrası mövcud olub. Həmin kafedra «İdman fənləri» kafedrası adlanırdı. Kafedranın professor-müəllim heyəti mühazirə-seminar məşğələlərini və təcrübi-idman dərslərini tədris edirdilər. 1983-cü ildə «İdman fənləri» kafedrası nəzəri və praktik kafedralara bölündü.

Praktik kafedra «Təknövlülük və gimnastika» adlandırıldı. Kafedrada güləş, əlbəyaxa döyüş, badminton, bədii gimnastika, gimnastika, idman oyunları, üzgüçülük və onların metodikası öyrədilirdi. Pedaqogika üzrə fəlsəfə doktoru, dosent, Azərbaycan Respublikasının Fəxri bədən tərbi-



*İdman fənləri kafedrasının əməkdaşları*

yəsi və idman işçisi, SSRİ idman ustası B.S.Quliyev 1983-cü ildən 1996-cı ilədək həmin kafedraya rəhbərlik etmişdir.

Kafedrada vaxtilə Azərbaycan Respublikasının əməkdar məşqçisi A.Quliyev, dos. R.Y.Rəsulov, pedaqogika üzrə fəlsəfə doktoru, dosent, SSRİ idman ustası F.P.Məmmədov və Azərbaycan Respublikasının əməkdar məşqçisi dos. Ə.D.Muradov çalışmışlar.

Kafedranın dosentlərindən B.S.Quliyev, G.B.Quliyev və A.A.Əmiraslanov güləş, üzgüçülük, gimnastika, idman oyunları, fiziki tərbiyənin nəzəriyyəsi və metodikası ilə bağlı dərslik və dərs vəsaitləri nəşr etdirmiş, proqramlar hazırlamışlar.

Respublikanın Əməkdar məşqçisi, Əməkdar bədən tərbiyəsi və idman xadimi Quliyev Gülbaba ölkəmizdə idmanın inkişafında və sərbəst güləş üzrə idmançı kadrların yetişdirilməsində xidməti olan məşqçilərdəndir. O, Azərbaycan Respublikasının Prezidenti, Milli Olimpiya Komitəsinin prezidenti İlham Əliyev tərəfindən dəfələrlə qəbul edilib mükafatlandırılmışdır.

Onun yetirməsi E.N.Əsgərov sərbəst güləş üzrə Beynəlxalq dərəcəli idman ustası, beş Qran-Pri turnirinin qalibi, 1996-cı ildə tələbələrin dünya çempionatında bürünc, 2002-ci ildə Avropa çempionatında gümüş medal qazanmış, 2004-cü ildə dünya kubokunun sahibi, Afina–2004 XXVIII Yay Olimpiya Oyunlarının iştirakçısı, 2005-ci ildə Avropa çempionatının gümüş mükafatçısı, 2006-cı ildə İstanbulda keçirilmiş Beynəlxalq Qran-Pri turnirinin qalibi olmuşdur.

Digər bir yetirməsi Aslanov Ruslan sərbəst güləş üzrə 2011-ci ildə Ankarada keçirilən yeniyetmələrin Ümumdünya festivalında III mükafata layiq görülmüşdür.

Kafedraya 1996-cı ildən 2006-cı ilədək Azərbaycan Respublikasının əməkdar məşqçisi, dosent Ə.D.Muradov rəhbərlik etmişdir.

2007– 2011-ci illərdə kafedraya pedaqogika üzrə fəlsəfə doktoru, dos. A.A.Əmiraslanov rəhbərlik etmişdir. Hazırda kafedraya dos. G.Quliyev rəhbərlik edir.

Hazırda kafedrada 4 nəfər – 1 nəfər dosent (Gülbaba Quliyev), 2 nəfər baş müəllim (Şərif Allahverdiyev, Vaqif Sadıqov) və 1 nəfər müəllim (Zərəngiz Qasımova) fəaliyyət göstərirlər.

### 3.8.7. BƏDƏN TƏRBİYƏSİ KAFEDRASI

Kafedrada yüksəkixtisaslı kadrlar – əməkdar məşqçi, dosent Səlim Ağayev, əməkdar məşqçi Ramiz Mehdiyev, dosent Hənifə Qurbanov, Tofiq Cəbrayılov, SSRİ idman ustası Göyüş Məmmədov, Əlibəy Tağıyev və başqaları işləmişlər. Kafedraya müxtəlif vaxtlarda baş müəllim R.Y.Rəsulov, dosent S.H.Ağayev rəhbərlik etmişdir.

Hazırda kafedranın müdiri, əməkdar məşqçi, idman ustası, respublika dərəcəli hakim, Milli Olimpiya Akademiyasının üzvü, pedaqogika üzrə fəlsəfə doktoru, professor Əli Mehdiyevdir.

Kafedrada 13 nəfər – 1 nəfər fəlsəfə doktoru, professor (Əli Mehdiyev), 10 nəfər baş müəllim (Əlibəy Tağıyev, Anatoli Knyazixin, Rəhilə Əliyeva, Məmməd Kərimov, Musa Musayev, Rafiq Qəribov, Bənövşə Salahova, Tofiq Cəbrayılov, Fərman Məmmədov Laçın Əsgərov), 2 nəfər müəllim (Məsim Quliyev, Nazir Nağıyev) çalışır.




*Bədən tərbiyəsi kafedrasının əməkdaşları*



*İdman dərsində*

## 3.9. PEDAQOGİKA VƏ PSİXOLOGİYA FAKÜLTƏSİ



*Dekan*
*dos. Şəhla Əliyeva*

Fakültə müstəqil şəkildə 1981-ci ildə yaradılmışdır. Həmin ilə qədər Pedaqoji fakültənin nəzdində Məktəbəqədər tərbiyə şöbəsi (əyani və qiyabi) fəaliyyət göstərmiş, məktəbəqədər tərbiyə müəssisələri üçün ali təhsilli kadr hazırlığı ilə məşğul olmuşdur.

Yarandığı gündən etibarən fakültənin dekanı vəzifəsində dos. Eldar Abbaszadə (1981–1985), dos. Gülarə Qayıbova (1985–1987), prof. Xəlil Fətəliyev (1987–1989), prof. Məmməd Məmmədov (1989–1997-əyani), dos. Musa Həsənov (1989–1997-qiyabi), dos. Şəhla Əliyeva (1997–2001), dos. Allahverdi Hacıyev (2001–2011) çalışmışlar. 2011-ci ilin sentyabr ayından fakültəyə dos. Ş.Q.Əliyeva rəhbərlik edir.

Əvvəllər fakültədə yalnız bir ixtisas (məktəbəqədər təhsilin pedaqogikası və metodikası) üzrə kadr hazırlanırdısa, 1996-cı ildən korreksiyaedici pedaqogika və xüsusi psixologiya, 1997-ci ildən defektologiya, 1999-cu ildən isə psixologiya ixtisası üzrə kadr hazırlığına başlanmışdır.

Hal-hazırda fakültənin əyani şöbəsində üç ixtisas (məktəbəqədər təlim və tərbiyə, təhsildə sosial-psixoloji xidmət, korreksiyaedici təlim), qiyabi şöbədə isə bir ixtisas (məktəbəqədər təlim və tərbiyə) üzrə kadr hazırlanır. Həmin ixtisaslara dair baza proqramları, dövlət standartları və tədris planları fakültədə hazırlanmışdır.

2009–2010-cu tədris ilindən başlayaraq fakültə tələbələri kredit sistemi ilə təhsil alır. Fakültənin əyani şöbəsində, ilk dəfə olaraq Müasir təhsil və tədrisə yardım mərkəzi, Dünyaya baxış təşkilatı və Azərbaycan Respublikası Təhsil Nazirliyinin dəstəyi ilə inklüziv təhsilə dair pilot layihəsi həyata keçirilir. 2010–2011-ci tədris ilindən inklüziv təhsil seçmə fənn kimi müvafiq kurslarda tədris olunur. Fakültədə hər il TEC xətti ilə 70-ə yaxın tələbənin elmi tədqiqat işinə rəhbərlik olunur.

Hacəttəpə Universitetinin «Məktəbəqədər təhsil» kafedrasının əməkdaşı doktor Mine C.Durmuşoğlu 2008–2009-cu tədris ilində ADPU-nun



*Pedaqogika və psixologiya fakültəsinin elmi şurası*

«Məktəbəqədər pedaqogika» kafedrasında stajor praktikasında (4 ay) olmuşdur. Stajor dövründə kafedranın iclaslarında, elmi seminarlarında, kafedra əməkdaşlarından dos. R.Mursaqulovanın, dos. N.Rüstəmovanın mühazirələrində, müəllim P.Cəfərovanın və M.Kərimovanın seminarlarında iştirak etmişdir. Bu müddət ərzində Mine Durmuşoğlu Hacəttəpə Universitetinin «Məktəbəqədər» kafedrasındakı iş təcrübəsinə dair kafedra əməkdaşları qarşısında çıxış etmişdir.

İndiyədək fakültədə respublikanın məktəbəqədər təhsil müəssisələri, ümumtəhsil məktəbləri, xüsusi və yardımçı məktəb, yardımçı məktəbəqədər müəssisələr üçün xeyli sayda ali təhsilli tərbiyəçilər, praktik psixoloqlar və defektoloqlar hazırlanmışdır.

Hazırda fakültənin əyani şöbəsində 505, qiyabi şöbəsində 195 tələbə təhsil alır.

Fakültənin nəzdində 3 ixtisas kafedrası: Məktəbəqədər təhsilin pedaqogikası və metodikası (kafedra müdiri dos. R.Mursaqulova), Ümumi psixologiya (kafedra müdiri prof. Ə.Əlizadə), Yaş və pedaqoji psixologiya (kafedra müdiri prof. Ə.Baxşəliyev) fəaliyyət göstərir.

### 3.9.1. MƏKTƏBƏQƏDƏR PEDAQOGİKA KAFEDRASI

Məktəbəqədər təhsil müəssisələri üçün ixtisaslı pedaqoji və elmi-pedaqoji kadr hazırlığında Məktəbəqədər pedaqogika kafedrasının müstəsna xidməti vardır. Kafedra 1968-ci ildə dosent Ə.Qədimbəyova (müdir), dos. Nazimə Rüstəmova, dos. B.Paşayeva, müəllim Z.Vəliyeva, S.Axundova, R.Mursaqulova, R.Şapiro, C.Rəhimova, S.Ələkbərova, Z.Quliyeva, X.Məmmədovadan ibarət tərkibdə yaradılmışdır.

Ötən illər ərzində kafedraya dos. Ə.Qədimbəyova (1968–1978), dos. N.Rüstəmova (1980–1989), dos. B.Paşayeva (1990–1999) rəhbərlik etmişdir. 1999-cu ildən bəri kafedranın müdiri dos. Raya Mursaqulovadır.

Kafedra üzvləri məktəbəqədər yaşlı uşaqların təhsil və tərbiyəsinin mühüm problemlərinə dair tədqiqatlar aparmış, namizədlik dissertasiyaları müdafiə etmiş, kitab və kitabçalar nəşr etdirmişlər.

Son illərdə kafedra əməkdaşları – dos. R.Mursaqulova, dos. Ş.Əliyeva «Bağça yaşlı uşaqların təbiətlə tanış edilməsi» (1993), dos. R.Mursaqulova, dos. S.Cəmilzadə «Kiçik məktəblilərdə və bağça yaşlı uşaqlarda əxlaqi keyfiyyətlər tərbiyəsi» (1995), dos. R.Mursaqulova, dos. S.Cəmilzadə, P.Cəfərova «Körpə yaşlı uşaqların tərbiyəsi» (2010), dos. Nazimə Rüstəmova «Məktəbəqədər pedaqogika tarixi (2004), dos. Z.Vəliyeva «Mək-



*Məktəbəqədər pedaqogika kafedrasının əməkdaşları*

təbəqədər yaşlı uşaqlarda əxlaq tərbiyəsi» (1993), dos. Ş.Əliyeva «Məktəbəqədər yaşlı uşaqların mənəvi tərbiyəsi» (2008), «Məktəbəqədər pedaqogika» (2010), «Məktəbəqədər təhsilin aktual problemləri» (2010), dos. Ş.Əliyeva, A.Əhmədova «Uşaqların emosional aləminin inkişafı» (2010), S.Mehdiyeva «Ustadnamələr» (2006), dos. N.Rüstəmova, dos. Z.Zeynalova «Məktəbəqədər yaşlı uşaqlarda sadə riyazi təsəvvürlərin formalaşması» (1993), dos. S.Salamova «Yaradıcı oyunlar prosesində lüğət ehtiyatının zənginləşdirilməsi» (1994), T.Sadıqova «Uşaq bağçasının böyük qrupunda fiziki mədəniyyət məşğələləri» (2009), «Məktəbəqədər pedaqogikaya dair icmal və sxemlər» (2010), «Məktəbəhazırlıq qrupunda ətraf aləmlə tanışlıq üzrə məşğələlər» (2008), «Məktəbəqədər yaşlı uşaqların ətraf aləmlə tanışlığı prosesində oyunlardan istifadə» (2011) adlı dərslik və dərs vəsaitləri nəşr etdirmişlər.

Kafedrada «Pedaqogika», «Məktəbəqədər pedaqogika» (dos. Raya Mursaqulova, dos. Z.Vəliyeva), «Sosial pedaqogika» (dos. Ş.Əliyeva), «Nitq inkişafı metodikası» (dos. B.Paşayeva), «Məktəbəqədər pedaqogika tarixi» (dos. N.Rüstəmova), «Ətraf aləmlə tanışlığın metodikası» (dos. R.Mursaqulova), «Fiziki mədəniyyətin tədrisi metodikası» (dos. S.Cəmilzadə) və başqa fənlərin proqramları hazırlanaraq qriflə nəşr olunmuşdur.

Məktəbəqədər pedaqogika kafedrasının iki əməkdaşı (Sona Sadıqova və Sədaqət Əliyeva) pedaqogika üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün namizədlik dissertasiyası müdafiə etmiş, dos. Şəhla Əliyevanın doktorluq dissertasiyasının müzakirəsi keçirilmişdir. Pərvin Cəfərova pedaqogika üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün namizədlik dissertasiyası üzərində işləyir.

Kafedranın əsas elmi istiqamətini məktəbəqədər təhsil və tərbiyənin təkmilləşdirilməsi problemi təşkil edir.

Hazırda kafedrada 20 nəfər – 8 nəfər fəlsəfə doktoru, dosent (Raya Mursaqulova (kafedra müdiri), Nazimə Rüstəmova, Brilliant Paşayeva, Zemfira Vəliyeva, Şəhla Əliyeva (fakültə dekanı), Sevil Cəmilzadə, Səlimə Salamova, Zərifə Zeynalova), 6 nəfər baş müəllim (Kifayət Abdullayeva, Zoya Pulatova, Xədicə Məmmədova, Almaz Əhmədova, Sona Sadıqova, Sədaqət Əliyeva), 3 nəfər müəllim (Maya Kərimova, Pərvin Cəfərova, Təranə Sadıqova), 3 nəfər baş laborant (Cəmilə Rəhimova, Zöhrə Salamova və Laləzar Şamxalova) fəaliyyət göstərir.

### 3.9.2. ÜMUMİ PSİXOLOGİYA KAFEDRASI

Psixologiya dövrün aktual elmlərindən biri kimi həmişə fəlsəfi kontekstdə inkişaf etmişdir. 1920-ci illərdə ilk Azərbaycan ali məktəbləri – BDU və APİ yarananda, psixologiya fəlsəfi ənənələrlə inkişaf etmişdir. Respublikanın ilk psixoloqları və psixologiya müəllimləri pleyadasında da respublikanın, əsasən, görkəmli filosofları – H.Şaxtaxtinski, A.Makovelski, Ə.Zəkuyev və b. həlledici rol oynamışlar.

II Dünya müharibəsindən sonrakı illərdə APİ-da psixologiyanın inkişafında yeni mərhələ yaranmışdır. Respublikada psixoloji eksperimental tədqiqatlar tarixi (Ş.Ağayev, Ə.Bayramov və b.) məhz bu mərhələdən başlayır. İlk eksperimental axtarışlar XX əsr Azərbaycan psixologiya tarixinin fundamental tədqiqatları kimi əlamətdardır. 1941–1963-cü illərdə aktual problemlər psixoloji gündəmdə xüsusi yer tuturdu (M.Abbasov, A.Abdullayev, M.Mustafayeva və b.).

1963–1975-ci illərdə APİ-nin psixoloqları artıq özlərinin elmi əsərləri, doktorluq dissertasiyaları ilə diqqəti cəlb edirdilər. İnstitutun elmi-metodoloji əlaqələri günü-gündən genişlənirdi. Azərbaycan psixologiyası salnaməsində akademik Q.Lomov, akademik Ş.Nadiraşvili, akademik B.M.Teplov kimi görkəmli psixoloqların metennantları iftixarla səslənirdi. İnstitutda artıq iki yeni kafedra «Ümumi psixologiya» və «Yaş və pedaqoji psixologiya» kafedraları təsis edilmişdi.

1975–2011-ci illər Ümumi psixologiya kafedrasının inkişafında xüsusi mərhələ kimi əhəmiyyətə malikdir.

Kafedra müdiri professor Ə.Əlizadə bu illər ərzində 60-dan artıq fundamental psixoloji əsər (monoqrafiya, dərslik və dərs vəsaiti) nəşr etdirmiş və psixologiyanın nəinki çalışdığı İnstitutda, həm də bütün respublikada inkişafına rövnəq vermişdir.

Kafedra fundamental psixoloji mərkəz kimi formalaşdıqca Azərbaycan psixologiyasının inkişafında önəmli rol oynayırdı. Ümumi psixologiya kafedrası özünün elmi işləri ilə dünya konqreslərində, Beynəlxalq konfranslarda eksperimental tədqiqatlarla yaxından iştirak edirdi. Dünyanın görkəmli psixoloqlarının bu məruzələrə verdikləri yüksək qiymətlər XX əsr Azərbaycan psixologiyasının maraqlı səhifələri sayıla bilər. Kafedra şəxsiyyətlərarası münasibətlər və ya təxəyyül psixologiyası sahəsindəki

fundamental tədqiqləri (Ə.Əlizadə) ilə psixologiya alimlərinin artıq çoxdan diqqətini cəlb etmişdir.

Kafedrada taksonomiya konsepsiyasının Azərbaycan variasiyaları yaradılmışdır (Ə.Əlizadə). Kafedra yeni psixologiya dərslikləri ilə, onlarla psixoloji monoqrafiya nəşri sahəsindəki səmərəli uğurları ilə seçilir. Ümumtəhsil məktəbləri üçün 4 dəfə nəşr olunan və rus dilinə tərcümə edilmiş «Ailə» dərsliyində bənzərsiz Azərbaycan ailəsinin rəngarəng portreti məhəbbətlə təsvir olunmuşdur. Dahi Nizami Gəncəvinin psixoloji görüşlərinin öyrənilməsi sahəsində aparılan tədqiqatlar kafedranın elmi tezaurusunda işıqlı yer tutur.

XXI əsrdə Azərbaycan psixologiyasında şəxsiyyət konsepsiyaları xüsusilə aktuallaşıb və müxtəlif aspektlərdə öyrənilməyə başlanılıb. Kafedrada bu konsepsiyalar axarında önəmli tədqiqlər aparılıbdır (Ü.Əfəndiyeva, S.Ələkbərova, G.Əfəndiyeva, M.Əliyev, R.Qasımova və b.). Ü.Əfəndiyeva, G.Əfəndiyeva, S.Ələkbərova və başqaları ali məktəblərin təcrübəsində maraqlı innovasiya olan test sisteminin formalaşmasında fəal rol oynayıblar.

Ümumi psixologiya kafedrası XXI əsr Azərbaycan mədəniyyətində böyük önəm verilən idman psixologiyası problemlərini vaxtında əsrin ölçüləri ilə dəyərləndirə bilib (G.Məmmədova). Kafedrada Azərbaycan psixologiyası tarixində, ilk dəfə olaraq «Psixologiya atlası» tərtib olunmuşdur (M.Əliyev).

Respublikada psixologiya üzrə elmi kadrların formalaşmasında kafedranın xidmətləri böyükdür. Onlarla psixologiya elmləri doktorlarının və psixologiya üzrə fəlsəfə doktorlarının tərcümeyi-halı bu kafedranın adı ilə bağlıdır.

Kafedra yarandığı günlərdən «Psixologiya» üzrə proqramların yaradılmasında sistemli fəaliyyət göstərib. Yeni «Psixologiya» proqramının hazırlanması isə kafedranın təcrübəsində çox maraqlı innovasiyadır. Kafedranın hazırladığı yeni proqramda (2011) «Ümumi psixologiya» məsələlərinin bilavasitə «Yaş və pedaqoji psixologiya» aspektində tərtib olunması respublika ali məktəblərinin təcrübəsində ilk elmi hadisədir.

Ümumi psixologiya kafedrası respublikada bakalavr və magistr pilləsində kadr hazırlığına özünün sınaqdan çıxmış töhfələrini verir, bu işin inkişafında özünəməxsus rol oynayır.



*Ümumi psixologiya kafedrasının əməkdaşları*

Kafedrada önəmli bir təcrübə – Azərbaycan loqopediyası təcrübəsi bərqərar olub və müvəffəqiyyətlə inkişaf edir. Azərbaycanın təhsil tarixində, ilk dəfə olaraq loqopediya və defektologiya problemləri sahəsində sistemli tədqiqatlar (T.Ağayeva, N.Hüseynova, S.Aslanova) aparılır.

Hazırda kafedrada 16 nəfər – 1 nəfər psixologiya elmləri doktoru, professor (Əbdül Əlizadə (kafedra müdiri), 2 nəfər fəlsəfə doktoru, dosent (Arif Məmmədov, Tamilla Ağayeva), 4 nəfər baş müəllim (Gülnarə Məmmədova, Sədaqət Ələkbərova, Günəş Əfəndiyeva, Məhərrəm Əliyev), 1 nəfər psixologiya üzrə fəlsəfə doktoru (Ülviyyə Əfəndiyeva), 2 nəfər pedaqogika üzrə fəlsəfə doktoru (Nailə Hüseynova, Səbinə Aslanova), 3 nəfər müəllim (Rəna Qasımova, Sona Əliyeva, Nigar Muradova), 3 nəfər baş laborant (Elnarə Cəfərova, Gülnarə Quliyeva, Zəhra Aslanova) çalışır.

### 3.9.3. YAŞ VƏ PEDAQOJİ PSİXOLOGİYA KAFEDRASI

Yaş və pedaqoji psixologiya kafedrası 1974-cü ildə Ümumi psixologiya kafedrasının bazası əsasında təşkil edilmişdir. Kafedraya ayrı-ayrı vaxtlarda dos. Z.Mehdizadə (1974–1988), prof. Q.Əzimli (1988–1992) rəhbərlik etmişdir. 1992-ci ildən kafedraya prof. Ə.T.Baxşəliyev rəhbərlik edir.



*Yaş və pedaqoji psixologiya kafedrasının əməkdaşları*

«XX əsrdə Azərbaycanda psixoloji fikrin inkişafı» (Ə.T.Baxşəliyev), «Yeniyetmələrdə hərbi vətənpərvərlik hissinin inkişaf xüsusiyyətləri» (M.Dəmirov), «Kiçik məktəb yaşlı şagirdlərdə ümumiləşdirmə bacarıqlarının inkişaf xüsusiyyətləri» (M.Abdullayeva), «Uşaq şəxsiyyətinin formalaşmasında Azərbaycan xalq nağılları və atalar sözlərinin rolu» (S.Heydərova), «Azərbaycan psixoloqlarının tədqiqatlarında milli-mənəvi dəyərlərimiz problemi və onun müasir vəziyyəti» (Q.Rəhimova) adlı dissertasiyalar məhz bu kafedrada hazırlanmışdır. Kafedranın dosenti Z.Əliyeva elmlər doktoru, dissertantlardan K.Həsənquliyeva, A.Mahmudova isə fəlsəfə doktoru dissertasiyaları üzərində çalışırlar.

Yaş və pedaqoji psixologiya kafedrasının əməkdaşları psixologiyanın müxtəlif sahələri üzrə dərsliklər, dərs vəsaitləri, proqramlar hazırlamışlar. Ə.T.Baxşəliyevin «Azərbaycanda psixoloji fikrin inkişafı» (1997), «Azərbaycanda psixoloji fikrin təşəkkülü, inkişafı və müasir vəziyyəti» (2007), «Azərbaycan milli-mənəvi dəyərlərinin sosial-psixoloji mahiyyəti» (2011), Q.Əzimlinin «Yaş və pedaqoji psixologiyanın müasir problemləri» (2006) adlı əsərləri bu qəbildəndir.



*Tələbələr kompyuter vasitəsi ilə imtahan verərkən*

Kafedranın əməkdaşlarından Ə.T.Baxşəliyev, Q.E.Əzimli Bakı Dövlət Universitetində psixologiya üzrə ixtisaslaşdırılmış dissertasiya şurasının üzvüdürlər.

Yaş və pedaqoji psixologiya kafedrasında iki istiqamətdə (psixologiya tarixi, təhsildə şagird şəxsiyyətinin formalaşması) elmi-tədqiqat işləri aparılır.

Hazırda kafedrada 18 nəfər – 2 nəfər elmlər doktoru, professor (Ərəstun Baxşəliyev (kafedra müdiri), Qulam Əzimli), 2 nəfər fəlsəfə doktoru, dosent (Edison Quliyev, Zərifə Əliyeva), 1 nəfər baş müəllim (Solmaz Tağıyeva), 9 nəfər müəllim (Minarə Məmmədova, Zemfira Səlimova, Aynur Mahmudova, Qəribə Rəhimova, Simnarə Heydərova, Həqiqət Gözəlova, Kubra Mehdiyeva, Könül Həsənquliyeva, Könül İsmayılova), 2 nəfər baş laborant (Sonaxanım Lalayeva, Namilə Əliyeva), 2 nəfər laborant (Samirə İsgəndərova, Şəhla Kazımova) çalışır.

## 3.10. MÜHƏNDİS-PEDAQOJİ VƏ BƏDİİ QRAFİKA FAKÜLTƏSİ



*Dekan*
*dos. Arif Mustafayev*

1957-ci ildən etibarən Fizika fakültəsinin tərkibində fizika və istehsalatın əsasları ixtisası üzrə müəllim kadrları hazırlanmağa başlanıldı. 1971-ci ildə həmin baza əsasında Ümumi texniki fənlər fakültəsi yaradıldı. Fakültəyə müxtəlif illərdə dos. S.İ.Abdullayev (1971–1977), prof. Ə.H.Rüstəmov (1977–1982), dos. İ.Q.Bənənyarlı (1982–1988), prof. K.D.Hüseynov (1990–1998), prof. H.İ.Həşimov (1998–2009) rəhbərlik etmişlər.

2009-cu ildən fakültəyə dos. A.Ə.Mustafayev rəhbərlik edir.

Fakültənin yaradıldığı zaman onun nəzdində 2 kafedra fəaliyyət göstərirdi: Ümumi texniki fənlər kafedrası, Materialların texnologiyası və əmək təliminin tədrisi metodikası kafedrası. Fakültədə rəsm və rəsmxət ixtisası üzrə müəllim kadrlarının hazırlanması ilə əlaqədar olaraq 1971-ci ildə Təsviri incəsənət kafedrası yaradıldı. Fakültənin genişlənməsilə əlaqədar olaraq 1974-cü ildə yeni Elektroradiotexnika kafedrası yaradıldı.

1994-cü ildə ümumi texniki fənlər kafedrasının əsasında 2 yeni kafedra yaradıldı: İstehsalatın əsasları kafedrası, Maşınşünaslıq kafedrası.

1981-ci ildə universitetdə aparılan struktur dəyişikliyi ilə əlaqədar olaraq müstəqil Bədii qrafika fakültəsi yaradıldı. Bu fakültəyə 1981– 1988-ci illərdə dos.T.İ.Məmmədov, 1989–1998-ci illərdə isə dos. M.N.Yüzbaşıyev rəhbərlik etmişdir. Bu fakültə nəzdində 3 kafedra fəaliyyət göstərmişdir: Rəsm, heykəltəraşlıq və boyakarlıq kafedrası, Rəsmxət və onun tədrisi metodikası kafedrası, Təsviri incəsənət və onun tədrisi metodikası.

2000-ci ildə Təsviri incəsənət və onun tədrisi metodikası, eləcə də Rəsmxət və onun tədrisi metodikası kafedralarında tədris yükü azaldığından onların bazası əsasında Təsviri incəsənət, rəsmxət və onların tədrisi metodikası kafedrası yaradıldı.



*Mühəndis-pedaqoji və bədii qrafika fakültəsinin elmi şurası*

Pedaqoji Universitetdə aparılan struktur dəyişikliyi ilə əlaqədar olaraq 1998-ci ildə Mühəndis-pedaqoji və Bədii qrafika fakültələri birləşdirilərək Mühəndis-pedaqoji və bədii qrafika fakültəsi yaradıldı.

Fakültədə müasir dəzgah və avadanlıqlarla təchiz edilmiş 32 tədris laboratoriyası, ixtisaslaşdırılmış fənn kabinetləri və emalatxanaları, kompyuter otaqları mövcuddur. Müxtəlif illərdə fakültə əməkdaşları 3 monoqrafiya, 98 dərslik və dərs vəsaiti, 58 metodik göstəriş, 650-dən artıq elmi-metodiki məqalə çap etdirmiş, 4 müəlliflik şəhadətnaməsi almışlar.

Fakültənin əməkdaşları müxtəlif illərdə keçmiş SSRİ-nin, Rusiya Federasiyasının və Respublika Təhsil Nazirliyinin elmi-metodiki şuralarının işində yaxından iştirak etmişlər. 1975–1980-ci illərdə fakültə əməkdaşlarından prof. A.M.Quliyev və dos. S.İ.Əlai SSRİ Təhsil Nazirliyi Elmi-metodiki şurasının üzvü, 1993-cü ildən 2009-cu ilədək prof. H.İ.Həşimov Rusiya Federasiyası Təhsil Nazirliyi Elmi-metodiki şurasının üzvü olmuşlar. Dos. Ə.Ağalarov Azərbaycan Respublikası Təhsil Nazirliyi Elmi-metodiki şurasının «Texniki peşə təhsili» bölməsinin sədridir.

Hazırda fakültədə bakalavr pilləsində 679 tələbə peşə təlimi, ümumtexniki fənlər və fizika, təsviri incəsənət, rəsmxət və əmək təlimi, texnologiya, təsviri incəsənət müəllimliyi ixtisasları üzrə təhsil alırlar.

Fakültədə 5 kafedra – İstehsalatın əsasları (kafedra müdiri dos. S.Musayeva), Maşınşünaslıq (kafedra müdiri dos. N.Qasımov), Elektroradiotexnika (kafedra müdiri dos. A.İsmayılov), Rəsm, heykəltəraşlıq və boyakarlıq (kafedra müdiri dos. F.Zeynalov), Təsviri incəsənət, rəsmxət və onların tədrisi metodikası (kafedra müdiri dos. S.Atayev) fəaliyyət göstərir.

### 3.10.1. İSTEHSALATIN ƏSASLARI KAFEDRASI

1957-ci ildə Fizika fakültəsi nəzdində İstehsalatın əsasları kafedrası yaradılmışdır. Kafedraya 1957–1964-cü illərdə prof. A.A.Mustafayev, 1964–1970-ci illərdə dos. R.M.Əfəndiyev rəhbərlik etmişdir.

1971-ci ildə kafedranın bazasında iki müstəqil kafedra yaradılmışdır: 1) Ümumi texniki fənlər; 2) Materiallar texnologiyası və əmək təliminin tədrisi metodikası kafedraları. Kafedraya müxtəlif vaxtlarda dos. S.İ.Əlai (1971–1977), dos. M.G.Seyidov (1977–1982), dos Ş.H.Əhmədova (1984–1986), dos. S.İ.Abdullayev (1986–1994) rəhbərlik etmişdir.

1986-cı ildə həmin kafedralar birləşdirilmiş, Ümumi texniki fənlər kafedrası adlandırılmışdır. 1994-cü ildə Ümumi texniki fənlər kafedrası yenidən Maşınşünaslıq və İstehsalatın əsasları kafedrasına ayrılmışdır. Kafedraya 1994–1998-ci illərdə prof. K.D.Hüseynov, 1998–2003-cü illərdə dos. S.İ.Abdullayev rəhbərlik etmişlər. 2003-cü ildən dos. S.M.Musayeva kafedraya rəhbərlik edir.

Kafedra əməkdaşları «Materialların kəsilməsi, dəzgah və alətlər», «Texnologiyanın tədrisi metodikası», «Peşə hazırlığı və texniki yaradıcılıq», «Avtomobil», «Kənd təsərrüfatı işlərinin mexanikləşdirilməsi», «Məmulatların hazırlanma texnologiyası», «Ağac materialların xassələri və emal texnologiyaları», «Metal materiallarının xassələri və emal texnologiyaları», «Nəqliyyat vasitələrinin istismarı və yol hərəkətinin təşkili» fənlərini tədris edirlər. Təlim prosesində tələbələrə metal və ağac emalı üzrə, kulinariya və tikiş texnologiyası üzrə peşələrin əsasları öyrədilir.

Kafedranın 6 tədris emalatxanası, 4 ixtisas laboratoriyası, 3 fənn kabineti mövcuddur ki, bunlar da müasir cihaz və avadanlıqlarla təchiz edilmişdir.



*İstehsalatın əsasları kafedrasının əməkdaşları*

Kafedrada tədris olunan bütün fənlərin proqramları yenidən hazırlanmış və Təhsil Nazirliyi tərəfindən təsdiq edilmişdir. Son illərdə S.M.Musayevanın «Şagirdlərin texniki yaradıcılığı» (2000), Ş.Əhmədova, S.Abdullayev və Ə.Əliyevin «Ümumi texniki fənlərin tədrisi metodikası» (2000), S.İ.Abdullayevlə, F.C.İsmayılova və Q.H.Əliyevin «Tədris emalatxanası praktikumu» (2003), S.M.Musayeva və C.İ.Səfərovun «Ağac materiallarının xassələri və emal texnologiyaları» (2006), S.M.Musayeva və S.M.Əliyevanın «Pedaqoji təcrübənin aparılmasına dair metodik göstəriş» (2006), S.Musayeva və C.Səfərovanın «Cilalama və cilalanma dəzgahları» (2009), Q.Əliyev, S.Musayeva və S.Məmmədovanın «Metal məmulatların hazırlanması texnologiyaları» (2010), S.Abdullayev və Ə.Quliyevin «Texniki tərəqqinin ətraf mühitə təsiri» (2010), Ə.Quliyevin «Avtomobil fənnindən laborator-praktiki işləri» (2011), Ə.Quliyev və S.Abdullayevin «Enerjinin istehsalı və ətraf mühit» (2011) adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

Kafedrada TEC xətti ilə tədqiqat aparan tələbələr elmi konfranslarda texnoloji proseslər və onların öyrədilməsi, texnologiya müəllimliyi ixtisa-

sının aktual problemləri barədə maraqlı məruzələrlə çıxışlar edirlər. Kafedra əməkdaşlarından dos. S.İ.Abdullayev və dos. S.M.Musayeva Təhsil Nazirliyinin fəxri fərmanı ilə təltif edilmişlər.

Kafedranın Azərbaycan Dövlət İqtisad Universitetinin, Naxçıvan Dövlət Universitetinin, Gəncə Dövlət Universitetinin müvafiq kafedraları və Sənaye pedaqoji kolleci, Bakı yeyinti sənaye kolleci, Sumqayıt 3 saylı, Bakı şəhər 16 saylı peşə liseyləri ilə də sıx əlaqələri vardır.

Hazırda kafedrada 18 nəfər – 2 nəfər fəlsəfə doktoru, dosent (Səadət Musayeva (kafedra müdiri), Saleh Abdullayev), 1 nəfər fəlsəfə doktoru, baş müəllim (Ənvər Quliyev), 1 nəfər dosent (Səkinə Əliyeva), 3 nəfər baş müəllim (Firəngiz İsmayılova, Ofelya Həmidova, Qaçay Əliyev), 3 nəfər müəllim (Aybəniz Haqverdiyeva, Sevinc İbrahimova, Əminə Əhmədova) və 3 nəfər laboratoriya müdiri (Məmməd Məmmədov, Tükəzban Xəlilova, Rəfael Sadıqov), 3 nəfər baş laborant (Sənayə Hüseynova, Xəyalə Sadıqova, Təhminə Zeynalova), 1 nəfər laborant (Zalxa Orucova) və 1 nəfər tədris ustası (Rəna Məmmədova) çalışır.

### 3.10.2. MAŞINŞÜNASLIQ KAFEDRASI

Kafedra 1994-cü ildə «Ümumi texniki fənlər» kafedrasının əsasında yaradılmışdır. Kafedraya ayrı-ayrı vaxtlarda dos. A.M.Məmmədov (1994–2003), prof. H.İ.Həşimov (2003–2005) rəhbərlik etmişdir. 2005-ci ildən kafedraya dos. N.V.Qasımov rəhbərlik edir.

Kafedra əməkdaşları Konstruksiya materiallarının texnologiyası, Materiallar müqaviməti, Maşın və mexanizmlər nəzəriyyəsi, Maşın hissələri və qarşılıqlı əvəz olunma, Hidravlika və hidravlik maşınlar, Texniki termodinamika və istilik maşınları, Maşınşünaslığın əsasları fənlərini tədris edir.

Kafedrada maşınşünaslığın nəzəri, eksperimental, pedaqoji və psixoloji problemləri ilə bağlı elmi-tədqiqat işləri aparılır.

Kafedrada 6 tədris laboratoriyası mövcuddur. Son illərdə kafedra əməkdaşları tərəfindən tədris olunan bütün fənlərin yeni proqramı hazırlanmış, xeyli dərslik, dərs vəsaiti və monoqrafiya nəşr edilmişdir. M.F.Hüseynov və Ə.Ə.Eyyubovun «Maşın hissələri» (2009), N.V.Qasımovun «Materiallar müqaviməti fənnindən testlər» (2008), «Materiallar müqaviməti fən-



*Maşınşünaslıq kafedrasının əməkdaşları*

nindən laboratoriya işləri» (2009), «Materiallar müqaviməti fənnindən məsələ həlli» (2009), «Neft və qazkondensat quyuların hidrotermodinamiki tədqiqat məlumatlarının kompleks interpretasiya üsullarının hazırlanması» (2009), N.V.Qasımov və K.A.Abbasovun «Təbii enerji mənbələri və onlardan istifadə» (2009), N.V.Qasımov və S.İ.Abdullayevin «Enerjinin istehsal növləri və ətraf mühitə təsiri» (2011), K.A.Abbasovun «İstilik texnikasına giriş» (1982), «İstilik maşınları» (1990), X.B.Məmmədovun «Ümumtexniki terminlərin izahlı lüğəti» (2009), «Texniki mexanikanın əsasları fənnindən testlər» (2010), «Texniki mexanikanın əsasları» (2010), K.Ə.Əzimovun «X – şüaları və maddə quruluşu» (2007), «Çətin əriyən yarımkeçiricilərin alınma texnologiyası» (2009), «Müxtəlif materiallardan hazırlanan tenzovericilərin alınma texnologiyası» I və II hissə (2009, 2010) adlı dərslik və dərs vəsaitləri bu qəbildəndir.

Hazırda kafedrada 18 nəfər – 5 nəfər texnika elmləri üzrə fəlsəfə doktoru, dosent (Niyazi Qasımov (kafedra müdiri), Müzafeddin Hüseynov,

Baris Məmmədov, Kamil Abbasov, Xankişi Məmmədov), 4 nəfər baş müəllim (Əlirza Eyyubov, İbrahim İbrahimov, Faiq Rzayev, Səfər Hüseynov), 3 nəfər müəllim (Knyaz Əzimov, Əsmət Teymurova, Təranə Mehdiyeva), 1 nəfər laboratoriya müdiri (Günel Məmmədova), 3 nəfər böyük laborant (Günel Əzizova, Gülnar Novruzova, Gülmirə Qafurova), 1 nəfər laborant (Sürəyya Hüseynova), 1 nəfər tədris ustası (Əli Səmədov) çalışır.

### 3.10.3. ELEKTRORADİOTEXNİKA KAFEDRASI

Kafedra 1974-cü ildə yaradılmışdır. Kafedraya ayrı-ayrı vaxtlarda dos. Ə.M.Ağalarov (1974–1983 ; 1999–2011), prof. H.İ.Həşimov (1983–1999) rəhbərlik etmişlər. 2011-ci ildən kafedraya dos. A.Ö.İsmayılov rəhbərlik edir.

Kafedranın müəllimləri Elektrotexnika, Radiotexnika, Elektrotexniki materiallar və sənaye elektronikasının elementləri, Avtomatikanın əsasları, Elektrik ölçmələri, Əməyin mühafizəsi və təhlükəsizliyi və digər fənləri tədris edirlər.

Kafedrada 2 istiqamətdə (şpinel quruluşlu maqnit yarımkeçiricilərinin elektrik və maqnit xassələrinin tədqiqi və elektrik şəbəkələrinin etibarlılığının artırılması) elmi-tədqiqat işi aparılır.

Aparılan elmi tədqiqatların nəticələri dərslik, dərs vəsaiti və elmi məqalələr kimi nəşr etdirilir.

Kafedra əməkdaşlarının (dos. A.Ö.İsmayılov, dos. K.L.Şirinov, dos. A.Ə.Mustafayev və dos. Ə.M.Ağalarovun ) elmi məqalələri Almaniyada, Rusiya EA-nın «Xəbərlər»ində, «Bərk cisimlər fizikası», «Yarımkeçiricilər fizikası və texnikası» jurnallarında və AMEA-nın «Xəbərlər»ində (fizika bölməsi üzrə) nəşr edilmişdir. K.L.Şirinov «Rentgen-şüa detektoru» (2004) adlı müəlliflik şəhadətnaməsi almışdır.

Son illərdə A.Ə.Sadıqova və A.Ö.İsmayılovun «Əməyin mühafizəsi və təhlükəsizliyi» (2008), A.Ö.İsmayılov və Ə.F.Quliyevin «Avtomatikanın əsasları» (2011), A.Ə.Sadıqova və Ə.F.Quliyevin «Elektrotexnikadan laboratoriya işlərinə dair metodiki göstəriş» (2011), A.Ə.Mustafayev və H.İ.Həşimovun «X-şüaları və maddə quruluşu» (2007), A.Ə.Mustafayev və H.İ.Həşimovun «Müxtəlif materiallardan hazırlanan tenzovericilərin alınma texnologiyası» – I hissə (2009), A.Ə.Mustafayevin «Çətin əriyən yarımkeçiricilərin alınma texnologiyası» (2009), A.Ə.Mustafayevin «Müx-



*Elektrotexnika kafedrasının əməkdaşları*

təlif materiallardan hazırlanan tenzovericilərin alınma texnologiyası» II hissə (2010), A.Ə.Sadıqova və Ə.F.Quliyevin «Əmək mühafizəsi və təhlükəsizlik texnikası üzrə laboratoriya işlərinin yerinə yetirilməsinə dair metodik göstəriş» (2006), K.L.Şirinov və Ə.M.Ağalarovun «Qeyri-metallarda pyezo və tenzo effektləri» (2010), K.L.Şirinovun «Enerjinin istehsalı və ətraf mühit» (2011) adlı dərslik və dərs vəsaitləri nəşr olunmuşdur.

Kafedrada 5 tədris laboratoriyası mövcuddur ki, bunlar da müasir cihaz və avadanlıqlarla təchiz edilmişdir.

Kafedranın əməkdaşı dos. Ə.M.Ağalarov «Tərəqqi» medalı (2006) ilə təltif olunmuşdur. Kafedra müdiri dos. A.Ö.İsmayılov SSRİ Maqnit Cəmiyyətinin (1991) daimi üzvü seçilmişdir.

Hazırda kafedrada 13 nəfər – 4 nəfər fəlsəfə doktoru, dosent (Akif İsmayılov (kafedra müdiri), Ədnan Ağalarov, Kamil Şirinov, Arif Mustafayev), 3 nəfər baş müəllim (Adilə Sadıqova, Ədalət Quliyev, İradə Hacıyeva), 1 nəfər müəllim (Qabil İsayev), 5 nəfər tədris-köməkçi heyət (Səriyyə Abbasova, Rüxsarə Məmmədova, Sevda Məmmədova, Ziba Rəhimova, Nigar Heydərova) çalışır.

## 3.10.4. RƏSM, HEYKƏLTƏRAŞLIQ VƏ BOYAKARLIQ KAFEDRASI

Rəsm, heykəltəraşlıq və boyakarlıq kafedrası 1981-ci ildə Xalq rəssamı prof. İ.İ.Zeynalovun təşəbbüsü ilə yaradılmışdır. Kafedraya 1981–1996-cı illərdə İ.İ.Zeynalov, 1996–2001-ci illərdə L.H.Məmmədova rəhbərlik etmişdir. 2001-ci ildən kafedraya Azərbaycan Rəssamlar İttifaqının üzvü, pedaqogika üzrə fəlsəfə doktoru, dosent F.İ.Zeynalov rəhbərlik edir.

Kafedrada rəsm, boyakarlıq, kompozisiya, heykəltəraşlıq və dəzgah qrafikası fənləri tədris edilir. Tədrisin keyfiyyətini yüksəltmək məqsədi ilə bu fənlər üzrə yeni proqramlar hazırlanmış və çap etdirilmişdir. Kafedrada çalışan müəllimlərdən 10 nəfəri (Fərahim Zeynalov, Sima Ağayeva, Rəis Rəsulov, Ruslan Veysov, Firdovsi Atayev, Hikmət Qəhrəmanov, Aslan Həşimov, İdrak Novruzov, Bənövşə Ağayeva, İlqar Məmmədov) Azərbaycan Rəssamlar İttifaqının üzvüdürlər. Onlardan 2 nəfəri (dos. Sima Ağayeva, dos. Rəis Rəsulov) Əməkdar rəssam fəxri adına layiq görülüblər.

Kafedra müəllimləri orta məktəblərdə, pedaqoji təmayüllü orta ixtisas və ali məktəblərdə rəsm, boyakarlıq və kompozisiya fənlərinin nəzəri və praktik problemlərinin araşdırılması və tədrisin məzmununun təkmilləşdirilməsi istiqamətində elmi tədqiqat işi aparırlar.

Son illərdə dos. F.Zeynalovun «İbtidai siniflərdə təsviri sənətin digər fənlərlə əlaqəli tədrisi» (2006), «İbtidai siniflərdə təsviri incəsənətin digər fənlərlə əlaqəli tədrisinin təşkili» (2007), «5-ci sinif üçün təsviri incəsənət dərsliyi» (2008) və dos. F.Zeynalovla, b/m. A.Həşimovun «Plener» (çöl təcrübəsi) (2008) adlı dərs vəsaitləri nəşr olunmuşdur.

Kafedra əməkdaşları pedaqoji fəaliyyətlə yanaşı, müntəzəm olaraq beynəlxalq və respublika dərəcəli sərgilərdə öz əsərləri ilə iştirak edir, tələbələri müzeylərə, rəssamlıq sərgilərinə aparır və onları Azərbaycanın görkəmli rəssamlarının yaradıcılığı ilə tanış edirlər. Mütəmadi olaraq Universitetdə müəllim və tələbələrin əl işlərindən – rəsm əsərlərindən ibarət sərgilər təşkil olunur. Bu işdə kafedranın nəzdində fəaliyyət göstərən Tələbə Yaradıcılıq Cəmiyyətinin üzvləri fəal iştirak edirlər. Belə sərgilər, bir qayda olaraq, tarixi günlərə, xalqın milli adət və ənənələrinə



*Rəsm, heykəltəraşlıq və boyakarlıq kafedrasının əməkdaşları*

həsr olunur. 15 iyun – Qurtuluş gününə həsr olunmuş «İpək yolu» sərgisi (2007) böyük maraqla qarşılanmışdır. Tədbirdə Azərbaycan Rəssamlar İttifaqının əməkdaşları – Xalq rəssamları A.İbrahimov və A.Hüseynov iştirak etmiş, sərginin məzmununu yüksək qiymətləndirmişdir. Sərgidə fəal iştirak edən müəllim və tələbələr diplom və fəxri fərmanlarla mükafatlandırılmışdır.

Hazırda kafedrada 17 nəfər – 3 nəfər fəlsəfə doktoru, dosent (Fərahim Zeynalov (kafedra müdiri), Sima Ağayeva, Rəis Rəsulov), 6 nəfər baş müəllim (Ruslan Veysov, Firdovsi Atayev, Aslan Həşimov, Hikmət Qəhrəmanov, İdrak Novruzov, Fialeta Babayeva), 2 nəfər müəllim (İlqar Məmmədov, Bənövşə Ağayeva), 6 nəfər köməkçi heyət (Zümrüd Rəhimova, Şəfiqə Quliyeva, Gülnar Rəsulova, Gülnarə Hüseynova, A.Səmədova və Lalə Ağayeva) çalışır.

### 3.10.5 TƏSVİRİ İNCƏSƏNƏT, RƏSMXƏT VƏ ONLARIN TƏDRİSİ METODİKASI KAFEDRASI

1971-ci ildə Ümumi texniki fənlər fakültəsinin nəzdində Rəsmxət, təsviri incəsənət və əmək ixtisası açıldı. Həmin ildə də Təsviri incəsənət kafedrası yaradıldı. Kafedraya sənətşünaslıq üzrə fəlsəfə doktoru, dos. P.Hacıyev müdir təyin edildi. O, 1971–1981-ci illərdə kafedraya rəhbərlik etdi. O dövrdə kafedrada tanınmış rəssamlardan, Xalq rəssamı N.Əbdürrəhmanov, İ.Zeynalov, A.İbrahimov, C.Fərzəliyev, Ə.Verdiyev, Əməkdar rəssam S.Ağayeva, Ə.Səfərov, H.Hüseynov, K.Rzayev, R.Veysov və başqaları fəaliyyət göstərmişdir. Qısa bir müddətdə Təsviri incəsənət, rəsmxət və əmək ixtisası üzrə 300-ə yaxın yüksəkixtisaslı müəllim kadrları hazırlamışdır.

1981-ci ildə bu ixtisasa olan tələbatı və orada tədris olunan fənlərin xüsusiyyətlərini nəzərə alaraq müstəqil Bədii qrafika fakültəsi yaradıldı.

Təsviri incəsənət və onun tədrisi metodikası kafedrası 1981-ci ildə əvvəllər fəaliyyət göstərən Təsviri incəsənət kafedrası əsasında yaradılmış-



*Təsviri incəsənət, rəsmxət və onların tədrisi metodikası kafedrasının əməkdaşları*



*Təsviri incəsənət məşğələsində*

dır. Kafedraya 1981–1988-ci illərdə dos. H.Hüseynov, 1988–1993-cü illərdə dos. Ç.A.Rüstəmov rəhbərlik etmişdir.

1993-cü ildən kafedraya pedaqoji elmlər üzrə fəlsəfə doktoru, dos. S.H.Atayev rəhbərlik edir. 2000-ci ildə universitetdə aparılan struktur dəyişikliyi ilə əlaqədar olaraq Təsviri incəsənət və onun tədrisi metodikası kafedrası Rəsmxət və onların tədrisi metodikası kafedrası ilə birləşdirildi. Onların bazası əsasında «Təsviri incəsənət, rəsmxət və onların tədrisi metodikası» kafedrası yaradıldı.

Kafedrada 2 tədris kabineti, 2 xalçaçılıq emalatxanası, xalq sənəti, konstruksiya etmə və dizayn işi üzrə dərnəklər fəaliyyət göstərir.

Tələbələrin müstəqil işlərinə təcrübəli ustalar və müəllimlər rəhbərlik edir və burada çalışan tələbələrin əl işləri universitet və respublika səviyyəsində keçirilən sərgilərdə və müsabiqələrdə nümayiş etdirilir, müxtəlif səviyyələrdə pul mükafatı, diplomlar və hədiyyələrlə mükafatlandırılır.

Kafedra əməkdaşlarından dos. S.H.Atayev, b/m R.Səmədov, b/m R.Quliyev Rəssamlar İttifaqının üzvüdürlər.



*Tələbələr dərs zamanı*

Kafedranın müəllimləri müxtəlif səviyyəli konfranslarda, elmi seminarlarda çıxış edir, sərgilərdə öz yaradıcılıq işləri ilə iştirak edirlər.

Kafedranın əməkdaşları son illərdə xeyli dərslik, dərs vəsaiti və elmi məqalə nəşr etdirmişlər. Ç.Rüstəmov və S.H.Atayevin «Orta məktəblərdə təsviri incəsənət dərslərində kompozisiyanın öyrədilməsi», dos. S.H.Atayevin «İbtidai siniflərdə təsviri sənətin tədrisi metodikası» adlı dərs vəsaitləri son illərin elmi-metodik uğurlarından sayıla bilər.

Hazırda kafedrada 17 nəfər – 5 nəfər fəlsəfə doktoru, dosent (Soltan Atayev, Tofiq Məmmədov, Çingiz Rüstəmov, Teyyub Abbasov, Saleh Quliyev), 2 nəfər baş müəllim (Ramiz Quliyev, Rauf Səmədzadə), 5 nəfər müəllim (Samirə Əliyeva, Ofeliya Sarıyeva, Səyyar Əliyev, Məryam Kazımova, İradə Aşumova), 5 nəfər tədris-köməkçi heyət (Pərvanə Məmmədova, Təhminə Rüstəmova, Səriyyə Cahangirova, Gülnar Kərimova, Afaq Səmədova) çalışır.

## 3.11. ƏLAVƏ TƏHSİL FAKÜLTƏSİ



*Dekan*
*prof. Mehralı Yusifov*

Əlavə təhsil fakültəsi əvvəlcə İxtisasartırma fakültəsi kimi yaradılmış, Təhsil Nazirliyinin 7 oktyabr 1995-ci il tarixli əmri ilə fakültəyə yenidənhazırlanma statusu verilərək İxtisasartırma və yenidənhazırlanma fakültəsi adlandırılmışdır. Təhsil Nazirliyinin 10 iyun 2010-cu il tarixli məktubundan sonra Əlavə təhsil fakültəsi adlandırılmışdır.

Əlavə təhsil fasiləsiz təhsilin və peşə hazırlığının tərkib hissəsi olmaqla, peşə ixtisas təhsilinin hər hansı pilləsini bitirmək haqqında dövlət sənədi olan hər bir vətəndaşın fasiləsiz təhsil almaq imkanını təmin edir. Əlavə təhsil peşə hazırlığı səviyyəsinin yüksəldilməsi və təkmilləşdirilməsi, onların daim dəyişən və yeniləşən əmək şəraitinə uyğunlaşdırılması, yaşlı vətəndaşların ölkənin sosial, iqtisadi, siyasi və mədəni həyatında fəal və səmərəli iştirakının təmin edilməsi vəzifəsinə xidmət edir.

Azərbaycan Respublikasında, o cümlədən ADPU-da əlavə təhsilin aşağıdakı istiqamətləri həyata keçirilir:

– ixtisasartırma;
– kadrların yenidən hazırlanması;
– stajkeçmə və kadrların təkmilləşdirilməsi;
– təkrar ali təhsil;
– dərəcələrin yüksəldilməsi;
– yaşlıların təhsili.

İxtisasartırma təhsilinin əsas məqsədi hər bir işçinin və ya mütəxəssisin ixtisası üzrə intellektual və peşə hazırlığı səviyyəsinin yüksəldilməsi və təkmilləşdirilməsini təmin etməkdir. İxtisasartırma təhsilində dinləyicilərin biliklərinin, bacarıqlarının və peşəkarlıq səviyyələrinin, dünyagörüşlərinin müxtəlif istiqamətlərdə inkişaf etdirilməsi təlim modulları üzrə həyata keçirilir. Modul ixtisasartırma təhsili prosesində nəzərdə tutulmuş müəyyən istiqamətdə bilik, bacarıq və vərdişlərin əldə edilməsinə, dünya-



*Əlavə təhsil fakültəsinin əməkdaşları*

görüşü formalaşdırılmasına xidmət edən biliklər sistemini ifadə edir. İxtisasartırma təhsili üzrə təlim modulları aşağıdakılardan ibarətdir:

– peşə fəaliyyətinin ümumi əsasları üzrə təlim;
– ixtisas sahələri üzrə təlim;
– innovasiyalar üzrə təlim.

Fakültədə ixtisasartırma təhsili kurikulum modeli əsasında həyata keçirilir. Kurikulum modeli bir ixtisasartırma dövrü üçün nəzərdə tutulmuş təhsilin məzmununu müəyyən edən sənəddir. Bu modelə daxil olan modulların hər birində dəqiq məqsədlər, vəzifələr, məzmun standartları, gözlənilən nəticələr və təlim saatları ixtisasartırma proqramları vasitəsilə müəyyən edilir. İxtisasartırma proqramının həcmi və məzmunu ixtisasartırma krediti ilə ifadə olunur. İxtisasartırma krediti – ədədlə ifadə olunan şərti anlayışdır. İxtisasartırma təhsili üzrə hər bir təhsil krediti proqramın 6 təlim saatına bərabər tutulur. İxtisasartırma təhsilini müvəffəqiyyətlə başa vuran və müəyyən edilmiş krediti toplayan hər bir dinləyiciyə vahid formalı sertifikat verilir. Sertifikat stimullaşdırıcı tədbirlərin həyata keçirilməsi zamanı nəzərə alınır.

Yenidənhazırlanma təhsili ilkin baza peşə-ixtisas təhsili almış və müəyyən əmək sahəsində çalışan hər bir vətəndaşın müvafiq sahə üzrə yeni peşə və ixtisasa yiyələnmək istəyini həyata keçirən əlavə təhsil formasıdır və kadrlara olan real tələbatın daha dinamik və çevik surətdə ödənilməsinə xidmət edir. Bu təhsil forması ilkin baza təhsil proqramları ilə yenidən əldə ediləcək ixtisasın baza təhsili proqramı arasındakı fərqin bir tədris ilinə hesablanmış saatdan çox olmaması şərtilə mütəxəssislərə verilən əlavə təhsildir. Kadrların yenidənhazırlanması aşağıdakı hallarda həyata keçirilir:

– peşə-ixtisas təhsilində yeni ixtisaslar üzrə mütəxəssis hazırlığına başlandıqda, bu ixtisaslar üzrə təhsil verənlərin yenidən hazırlanması;

– ilkin kadr hazırlığı kifayət etməyən ixtisaslar üzrə yenidənhazırlanma;

– müəyyən müddət işləmiş qeyri-ixtisas təhsilli kadrların işlədiyi ixtisas üzrə yenidən hazırlanması;

– sahənin təşkili və idarə olunması üzrə kadrların yenidən hazırlanması.

Yenidənhazırlanma təhsilinin təşkili, ixtisaslar və qəbul qaydaları barədə əvvəlcədən kütləvi informasiya vasitələrində elan verilir. Mütəxəssislərin yenidən hazırlanmasında müxtəlif tədris formalarından (mühazirə, seminar, laboratoriya, referatların hazırlanması və qiymətləndirilməsi, biliklərin test üsulu ilə yoxlanması və s.) istifadə olunur. Tədris prosesində yeni təlim texnologiyaları, fəal (interaktiv) təlim metodları, informasiya və kommunikasiya texnologiyalarından istifadə olunur və yeni üsullar tətbiq olunur.

Fakültədə yenidənhazırlanma təhsili üzrə proqramları tam mənimsəyən, dövlət attestasiyasından müvəffəqiyyətlə keçən hər bir dinləyiciyə vahid formalı dövlət sənədi diplom verilir. Yenidənhazırlanma diplomu ali təhsil haqqında müstəqil sənəd deyildir. İşə qəbul zamanı yenidənhazırlanma haqqında verilmiş diplom baza təhsili diplomu ilə birgə təqdim edildikdə hüquqi əsasa malikdir.

Hazırda Əlavə təhsil fakültəsində Azərbaycan dili və ədəbiyyatı müəllimliyi, Riyaziyyat və informatika müəllimliyi, Təhsildə sosial-psixoloji xidmət və Məktəbəqədər təlim və tərbiyə ixtisasları üzrə yenidənhazırlanma təhsili həyata keçirilir. Fakültədə əlavə təhsilə cəlb olunan

kontingentin təhsili ilə ADPU-nun professor və müəllimləri ilə yanaşı, digər tədris ocaqlarından dəvət olunmuş yüksəkixtisaslı mütəxəssislər də məşğul olurlar. İndiyədək üç minə qədər mütəxəssis fakültədə yenidənhazırlanma təhsili almış və onların əksəriyyəti respublikamızın müxtəlif təhsil ocaqlarında yenidən aldıqları ixtisas üzrə fəaliyyət göstərirlər.

Stajkeçmə və kadrların təkmilləşdirilməsi elmi-pedaqoji, pedaqoji, mühəndis-müəllim kadrları, sənaye, tikinti, iqtisadiyyat, tibb, kənd təsərrüfatı, bütün növ istehsal sahələri və s. kateqoriyadan olan kadrlar üçün əlavə təhsil növüdür. Stajkeçmə və kadrların təkmilləşdirilməsi təhsili peşəkarlıq səviyyəsinin və əməyin keyfiyyətinin yüksəldilməsi məqsədi daşıyır, kadrların peşə bacarıqlarının formalaşdırılması ilə inkişaf etdirilməsinə, nəzəri biliklərin təcrübə ilə əlaqələndirilməsinə, daha müasir peşə, bacarıq və vərdişlərin qazanılmasına, yeni texnologiyalar və innovasiyalar sisteminin tətbiqi üzrə təcrübə əldə edilməsinə xidmət edir. Stajkeçmə və kadrların təkmilləşdirilməsi prosesində xüsusi ayrılmış müəssisələrdə yüksəkixtisaslı mütəxəssislərin rəhbərliyi altında əvvəlcədən nəzərdə tutulan problem üzrə yeni texnologiyaların, innovasiyaların öyrədilməsi həyata keçirilir. Stajkeçmə və kadrların təkmilləşdirilməsi təhsili şəbəkəsinə ölkədə və xaricdə olan müxtəlif tip ali təhsil müəssisələri, ixtisas profilinə uyğun elm, təhsil və istehsalat müəssisələri, təcrübə sınaq stansiyaları və s. aiddir.

Təhsilin bu sahəsindən Azərbaycan Dövlət Pedaqoji Universitetində daha çox istifadə olunur.Universitetin professor-müəllim heyəti stajkeçmə və təkmilləşmə üçün AMEA-nın sahə institutlarına, respublikanın qabaqcıl universitetlərinə göndərilir, onlarla təcrübə mübadiləsi aparılır, elmi və pedaqoji sahədə olan yeniliklərlə tanış olurlar. Həmçinin Azərbaycan Müəllimlər İnstitutundan və digər elmi tədris müəssisələrindən staj keçmək üçün Azərbaycan Dövlət Pedaqoji Universitetinə göndərilən müəllimlərin peşə hazırlığı məsələləri universitetimizin baza kafedralarında təşkil edilir. Stajkeçmə və təkmilləşmənin sonunda staj keçənə və təkmilləşdirilənə vahid formada sənəd – staj keçənə sertifikat, təkmilləşdirilənə arayış verilir.

Təkrar ali təhsil baza peşə-ixtisas təhsili proqramı ilə yenidən əldə ediləcək ixtisasın baza təhsili proqramı arasındakı fərq bir tədris ilinə hesab-



*Əlavə təhsil fakültəsində məşğələ*

lanmış saatdan çox olduqda mütəxəssislərə verilən əlavə təhsil növüdür. Bu təhsil növü mütəxəssis hazırlamaq işində çevikliyi və ayrı-ayrı şəxslərin əlavə ixtisas təhsili almaq arzusunu təmin etmək məqsədilə həyata keçirilir. Təkrar ali təhsilin məzmunu təsdiq edilmiş tədris planları və proqramları əsasında müəyyənləşdirilir.

Təhsilin bu növü əyani, qiyabi və distant (məsafədən) formalarla həyata keçirilir.

Əvvəl alınan ixtisasın baza proqramında öyrədilmiş fənlərin məzmunu yeni almaq istədiyi əlavə ixtisasın təhsil proqramına daxil olan hər hansı fənnin məzmununa uyğun olduqda tələbə həmin fənlər üzrə məşğələlərdən və attestasiyalardan azad olunur. Təkrar ali təhsil üzrə proqram və tədris planı əsasında ali təhsilini müvəffəqiyyətlə başa vuranlara bakalavr dərəcəsi və ali təhsil haqqında diplom verilir.

Dərəcələrin yüksəldilməsi təhsili – orta-ixtisas təhsili müəssisələrini bitirmiş və subbakalavr dərəcəsi almış kadrların uyğun ixtisaslar üzrə bakalavr səviyyəsinə hazırlığını nəzərdə tutan təhsil növüdür. Dərəcələrin yüksəldilməsi təhsili ali təhsilli kadrlara olan real tələbatın daha dinamik

və çevik surətdə ödənilməsinə xidmət edir və ilkin baza təhsil proqramı ilə yenidən əldə ediləcək ixtisas üzrə bakalavr təhsili proqramı arasındakı fərqin 1 tədris ilinə hesablanmış saatdan az və 2 tədris ilinə hesablanmış saatdan çox olmaması şərtilə subbakalavrlara verilən əlavə təhsildir. Bu təhsilin müddəti subbakalavrın ilkin baza təhsili proqramı ilə onun təhsil almaq istədiyi müvafiq ixtisas üzrə bakalavr təhsili proqramı arasındakı fərqə əsasən müəyyən edilir. İlkin baza təhsili proqramı ilə yenidən əldə ediləcək ixtisas üzrə bakalavr təhsili proqramı arasındakı fərqdən asılı olmayaraq, subbakalavrlar bakalavr dərəcəsi üzrə ali təhsil almaq üçün yalnız dövlət tərəfindən müəyyən olunmuş ümumi qaydada ali məktəblərin birinci kursuna qəbul olunurlar. Təhsilin bu növü əyani, qiyabi və distant (məsafədən) formalarda həyata keçirilir. Dərəcələrin yüksəldilməsi üzrə təhsil ödənişlidir və bakalavr hazırlığına uyğun olaraq, reallaşdırılır. Mütəxəssis hazırlamaq işində çevikliyi və ayrı-ayrı subbakalavrların uyğun ixtisaslar üzrə bakalavr təhsili almaq arzusunu təmin etmək məqsədilə dərəcələrin yüksəldilməsi təhsili həmin şəxslərlə və onların işlədikləri idarə və təşkilatlarla əlavə təhsil müəssisəsi arasında bağlanmış fərdi müqavilələr əsasında həyata keçirilir.

Yaşlıların təhsili vətəndaşlarn fasiləsiz olaraq cəmiyyətdə və iqtisadiyyatda baş verən dəyişikliklərə uyğunlaşmasını təmin edən əlavə təhsil növüdür. Əlavə təhsilin bu istiqaməti əmək qabiliyyətli əhalinin böyük bir hissəsinin əmək bazarında rəqabət qabiliyyətli olmaları üçün onların yenidən ixtisaslaşması, yeni şəraitə uyğunlaşdırılması və yeni iş imkanlarının yaradılması zərurətindən irəli gəlir.

Yaşlıların təhsilinin məqsədi yaşlı vətəndaşların cəmiyyətin daim dəyişən sosial, siyasi, mədəni həyatında fəal və səriştəli iştirakını təmin etməkdən ibarətdir. Bu növ təhsil vasitəsilə yaşlı vətəndaşlar öz bacarıqlarını artırır, biliklərini zənginləşdirir, peşəkarlıqlarını təkmilləşdirir və ya yeni istiqamətə yönəldir və bu yolla onların müstəqil sosial, iqtisadi və mədəni inkişafda iştirakı təmin edilir. Yaşı 18-dən yuxarı, müstəqil təcrübəsi və peşəsi olan, bəzi hallarda isə heç bir peşəsi olmayan insanlar yaşlıların təhsilinə cəlb oluna bilər. Təhsilə cəlb ediləcək kontingentin tərkibinə aşağıdakı şəxslər daxil ola bilər:

– əmək funksiyalarının məzmununda baş vermiş yeniliklərlə əlaqədar ixtisasartırma və yenidənhazırlanmaya cəlb edilən peşəkar işçilər;

– məşğuliyyət sahəsini və ya peşəsini dəyişmək fikrində olan şəxslər;
– uzunmüddətli fasilədən sonra peşəkar əmək fəaliyyətinə qayıdanlar;
– peşəsi olmayanlar;
– yeni peşəyə yiyələnməyə və ya ixtisasını artırmağa ehtiyacı olan işçilər;
– hərbi xidmətdən tərxis olunanlar;
– evdar qadınlar və uşaqlı analar;
– şəxsi keyfiyyətini inkişaf etdirmək və ya bilik dairəsini genişləndirmək arzusunda olan şəxslər;

Yaşlıların təhsilinin təşkili zamanı aşağıdakılar nəzərə alınır:
– yaşlıların təhsili baza təhsilini əvəz etmir, əksinə onun əsasında həyata keçirilir;
– yaşlıların təhsili heç bir peşə və təhsili olmayan gənclərin müvafiq peşə almalarına şərait yaradır;
– yaşlıların təhsili zamanı onların fərdi təcrübələri nəzərə alınır;
– bir təhsil pilləsi və səviyyəsindən digərinə keçid asanlaşdırılır;
– təhsil sistemi onu əhatə edən sosial-mədəni və iqtisadi mühitə uyğunlaşdırılır;

Təhsilə çəkilən xərclər sosial həyata, mədəniyyətə və iqtisadiyyata çəkilən xərclərdən daha çox effekt verməlidir. İnkişaf proqramında yaşlıların təhsili ilə əlaqədar tədbirlər nəzərdə tutulur, yaşlıların təhsili milli, regional, sosial-iqtisadi inkişaf və təhsil proqramlarında nəzərdə tutulmuş məqsədlərə uyğun istiqamətləndirilir və koordinasiya edilir. Yaşlıların təhsilinin sonunda mənimsənilmiş proqramın məzmununa, yeni qazanılan ixtisasa uyğun möhürlə təsdiq edilmiş vahid formada sertifikat və ya diplom verilir.

Fakültənin dekanı professor Mehralı Yusifovdur.

## 3.12. ƏCNƏBİ TƏLƏBƏLƏRİN İŞİ ÜZRƏ FAKÜLTƏ



*Dekan*
*dos. Nurəddin Uluxanlı*

Azərbaycan Dövlət Pedaqoji Universitetində xarici ölkələr üçün pedaqoji kadr hazırlığına keçən əsrin ortalarından başlanmışdır. Universitetimizin ilk tələbə kontingenti Bolqarıstan Respublikasından mənşəcə türk olan 20 nəfərə yaxın gəncdən ibarət olmuşdur. Həmin tələbələr Universitetin ədəbiyyat, coğrafiya, fizika və tarix ixtisaslarında təhsil alaraq müəllimlik peşəsinə yiyələnmişlər. O vaxtdan bu günə qədər xarici ölkələr, xüsusilə qardaş və dost Türkiyə Cümhuriyyəti üçün müxtəlif ixtisaslar üzrə yüzlərlə müəllim hazırlanmışdır.

2005-ci ilin dekabr ayında universitetin riyaziyyat, fizika, kimya və biologiya fakültələrinin bazası əsasında 395 nəfər tələbə kontingentini özündə birləşdirən Əcnəbi tələbələrin işi üzrə fakültə yaradılmış və onun dekanı vəzifəsinə dos. Nurəddin Uluxanlı təyin olunmuşdur.

2005–2006-cı tədris ilində həmin fakültənin ilk məzunu olan 85 nəfər tələbənin 34-ü riyaziyyat, 13-ü fizika, 15-i kimya və 23 nəfəri biologiya ixtisasına yiyələnmişdir. 2006–2007-ci tədris ilində kimya, biologiya, fizika, riyaziyyat ixtisasları üzrə 100 nəfər tələbə qəbul olunmuş, 54 nəfər məzun olmuşdur. 2007–2008, 2008–2009-cu tədris illərində fakültəyə qəbul olmasa da, 227 nəfər məzun olmuşdur. 2009–2010-cu tədris ilində 35 nəfər qəbul, 40 nəfər məzun olunmuşdur. 2010–2011-ci tədris ilində 23 nəfər, 2011–2012-ci tədris ilində isə 29 nəfər tələbə qəbul olunmuşdur.

Fakültənin fəaliyyəti dövründə 386 tələbə məzun olmuşdur. Universitetə təhsil almağa gələn əcnəbi vətəndaşlar mənşəcə müxtəlif olsalar da, onların hamısı qardaş Türkiyə Cümhuriyyətinin vətəndaşları olmuşlar. ADPU-nun Əcnəbi tələbələrin işi üzrə fakültəsinin tələbə kontingenti yalnız Türkiyə Cümhuriyyətinin vətəndaşlarından ibarət olduğundan, bəzi səbəblərdən Türkiyə Cümhuriyyətinin Ali Təhsil Şurasının (YÖK) Tə-



*Əcnəbi tələbələrin işi üzrə fakültənin əməkdaşları*

ləbə Seçmə və Yerləşdirmə Mərkəzi (ÖSYM) Azərbaycan Dövlət Pedaqoji Universitetinə tələbə göndərilməsini dayandırdığından, tələbə qəbulunda fasilə yaranmış, 2007–2009-cu illərdə, ümumiyyətlə, əcnəbi vətəndaşların qəbulu olmamışdır.

Türkiyə Cümhuriyyətinin Ali Təhsil Şurasının rəhbərliyi, xüsusilə onun sədri ilə apardığımız danışıqlar nəticəsində son illərdə universitetə tələbə qəbulu bərpa edilmiş, pedaqoji ixtisası seçən tələbələrin hazırlığı şöbəsinin Pedaqoji Universitetin özündə yaradılmasına nail olunmuşdur. Əvvəllər ADPU-ya pedaqoji təhsil almağa gələn tələbələr hazırlıq kurslarını universitetin özündə deyil, Pedaqoji Universitetin profilinə uyğun olmayan texniki ali məktəblərdə, əsasən, Azərbaycan Dövlət Neft Akademiyasında, Memarlıq və İnşaat Mühəndisləri Universitetində keçirdilər. Bu isə pedaqoji təlim yönümlü fənlərin tədrisində bir sıra çətinliklər yaratmaqla yanaşı, onun kəmiyyət və keyfiyyət göstəricilərinə əhəmiyyətli dərəcədə təsir göstərirdi.

Hazırda əcnəbi tələbələrin hazırlığı şöbəsi «Əcnəbi tələbələrin işi üzrə» fakültənin nəzdində fəaliyyət göstərir. 2011–2012-ci tədris ilində



*Türk tələbələri konseyinin üzvləri dekanlıqda*

hazırlıq şöbəsində Məktəbəqədər təlim və Korreksiyaedici təlim ixtisasları üzrə 37 tələbə-dinləyici təhsil alır.

Əcnəbi tələbələrin işi üzrə fakültəyə universitetin 26 kafedrası xidmət göstərir. Hal-hazırda Əcnəbi tələbələrin işi üzrə fakültənin dekanlığında dörd əməkdaş – dos. Nurəddin Uluxanlı (dekan), M.Y.Əliyeva, D.B.Yolçuyeva və S.Ə.Mirzəyeva çalışır.



*Təhsil naziri prof. M.Mərdanov və prof. Y.Məmmədov*



*Yeni Azərbaycan Partiyasının icraçı katibi Ə.Əhmədov və prof. Y.Məmmədov*





Təhsil naziri M.Mərdanov, Rabitə və İnformasiya Texnologiyaları
naziri Ə.Abbasov ADPU-da imtahan prosesini izləyərkən



*Təhsil naziri M.Mərdanov, Rabitə və İnformasiya Texnologiyaları naziri Ə.Abbasov və b. ADPU-da*



*Təhsil naziri M.Mərdanov və YAP-ın icraçı katibi Ə.Əhmədov ADPU-da*



YAP-ın icraçı katibi Ə.Əhmədov ADPU-da imtahan prosesini izləyərkən



Cənubi Koreya nümayəndə heyəti ADPU-da

## 4.1. TƏDRİS-METODİKA ŞÖBƏSİ



Şöbə müdiri
dos. Namiq Hacıyev

Pedaqoji kadrların elmi-metodik hazırlığı, ilk növbədə, tədris prosesinin düzgün elmi əsaslarla təşkilindən, ali məktəbin elmi-pedaqoji kadr potensialının və maddi-texniki bazasının səviyyəsindən birbaşa asılıdır.

Tədris-metodika şöbəsi Azərbaycan Dövlət Pedaqoji Universitetində müxtəlif ixtisaslar üzrə kadr hazırlığında tarixən səmərəli fəaliyyəti ilə seçilmişdir. Şöbə tədris prosesinin təşkili və idarə edilməsi ilə yanaşı, hər tədris ilinin əvvəlinə tədris yüklərinin hesablanması və bölgüsünə, onun yerinə yetirilməsi vəziyyətinə nəzarəti, müxtəlif statistik hesabatların hazırlanmasını, pedaqoji təcrübələrin təşkili və aparılmasına rəhbərliyi də həyata keçirir.

Tədris-metodika şöbəsinə müxtəlif vaxtlarda Əli Əliyev, Vəliyulla Əsədov, Böyükağa Əsgərov, Əbdül Qənbəroğlu, Eldar Abbaszadə, Adil Balıyev, Vaqif Həsənov, Alı Namazov, İbrahim Bayramov rəhbərlik etmişlər.

Hazırda tədris-metodika şöbəsinə dosent Namiq Hacıyev rəhbərlik edir.

Yaranmış ənənəyə uyğun olaraq, müasir dövrdə də tədris-metodika şöbəsi öz işini dövrün tələblərinə uyğun qurmağa çalışır, fəaliyyətini ali təhsil müəssisələrində təhsilin idarə edilməsi haqqında müvafiq hüquqi-normativ sənədlər əsasında aparır.

Tədris-metodika şöbəsi tərəfindən dövlət standartları əsasında ADPU-da kadr hazırlığı həyata keçirilən bütün ixtisaslar üzrə tədris planları tərtib edilmiş və onların təkmilləşdirilməsi istiqamətində müntəzəm iş aparılır. 2007–2008-ci tədris ilindən başlayaraq respublikada, ilk dəfə olaraq ADPU-da tələbələrin bilik və bacarıqlarının yoxlanmasının daha obyektiv, şəffaf və mütərəqqi üsulu hesab edilən test üsuluna keçilmişdir. Bu dövrdən başlayaraq imtahanqabağı kollokviumların, imtahanların təşkili və keçirilməsinə tədris-metodika şöbəsi rəhbərlik edir. İmtahanların test üsulu ilə kompyuter mərkəzində keçirilməsi üçün test,



*Tədris-metodika şöbəsinin əməkdaşları*

işçi, nəzarət və appelyasiya qrupları yaradılmışdır. Test qrupu semestr ərzində keçiriləcək imtahanlar üçün testlərin vaxtında hazırlanması və yığılması prosesinə cavabdehlik daşıyır. Test qrupuna dosent İsa İsmayılov rəhbərlik edir.

İşçi qrup test üsulu ilə keçiriləcək imtahanların təşkili və keçirilməsi məsələlərinə cavabdehlik daşıyır. İşçi qrupa tədris-metodika şöbəsinin müdiri, dosent Namiq Hacıyev rəhbərlik edir. Nəzarət qrupu imtahanların obyektiv və şəffaf şəraitdə keçirilməsinə cavabdehlik daşıyır. Nəzarət qrupuna dosent Qulaməli Balaşov rəhbərlik edir.

Appelyasiya qrupuna ADPU-nun ümumi işlər üzrə prorektoru, dosent Vüqar Mehrabov rəhbərlik edir.

Azərbaycan Respublikası Prezidentinin 23 fevral 2010-cu il tarixli fərmanı ilə TQDK-nın nəzdində «Tələbə-məzun dövlət elektron məlumat sistemi» yaradılmışdır. ADPU-da bu işlərə rəhbərlik Riyaziyyat və onun ibtidai kursunun tədrisi metodikası kafedrasının dosenti Nazim Abbasova həvalə edilmişdir.

Tələbələrin pedaqoji təcrübələri Bakı şəhərinin müasir tələblərə cavab verən, yüksək pedaqoji kadr potensialı ilə seçilən orta məktəblərində

və məktəbəqədər tərbiyə müəssisələrində təşkil edilir. Ümumilikdə pedaqoji təcrübələr 52 orta ümumtəhsil məktəbi və məktəbəqədər müəssisədə aparılır ki, bu işə dos. Xankişi Məmmədov rəhbərlik edir.

Tələbələrin şəxsi işlərinin təlimata müvafiq qaydada saxlanılması, məzunlara diplomların verilməsi və onların qeydiyyatının aparılması tədris-metodika şöbəsinin nəzdində fəaliyyət göstərən tələbələr şöbəsi tərəfindən həyata keçirilir. Tələbələr şöbəsi 2006-cı ildə yaradılmışdır. İlk dövrlər tələbələr şöbəsinə Dürdanə Əhədova rəhbərlik etmişdir. Hazırda şöbəyə Şəhla Muradova rəhbərlik edir.

Tələbələr şöbəsində universitetdə təhsil alan tələbələrin şəxsi işləri təlimata müvafiq qaydada saxlanılır.

Hazırda Tədris-metodika şöbəsində 17 nəfər – 1 nəfər müdir (fəlsəfə doktoru, dos. N.Hacıyev), 1 nəfər tələbələr şöbəsinin müdiri ( Şəhla Muradova), 1 nəfər böyük müfəttiş (Dildadə Orucova), 2 nəfər böyük laborant (Firuzə Salmanova, Mafilə Qiyasova), 3 nəfər müfəttiş (Sima Babayeva, Yeganə İbrahimova, Rəna Süleymanova), 4 nəfər statist (Şəfəq Bağırova, Könül Məmmədova, İradə Rüstəmova, Kəmalə Ağayeva), 2 nəfər kompyuter icraçısı (Xədicə Babayeva, Şəfa Əhmədova), 1 nəfər böyük dispetçer (Vidadi Hüseynov), 2 nəfər dispetçer (Zamiq Şammədov, Ceyhun Hüseynov) çalışır.

## 4.2. MAGİSTRATURA VƏ DOKTORANTURA ŞÖBƏSİ


*Şöbə müdiri*
*prof. İbrahim Bayramov*

Azərbaycan Dövlət Pedaqoji Universitetində magistratura və doktorantura şöbəsi 1997-ci ildə yaradılmışdır. 1997– 2003-cü illərdə şöbəyə pedaqoji elmlər namizədi, dosent İsa İsmayılov rəhbərlik etmişdir.

2003-cü ildən Magistratura və doktorantura şöbəsinə filologiya elmləri doktoru, professor İbrahim Bayramov rəhbərlik edir.

ADPU-da magistraturaya ilk qəbul 1997–1998-ci tədris ilində əyani şöbə üzrə aparılmışdır. 1997–1998-ci tədris ilində əyani şöbəyə dövlət hesabına müsabiqə yolu ilə Riyaziyyat istiqaməti üzrə 8, Fizika istiqaməti üzrə 4, Biologiya istiqaməti üzrə 5, Kimya istiqaməti üzrə 3, Filologiya istiqaməti üzrə 6, Dilşünaslıq istiqaməti üzrə 6, Tarix istiqaməti üzrə 12, Coğrafiya istiqaməti üzrə 7, Psixologiya istiqaməti üzrə 4, Maarif istiqaməti üzrə 9 nəfər qəbul olunmuşdur. ADPU-da magistraturanın ilk buraxılışı 1999–2000-ci tədris ilində olmuşdur.

Magistraturaya qəbul ildən-ilə genişlənir. Əgər 1997–1998-ci tədris ilində magistraturaya 64 nəfər qəbul edilmişdirsə, hal-hazırda magistraturanın əyani və qiyabi şöbələrində oxuyan magistrantların sayı 802 nəfərə çatmışdır.

Hazırda magistraturanın əyani şöbəsində 11 istiqaməti əhatə edən (Riyaziyyat, Fizika, Kimya, Biologiya, Dilşünaslıq, Filologiya, Tarix, Coğrafiya, Maarif, Psixologiya, Musiqişünaslıq) 37 ixtisas (Riyazi analiz, Funksional analiz, Cəbr və topologiya, Həndəsə, İnformatika, Üzvi kimya, Qeyri-üzvi kimya, Analitik kimya, İnsan və heyvan fiziologiyası, Onurğalılar zoologiyası, Botanika, Biologiyanın tədrisi metodikası və metodologiyası, Yarımkeçiricilər fizikası, İstilik fizikası və molekulyar fizika, Nəzəri və riyazi fizika, Fizikanın tədrisi metodikası və metodologiyası, Azərbaycan dili, Ümumi dilçilik, İngilis dili, Azərbaycan ədəbiyyatı, Ədəbiyyat nəzəriyyəsi, Folklorşünaslıq və mifologiya, Azərbaycan dili və ədəbiyyatın tədrisi metodikası və metodologiyası, Azərbaycanın yeni və ən yeni tarixi, Türk dünyası tarixi, Arxeologiya və etnoqrafiya, Avropa və Amerikanın yeni və ən yeni tarixi, Tarixin təd-



*Fəlsəfə doktoru proqramı üzrə imtahan zamanı*

risi metodikası və metodologiyası, İqtisadi və sosial coğrafiya, Azərbaycanın fiziki coğrafiyası, Landşaftşünaslıq, Pedaqogika nəzəriyyəsi və tarixi, İbtidai təhsilin pedaqogikası və metodikası, Məktəbəqədər təhsili pedaqogikası və metodikası, Ümumi psixologiya, Pedaqoji psixologiya, Musiqişünaslıq), qiyabi şöbə üzrə isə 8 istiqaməti əhatə edən (Riyaziyyat, Fizika, Biologiya, Filologiya, Dilşünaslıq, Fizika, Coğrafiya, Maarif) 20 ixtisas (Riyazi analiz, Cəbr və topologiya, İnsan və heyvan fiziologiyası, Onurğasızlar zoologiyası, Botanika, Biologiyanın tədrisi metodikası və metodologiyası, Fizikanın tədrisi metodikası və metodologiyası, Azərbaycan dili, Ümumi dilçilik, Azərbaycan ədəbiyyatı, Azərbaycan dili və ədəbiyyatın tədrisi metodikası və metodologiyası, Türk dünyası tarixi, Avropa və Amerikanın yeni və ən yeni tarixi, Tarixin tədrisi metodikası və metodologiyası, İqtisadi və sosial coğrafiya, Azərbaycanın fiziki coğrafiyası, Landşaftşünaslıq, Pedaqogika nəzəriyyəsi və tarixi, İbtidai təhsilin pedaqogikası və metodikası, Məktəbəqədər təhsilin pedaqogikası və metodikası ) üzrə magistr hazırlığı həyata keçirilir.

ADPU-nun magistraturasında Türkiyə Respublikasından 4 nəfər, İran İslam Respublikasından isə 1 nəfər müxtəlif ixtisaslar üzrə təhsil almışdır.

Magistraturanın həm əyani, həm qiyabi şöbələrində təhsil alan magistrantlar elmi-pedaqoji və elmi-tədqiqat təcrübəsi keçirlər. Elmi-pedaqoji təcrübəni magistrantlar ixtisaslarına uyğun olaraq, universitetin uyğun fakültələ-



*Magistratura və doktorantura şöbəsinin əməkdaşları*

rində, elmi-tədqiqat təcrübələrini isə Təhsil Problemləri İnstitutunda və Milli Elmlər Akademiyasının sahə institutlarında keçirlər.

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2010-cu il tarixli 12 may tarixli, 88 nömrəli qərarı ilə təsdiq edilmiş «Magistratura təhsilinin məzmunu, təşkili və «magistr» dərəcələrinin verilməsi qaydaları»na əsasən 2010–2011-ci tədris ilindən universitetin magistratura pilləsinin əyani və qiyabi şöbələrində kredit sistemli təhsilə keçilmiş, bununla bağlı olaraq tədris planları kredit sisteminə uyğunlaşdırılmışdır.

## 4.3. BEYNƏLXALQ ƏLAQƏLƏR ŞÖBƏSİ



*Şöbə müdiri*
*dos. Azər Sərdarlı*

1991-ci ilin aprel ayında Azərbaycan Respublikasının Təhsil Nazirliyinin əmri ilə universitetin nəzdində Beynəlxalq əlaqələr şöbəsi yaradılmışdır. Təşkil edildiyi vaxtdan şöbəyə A.M.Sərdarlı rəhbərlik edir.

Azərbaycan Respublikası öz dövlət müstəqilliyini bərpa etdikdən sonra Pedaqoji Universitetdə müxtəlif ölkələrlə tələbə mübadiləsi aparılır, birgə elmi-tədqiqatlar, beynəlxalq forum, konqres, konfrans, simpoziumlar keçirilir, beynəlxalq və regionlararası təhsil proqramlarına qoşulmaq və onların işində fəal iştirak etmək istiqamətində iş görülür.

Universitetin tədris işləri üzrə prorektoru, prof. M.S.Cəbrayılov İran İslam Respublikasına dəvət olunmuş müəllimlərin nümayəndə heyətinə başçılıq etmişdir. Fransanın Strasburq Dilçilik Universiteti ilə bağlanmış müqaviləyə əsasən Fransa səfirliyinin təşəbbüsü ilə ADPU-da fransız dili şöbəsi açılmış, hal-hazırda orada 91 nəfər tələbə təhsil alır. Eyni zamanda burada fransız dili otağı təşkil olunmuşdur. 1999-cu ildə həmin universitetin dəvəti ilə kafedra müdiri, filologiya elmləri doktoru, prof. B.Q.Hüseynov Strasburq və Versal universitetlərində olmuş, təcrübə mübadiləsi aparmışdır. 2000-ci ilin iyul ayında imzalanmış müqaviləyə əsasən müəllimlərdən A.Babayeva və K.Əhmədova Fransanın Mark Blok adına Strasburq Universitetinə dəvət olunmuşlar. Məqsəd fransız dilinin təkmilləşməsinə həsr edilmiş konfransda iştirak etmək idi.

2001-ci ilin aprel-iyun aylarında universitetimizin 2 müəllimi – H.A.Səmədova və H.B.Balacayeva Avropa Şurası Nəzdində təcrübə keçmək üçün Fransaya dəvət olunmuşlar.

Prof. S.A.Məmmədov Türkiyə Respublikasının paytaxtı Ankara şəhərində üç ay işləyərək «Türk xalqlarının ortaq tarixi» adlı kitabın Azərbaycan bölməsinin yazılmasında iştirak etmişdir. Prof. Ə.N.Fərəcov Türkiyənin Uludağ Universitetinin «Biologiya ixtisası departamenti» və Tehran Tibb Universitetinin fiziologiya-farmokologiya kafedraları ilə elmi əməkdaşlıq əlaqələri ya-



*Beynəlxalq əlaqələr şöbəsinin əməkdaşları*

ratmışdır. 21 iyul 2005-ci il tarixində İspaniyanın Salamanka şəhərində məktəblilərin 36-cı Beynəlxalq fizika olimpiadası keçirilmişdir. Olimpiadada 78 ölkə təmsil olunmuşdu. İki mərhələdə (nəzəri və təcrübi) keçirilən intellekt yarışında komandamızın 5 nəfərdən ibarət bütün üzvləri yer tutmuşdu. Həmin komandaya elektrik və optika kafedrasının müdiri, prof. Mirzəli Murğuzov rəhbərlik etmişdir.

Universitetin professoru Ə.N.Fərəcov 9–17 iyul 2006-cı il tarixində Argentinanın Gordoba şəhərində keçirilən XVII Beynəlxalq Biologiya Olimpiadasında komanda rəhbəri kimi respublikamızı təmsil etmişdir.

Azərbaycan Respublikasından həmin tədbirdə 4 məktəbli iştirak etmişdir. Məktəblilərdən 1 nəfəri bürünc, 1 nəfəri gümüş medal almışdır. 2 nəfəri isə tərifnaməyə layiq görülmüşdür.

Prof. R.Qafarov 2006-cı ilin sentyabr ayının 18-də Türkiyənin Antaliya şəhərində keçirilən 10-cu Türk Dövlət Topluluqları, Dostluq, Qardaşlıq və İşbirliyi qurultayında elm, təhsil, mədəniyyət və turizm komissiyasında «Azərbaycan və Türkiyənin ortaq mədəni dəyərləri» mövzusunda məruzə etmişdir. Prof. E.H.Quliyev 2006-cı ildə dahi Azərbaycan şairi Məmmədhüseyn Şəhriyarın 100 illiyi ilə əlaqədar Tehran və Təbriz şəhərlərində keçirilən Beynəlxalq elmi konfransda iştirak etmişdir. O, «M.Şəhriyar yaradıcılığının təka-

mülü: «Heydərbaba» yüksəkliyi «sənət möcüzəsi» və «Şəhriyar yaradıcılığının ədəbi təsir dairəsi» mövzuları üzrə məruzə etmişdir.

Ümumi tarix kafedrasının müdiri, Azərbaycan Milli Elmlər Akademiyasının müxbir üzvü, professor V.H.Əliyev Beynəlxalq əlaqələr üzrə səmərəli işlər görmüşdür. O, ABŞ, Belçika, Almaniya, Fransa və Türkiyə elm mərkəzləri ilə əlaqələr yaratmış, Azərbaycan tarixinin və qədim mədəniyyətinin problem məsələlərinə dair məqalələr nəşr etdirmişdir.

Prof. Oqtay Sultanov tanınmış tarixçi alimdir. O, tarix elminin müxtəlif problemləri ilə bağlı keçirilən beynəlxalq konfranslarda Azərbaycan elmi ictimaiyyətini ləyaqətlə təmsil edir. Rusiya Təhsil Akademiyası prof. H.Əhmədovun və prof. F.Rüstəmovun «Müasir dövrdə Azərbaycanda təhsilin inkişafının əsas istiqamətləri» (Moskva, 2000) əsərini nəşr etmişdir. 2010-cu ildə prof. F.Rüstəmovun «Pedaqoji (təlim və tərbiyə) tarixi Şərqdə» kitabı (377 s.) İranda «Xorşidafərin» nəşriyyatında çap olunmuşdur.

Azərbaycan Dövlət Pedaqoji Universiteti ilə Türkiyə Cümhuriyyətinin Hacəttəpə Universiteti arasında 2006-cı ildə əməkdaşlıq müqaviləsi imzalanmışdır. Universitetimizin elmi işlər üzrə prorektoru, prof. V.Əliyevin rəhbərliyi ilə dos.V.Mehrabov, prof.F.Rüstəmov, prof.O.Sultanov, dos. M.Əliyev, dos. A.Hacıyev, dos.A.Sərdarlı 21–25 noyabr 2008-ci il tarixində Türkiyənin Hacəttəpə Universitetində «Müəllim hazırlığı sistemi: dünən və bu gün» mövzusunda keçirilən toplantıda iştirak etmişlər. Toplantıda prof. F.Rüstəmov «Azərbaycanda müəllim hazırlığı sistemi: dünən və bu gün» mövzusunda məruzə etmişdir.

Avropa Pedaqoji Universitetlər Birliyinin (ETEN) Türkiyənin Ege Universitetində keçirilən «Təhsil vasitəsilə mədəniyyətlərin qurulması» konfransında ADPU-nun təqdimetmə mərasimi ilə əlaqədar 21–24 aprel 2009-cu il tarixində tədris işləri üzrə prorektor, prof. M.Cəbrayılov, İngilis dili və onun tədrisi metodikası kafedrasının müdiri, prof. B.Hüseynov iştirak etmişlər.

ADPU ilə Türkiyə Respublikasının Mehmet Akif Ersoy Universiteti, Ruminiyanın Babeş-Bolyai Universiteti və Rusiyanın Tatarıstan Dövlət Humanitar Pedaqoji Universiteti arasında əməkdaşlıq müqaviləsi imzalanmışdır. Pedaqoji Universitetin Elmi Şurasının qərarı ilə Babeş-Bolyai Universitetinin rektoru, professor A.Marqaya ADPU-nun «Fəxri Doktoru» adı verilmiş və Elmi Şuranın genişləndirilmiş iclasında şəxsən özünə təqdim edilmişdir.

12–14 noyabr 2009-cu il tarixində Türkiyə Respublikası Elazığ vilayətindəki «Fırat Universiteti»ndə «Qafqaz ölkələri, Türk Cümhuriyyətləri və Türkiyə universitetlərinin İnformasiya Sistemləri işbirliyi problemləri (BSİ–2009)» adlı I Beynəlxalq konfrans keçirilmişdir. Konfransın işində ADPU-dan nümayəndələr (prof. R.Baxşəliyev, A.Hüseynov, dos. İ.Əhmədov) iştirak etmişlər.

Prof. M.S.Cəbrayılov Antaliya, dos. İlham Əhmədov Moskva, prof. Elman Quliyev Aşqabad və Lefkoşa şəhərində keçirilən konfranslarda məruzə ilə çıxış etmişlər.

Universitetimiz ABŞ səfirliyinin «Fullbrayt» proqramına qoşulmuşdur.

Bakı şəhərində 10–12 noyabr 2011-ci il tarixində «Müəllim hazırlığında yeni forma, metod və üsullar: Şərqi Avropa Təcrübəsi» mövzusunda beynəlxalq konfrans keçirildi. Konfransda Azərbaycan, Ukrayna, Moldova, Gürcüstan və Rumıniya təmsil olunmuşdu. Konfrans iştirakçıları Azərbaycanda bu sahədəki təcrübəni öyrənmək məqsədilə universitetimizdə qonaq oldular.

Azərbaycan Respublikası Təhsil Nazirliyi və UNICEF (BMT-nin Uşaq Fondu) arasında 2010-cu ilə dair imzalanmış İllik Fəaliyyət Planına müvafiq olaraq, UNICEF-in dəstəyi ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin nəzdində Müasir Təlim Texnologiyaları Təlim və Resurs Mərkəzi yaradılmışdır. Mərkəzə ictimai əsaslarla pedaqogika üzrə fəlsəfə doktoru, dosent Fəxrəddin Yusifov rəhbərlik edir.

## 4.4. KOMPYUTER MƏRKƏZİ

Bu gün ali pedaqoji təhsilin əsas məqsədlərindən biri təhsilin təşkilində yeni informasiya texnologiyalarının tətbiqi ilə informasiya cəmiyyətinin tələblərinə cavab verən, keyfiyyətli müəllim kadrlarının hazırlanmasıdır. Bu səbəbdən milli səviyyədə və ayrı-ayrılıqda hər bir universitet səviyyəsində informatlaşma proqramlarının hazırlanmasına və mərhələlərlə icrasına ciddi ehtiyac var. Bu sahə respublikada həyata keçirilən təhsil islahatları proqramının, bəlkə də, ən mürəkkəb və mühüm sahəsidir. Elə ona görə də 2007-ci ildə Kompyuter Mərkəzi yenidən təşkil edilmiş, kadr potensialı və texniki bazası gücləndirilmişdir. Mərkəzin direktoru vəzifəsinə universitetin dosenti İlham Əhmədov təyin edilmişdir.

Kompyuter Mərkəzinin yaradılmasında məqsəd universitetin kompleks kompyuterləşməsinin layihələndirilməsi, müvafiq strateji proqramın hazırlanması, icrası, monitorinqi, tədris prosesinin proqram-metodik təminatı sahəsində elmi-tədqiqatların aparılması, universitet təhsilinin informatlaşması sahəsində elmi-texniki siyasətin formalaşması və həyata keçirilməsi, tədricən universitetin vahid informasiya təhsil məkanının formalaşdırılması, onun milli və qlobal informasiya məkanına inteqrasiya edilməsi kimi müasir problemləri həll etməkdir.

Mərkəzin fəaliyyətində təhsildə İKT-nin tətbiqinə dair universitetdə aparılan elmi-tədqiqat işlərinin əlaqələndirilməsi, tədris təyinatlı proqram vasitələrinin yaradılması, universitetdə rəqəmsal tədris resursları fondunun formalaşdırılması və təbliği, tədris təyinatlı proqram vasitələrinin ekspertizasının aparılması, tədris prosesinin İKT ilə təminatının təhlili, universitetin əməkdaşlarının İKT üzrə məqsədli hazırlanması, yenidənhazırlanması, ixtisasların artırılması, təhsildə İKT-nin tətbiqinə dair milli və beynəlxalq səviyyəli elmi konfrans və seminarların təşkili də mühüm yer tutur.

Mərkəz 3 şöbədən ibarətdir: Elm və tədrisin informatlaşdırılması şöbəsi (şöbə müdiri – prof. Arif Bünyatov), Texniki xidmət şöbəsi (şöbə müdiri – dos. Fərhad Mustafazadə), Elektron test şöbəsi (şöbə müdiri – dos. Vaqif Əmikişiyev).

ADPU-nun informatlaşması prosesi bu məqsədlə yaradılmış xüsusi proqram – «2007–2013-cü illərdə ADPU-da təhsilin İnformatlaşması Proqramı» əsasında həyata keçirilir.



*Kompyuter mərkəzinin əməkdaşları*

ADPU-da təhsilin informatlaşması proqramının məqsədi informasiya cəmiyyəti, biliyə əsaslanan iqtisadiyyat şəraitində işləyə bilən yeni nəsil keyfiyyətli müəllim kadrlarının hazırlanması, ADPU-da təhsilin informatlaşması, vahid informasiya-təhsil məkanının yaradılması üçün zəruri tədbirlər sistemini müəyyənləşdirməkdir. Bu məqsədlə universitet vahid informasiya-təhsil məkanının yaradılması nəzərdə tutulur.

ADPU-da tədrisin informatlaşması istiqamətində həyata keçirilən mühüm təhsil innovasiyası kimi tələbələrin biliklərinin qiymətləndirilməsində elektron test sisteminin tətbiqini nümunə kimi göstərmək olar. Proqram məhsulunun müəllifi Etibar Axundovdur.

Universitetin kafedralarında hazırlanmış testlər Kompyuter Mərkəzinin Elektron test şöbəsinə daxil olduqdan sonra mərkəzin əməkdaşları – İbrahimova Günel, Cəfərova Roza, Süleymanova Cəmilə, Yaqubova Şükufə, Cəbiyeva Sevinc, Məmmədova Günel bu materialları sistemləşdirib bazaya daxil edir, testləri bir daha imtahanqabağı texniki cəhətdən yoxlayırlar.

Kompyuter Mərkəzinin fəaliyyətinin digər istiqaməti universitetin informasiya portalının hazırlanmasıdır. İlk versiyası 2007-ci ilin sonunda istifadəyə verilən portal texnoloji cəhətdən mərhələlərlə təkmilləşdirilərək,

kifayət qədər dinamik forma almışdır. Burada universitetin tarixi, idarəetmə strukturu, fakültə və kafedraları, universitet həyatı barədə məlumatlar yerləşdirilib. Portalın proqramçısı və inzibatçısı İbadət Məmmədovdur.

Kompyuter Mərkəzi universitetin kompyuter parkının işlək vəziyyətdə saxlanılması üçün zəruri texniki və proqram vasitələri ilə təminat məsələlərini də həyata keçirdir. Mərkəzin «Texniki xidmət» şöbəsinin əməkdaşları Rüfət Əliyev, Rüfət Hüseynov, Elçin İsmayılov fakültə və kafedralarda olan kompyuterlərə texniki xidmət göstərirlər.

Kompyuter Mərkəzində professor-müəllim və texniki-köməkçi heyətin İKT sahəsində səriştəliliklərinin və ixtisaslarının artırılması məqsədilə mütəmadi olaraq kurslar təşkil edilir. Bu məşğələləri mərkəzin əməkdaşı, təcrübəli informatika müəllimi Cəvahir İsmayılova aparır. Mərkəzin təşkilatçılığı ilə həmçinin «İntel–Gələcək üçün təhsil» proqramı çərçivəsində universitetin magistr və texniki-köməkçi heyəti üçün də treninqlər təşkil edilmişdir. Mərkəz professor-müəllim və texniki-köməkçi heyətin «Təhsildə İKT» sahəsində səriştəliliklərinin artırılması məqsədilə fakültələrlə birgə sistematik olaraq elmi seminarlar təşkil edir.

Kompyuter Mərkəzinin fəaliyyət istiqamətlərindən biri də təhsilin informatlaşması və innovasiyalar mövzusunda keçirilən beynəlxalq və respublika səviyyəli elmi konfranslarda iştirakdır.

## 4.5. «TÜRK ARAŞDIRMALARI» ELMİ-TƏDQİQAT MƏRKƏZİ

ADPU-da «Türk odası» 2004-cü ilin 1 oktyabr tarixində fəaliyyətə başlamışdır. Prof. Elman Quliyevin təşəbbüsü ilə yaradılan «Türk odası» Türkiyənin Azərbaycandakı səfirliyi tərəfindən rəsmi olaraq qeydə alınmışdır. Fəaliyyət göstərdiyi müddət ərzində «Türk odası»nın vasitəçiliyi ilə universitetlə Türkiyə Cümhuriyyətinin Azərbaycandakı Böyükelçiliyi arasında mədəni əlaqələrin qurulmasına, Türkiyə universitetləri ilə tanışlıq xarakterli elmi-pedaqoji əlaqələrin yaradılmasına nail olunmuşdur.

Azərbaycan Respublikası Təhsil Nazirliyinin 20.06.2007-ci il tarixli 728 saylı əmri ilə Azərbaycan Dövlət Pedaqoji Universitetində «Türk odası»nın bazası əsasında «Türk araşdırmaları» elmi-tədqiqat laboratoriyası yaradılmışdır. Türk xalqları ədəbiyyatı problemlərinin öyrənilməsi laboratoriyanın əsas tədqiqat mövzusu kimi təsdiqlənmişdir.

2008-ci il dekabrın 18-də Azərbaycan Dövlət Pedaqoji Universiteti, Türkiyənin Azərbaycandakı səfirliyi və TİKA-nın dəstəyi ilə «Türk araşdırmaları» ETL-in yeni avadanlıqlarla təchiz olunmuş iş otağının rəsmi açılışı olmuşdur. Açılışda Türkiyənin Azərbaycandakı səfiri Hulusi Kılıç, TİKA-nın sədri Əbubəkr Çelik, Təhsil müşaviri Halis Koyunçuoğlu, Mədəniyyət müşaviri Melda Aras və digər rəsmi şəxslər iştirak etmişlər.

Araşdırma mərkəzinin əməkdaşları türk xalqları ədəbiyyatının ayrı-ayrı dövrləri və tanınmış şəxsiyyətləri – «Ziya Göyalp yaradıcılığında müqəddəs amal və böyük ideyaların tərənnümü», «M.A.Ərsoy yaradıcılığında türk zəfər tarixi və istiqlal duyğularının tərənnümü», «Türk xalqları ədəbiyyatı problemlərinin tədrisi və öyrədilməsi məsələləri», «Namiq Kamal yaradıcılığında vətən və hürriyyət ideyalarının tərənnümü», «İsmayıl Qaspiralı publisistikasında mənsub olduğu millətin problemlərinə ictimai-siyasi kontekstdə yanaşma», «Türkdilli sufi ədəbiyyatda Əhməd Yəsəvi ənənələri və Yunis İmrə yaradıcılığı» (prof. Elman Quliyev); «Ömər Seyfəddin Türkiyə realist nəsrinin görkəmli nümayəndəsi kimi», «Nazim Hikmətin poetikası» (A.Ş.Abbasova); «Mehmed Akif Ərsoy yeni dövr Türkiyə türk ədəbiyyatının azadlıq və mübariz şairi kimi», «Rəşad Nuri Güntəkinin həyat və yaradıcılığı» (L.F.Kərimova); «Haldun Tanerin həyat və yaradıcılığı», «Əziz Nesinin həyatı və yaradıcılığı» (O.E.Babayeva); «Şərq sufi ədəbiyyatı ənənələri və Yunis İmrə», «XX əsrin I yarısında Türkiyə türk ədəbiyyatının inkişaf problemləri» (V.R.Zeynalova); «Müasir qırğız ədəbiyyatında milli düşüncənin təzahür formaları (Ç.Aytmatov yaradıcılığı əsasında)» (K.R.Sadıqova) və s. mövzularda maraqlı tədqiqatlar aparmışlar.

Prof. Elman Quliyev Türkiyə, İran, Şimali Kipr, İraq və Türkmənistanda beynəlxalq elmi konfranslarda iştirak etmiş, bu ölkələrin ən nüfuzlu elmi dərgilərində məqalələr çap etdirmişdir.

Prof. Elman Quliyevin «Müasir özbək ədəbiyyatı tarixi» (1999), «Türkiyə türk ədəbiyyatı» (2003), «Özbək ədəbiyyatı» (2007), «Orta əsrlər türk xalqla-



*«Türk araşdırmaları» elmi-tədqiqat mərkəzinin əməkdaşları*

rı ədəbiyyatı» (2010), «Türk xalqları ədəbiyyatı» (2009–2011) kitabları, araşdırma mərkəzi əməkdaşlarının kollektiv şəkildə hazırladıqları «Türk xalqları ədəbiyyatının yaradıcılıq problemləri» (2010), 2 cildlik «Şərq xalqları ədəbiyyatı» (2011) adlı kitabları türk xalqları ədəbiyyatı problemlərinin öyrənilməsi baxımından əhəmiyyət kəsb edir. Prof. E.H.Quliyev Türkiyədə dərc olunan «Turan» Strateji Araşdırmalar jurnalının elmi heyətinin, AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunun və AMEA-nın akad. Z.Bünyadov adına Şərqşünaslıq İnstitutunun nəzdində fəaliyyət göstərən dissertasiya şuralarının üzvüdür. O, türk ədəbiyyatı problemlərinin öyrənilməsində göstərdiyi xidmətlərinə görə UNESCO, Türkiyə və Şimali Kipr Türk Cümhuriyyətlərinin təltiflərinə, 2011-ci ildə «Avropa Nəşr Mətbu Evi»nin «Ən Yaxşı Vətənpərvər Tədqiqatçı Alim» qızıl medalına, 2011-ci ildə ADPU-da «İlin alimi» müsabiqəsinin qalibi kimi I yerə layiq görülmüşdür.

A.Abbasovanın «Xoca Əhməd Yəsəvi və onun «Divani-hikmət» əsəri», «Nazim Hikmət türk lirik şeirinin ustadı kimi» və L.Kərimovanın «Orxan Kamalın «Yad qızı» romanında gerçəkliyin bədii əksi», «El şairi Məzahir Daşqın» adlı məqalələri də xüsusi əhəmiyyət kəsb edir.

Əməkdaşlar vaxtaşırı olaraq türk xalqları ədəbiyyatı problemləri ilə bağlı Türkiyə, Şimali Kipr, Türkmənistan və digər dövlətlərdə təşkil olunmuş beynəlxalq konfranslarda iştirak edirlər.

Elmi qurum Türkiyənin Azərbaycandakı səfirliyi, Türkiyə, Şimali Kipr və Orta Asiyanın bir sıra universitetləri ilə sıx əməkdaşlıq edir.

Hazırda elmi-tədqiqat laboratoriyasında 11 nəfər – 1 nəfər elmlər doktoru, prof. (Elman Quliyev), 1 nəfər elmi işçi (Vüsalə Zeynalova), 5 nəfər kiçik elmi işçi (Aytən Abbasova, Leyla Kərimova, Könül Nəbiyeva, Ofelya Babayeva, Mehriban Abbasova), 4 nəfər laborant (Günel Bağırova, Ümidə Abbasova, Validə Şıxəliyeva, Elnurə Paşayeva) çalışır.

## 4.6. «DƏDƏ QORQUD» ELMİ-TƏDQİQAT MƏRKƏZİ

«Dədə Qorqud» elmi-tədqiqat mərkəzi (laboratoriyası) «Kitabi-Dədə Qorqud» dastanının 1300 illiyi ərəfəsində yaradılmışdır.

«Kitabi-Dədə Qorqud» dastanının 1300 illiyi haqqında 1997-ci il 20 aprel tarixli Prezident fərmanından sonra universitetimizdə yubileyə hazırlıq işlərinə başlanmış, ali təhsil ocaqları arasında ilk irimiqyaslı elmi konfrans məhz ADPU-da təşkil olunmuşdur. Bütün fakültələrdə «Dədə Qorqud» dərsləri keçilmiş, elmi məcmuələr, toplular çap edilmişdir. Görülən tədbirlərin ən mühümü isə 2000-ci ilin dekabr ayında «Dədə Qorqud» elmi-tədqiqat mərkəzinin (laboratoriyası) yaradılması olmuşdur.

İctimai elmlər sahəsi üzrə uzun illər fəaliyyət göstərən üç problem laboratoriyanın bazası əsasında təşkil edilən «Dədə Qorqud» elmi-tədqiqat mərkəzinin ilk rəhbəri prof. Buludxan Xəlilov olmuşdur. 2011-ci ilin oktyabrından mərkəzə prof. Ramazan Qafarlı rəhbərlik edir.

«Dədə Qorqud» elmi-tədqiqat mərkəzində dünya mədəniyyətinin şah əsərlərindən sayılan «Kitabi-Dədə Qorqud» eposu bir neçə istiqamətdə hərtərəfli araşdırılır və təbliğ edilir. Mərkəz müvafiq olaraq üç bölməyə ayrılır. Birinci bölmə «Onomastika-dialektologiya-etimologiya» adlanır. Bölməyə uzun illər Azərbaycan MEA-nın müxbir üzvü, prof. A.Qurbanov rəhbərlik etmişdir. Hazırda bölmədə 4 nəfər elmi işçi (A.Əliyeva, B.Məmmədov, M.Seyidov, Ə.Cəfərov) və iki nəfər baş laborant (G.Balayeva, M.Əliyeva) çalışır.



*«Dədə Qorqud» elmi-tədqiqat mərkəzinin əməkdaşları*

İkinci bölmə «Folklor-etnoqrafiya-mifologiya» adlanır. Bölmənin müdiri vaxtilə prof. M.Həkimov olmuşdur. Hazırda isə prof. P.Əfəndiyevdir. Burada 1 nəfər böyük elmi işçi (P.Hüseynova), 3 nəfər kiçik elmi işçi (X.Əliyeva, Ş.Allahverdiyeva, S.Babayeva), 1 nəfər baş laborant (Ü.İsmayılova) çalışır.

Üçüncüsü «Pedaqogika-psixologiya-fəlsəfə» bölməsidir. Bu bölməyə son illərədək prof. F.Rüstəmov rəhbərlik etmişdir. Burada 3 nəfər kiçik elmi işçi (T.Əsgərova, M.Sərdarova, S.Məmmədova), 5 nəfər böyük laborant (S.Muradova, N.İsmayılova, N.Qurbanova, M.Abdullayeva, G.Mehdizadə) fəaliyyət göstərir.

«Dədə Qorqud» elmi-tədqiqat mərkəzinin təşəbbüsü ilə 2001-ci ildə I Türkoloji qurultayın 75 illik yubileyi respublika səviyyəsində keçirilmişdir. Mərkəzdə «Dədə Qorqud dünyası» adlı elmi-tədqiqat jurnalı hazırlanıb çap olunur.

## 4.7. «PEDAQOJİ TƏHSİLİN PROBLEMLƏRİ» ELMİ-TƏDQİQAT LABORATORİYASI

Azərbaycan Hökuməti və Dünya Bankının Beynəlxalq İnkişaf Assosiasiyası arasında bağlanmış layihənin əsas istiqamətlərindən biri olan «Müəllim hazırlığı» alt komponenti çərçivəsində «İbtidai sinif müəllimi hazırlığı üzrə kurikulum»un pilot ali məktəb kimi ADPU-nun Pedaqoji fakültəsində tətbiqi nəzərdə tutulmuşdu. Bu məqsədlə ali pedaqoji təhsilin elmi-nəzəri və praktik istiqamətlərinin araşdırılması, mövcud təcrübənin ümumiləşdirilməsi, perspektivlərin müəyyənləşdirilməsi, şəxsiyyətyönümlü, həyati bacarıqlara əsaslanan təhsilin məzmununun milli və bəşəri dəyərlər əsasında formalaşdırılması, tələbələrin bilik, bacarıq və vərdişlərinin monitorinqi və qiymətləndirilməsinin beynəlxalq təcrübəyə istinadən yeni formalarının yaradılması üçün Pedaqoji fakültənin nəzdində Azərbaycan Respublikası Təhsil Nazirliyinin 17.12.2007-ci il tarixli 1260 saylı əmri və universitet elmi şurasının 04.10.2007-ci il tarixli 4 saylı qərarı ilə «Pedaqoji təhsilin problemləri» elmi-tədqiqat laboratoriyası yaradılmış-



*«Pedaqoji təhsilin problemləri» elmi-tədqiqat laboratoriyasının əməkdaşları*

dır. Laboratoriya prof. Fərrux Rüstəmovun təşəbbüsü ilə təşkil edilmişdir. O, 2011-ci ilə kimi laboratoriyaya rəhbərlik etmişdir. Hazırda laboratoriyaya dos. Bəhruz Nəsirov rəhbərlik edir.

«Pedaqoji təhsilin problemləri» laboratoriyasının məqsədi pedaqoji təhsilin keyfiyyətinin yüksəldilməsi, müasir beynəlxalq təcrübə və milli ənənələr əsasında onun məzmununun və strukturunun yeniləşdirilməsi, pedaqoji təhsil sistemində yeni texnologiyaların, innovasiyaların tətbiqinin təmin olunmasını həyata keçirməklə yanaşı, ali pedaqoji təhsillə bağlı aparılan elmi tədqiqatların koordinasiya mərkəzi rolunu da oynaması nəzərdə tutulmuşdur.

Zemfira Rəcəbova ADPU-nun, Təkminə Cabbarova isə Azərbaycan Müəllimlər İnstitutunun doktorantıdır. Laboratoriya əməkdaşları ali pedaqoji təhsilin elmi-nəzəri və praktik problemləri ilə bağlı araşdırmalar aparır, beynəlxalq və respublika səviyyəli elmi-praktik konfranslarda məruzələrlə çıxış edir, elmi məqalələr nəşr etdirirlər.

Laboratoriyada 1 nəfər elmi işçi (Zemfira Rəcəbova), 4 nəfər kiçik elmi işçi (Turan Zamanova, Şəhanə Cəfərova, Sevinc Kərimova, Təkminə Cabbarova), 1 nəfər böyük laborant (Abbasova Günel) fəaliyyət göstərir.

## 4.8. «NADİR TORPAQ METAL MATERİALLARININ FİZİKASI» ELMİ-TƏDQİQAT LABORATORİYASI

«Nadir torpaq metal materiallarının (NTMM) fizikası» elmi-tədqiqat laboratoriyası Elektrik və optika kafedrasının nəzdində 1989-cu ildə yaradılmışdır. Laboratoriya tətbiq xarakterli tədqiqat işlərini tənzimləmək, professor-müəllim heyəti və tələbələri elmi işə fəal cəlb etmək məqsədi ilə yaradılmışdır. Laboratoriyada, Elektrik və optika kafedrasının əsas elmi işlərinin istiqaməti olan nadir torpaq metallarının iştirakı ilə $A^{IV}B^{VI}$ ($A^{IV}$=Ge, Sn, Pb; $B^{VI}$=Se, Te, S) qrup birləşmələri əsasında yeni yarımkeçirici materialların alınması, optimal texnologiyanın işlənilməsi, onların fiziki-kimyəvi analizi və elektrofiziki xassələrinin tədqiqi üzrə tədqiqat işləri aparılır.



*«Nadir torpaq metal materiallarının fizikası» elmi-tədqiqat laboratoriyasının əməkdaşları*

Elmi-tədqiqat laboratoriyası yarandığı ilk gündən onun elmi istiqaməti NTM-in iştirakı ilə olan yeni yarımkeçirici materialların alınması və onların elektrofiziki xassələrinin tədqiqi üzərində qurulmuşdur. O dövrdə (1980–1990-cı illərdə) nadir torpaq metalları (NTM) aşqar kimi müxtəlif metalların möhkəmliyinin, ərimə temperaturunun artırılması və s. məqsədlər üçün istifadə olunurdu. İlk dəfə prof. M.İ.Murquzov hələ Kiyevdə olarkən öz elmi işlərini NTM-in iştirakı ilə olan yarımkeçirici materialların alınması, tədqiqi məsələsinə həsr etmişdir. O, elmi işlərini NTM-in elektron konfiqurasiyası modeli əsasında qurmuş və $A^{IV}B^{VI}$ – qrup yarımkeçirici birləşmələrinin bu model əsasında bir sıra xassələrinin izahını vermişdir. Azərbaycana bu sahədə olan tədqiqat işlərini ilk dəfə prof. M.İ.Murquzov gətirmiş və bu baza əsasında 1989-cu ildə Elektrik və optika kafedrası nəzdində NTM-in iştirakı ilə olan «NTMM-in fizikası» elmi-tədqiqat laboratoriyası yaradılmışdır. Laboratoriyanın əsas elmi istiqaməti NTM-in iştirakı ilə və yuxarıda göstərdiyimiz $A^{IV}B^{VI}$ «qrup yarımkeçirici birləşmə və onların bərk məhlullarının alınması, kinetik xassələrinin və elektron quruluşunun «Elektron konfiqurasiyası modeli» əsa-

sında elmi izahını verməklə bərabər, praktik əhəmiyyət kəsb edən tərkibləri müəyyən etmək, tətbiqini tövsiyə etməkdir.

Hazırda dünyanın bir çox ölkələrində: ilk növbədə, Ukraynada, Rusiyada, Qazaxıstanda, Gürcüstanda, Belarusiyada və s. ölkələrdə bu NTM atomlarının elektron konfiqurasiyası modeli əsasında aparılan elmi tədqiqat işləri xeyli artmışdır. Azərbaycada, AMEA-nın Fizika və Kimya Problemləri institutlarında, Texniki Universitetdə, Bakı Dövlət Universitetində, Sumqayıt Dövlət Universitetində və s. elmi təşkilatlarda da bu sahədə elmi-tədqiqat işləri aparılır.

Prof. M.İ.Murquzovun rəhbərliyi ilə aparılan tədqiqat işlərində: üç və dördkomponentli, mürəkkəb yarımkeçirici maddələrin fiziki xassələrinin formalaşmasında bir sıra ümumi qanunauyğunluqlar müəyyən olunmuşdur. NTM-atomlarının elektron konfiqurasiyasının formalaşmasında dərində yerləşən *4f* orbitası mühüm rol oynayır. Lantanoidlərin sıra nömrəsi artdıqca *4f*-orbitasının dolması prosesi gedir və enerji baxımından *f-d* keçidində baş verən dəyişikliklər onların fiziki xassələrinə təsir göstərir. Ona görə də mürəkkəb yarımkeçirici materialların fiziki xassələrinin dəyişməsində sp-konfiqurasiyasının rolu böyükdür. Enerji baxımından alınan tərkiblərin energetik dayanıqlığı halı $sp^3$ və $s^2p^2$ konfiqurasiyalarından asılı olduğu prof. M.İ.Murquzov tərəfindən müəyyən edilmişdir. Lantanoid element atomlarının elektron quruluşunda, dərində *4f* enerji səviyyəsində yerləşən elektronların ona yaxın olan *5d*-səviyyəyə keçid ehtimalının və həm də enerji baxımından və enerji səviyyələrinin daha dayanıqlı olması lantanoidli birləşmələrin fiziki xassələrini çox geniş səpkidə dəyişdirir və bu baxımdan onların tədqiqi xüsusi maraq kəsb edir. Laboratoriyada uzunmüddətli elmi-tədqiqat işlərinin aparılması da məhz bu səbəbdəndir. NTM-atomları ilə aşqarlanmış mürəkkəb birləşmə və tərkiblər aşqarların miqdarından asılı olaraq onların elektrofiziki xassələri də dəyişir. Aparılan təcrübələr nəticəsində müəyyən olunmuşdur ki, NTM atomları ilə daha kiçik dozalarda aşqarlanmış yarımkeçirici tərkiblərin həssaslığı daha yüksəkdir və tərkibləri daxil edilən dozanın miqdarından asılı olaraq maddələrin fiziki xassələrini tənzimləmək mümkündür. Həmçinin *4f* orbitin dolması ilə fiziki-kimyəvi xassələr arasında funksional asılılıq müəyyənləşdirilmişdir.

Laboratoriyanın elmi fəaliyyəti ilə bağlı keçən müddət ərzində 3 nəfər fəlsəfə doktoru elmi dərəcəsi almışdır. 4 müəlliflik şəhadətnaməsi alınmışdır. 54 nəfərdən çox magistr öz elmi-tədqiqat işlərini həmin laboratoriyada aparmış və müvəffəqiyyətlə müdafiə etmişdir.

Laboratoriyada aparılan elmi-tədqiat işlərinin nəticəsində 120-dən çox yeni yarımkeçirici materiallar alınmış və onların kompleks: fiziki-kimyəvi və fiziki xassələri öyrənilmişdir. Bu sahədə 5 monoqrafiya və 100-dən çox məqalə və tezis nəşr olunmuşdur. Bir sıra beynəlxalq konfranslarda məruzələr edilmişdir.

Hazırda elmi-tədqiqat laboratoriyasında 12 nəfər – 3 nəfər böyük elmi işçi (Şərif İsmayılov, Şubay Sərdarov, Yəhya Şərifov), 1 nəfər kiçik elmi işçi (Azər Nəsibli), 5 nəfər mühəndis (Zeynəb Nəcəfova, Sona Səfərova, Amid Qurbanov, Elnarə Cəfərova, Məmləkət Həsənova), 1 nəfər böyük laborant (Nigar Həsənli), 2 nəfər laborant (Arzu Ağaməmmədova, Natella Namazova) çalışır.

## 4.9. «KOORDİNASİON BİRLƏŞMƏLƏR» ELMİ-TƏDQİQAT LABORATORİYASI

«Koordinasion birləşmələr» elmi-tədqiqat laboratoriyası 1989-cu ildə Analitik və fiziki kimya kafedrasının nəzdində yaradılmışdır. Bu elmi-tədqiqat laboratoriyası yarandığı dövrdən bu günə qədər analitik kimyanın müasir problemlərindən bəhs edən praktik məsələlərin həlli ilə məşğul olur.

«Koordinasion birləşmələr» elmi-tədqiqat laboratoriyasının əsas tədqiqat obyekti tərkibində kükürd və azot olan liqandlarla metalların üçkomponentli kompleksləri və onların müxtəlif obyektlərdə həmin metalların analizində tətbiqi olmuşdur. Laboratoriya yaranan gündən indiyə qədər onun rəhbəri k.e.d., prof. N.A.Verdizadədir. Onun rəhbərliyi altında kükürd və azottərkibli liqandlar sintez olunmuş və bəzi d-keçid elementlərlə (nikelin, dəmirin, müxtəlif oksidləşmə dərəcələrində olan vanadiumun, molibdenin, volframın, misin, kobaltın və titanın) kompleks əmələgəlmə reaksiyaları fotometrik və ekstraksiyalı-fotometrik tədqiq edilərək analitik praktikaya tətbiq edilmişdir.



*«Koordinasion birləşmələr» elmi-tədqiqat laboratoriyasının əməkdaşları*

Dos. Ə.Z.Zalov və kiçik elmi işçi R.A.Məmmədova bəzi d-keçid elementlərin kükürd və azot olan liqandlarla müxtəlif liqandlı komplekslərin sintezinin optimal şəraiti, tərkibi, quruluşu və davamlılıqlarının müəyyən edilməsi istiqamətində geniş elmi-tədqiqat işləri aparırlar. Bu işlərin nəticəsi olaraq bir çox elementlərin təyini reaksiyalarının seçiciliyi mövcud üsullara nisbətən artırılmış və minimum təyinetmə həddi daha da aşağıya salınmışdır. Aparılan tədqiqatlar nəticəsində 1 nəfər (Ə.Z.Zalov) namizədlik dissertasiyası müdafiə etmişdir (1997).

Laboratoriya əməkdaşlarının apardığı tədqiqatların nəticələri çoxsaylı elmi məqalələr şəklində xarici ölkə və respublika elmi mətbuatında çap olunmuşdur. «Koordinasion birləşmələr» elmi-tədqiqat laboratoriyasının elmi əlaqələri həm xarici ölkə, həm MDB ölkələri, həm də respublika daxili elmi müəssisələrini əhatə edir. Laboratoriya əməkdaşlarının 1989-cu ildən bəri apardıqları elmi-tədqiqat işlərinin nəticələri 200-ə qədər elmi məqalə və 20-yə qədər dərslik və dərs vəsaitində çap olunmuşdur. Bu işdə əməkdaşlardan prof. N.A.Verdizadə, dos. Ə.Z.Zalov, dos. S.N.Quliyev və dos.T.İ.Əmrahov xüsusilə fərqlənmişlər.

## 4.10. «YENİ BİOLOJİ AKTİV BİRLƏŞMƏLƏR» ELMİ-TƏDQİQAT LABORATORİYASI

«Yeni bioloji aktiv birləşmələr» elmi-tədqiqat laboratoriyası 1989-cu ildən fəaliyyət göstərir. Laboratoriya müəyyən edilmiş tədqiqat istiqamətinə uyğun olaraq, bioloji aktivliyə malik yeni üzvi birləşmələrin və polimer kompozisiyaların tərkibinin tədqiqi sahəsində uğurlu tədqiqat işləri aparır. Laboratoriyanın əməkdaşlarının əldə etdikləri nəticələr təqdirəlayiqdir. Aparılan elmi-tədqiqatın nəticələri əsasında dünyanın və respublikanın nüfuzlu elmi jurnallarında onlarla məqalə dərc edilmiş, Beynəlxalq və Respublika səviyyəli elmi konfranslarda çıxışlar edilmiş və uyğun materiallar nəşr edilmiş, 3 patent və 1 akt əldə edilmişdir. Ötən dövrdə laboratoriyanın 2 əməkdaşı fəlsəfə doktoru  alimlik dərəcəsi almaq üçün dissertasiya müdafiə etmiş, 1 əməkdaşı – böyük elmi işçi İ.A.Cəfərov isə fəlsəfə doktoru alimlik dərəcəsi almaq üçün  dissertasiyasını BDU-nun nəzdindəki müvafiq Dissertasiya Şurasına təqdim etmişdir.

Bu gün laboratoriyada 2 nəfər böyük elmi işçi – İ.A.Cəfərov və fəlsəfə doktoru R.S.Məmmədova, 1 nəfər kiçik elmi işçi – P.Ş.Ələsgərova, 1 nəfər baş laborant S.Rəhimova və 3 nəfər laborant fəaliyyət göstərir. Laboratoriyada elmi-pedaqoji fəaliyyət göstərmiş bir sıra əməkdaşlar isə digər sahələrdə çalışmaqdadırlar: Məlumdur ki, bioloji aktiv birləşmələr antiseptik və funqisid xassələrinə malikdirlər. Buna görə də tibbdə, texnikada, sənayenin müxtəlif sahələrində, kənd təsərrüfatında, o cümlədən baytarlıqda və s. geniş istifadə edilməkdədir.

Laboratoriyada böyük elmi işçi İ.A.Cəfərov tərəfindən əvəzli alkanollar əsasında sintez edilən  aminometol birləşmələrin aktiv antiseptik göstəriciləri ADTU və AMEA-nın Aşqarlar Kimyası İnstitutunda həyata keçirilən sınaq təcrübələrində təsdiq edilmişdir. Əldə edilmiş nəticələrə patent verilmişdir. İ.A.Cəfərovun apardığı elmi-tədqiqat işlərinin nəticələri 63 elmi əsərdə, o cümlədən 4 müəlliflik şəhadətnaməsində və 12 xarici elmi jurnalda öz əksini tapmışdır.

Böyük elmi işçi, kimya üzrə fəlsəfə doktoru R.S.Məmmədovanın bioloji aktivliyə malik polimer kompozisiyalarının tərkibinin tədqiqi sahəsində apardığı araşdırmalar da elmi-praktiki əhəmiyyəti və aktuallığı ilə diqqəti cəlb edir. Məlumdur ki, polimer kompozisiyalarının materillarından insanın



*«Yeni bioloji aktiv birləşmələr» elmi-tədqiqat laboratoriyasının əməkdaşları*

müasir həyat fəaliyyətinin ən müxtəlif sahələrində çox geniş miqyasda istifadə edilir: məişətdə; tibdə; cihazqayırmada (o cümlədən Yüksək İnformasiya Texnologiyalarının hazırlanmasında); texnikada; sənayenin müxtəlif sahələrində (o cümlədən maşınqayırma, aviasiya, gəmiqayırma və s.); yüksək gərginlikli cərəyanı, nefti, qazı, suyu və s. nəql edən avadanlıqların hazırlanmasında və s. Bu səbəbdən də polimer kompozisiyalarının bioloji aktivliyinin təmin edilməsi insanın həyat fəaliyyətinin təhlükəsizliyi, ekoloji, iqtisadi, enerji və s. aspektlərdən dəyərləndirilir. R.S.Məmmədovanın apardığı elmi-tədqiqat işinin qeyd edilən aspektlərlə yanaşı, digər səciyyəvi xüsusiyyətləri də mövcuddur: tükənməz olmayan ilkin xammaldan qənaətlə istifadənin vacibliyinin, bəşəriyyətin gələcək ehtiyaclarının labüdlüyünün və s. nəzərə alınması.

R.S.Məmmədovanın apardığı elmi-tədqiqat işlərinin nəticələri elmi jurnallarda dərc edilməklə yanaşı, elmi-tədqiqat işlərinin müsabiqələrində – «Azərbaycan neftinin dünəni, bu günü və sabahı» mövzusunda BDU-nun AMEA, Təhsil Nazirliyi və ABƏŞ ilə birgə təşkil etdiyi elmi-tədqiqat işlərinin müsabiqəsində (1997-ci il), akademik İzzətxanım Orucovanın 100 illik yubileyi ilə əlaqədar Ailə, Uşaq və Qadın problemləri üzrə Dövlət Komitəsi tərəfindən təşkil edilən müsabiqədə (2011-ci il) və s. diplomlara layiq görülmüşdür. Elmi nəticələr əsasında 1 patent alınmış, 2-ci patent alınması üçün müvafiq sənədlər hazırlanır.

R.S.Məmmədovanın elmi-tədqiqat işlərinin nəticələri 40-a yaxın beynəlxalq və respublika səviyyəli nəşrlərdə öz əksini tapmışdır.

2009-cu il tarixində təşkil edilən ulu öndər H.Əliyevin 86-cı ildönümünə həsr edilmiş «Kimya və ekobiologiyanın aktual problemləri» mövzusunda Respublika elmi konfransı laboratoriyanın fəaliyyət dövründəki parlaq səhifələrdən biridir. Laboratoriyanın və uyğun kafedranın əməkdaşları, fakültə və universitet rəhbərliyinin dəstəyi nəticəsində AMEA-nın uyğun sahələrdə ixtisaslaşan institutları (BDU, ADNA, ADTU, ATU) ilə birlidə ölkəmizdə və bütün dünyada kimya və ekologiya sahəsində mövcud olan bir sıra problemlərin araşdırılaraq təhlil edilməsinə nail oldular. Konfransda AMEA-nın müxbir üzvləri M.Salahov, V.Abbasov, ADNA-nın professoru K.Əcəmov, ADPU-nun pofessorları N.Verdizadə və T.Ağdamski mövcud problemlər, onların yaranma səbəbləri, problemlərin həlli üçün səmərəli araşdırma üsulları və s. haqqında dəyərli məruzələrlə konfrans iştirakçılarına faydalı məlumatlar və məsləhətlər verdilər. Konfransın təşkilində laboratoriyanın əməkdaşlarından böyük elmi işçi, k.e.f.d R.S.Məmmədova təşkilatçı, böyük elmi işçi İ.A.Cəfərov dərc edilən konfrans materialının redaktoru, S.Rəhimova isə ən yaxın köməkçi kimi intensiv və uğurlu fəaliyyət göstərdilər. Təşkil edilən konfrans bu kiçik laboratoriyanın respublikanın elmi arenasında özünəməxsus rolunun olduğunu aşkarladı.

Laboratoriyanın əməkdaşı S.Rəhimova elmi-tədqiqat işlərinin yerinə yetirilməsinə professional kömək etmək baxımından püxtələşmiş kadrdır. Laboratoriyada yenicə əmək fəaliyyətinə başlayan əməkdaşlar Pərvin Ələsgərova, Fərqanə Əzizova da məqsədəuyğun elmi-tədqiqat işlərinin aparılması üsullarını və təcrübi işlərin reallaşmasına ixtisaslaşmış kömək etmək üçün mövcud çoxsaylı qaydaları səylə öyrənərək tətbiq edirlər.

Laboratoriyanın əməkdaşları qeyd edilənlərlə yanaşı, tədris prosesinə daimi elmi-pedaqoji dəstək göstərir. Laboratoriyada bakalavr və magistr pilləsində təhsil alan tələbələrə TEC-nin xətti ilə ilkin elmi araşdırmaların aparılması üçün şərait yaradılır, elmi-tədqiqat işlərinin aparılması üsulları, əldə edilən nəticələrin araşdırılması və s. istiqamətlərdə məsləhətlər verilir.

Qeyd edilənlərlə yanaşı, laboratoriyanın əməkdaşları kafedranın, fakültənin, universitetin, TQDK-nın kimya seminarının və respublikada uyğun ixtisas sahələrində təşkil edilən tədbirlərdə (konfrans, konfrans-sərgi və s.) elmi-pedaqoji fəaliyyətlərini uğurla davam etdirirlər.

## 4.11. MƏTBUAT VƏ İNFORMASİYA ŞÖBƏSİ

Azərbaycan Dövlət Pedaqoji Universitetinin Mətbuat və informasiya şöbəsi 2006-cı ildə yaradılıb. Mətbuat və informasiya şöbəsinin yaradılmasında əsas məqsəd ADPU-nun respublikamızın kütləvi informasiya vasitələri ilə səmərəli əməkdaşlığını təşkil etmək, universitetin elmi-pedaqoji və ictimai-mədəni həyatını dövri mətbuatda yüksək səviyyədə işıqlandırmaq olmuşdur. Son illər ADPU-da təhsilin və tədrisin keyfiyyətinin yüksəldilməsi, tələbələrin biliyinin qiymətləndirilməsi zamanı şəffaflığın və obyektivliyin təmin edilməsi, bu elm və təhsil ocağında informasiya-kommunikasiya texnologiyalarının uğurlu tətbiqi, eyni zamanda universitetin maddi-texniki bazasının gücləndirilməsi və beynəlxalq əlaqələrinin genişləndirilməsi istiqamətində həyata keçirilən islahatların dövri mətbuatda günün tələbləri səviyyəsində təbliğ edilməsi Mətbuat və informasiya şöbəsinin fəaliyyətinin əsas mahiyyətini təşkil edir.

Mətbuat və informasiya şöbəsinin öz fəaliyyətini ölkəmizin aparıcı kütləvi informasiya vasitələri ilə sıx əməkdaşlıq şəraitində qurması nəticəsində universitetin həyatı dövri mətbuatda və televiziyada lazımi səviyyədə işıqlandırılır. Mətbuat və informasiya şöbəsinin veb-portalı belədir: www.press. adpu.az. Universitetin «Gənc müəllim» qəzeti də Mətbuat və informasiya şöbəsinin tərkibində fəaliyyət göstərir.

«Gənc müəllim» qəzeti ADPU-da 1958-ci il fevral ayının 1-dən nəşr olunur. Qəzetin yaradılmasında başlıca məqsəd bu ali təhsil müəssisəsinin həyatını işıqlandırmaq olmuşdur. İlk nüsxələri jurnalist Xəlil Köçərlinin redaktorluğu ilə nəşr olunan qəzetin səhifələrində bu qabaqcıl elm və təhsil ocağının həyatı dolğun şəkildə öz əksini tapmış, onun elmi-pedaqoji sahədə qazandığı uğur və nailiyyətlər, həmçinin universitetdə keçirilən ictimai-mədəni tədbirlər müntəzəm olaraq işıqlandırılmışdır. «Gənc müəllim» qəzeti fəaliyyətinin ilk günlərindən gənc nəslin təlim-tərbiyəsi işinin fəal iştirakçısına çevrilmiş, tələbələrin mənəvi-əxlaqi təkamülünə ciddi təsir göstərmişdir.

«Gənc müəllim» qəzeti pedaqoji kadr hazırlığı işində bilavasitə xidmətlər göstərmiş, tələbələrin elmi-mədəni səviyyəsinin yüksəldilməsində və dünyagörüşünün genişləndirilməsində mühüm rol oynamışdır. Müxtəlif vaxtlarda qəzetə redaktorluq edən Kamal Qəhrəmanov (1963–1966), Zahid Xəlil (1966–1969), Sərhəd Məmmədov (1969–1972), Zakir Sərdarov (1972–1984),



*Mətbuat və informasiya şöbəsinin əməkdaşları*

Əziz Axundlu (1984–2000), Təranə Rəhimli (2000–2006) universitetin elmi-mədəni nailiyyətlərini «Gənc müəllim»in səhifələrində işıqlandırmaqla yanaşı, tələbə-gənclərin yaradıcılığına da xüsusi qayğı ilə yanaşmış, onlarla fəal iş aparmışlar. Tofiq Qəhrəmanov, Akif Səməd, Tofiq Eyvazov, Rabil Novruzov və başqa istedadlı şair və jurnalistlər qəzetin məsul katibi, müxbiri və ədəbi işçisi kimi fəaliyyət göstərmişlər. Yazıları «Gənc müəllim»in səhifələrində müntəzəm olaraq dərc edilən Xəlil Rza Ulutürk, Xeyrəddin Qoca, Məmməd Elli, Tinatin Əliyeva, Əsəd Əsədov, Alqayıt və başqaları qəzetlə sıx əlaqə saxlayan ən fəal müəlliflərdən olmuşlar. Bu tanınmış imzalar qəzetin fəaliyyətinin yüksəldilməsində mühüm rol oynamışlar.

«Gənc müəllim» bədii istedadı olan tələbə-gənclərin yaradıcılıq istiqamətlərinin düzgün müəyyənləşdirilməsində də onlara yardımçı olmuşdur. 2007-ci ildən redaksiyanın nəzdində yaradılan «Gənc qələmlər» Yaradıcılıq Birliyi öz ətrafına universitetin istedadlı gənc yazarlarını toplamışdır. Eyni zamanda fakültələrdə yaradılan müxbir postları neçə-neçə gəncin jurnalist istedadının püxtələşməsinə kömək etmişdir.

Son 5 ildə qəzetin nəşri sahəsində bir sıra uğurlar əldə edilmişdir. Qəzetdə dərc edilən materialların jurnalistik, elmi, bədii səviyyəsi və qəzetin texniki tərtibatı xeyli yüksəldilmişdir. Qəzetin səhifələrinin artırılması, tirajın çoxaldılması, rəngli çapı, yüksək kompyuter tərtibatı ilə təmin edilməsi «Gənc müəllim»in texniki cəhətdən təkmilləşdirilməsinə şərait yaratmışdır. Mübaliğəsiz demək olar ki, qəzet, sözün həqiqi mənasında, universitet həyatının güzgüsünə, onun tarixini yazan mətbuat orqanına çevrilmişdir.


HEYDƏR ƏLİYEV - 85

GƏNC MÜƏLLİM

QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

Xüsusi buraxılış

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Şah əsəri - bəşəriyyətin marağına çevirdiyi Azərbaycan

## ADPU magistrantlarının III elmi konfransı

*«Gənc müəllim» qəzetinin Ümummilli lider Heydər Əliyevin anadan olmasının 85-ci ildönümünə həsr olunmuş xüsusi buraxılışı*

«Gənc müəllim» qəzeti 2010-cu ilin aprel ayından Azərbaycan Mətbuat Şurasının üzvüdür.

«Gənc müəllim» qəzeti Mətbuat və informasiya şöbəsinin müdiri, Azərbaycan Jurnalistlər Birliyinin üzvü Mənsur İbrahimovun ümumi rəhbərliyi, Ayətxan İsgəndərovun redaktorluğu və Ramilə Yolçuyevanın kompyuter yığıcılığı ilə universitetin elmi-pedaqoji və ictimai-mədəni həyatında baş verən hadisələrin fəal iştirakçısı və təbliğatçısı kimi öz fəaliyyətini davam etdirir.

## 4.12. «AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN XƏBƏRLƏRİ»

Azərbaycan Dövlət Pedaqoji Universiteti yarandığı ilk gündən burada çalışan professor-müəllim heyətinin elmi araşdırmalarının çapına xüsusi diqqət yetirilmişdir. 1935 və 1946-cı illərdə APİ-nin elmi əsərləri nəşr olunmuşdur. 1946-cı ildən 1953-cü ilə kimi onun nəşri dayandırılmışdır. 1953-cü ildə elmi əsərlər xüsusi cild kimi öz nəşrini davam etdirmişdir. Belə ki, 1953-cü ildə Elmi əsərlərin 1-ci cildi, 1955-ci ildə 2-ci cildi, 1957-ci ildə 3-cü cildi, 1958-ci ildə 4, 5, 6-cı cildləri işıq üzü görmüşdür. Bu cildlərə institutun professor-müəllim və aspirantlarının müxtəlif elm sahələrinə aid dəyərli tədqiqat işləri daxil edilmişdir.

Keçən əsrin 90-cı illərinə kimi APİ-nin «Elmi Xəbərləri»nin ildə 6 sayı nəşr olunmuşdur.

«Pedaqoji Universitetin Xəbərləri» 1991-ci ildə Azərbaycan Respublikası Mətbuat Komitəsində qeydiyyatdan keçmişdir. Hazırda jurnalın baş redaktoru ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, prof. Y.Ə.Məmmədov, baş redaktorun müavini prof. V.H.Əliyev, məsul katib prof. B.Ə.Xəlilovdur.



*«Azərbaycan Dövlət Pedaqoji Universitetinin Xəbərləri» jurnalının redaksiya heyəti*




«Pedaqoji Universitetin Xəbərləri» 3 seriyada – humanitar (redaktor prof. H.Ə.Qasımov), təbiət (redaktor prof. Ə.N.Fərəcov), pedaqogika-psixologiya (redaktor prof. F.A.Rüstəmov) ildə 4 dəfə nəşr olunur. Jurnalın baş redaksiya heyətinə həm Azərbaycanın (akademiklər B.Ə.Budaqov, A.M.Paşayev, A.C.Hacıyev, M.İ.Əliyev, M.Ə.Musayev, Z.Ə.Səmədzadə, Ə.M.Abbasov, F.M.Əliyev, A.A.Axundov, İ.Ə.Həbibbəyli, H.M.Əhmədov, İ.M.Hacıyev, AMEA-nın müxbir üzvləri V.H.Əliyev, N.Q.Cəfərov, B.H.Əliyev, R.B.Hüseynov, professorlar H.İ.Mirzəyev, S.A.Məmmədov, Ə.Ə.Əlizadə, B.Ə.Xəlilov), həm də Türkiyənin (professorlar Ş.H.Akalın, B.Akkoyunlu) nüfuzlu alimləri daxil edilmişdir. Jurnalda Azərbaycan elmi-pedaqoji ictimaiyyətinə yaxşı tanış olan alimlərlə yanaşı, digər ölkə alimlərinin də pedaqogika, fənlərin tədrisi metodikası, təbiət və humanitar elmlərin ayrı-ayrı sahələri ilə bağlı elmi yazıları dərc olunur.

## 4.13. «TƏHSİLDƏ İKT» ELMİ-METODİK JURNAL

«Təhsildə İKT» elmi-metodik jurnalı 2009-cu ildən nəşr olunur. Elmi-metodik jurnalın redaksiya şurasının sədri, AMEA-nın müxbir üzvü, prof. Y.Ə.Məmmədov, baş redaktoru prof. Arif Bünyatovdur. Jurnal 11 dekabr 2008-ci ildə Azərbaycan Respublikası Ədliyyə Nazirliyində Mətbu nəşrlərin Dövlət Qeydiyyatı reyestrinə və Azərbaycan Respublikası Prezidenti yanında AAK-nın reyestrinə daxil edilmişdir. Jurnalın redaksiya şurasına həm Azərbaycanın (akademik T.Əliyev, AMEA-nın müxbir üzvü R.M.Əliquluyev, prof. A.O.Mehrabov, prof. A.H.Naxçıvanlı, prof. A.D.Zamanov, prof. F.A.Rüstəmov, dos. İ.B.Əhmədov), həm Tür-




kiyə Cümhuriyyətinin Hacəttəpə Universitetinin (prof. B.Akkoyunlu, prof. P.Aşkar, prof. H.Yurdugül), həm də Rusiya Federasiyasının (prof. T.H.Vəzirov), İngiltərənin (prof. Y.Paker), Fransanın (prof. J.Bonnin) tanınmış alimləri daxildir. Jurnalı nəşr etməkdə əsas məqsəd təhsilin informatlaşmasının konseptual, metodoloji, texniki-texnoloji aspektlərinə dair elmi-metodik tədqiqatların nəticələrinin pedaqoji ictimaiyyətə çatdırılması, elmi ideyaların mübadiləsinin aktivləşməsinə yardımçı olmaqdır. Materiallar aşağıdakı bölmələrdə oxuculara təqdim olunur: 1) rəsmi sənədlər; 2) təhsilin informatlaşmasının nəzəri və metodoloji əsasları; 3) metodika və təcrübə; 4) kompyuterin təlim texnologiyaları; 5) təhsilin informatlaşmasının pedaqoji-psixoloji problemləri; 6) konfrans və sərgilər; 7) beynəlxalq təcrübə.

Jurnalın tərtibatını və dizaynını Etibar Seyidzadə və Heyran Kərimova icra edirlər. Bu müddət ərzində jurnalda respublika alimləri ilə yanaşı, Türkiyə, Rusiya, Ukrayna, Gürcüstan alimlərinin də elmi əsərləri dərc edilmişdir.

## 4.14. KİTABXANA

ADPU-da kitabxananın yaranması universitetin yaranması ilə bir vaxta düşür. Universitet təşkil olunduğu ilk dövrdə dərsliklər, xüsusən ana dilində dərsliklər çatışmırdı. İlk illər institut əməkdaşları və müəllimləri kitabxananın təşkil olunmasına çalışır, özlərində olan elmi-pedaqoji ədəbiyyatı və hətta öz mühazirə mətnlərinin surətini tələbələrin istifadəsi üçün kitabxanaya verirdilər. İnstitutda dərs deyən müəllimlərdən Fətulla Rzabəyli, Həbib Mahmudbəyov, Rəhim Cəfərov, Abdulla



*Kitabxananın əməkdaşları*

Şaiq və onlarla başqalarının səyi nəticəsində qısa bir müddətdə çətinliklər aradan qaldırıldı.

Əgər ilk illər institutun kitabxanasında ana dilində 50, rus və başqa dillərdə 73 kitab var idisə, bir neçə ildən sonra Moskvadan və başqa şəhərlərdən alınan ədəbiyyatın hesabına kitabxananın fondu xeyli artdı.

Artıq 1930-cu illərdə institutun müəllimləri dərsliklər yazmağa başladı. 1936–1946-cı illərdə müəllimlər tərəfindən müxtəlif mövzularda 55 adda dərslik və dərs vəsaiti hazırlandı. Bu illərdə institutun kitabxanasında Azərbaycan, rus və başqa dillərdə 10000-dən artıq kitab, jurnal, qəzet və digər ədəbiyyat vardı.

Müharibə illərində kitabxana işçiləri hospitaldakı yaralılar üçün səyyar kitab sərgiləri təşkil edir və hamiliyə götürdükləri hərbi hissələrə kitab da yollayırdılar.

1943-cü ildən APİ yenidən bərpa edildi (müharibənin ilk illərində institut hospitala çevrilmişdi) və sürətlə inkişafa başladı. İnstitut inkişaf etdikcə həm kitabxananın fondu, həm də oxucuların sayı artırdı. Artıq 1949–1950-ci tədris ilində kitabxananın fondu 64968 nüsxə, oxucuların sayı isə 2300 nəfər idi.

1959-cu ildə Qiyabi Pedaqoji İnstitutu bütövlükdə APİ ilə birləşdirildiyi üçün hər iki institutun kıtabxanası da birləşdirildi. 1959-cu ildə kitabxananın fondu 278117 nüsxə, oxucuların sayı 3500 nəfər oldu. Həmin il yeni istifadəyə verilmiş 4 mərtəbəli tədris binasında geniş və işıqlı oxu zalı da kitabxananın ixtiyarına verildi.

Vaxtaşırı institutun strukturunda edilmiş dəyişikliklər kitabxana fonduna da öz təsirini göstərmişdir. 100 minlərlə ədəbiyyat institutun yeni yaradılan filiallarına (Naxçıvan, Xankəndi) və digər institutların kitabxanalarına verilmişdir ki, bu da fondun azalmasına səbəb olmuşdur.

Rus dili və ədəbiyyatına aid olan kitablar – Rus Dili Pedaqoji İnstitutuna (Bakı Slavyan Universiteti), xarici dillərə aid ədəbiyyat – Xarici Dillər İnstitutuna (Azərbaycan Dillər Universiteti) verilmişdir.

Bütün bunlara baxmayaraq, kitabxana inkişaf etməkdə idi və 1970-ci illərdə onun fondu müqayisə edilməz dərəcədə genişlənmişdi. Bu illərdə kitabxana digər respublikalarla və SSRİ-nin 10 ən böyük şəhərlərinin pedaqoji universitetlərinin kitabxanaları ilə əlaqə saxlayır, kitab mübadiləsi aparırdı. Moskva, Leninqrad (Sankt-Peterburq), Kiyev və onlarla böyük şəhərlərdən poçt vasitəsilə ədəbiyyat alırdı. Hətta kitabxana Bolqarıstanın Sofiya şəhərinin Universitet kitabxanası ilə də kitab mübadiləsi aparır, Azərbaycan dilçiliyinə aid institut nəşrlərini onlara göndərirdi.

1970-ci illərdə kitabxana fondu xeyli dərəcədə genişləndi. 1972-ci ildə kitabxananın fondu 650000 nüsxə,1975-ci ildə 762000 nüsxəyə yaxın, 1979-cu ildə 799000 nüsxə, 1982-ci ildə isə 842000 nüsxə idi. Bu illərdə kitabxanaya ildə orta hesabla 40–50 min nüsxə ədəbiyyat daxil olmuşdu.

1980-ci illərdə institutda tədrisə daha yaxından kömək etmək məqsədilə kafedralarda kiçik həcmli kitabxanalar yaradıldı. Ayda bir dəfə «Yeni ədəbiyyatın bülleten»i makinada çap olunub kafedra informatorlarına verilirdi.

Son illərdə ADPU-da kitabxana-biblioqrafiya işlərinin informasiya daşıyıcılarına köçürülməsi, elektron-kitabxananın yaradılması, oxucuların İnternetə çıxışının təmin olunması istiqamətində işlər görülür, oxucuların kitabxanada olan elmi-mədəni sərvətlərdən hərtərəfli istifadəsi üçün şərait yaradılır.

Hazırda kitabxanada yeni çap olunmuş dərslik və dərs vəsaitlərinin 500 diski var və yaxın gələcəkdə bunun sayı artacaq və elektron kitab-

xana yaradıldıqdan sonra oxucular istədikləri vaxt onlardan istifadə edə biləcəklər.

İlk illərdə kitabxananın 40–50 oxucusu, 130-a yaxın ədəbiyyatı var idisə, hazırda onun 11000-dək oxucusu, 698000-dən cox fondu vardır. Əsas fondu kitablar təşkil edir ki, hal hazırda bu 673610 nüsxədir və bu ədəbiyyat, əsasən, Azərbaycan, rus, Qərbi Avropa və Yaxın Şərq ölkələri xalqlarının dilindədir. Bununla yanaşı, kitabxanada 1014 nüsxə dissertasiya, 16500-dək avtoreferat, 700-dək əski ərəb əlifbasında nadir kitablar və digər fondlar da var. Kitab fondunun nisbətən azalması son illərdə sovet ideologiyası ilə bağlı olan ədəbiyyatın silinməsi ilə əlaqədardır. Əgər 2007-ci ildə kitabxana fondunda olan 679959 ədəbiyyatdan 9663 oxucu istifadə edirdisə, 2008–2009-cu illərdə fondun və oxucuların sayı nisbətən artmış, 2011-ci ildə fondun sayı 673610, oxucuların sayı 10400 nəfər olmuşdur.

Yaxın illərdə kitabxana təmir olunmuş, kompyuterlə və yeni avadanlıqla təchiz edilmişdir. İndi kitabxananın 1360 $m^2$ sahəsi var. Burada 3 ixtisaslaşmış xidmət şöbə və bölməsi, 5 oxu zalı vardır. Oxu zallarından eyni vaxtda 225 nəfər oxucu istifadə edə bilər. Oxucular abonement və oxu zallarından əlavə biblioqrafiya şöbəsinin və KAA-nın xidmətlərindən istifadə etmək imkanına malikdirlər. Ayda bir dəfə təşkil olunan informasiya günlərində oxucular «Yeni ədəbiyyat»la tanış olur. Mübadilə fondu universitetin nəşrlərini digər kitabxanalar arasında geniş yaymaq imkanına malikdir. 1998-ci ildə yaradılmış elmi-metodiki şöbə hər bir işin elmi əsaslarla qurulmasına və kitabxanaya aid olan sorğuların cavablandırılmasına, işlə bağlı problemlərin vaxtında həll olunmasına çalışır.

Hazırda 8 şöbə və 11 bölməsi olan kitabxanada 71 işçi çalışır. Kitabxanaya müxtəlif dövrlərdə Fatmaxanım Tağıyeva (H.Z.Tağıyevin qardaşı qızı), Törəxanım Rzaquliyeva, Yudif Şexter, Raxil Finkelşteyn, Nataşa Şotaşvili, Gülağa Abdullayev, Sabir Axundov, Şəhrizad Hüseynova, Məmməd Həsənov rəhbərlik etmişlər. Hazırda kitabxananın müdiri Azər Hüseynovdur.



Rektorun köməkçiləri



Dəftərxana əməkdaşları



*ADPU-nun tədris-metodika şöbəsinin əməkdaşları*



*ADPU-nun xüsusi şöbəsinin əməkdaşları*

## 4.15. UNİVERSİTET HƏMKARLAR İTTİFAQI KOMİTƏSİ

Azərbaycan Dövlət Pedaqoji Universitetinin Həmkarlar İttifaqı Komitəsi 1923-cü ildə yaradılmışdır. Onun ilk sədri tanınmış psixoloq Mühiddin olmuşdur. Azərbaycan Dövlət Pedaqoji Universitetinin Həmkarlar İttifaqı Komitəsi Universitetdə çalışan əməkdaşların əmək, sosial, iqtisadi hüquqlarını və qanuni mənafelərini müdafiə etmək məqsədilə könüllülük əsasında yaradılmış, Azərbaycan Respublikası Ədliyyə Nazirliyində dövlət qeydiyyatından keçmiş qeyri-siyasi ictimai təşkilatdır.

Həmkarlar İttifaqı Komitəsi öz fəaliyyətini Azərbaycan Respublikası Təhsil İşçiləri Azad Həmkarlar İttifaqının Nizamnaməsi, Əmək Məcəlləsi və rektorluqla bağlanmış kollektiv müqavilə əsasında təşkil edir.

Təşkilatın xidmətində 10 fakültə və bölmədə fəaliyyət göstərən 1500-ə yaxın professor və müəllim heyəti, laborant və texniki işçi birləşir. Komitə, əsasən, ittifaq üzvlərinin sosial problemlərinin, müalicə və istirahətlərinin daha yaxşı təşkilinə fikir verməklə, onların hüquqlarının müdafiəsi ilə yaxından məşğul olur.

2008-ci ildə Milli Məclis Həmkarlar İttifaqı haqqında qərar qəbul edərək «Əmək Məcəlləsinə» dəyişikliklər etmişdir. Bu öz əksini «Əmək Məcəlləsinin» 80-ci maddəsində tapmışdır.

1. Bu Məcəllənin 70-ci maddəsinin b) və ç) bəndlərində göstərilən əsaslarla işəgötürən tərəfindən həmkarlar ittifaqının üzvü olan işçinin əmək müqaviləsi müəssisədə fəaliyyət göstərən həmkarlar ittifaqı təşkilatının qabaqcadan razılığı alınmaqla ləğv edilir.

2. Həmkarlar ittifaqının üzvü olan işçinin əmək müqaviləsini bu maddənin 1-ci hissəsində nəzərdə tutulan hallardan hər hansı biri ilə əlaqədar ləğv etmək istəyən işəgötürən həmin müəssisənin həmkarlar ittifaqı təşkilatına əsaslandırılmış yazılı təqdimatla müraciət edir. Təqdimata müvafiq əsaslandırma sənədləri əlavə edilir. Həmkarlar İttifaqı təşkilatı bu təqdimatın daxil olduğu gündən ən geci on gün müddətində özünün əsaslandırılmış yazılı qərarını işəgötürənə təqdim etməlidir.

Komitənin rəhbər orqanları beş ildə bir dəfə keçirilən hesabat seçki konfransında seçilir. Konfranslararası dövrdə komitəyə Məclis və Rəyasət Heyəti rəhbərlik edir. Komitənin nəzdində müxtəlif komissiyalar fəaliyyət göstərir. Komitənin sədri dos. Vaqif Əliyevdir.



*Universitet Həmkarlar İttifaqı Komitəsinin əməkdaşları*

Təkcə son 5 ildə 130 min manat həcmində vəsait hesabına universitetin 208 əməkdaşı respublikanın müxtəlif sanatoriyalarına (Bilgəh, Günəşli, Abşeron, Naftalan, Masallı, Qəbələ, İsmayıllı, Lənkəran, Nabran və s.) müalicəyə göndərilmiş, 950 nəfər əməkdaşa 50 min manat həcmində maddi yardım göstərilmişdir. Dünyasını dəyişən professor-müəllim heyətinin əksəriyyətinin ailəsinə köməklik olunmuşdur. Universitetdə keçirilən bütün mədəni-kütləvi tədbirlərdə Həmkarlar Təşkilatı yaxından iştirak edir.

## 4.16. TƏLƏBƏ HƏMKARLAR İTTİFAQI KOMİTƏSİ

Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tələbə Həmkarlar İttifaqı Komitəsi 1923-cü ildə yaradılmışdır. Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tələbə Həmkarlar İttifaqı Komitəsi universitetin əyani şöbəsində təhsil alan tələbələrin sosial, iqtisadi hüquqlarını və qanuni mənafelərini müdafiə etmək məqsədilə könüllülük əsasında yaradılmış, Azərbaycan Respublikası Ədliyyə Nazirliyində dövlət qeydiyyatından keçmiş qeyri-siyasi ictimai təşkilatdır.

Təşkilat öz tərkibində 10 fakültə və Magistratura və Doktorantura söbəsi üzrə 4815 tələbəni birləşdirir. THİK tələbə gənclərin sosial prob-



*Tələbə Həmkarlar İttifaqı Komitəsinin əməkdaşları*

lemlərinin həlli, müalicə və istirahətlərinin təşkili istiqamətində tədbirlər həyata keçirir. Hər il tələbələrin sosial durumlarını yaxşılaşdırmaq üçün əla qiymətlərlə oxuyan 4 tələbəyə təqaüd verir. Universitetdə təhsil alan imkansız tələbələrə hər gün pulsuz isti nahar yeməyinin verilməsini təşkil edir. 3 nəfər sosial durumu ağır olan tələbənin təhsil haqqının müəyyən hissəsini ödəyir.

Komitənin rəhbər orqanları beş ildə bir dəfə keçirilən hesabat seçki konfransında seçilir. Konfranslararası dövrdə komitəyə Məclis və Rəyasət Heyəti rəhbərlik edir. Komitənin nəzdində müxtəlif komissiyalar fəaliyyət göstərir. Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədri Vurğun Məmmədovdur.

Tələbələrin asudə vaxtlarını səmərəli keçirmələri üçün THİK mədəni kütləvi tədbirlər, idman yarışları təşkil edir, bədii özfəaliyyət kollektivləri ilə işləyir. THİK universitetin daxilində nizam-intizam qaydalarını möhkəmləndirmək üçün səy göstərir. THİK rektorluqla birlikdə tələbələrin sosial durumlarını daha da yaxşılaşdırmaq məqsədilə tədbirlər həyata keçirir. Təkcə son beş ildə 358 tələbəyə 10 min manat məbləğində maddi yardım göstərilmişdir. Universitetdə keçirilən bütün mədəni-kütləvi tədbirlərdə THİK yaxından iştirak edir.

## 4.17. TƏLƏBƏ-GƏNCLƏR TƏŞKİLATI

Azərbaycan Respublikası Prezidentinin İcra Aparatı Rəhbərinin 2005-ci il 15 fevral tarixli 41№-li Sərəncamına əsasən Azərbaycan Respublikasında bütün ali və orta ixtisas təhsil müəssisələrində gənclər və tələbələrlə işin təkmilləşdirilməsi məqsədi ilə Tələbə-Gənclər Təşkilatları yaradılmışdır.

Universitetimizdə Tələbə-Gənclər Təşkilatı 25.05.2005-ci il tarixdə təsis edilmişdir.

Təşkilatın ilk sədri Alıyev Ramin Rəşid oğlu olmuşdur. Sonrakı seçkilərdə təşkilata Zeynallı Kamal Yasim oğlu sədrlik etmişdir. Hal-hazırda təşkilata Möhbalıyev Mahmud Məhəmməd oğlu sədrlik edir.

Tələbə-Gənclər Təşkilatı ümumi maraqlar və könüllülük prinsipi əsasında birləşən tələbələrin ictimai həyatda fəal iştirakını təmin edir.

Təşkilat Azərbaycan Respublikasının Konstitusiyasına, qanunlarına, Gənclər və İdman Nazirliyinin, Təhsil Nazirliyinin qərar, əmr və tövsiyələrinə və təşkilatın əsasnaməsinə uyğun fəaliyyət göstərir.

Təşkilatın emblemi, rəsmi məktub blankı və digər rekvizitləri vardır.

Təşkilatın əsas məqsədi dövlət gənclər siyasətinin həyata keçirilməsi istiqamətində tələbələrin və ayrı-ayrılıqda hər bir tələbənin maraqlarını təmsil və müdafiə etmək, respublikanın ictimai, mədəni, sosial, iqtisadi həyatında onların fəal iştirakını təmin etməkdir.

Təşkilatın əsas vəzifələri aşağıdakılardır:

– tələbələrin sosial problemlərinin həlli istiqamətində işin aparılması;

– tələbələrin arasında maarifləndirmə işinin aparılması;

– tələbələrin asudə vaxtının səmərəli təşkil edilməsi;

– tələbələrin hüquqlarının təmin edilməsi;

– respublikanın daxilində və xaricində keçirilən müsabiqələrdə, olimpiadalarda, sərgilərdə istedadlı və yaradıcı tələbələrin inkişafının təmin edilməsi;

– tələbələr arasında narkomaniya, alkoqolizm, cinayətkarlıq, əxlaqsızlıq və digər neqativ meyillərə qarşı profilaktik tədbirlərin həyata keçirilməsi;

– tələbələrin iştirakı ilə müsabiqələrin, seminarların, festivalların, forumların, toplantıların, sərgilərin, aksiyaların, dəyirmi masaların, elmi



*Tələbə-Gənclər Təşkilatının büro üzvləri*

konfransların, təlim kurslarının, kütləvi təbliğat kompaniyalarının, diskussiya klublarının, müzakirələrin, simpoziumların, görkəmli şəxslərlə görüşlərin təşkil edilməsi.

Təşkilat yarandığı gündən universitetdə təşkil olunan bir çox mədəni-kütləvi tədbirlərin təşkilatçısı kimi fəaliyyət göstərir.

Tələbə-Gənclər Təşkilatının nəzdində müxtəlif klublar fəaliyyət göstərir.

## 4.18. İDMAN KLUBU

Respublikamızda «Gənclik» Tələbə İdman Cəmiyyəti yarandıqdan sonra ali məktəblərdə idman klubları təşkil olundu. Məqsəd ali təhsil müəssisələrində bədən tərbiyəsi və idmanın inkişafını təşkil etmək, ali məktəb tələbələrinin respublika çempionatında və tələbə universiadasında iştirakını təmin etməkdən ibarət idi. ADPU-nun İdman klubunda məşğul olan tələbələr müxtəlif illərdə nəinki respublika daxilində, həm də Avropa, Dünya və Olimpiya oyunlarında iştirak etmiş mükafata layiq yerlər tutmuşlar. Universitetimizin məzunu Elman Əsgərov 1996-cı ildə «Sərbəst güləş» üzrə tələbələrin Dünya Çempionatında III yeri, 2002-ci ildə Avro-



*ADPU-nun idmançı tələbələri rektorluqda*



*ADPU-nun Respublika ali məktəb tələbələri arasında I yeri tutan «Futzal» komandasının üzvləri Elmi Şurada*




*ADPU-nun futbol komandası*

pa Çempionatında II yeri tutmuş, 2004-cü ildə I yeri tutaraq Dünya kubokunun sahibi olmuşdur. O, 2004-cü ildə Afinada keçirilən Yay Olimpiya oyunlarında respublikamızı təmsil etmiş, 2005-ci ildə Avropa çempionatında II yerə layiq görülmüşdür. FİLA-nın 6 Qran-Pri Beynəlxalq turnirinin qalibidir. Qurbanov Etibar «Sərbəst güləş» üzrə 2005-ci ildə Avropa birinciliyində II yeri, 2008-ci ildə III yeri tutmuşdur. Qəmbərov Elmir «Sərbəst güləş» üzrə Avropa birinciliyi üzrə həm 2004-cü ildə, həm də 2007-ci ildə III yerə layiq görülmüşdür. Bəkirov Roman «Sərbəst güləş» üzrə Avropa birinciliyində həm 2008-ci ildə, həm də 2009-cu ildə III yerin sahibi olmuşdur. Əzizov Ramin «Taekvando» idman növü üzrə həm Avropa birinciliyində (2006-cı il), həm də Dünya Çempionatında (2011-ci il) III yeri tutmuşdur. O, 2012-ci ildə Londonda keçiriləcək Yay Olimpiya Oyunlarına lisenziya almışdır. Siyavuşov Rüstəm «Sərbəst güləş» üzrə 1998-ci ildə Yeniyetmələrin Ümumdünya oyunlarında III yeri tutmuşdur. Hüseynov Vüqar «Universal döyüş» idman növü üzrə 2010-cu ildə Avropa Çempionatında I yeri, 2011-ci ildə Dünya Çempionatında III yeri tutmuş-

dur. Hacıağalı Orxan «Cüdo» idman növü üzrə 2004–2005-ci illərdə I yeri tutaraq Dünya Kubokunun sahibi olmuş, 2011-ci ildə Avropa birinciliyində I yeri tutmuşdur. Hüseynov Rəşad «Karate» idman növü üzrə 2003–2006-cı illərdə Avropa birinciliyində I yeri tutmuş, 2005–2006-cı illərdə Dünya birinciliyində I yerə sahib olmuşdur.

Universitetimizin tələbələri komandalı idman növlərində də uğurlu nəticələr əldə etmişlər. Son illərdəki idman uğurlarımız daha yaddaqalan olmuşdur. Belə ki, «Voleybol» idman növü üzrə qızlarımız respublika ali məktəb tələbələri arasında 2010-cu ildə III yeri, 2011-ci ildə II yeri tutmuşlar. Ali məktəb tələbələrinin Respublika Çempionatında «Basketbol» idman növü üzrə qızlarımız 2010–2011-ci illərdə II yeri tutmuşlar. Oğlanlardan ibarət komandamız isə «Futzal» idman növü üzrə ali məktəb tələbələri arasında 2010–2011-ci illərdə I yeri tutmuşlar.

## 4.19. İNZİBATİ-TƏSƏRRÜFAT ŞÖBƏSİ

Tədris işinin keyfiyyətinin yüksəldilməsi müasir texniki vasitələrlə təchiz edilmiş laboratoriyaların, işıqlı, rahat auditoriyaların və başqa texniki məsələlərin yüksək səviyyədə həllindən çox asılıdır. Bu sahədə universitetin inzibati-təsərrüfat şöbəsi bütün imkanlarından bacarıqla istifadə edir.

Universitetin balansında üç tədris korpusu və dörd tələbə yataqxanası var. Üçmərtəbəli əsas tədris korpusu 1887-ci ildə inşa edilmişdir. Bu bina tarixi-memarlıq abidəsi olmaqla bərabər, unikal bir tikilidir. Ümumi sahəsi 7778 kv. metrdir. Binanın əsas hissəsi (6595 km. m) tədrisə yararlıdır. Həmin binaya bitişik dördmərtəbəli tədris korpusu 1956-cı ildə tikilmişdir. Bu binanın ümumi sahəsi 6267 kv. metrdir.

Universitetin təsərrüfat məsələlərinə inzibati-təsərrüfat işləri üzrə prorektor S.Ə.Hüseynov rəhbərlik edir.

Əsas tədris binasında ümumi sahəsi 799 kv. metr olan iki idman zalı yerləşir. İdman zalları son illərdə əsaslı təmir olunub, müasir avadanlıqlarla təchiz edilmişdir. Orada tələbələrin fiziki hazırlıq keçmələri üçün hər cür şərait yaradılmışdır. İdman zalında geyinib-soyunma otaqları, sanitariya qovşaqları və duşxana fəaliyyət göstərir.



*ADPU-nun əsas binası. Üzeyir Hacıbəyov küçəsindən görünüşü*



*ADPU-nun əsas binası. Zərifə Əliyeva küçəsindən görünüşü*



*ADPU-nun 2№-li tədris binası*



*ADPU-nun 14 mərtəbəli tədris binası (həyətdən görünüş)*



*ADPU-nun böyük akt zalı*



*ADPU-nun kiçik akt zalı*



*ADPU-nun əsas binasının 2-ci mərtəbəsinin dəhlizi*




*ADPU-nun tələbə yeməkxanası*



*İnzibati-təsərrüfat şöbəsinin əməkdaşları*

Tədris korpuslarında iki oxu zalı (biri 150, digəri 70 nəfər tutumlu) tələbə və müəllimlərə xidmət göstərir. Son iki ildə əsaslı kitabxana, demək olar ki, tamamilə yenidən qurulmuşdur. Oxu zalları əsaslı təmir edilərək oxucuların istifadəsinə verilmiş və kitabxana müasir avadanlıqla təchiz edilmişdir.

Universitetdə 500 yerlik böyük konfrans zalı yüksək zövqlə təmir edilmişdir. 130 il əvvəl tikilmiş səhnənin və zalın tamaşaçılar əyləşən hissəsi müasir avadanlıqla, xarici mebellərlə, akustik aparatlarla təchiz edilərək nümunəvi hala gətirilmişdir. Ona görə də bu zal müasir teatr zalları ilə müqayisə edilə bilər. Respublika səviyyəli bir sıra tədbirlərin burada keçirilməsi məhz zalın geniş imkanları ilə bağlıdır.

Mərkəzi tədris binalarında kiçik zal, muzey, yeməkxana və xüsusi lektoriya fəaliyyət göstərir.

Binaların istilik, su, çirkab sular axıdılan boru sistemi və elektrik xətləri əsaslı təmir edilərək, təhlükəsizlik texnikası qaydalarına cavab verən səviyyəyə gətirilmişdir.

Universitetin balansında müxtəlif vaxtlarda inşa edilmiş dörd tələbə yataqxanası vardır. Hal-hazırda bütün yataqxanalarda məcburi köçkünlər məskunlaşdırılmışdır.

## 4.20. BƏDİİ ÖZFƏALİYYƏT KOLLEKTİVİ

Tələbə gənclərin asudə vaxtlarının səmərəli keçməsində, onların estetik tərbiyəsində universitet bədii özfəaliyyət kollektivləri mühüm rol oynayır.

ADPU-da tələbələrin ilk bədii özfəaliyyət dərnəkləri 1952–1953-cü tədris ilində fəaliyyətə başlamışdır. O dövrdə dram, xor və nəfəsli alətlər üzrə dərnəklərə 600-ə yaxın tələbə cəlb edilmişdi.

İnstitutun «Çal, oyna» ansamblı, «Teatr baharı» dərnəyi və «Oxu, tar» xalq çalğı alətləri ansamblları televiziya müsabiqələrində diploma layiq görülmüş, «Çal, oyna» ansamblı 1977-ci ildə Ümumittifaq bədii özfəaliyyət kollektivlərinin müsabiqəsinin laureatı olmuşdur. 1981-ci ildə institutun rəqs ansamblı Bolqarıstanda uğurlu çıxışına görə laureat diplomu ilə mükafatlandırılmışdır.




*ADPU-nun xor kollektivi*

ADPU-da «Xalq çalğı alətləri» ansamblı (rəhbəri Camal Osmanov), birləşmiş xor (rəhbəri Nərmin Kamilova) fəaliyyət göstərir. Son illərdə hər iki kollektiv ali məktəb tələbələri arasında keçirilən müsabiqə və yaradıcılıq festivallarında uğurla çıxış etmiş, qalib kimi müxtəlif mükafatlara və diplomlara layiq görülmüşlər.

## 4.21. NƏŞRİYYAT ŞÖBƏSİ

Universitetdə nəşriyyat və mətbəə 1948-ci ildə yaradılmış və müvafiq avadanlıqla təchiz olunmuşdur. Nəşriyyat şöbəsi (müdiri Hüseyn Hacıyev) öz işini günün tələblərinə uyğun səviyyədə qurmağa çalışır. Proqram, metodik göstəriş və dərs vəsaitləri nəşriyyat şöbəsində koordinasiya edilir, nəşr olunan vəsaitlər kataloq sistemi ilə nəzarətdə saxlanılır

Universitetin daxili nəşriyyatında son 5 ildə bakalavr təhsil pilləsinə uyğun 2125 adda dərs vəsaiti çap olunmuşdur. Azərbaycan Respublikasının Təhsil Qanununa uyğun olaraq, təhsildə baş verən ciddi dəyişikliklər nəş-



*Nəşriyyat şöbəsinin əməkdaşları*

riyyat şöbəsinin işini bakalavr və magistr təhsil pilləsinə uyğun qurmağa yönəltmişdir. Bakalavr pilləsi üçün 18 ixtisas üzrə 508 fənn proqramı Təhsil Nazirliyinin qrifi ilə çap olunaraq istifadəyə verilmişdir.

Magistr pilləsi üzrə yeni tədris planlarına uyğun olaraq, fənn proqram və dərsliklərinin hazırlanması işi də daim diqqət mərkəzində durur. Hazırda magistr pilləsi üzrə 28 fənnin proqramı işlənmiş və çap olunmuşdur. Bütövlükdə son bir ildə 250 ç.v. həcmində dərs vəsaiti, metodik göstəriş, proqram çap olunmuşdur ki, bu da tələbələrin tədris ədəbiyyatına olan tələbatını ödəməyə xidmət edir.

Universitetin kitabxanasına son 5 ildə aşağıdakı miqdarda dərs vəsaiti verilmişdir:

| | |
|---|---|
| 2007-ci il – 2.635 nüsxə – 121 adda | 251 ç.v |
| 2008-ci il – 2.713 nüsxə – 132 adda | 249 ç.v |
| 2009-cu il – 2.816 nüsxə – 138 adda | 257 ç.v |
| 2010-cu il – 2.872 nüsxə – 191 adda | 263 ç.v |
| 2011-ci il – 2.913 nüsxə – 197 adda | 276 ç.v |

Hazırda nəşriyyat şöbəsində öz işinin öhdəsindən layiqincə gələn 18 nəfər işçi çalışır. Onlar universitet rəhbərliyinin tədrisin keyfiyyətini yüksəltmək baxımından qarşıya qoyduğu vəzifələrin layiqincə yerinə yetirilməsində fəal iştirak edirlər.

Son vaxtlar mətbəə üçün yeni avadanlıqlar alınaraq quraşdırılmışdır ki, bu da çap məhsullarının müasir standartlara uyğun hazırlanmasına səbəb olmuşdur.

## MÜNDƏRİCAT

**III FƏSİL**

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin fakültələri**

**IV FƏSİL**

**Azərbaycan Dövlət Pedaqoji Universitetinin digər qurumları**

Redaktoru *Nazim Abbasov*
Bədii və texniki redaktoru *Abdulla Ələkbərov*
Kompyuter tərtibatçıları *Səadət Quluzadə, Aqil Əmrahov*
Korrektoru *Ülkər Şahmuradova*

Fotolar *Əli Səmədovundur*.

Çapa imzalanmışdır 27.03.2012. Kağız formatı 70x100$^{1}/_{16}$.
Fiziki çap vərəqi 27,0. Sifariş 25. Tiraj 500. Qiyməti müqavilə yolu ilə.

«Təhsil Nəşriyyat-Poliqrafiya» MMC-nin mətbəəsində çap olunmuşdur.
Bakı, AZ 1052, Fətəli xan Xoyski küç., 121$^{A}$
Tel.: (+994 12) 567-81-28/29; Faks (+994 12) 567-82-68
E-mail: info@ tahsilnp.com

